# Bu kitabı
# 14 Məsumun(ə) pak və müqəddəs ruhlarına ithaf edirəm.

**Redaktor:** f.e.n. Vərağa Almasov
**Karrektor:** Dahi Almaslı

***H.X.Hüsqynov: "Gizli qalmış xəzinə"***
*Bakı, "NURLAR" Nəşriyyat-Poliqrafiya Mərkəzi, 2008. 992 səh.*

*Hüseynov Həsən Xalıqverdi oğlu 25 aprel 1970-ci ildə Zəngilan rayonunun Sobu kəndində anadan olub. Azərbaycanın ərazi bütövlüyü uğrunda gedən döyüşlərdə iştirak edib. Döyüşlərin birində ağır güllə yarası alıb. Uzun müddət yataq xəstəsi olub. I qrup Qarabağ müharibəsi əlilidir. Bakı İslam Universitetini bitirib.*

*Aşıq Qurbani məclisinin üzvüdür. "Olaylar", "İki sahil", "Üç nöqtə", "Nəbz" və "Dirili Qurbani" qəzetlərində və bir sıra jurnallarda məqalələri dərc olunub.*

*"Parlaq ulduz", "Ya Əli" və "Xuda Hüseynin aşiqi" adlı elmi tədqiqat əsərlərinin müəllifidir.*

*İSBN: 9952 - 426 - 07 - 0*

بسم الله الرحمن الرحيم

## PEYĞƏMBƏR SORAQLI POEZİYA

Bu gün bəşəriyyət üzləşdiyi çətinliklərin, keçirdiyi ruhi, mənəvi sıxıntıların kökünü araşdırdıqca Allah elmindən, saf və müdrik peyğəmbər öyüdündən nə qədər uzaqlaşdığını daha dərindən dərk edir. Təəssüf ki, yaşadığımız dünyada ən uca mənəvi əxlaqi dəyərlər ən bəsid maddi təmənnalara qurban verilir, sanki hər şey öz həqiqi mənasını asanlıqla itirir. Odur ki, artıq yer kürəsinin hər nöqtəsində bir ad gün-gündən daha gur, daha əzəmətlə eşidilir: Həzrəti Muhəmməd. Zaman ötdükcə daha çox könül bir adın həzinliyi və şirinliyi ilə təskinlik tapır, gözlənilən bəlalardan ona sığınmağa çalışır.

Doğrudan da,miladi təqvimilə 610-632-ci illər qiyamətədək bəşəriyyət tarixində ən şərəfli, ən müqəddəs bir dönüm nöqtəsi kimi qalacaq. Çünki peyğəmbərlik nuru və ilahi vəhy, məhz, həmin dövrdə tamamlanmış, Məkkə və Mədinə kainatın dayaq nöqtəsinə çevrilmişdir. Peyğəmbərimizin pak Əhli-beyti, Əbuzər, Salman, Cabir və Miqdad kimi sədaqətli səhabələri, məhz o çağlarda Həzrəti Muhəmmədin(s) gətirdiyi saf etiqad, ibadət və əxlaq dəyərləri ilə yetişərək tarix səhnəsinə çıxmışlar.

Göründüyü üzrə, bütün bunlar Həzrəti Muhəmmədin(s)

ətrafında cərəyan etmiş, hadisələrin mərkəzində həmişə tanrı sözünün kamil insan əməli ilə birləşdirən İslam rəhbərinin misilsiz şəxsiyyəti durmuşdur. O ilahi vəhydən qaynaqlanan yüksək bəşəri dəyərləri öncə özünə, sonra öz yaxınlarına, daha sonra isə cahil,bədəvi ərəblərə aşılamış, sonrakı nəsillər üçün olduqca sadə və nümunəvi bir həyat tərzi müəyyənləşdirmişdir. Bu həyat tərzi istər fərdi, istərsə də ictimai baxımdan ehtiyac duyulan iqtisadi-mədəni və ruhi mənəvi tələbatı ödəmək üçün ən əlverişli çıxış yoludur.

Yaşı minilliklərlə ölçülən zəngin Azərbaycan ədəbiyyatı daim müqəddəs İslam dini və onun əzəmətli peyğəmbəri Həzrəti Muhəmmədlə(s) bağlı mövzuları diqqət mərkəzində saxlamışdır. Şairlərimiz İslam peyğəmbərinin zahiri gözəlliklərini, əxlaqi üstünlüklərini, adlarını, ləqəblərini, Əhli-beyti və səhabələri ilə olan məhrəmanə münasibətlərini, hərbi səfərlərini, meracını və onun həyatı ilə bağlı bir çox başqa hadisələri sevə-sevə təsvir və tərənnüm etmişlər.

Hər şeydən öncə, bunu qeyd edək ki, həm klassik, həm də müasir şairlərimiz Həzrəti Muhəmmədin(s) dilindən çıxan inci kəlamları rəğbətlə nəzmə çəkmiş, onların bədii şərhinə can atmışlar. Məsələn, S.Ə. Şirvani peyğəmbərin «Ərşin altında Allahın (hikmət) xəzinələri vardır ki, onların açarları şairlərin dilindədir» hədisini belə nəzmə çəkmişdir:

**Ərşi-Əhəd altında olan kənzi-nihanə,**
**Ey Seyyidi-xoşnəzm, zəbanındı məfateh.**

Yeri gəlmişkən deməliyik ki, Seyyid Əzimin ustalıqla həm öz fərdi yaradıcılığını, həm də ümumən söz sənəti ilə bağladığı bu hədis Həzrəti Muhəmmədin(s) sənətə, şerə münasibətini göstərən möhkəm bir dəlildir. Qurani-Kərimin zəngin və bənzərsiz ədəbi-bədii incəliklərə malik olması, «Şüəra» surəsində iman gətirib,saleh əməl sahibi olan və Allahı yad edən şairlərin digərlərindən fərqləndirilməsi də hədisin doğruluğunu təsdiqləyir.

Başqa bir hədisində: «Şer hikmətdir» - deyərək poeziyaya və ədiblərə çox yüksək qiymət verən İslam peyğəmbərinin və məsum imamlarımızın Həssan bin Sabit, Fərəzdəğ, Dibili-Xüzai və başqa şairlərə göstərdikləri münasibət dinimizin əxlaqi mənəvi dyərləri uca tutan qabaqcıl sənətə və sənətkara həmişə ehtiramla, xoş niyyətlə yanaşdığını sübuta yetirir. Həzrəti Əlinin(ə) şərq və qərb alimləri tərəfindən yüksək qiymətləndirilən məxsusi bir şer divanına malik olması bu baxımdan böyük önəm daşıyır və demək olar ki, İslam və poeziya mövzusunun zirvəsini təşkil edir.

İslam dininin və onun gətiricisi Həzrəti Muhəmmədin(s) şerə, sənətə münasibəti yalnız o zaman mənfi səciyyə alır ki, mədəniyyət, sənət, poeziya əsl ümumbəşəri dəyərlərdən uzaqlaşır, şəhvət törədən ucuz duyğular yığınına çevrilir, ötəri dünyəvi qazanclara qulluq edir. Söz yox ki, belə bir poeziya nəinki insanı Tanrıya yaxınlaşdırmaz, əksinə, onunla mütləq həqiqət arasında pərdəyə, səddə çevrilər. Şerə aludəçiliyin

geniş yayıldığı Ərəbistan yarımadasında, İslama qədər, məhz, bu səpkili qəsidələr, qəzəllər hökmranlıq sürürdü. Ona görə də «Biz ona(peyğəmbərə) şer öyrətmədik»[1] ayəsi tamamilə təbii qarşılanmalıdır. Yeri gəlmişkən, qeyd edək ki, ustad Füzuli öz yaradıcılığında bu ayəyə işarə etmişdir:

**Şer bir zirvədir, amma biz kimi naqislərə,**
**Ol ki, kamildir, onu möhtaci-zivər qılmamış.**

Şair bu beytlə şerin Allah kəlamı qarşısındakı sönüklüyünü şair ilhamının peyğəmbərlik vəhyi ilə tutuşdurulmasının imkansız olduğunu,ən dahi sənətkarların da peyğəmbərdən qat-qat aşağıda dayandıqlarını önə çəkmək istəmişdir. Bu fikrə bir qədər başqa şəkildə Nizami Gəncəvi yaradıcılığında da rast gəlirik.

**O zaman ki, səflərin ön, arxası düzəldi,**
**Əvvəlcə peyğəmbərlər,sonra şairlər gəldi.**

İslamın gözündə şer o zaman qiymətli və qüdrətli olur ki, Quran və hədis bulağından su içsin, peyğəmbərimizin «şer hikmətdir» kəlamına uyğun olaraq, mayası elm və hikmətdən yoğrulsun. Bax belə bir sənət əsəri üçün Füzuli: «Allahın uca dərgahından enmişdir» - deyir:

**Sözə xor baxmaq olmaz; hər bir söz**
**Ərşdəndir, gəlib hədiyyə bizə!**
**Qəlbimiz meyl edir həmişə ona,**
**Çünki söz nazil oldu qəlbimizə.**

---

[1] Йасин суряси, айя69

Biz bilərəkdən İslam və poeziya məsələsi üzərində bir qədər geniş dayandıq. Çünkü müxtəlif ədəbi cərəyanların bir-birini əvəz etdiyini, cılız, bayağı verlişlərlə dolu telekanalların yarışa girdiyi, bəzən ən müqəddəs anlayışların və duyğuların belə ötəri mənfəətlər naminə ayaqlar altına salındığı bir dövrdə sənətin, poeziyanın əsl mahiyyətinin və həqiqi vəzifəsinin açılıb göstərilməsinə böyük ehtiyac vardır.

Bu vəzifələri aydın dərk edən və İslam peyğəmbərinin həqiqi poeziyaya verdiyi yüksək qiymətdən ruhlanan Azərbaycan şairləri onun əqidə,əxlaq və ibadət barəsində fikirlərini öz əsərlərində əks etdirmişlər. Məsələn: Həzrəti Muhəmmədin(s) məşhur «Cənnət anaların ayaqları altındadır» hədisini bizə bəlli olduğuna görə, üç böyük Azərbaycan şairi bədii vasitələrlə ifadə etmişdir:

**Analar hörmətin tutun ki, müdam**
**Qabili-rəhməti-İlah olasız!**
**İstək onlar ayağı altında;**
**Gər dilərsiz ki, cənnəti bulasız!**

Qurani-Kərimdə valideynə hörmət haqqında olan hökmlər böyük bir şəbəkə təşkil edir. Ulu yaradanımız şanlı kitabında azı dörd dəfə özünə ibadət etməyin vacibliyini buyurduqdan dərhal sonra ata-anaya gözəl münasibət bəsləməyin zəruri olduğunu bizə əmr edir. Bu mövzu hədislərdə də geniş əksini tapmışdır.

Yuxarıda Füzulinin «Hədisi-ərbəin» əsərindən gətirdiyimiz beytlər Qurani-Məciddə və hədislərdəki mənəvi-əxlaqi məzmunla yaxından səslənir. Şair peyğəmbər sözündən ilham alaraq gənclərimizi öz valideynlərinə qarşı səmimi, mehriban və itaətkar olmağa çağırır.

Böyük qələm ustası M.Ə. Sabir də «Məktəb cocuqlarını tərğib» şerində həmin hədisə üz tutmuşdur:

**Payi altındadır behişt ananın;**

**Bu hədisi-şərifdir, inanın!**

İlk baxışdan bu beyit hədisin sadə tərcüməsi kimi görünür. Ancaq diqqətlə yanaşdıqda müəllifin təkcə uşaqlarda öz ata-analarına qarşı rəğbət və ehtiram yaratmaqla kifayətlənmədiyini, bu sözlərin qiymətli, mötəbər bir hədis olduğunu açıqlayaraq gənc nəsildə Həzrəti Muhəmmədə(s) qarşı dərin sevgi və inam tərbiyə etdiyini görürük.

Mütəfəkkir şairimiz H. Cavid isə peyğəmbər pyesində hədisi bir qədər başqa şəkildə qələmə almışdır:

**O pək, sevimli, gözəl, incə, nazlı bir xilqət;**

**Onun ayaqları altındadır fəqət cənnət.**

Cavid baş qəhrəmanın – peyğəmbərin dili ilə həm yuxarıdakı hədisin məzmununu çatdırır, həm də yalnız anaların deyil, bütün qadınların hörmət və şərəfə layiq olduğunu elan edir. Qadın ləyaqətinin bəzi reklamlar və iyrənc rəsm əsərləri ilə tapdandığı bir zamanda mayası

peyğəmbər hədisindən yoğrulumuş bu sözlər nə qədər də yerinə düşür!...

Gətirdiyimiz bu bir neçə örnək də peyğəmbər sorağlı Azərbaycan poeziyasında Həzrəti Muhəmməd(s) kəlamlarının geniş və ardıcıl yer tutduğunu, ədiblərimizin bu tükənməz həqiqət çeşməsindən qidalanaraq İslami və ümumbəşəri dəyərləri necə ustalıqla oxuculara aşıladığını sübuta yetirir. Lakin Azərbaycan şairləri bununla kifayətlənməmiş, İslam rəhbərinin həyat və mübarizəsi, yetkin əxlaqi sifətləri, nümunəvi ailə-məişət münasibətləri, sərkərdəlik və idarəçilik bacarığı ilə bağlı bir çox mövzulara da toxunmuşlar. Bu mövzular tükənməz və rəngarəng olduğu kimi, onlarla bağlı sənət nümunələri də saysız-hesabsız və çox şaxəlidir. Təbii ki, kiçik həcimli bir yazıda bütün bunları əhatə etmək mümkün olmazdı. Biz ümumi anlayış yaratmaq üçün bəzi mövzularda yazılmış bədii parçalara qısaca işarə edəcəyik.

«Həqiqətən də, mən əxlaqi fəzilətləri, kəramətləri tamamlamaqdan ötrü peyğəmbərliyə seçildim.»- deyən Həzrəti Muhəmməd(s) bütün şərq və qərb alimlərinin yekdil fikrinə görə bəşəriyyətin ən kamil şəxsiyyətidir. Onun istər şəxsi rəftarı, istərsədə ictimai münasibətləri bütün zamanlar üçün misilsiz əxlaq nümunəsidir. Şeyx Nizami «İskəndərnamədə» peyğəmbərin tərifini elə bu fikirlərlə başlayır:

**Seçilmiş elçidir ulu tanrıdan,**
**Möhkəm hökmləri xalqa çatdıran,**
**Qiymətli tacıdır azadələrin,**
**Ən dəyərlisidir bütün bəşərin.**
**Əzəldən əbədə bütün yaranmış,**
**Məhəmməd adından almışdır naxış.**

M.Füzuli də nətinin son beytində məna və məzmun baxımından buna bənzər fikir söyləyir:

**Təfaxur eylə, Füzuli, kim, ondan özgə deyil,**
**Sənə zəmanədə nəqşü-səhifeyi-ixlas.**

Köründüyü kimi hər iki qüdrətli qələm ustası Həzrəti Muhəmmədi(s) Tanrının yer üzünə bəxş etdiyi ən seçkin, ən yetkin şəxsiyyət kimi təqdim edir, onun təbəqəsi olmaqla öyünür. Görkəmli qəzəl ustası S. Ə. Şirvani Quran ayələrinə, hədislərə və tarixi biliklərə söykənərək sevimli peyğəmbərinin paklıq, müqəddəslik və mənəvi qüdrət mücəssəməsi kimi vəsf edir:

**Sən əvvəlü, sən axir, sən zahirü, sən batin**
**Sən Teyyibü, sən Tahir, sən surətü, sən məna.**

Başqa bir nətində Seyid Əzim peyğəmbərimizin mülayim rəftarına, şirin və məlahətli danışığına işarə edir, bunu hər bir dərdin, kədərin əbədi dərmanı sayır:

**Çarəsi şərbəti-köftari-şəkərbarındır,**
**Ola bir kəsdə həvadisdən əgər sui-mizac.**

Orta əsrlər ədəbiyyatının davamçısı olan bəzi çağdaş şairlərimiz də bu mövzuya üz tutaraq Həzrəti Muhəm-mədin(s) bənzərsiz və dolğun əxlaqi cizgilərni tərənnüm edir, onu saflıq, ucalıq və mənəvi bütövlük nümunəsi kimi tanıtmağa çalışırlar:

**Ləkəsiz qəlbinə vəhyin işığı dolduqca,**
**Dirilik çeşməsi tək çağladı dünya-dünya**
**Mərifət zirvəsinin fəthi «Ləqəd kanə ləkum»,**
**«Ləəla xuduqin əzim» şərhi-məqami-əla.**

Dahi Almaslının Həzrəti Muhəmmədin(s) mövluduna həsr etdiyi bir qəsidəsindən götürülmüş bu parçada şanlı Quranımızın ən azı iki ayəsinə istinad olunur. Uca yaradanımız «Əhzab» surəsinin 21-ci ayəsində İslam peyğəmbərinin «Allaha və qiyamət gününə inanaraq ümid bəsləyən və Allahı çox xatırlayan şəxslər üçün gözəl bir örnək» olduğunu, «Qələm» surəsinin 4-cü ayəsində isə onun «böyük bir əxlaq üzrə» göndərdiyini bəyan edir. Müəllif bu ayələrə söykənərək reyğəmbərinin dərdini saflığı, könül genişliyi, əxlaqi üstünlüklərdən qaynağlanan mənəvi yüksəlişi haqda bədii söhbət açır.

Gənc əhli-beyt şairləri içərisində öz qələmi ilə seçilən Arif Buzovnalı Həzrəti Muhəmmədin(s) bənzərsiz daxili ülviyyətini onun son peyğəmbər olması ilə üzvi qovuşuqluqda tərənnüm edir:

**Yoxdu səndən sonra peyğəmbər, fəqət sənsən sonuncu,**
**Sən cahana gəlmək ilə gəldi ülviyyət cahana.**

Bu misraların məğzi odur ki peyğəmbərsiz dünya ali bəşəri dəyərlər baxışından çox yoxsul və önəmsiz görünərdi: Yəni Həzrəti Muhəmməd(s) sonuncu peyğəmbər olmaqla yanaşı, kainatın əzəli- əbədi mənəviyyat və əxlaq zirvəsidir.

Bu dahi şəxsiyyətin mənəvi əzəmətini və əxlaqi ucalığını göstərən Quran surələri arasında «Yasin» və «Taha» surələri xüsusilə seçilir. Məsum imamlarımızdan gələn hədislərə və bir çox alimlərimizin fikrinə görə, Yasin və Taha həm də peyğəmbərimizin mübarək adlarındandır. Azərbaycan şairləri Həzrəti Muhəmədin(s) böyüklüyünü, şan-şövkətini qələmə alarkən bu məsələdən bir bədii vasitə kimi tez-tez yararlanmışlar. Bir neçə örnək verək:

**Vəsfini «Vən-Nəcmü», «Vəş-Şəmsü» təbarək söylədi,**
**Şəninə «Taha»vü, «Yasin» gəldi həqdən bəyyinat.**

Filosof şairimiz Nəsimi bu beytində dörd Quran surəsinə əsaslanaraq Həzrəti Muhəmmmməd(s) barəsində ən gözəl tərifin Allah tərəfindən deyildiyini önə çəkir, Yasin və Taha anlayışlarının və bu adlara layiq yüksək əxlaqi dəyərlərin onun peyğəmbərliyinin danılmaz ilahi dəlilləri olduğunu göstərir.

Füzuli də öz yaradıcılığında bu mövzuya dönə-dönə müraciət etmişdir. «Leyli-Məcnun» məsnəvisindən bir beyit:

**«Yasin» sədəfi-duri sifatın,**

**«Taha» küli-bustani-zatın.**

Şair Həzrəti Muhəmmədin(s) sifətlərində, mənəvi xüsusiyyətlərini əvəzsiz incilərə bənzədir, «Yasin» surəsini bu incilərin yetişdirildiyi və qorunub saxlanıldığı» sədəf kimi dəyərləndirir. «Taha» surəsi isə onun bədii təxəyyülündə peyğəmbər zatının baxçasındakı solmaz gültək cilvələnir. Burada parlaq boyalarla, bir-birini əvəzləyən ədəbi incəliklərlə verilmiş fikrləri, Füzuli bir nətində daha aydın, birbaşa ifadə edir:

**Necə tərif edəyin vəsfini bir şahın kim,**
**Ona vəssaf ola «Yasin»ü, müərrif- «Taha».**

Böyük Füzuli məktəbinə sadiq qalmağa çalışan Arif Buzovnalı Həzrəti Muhəmmədin(s) mövludu münasibəti ilə yazdığı şerlərin birində bu ənənəni davam etdirir:

**O müqəddəs alişanın uca vəsfini nə kim var,**
**Gəhi «Taha» etdi elan, gəhi «Yasin» eylədi car,**
**Gözü kor, dili lal olsun onu kim edərsə inkar,**
**Nə gərəkdir özgə munis, nə gərəkdir özgə dildar,**
**Odur eşqdə səbəbkar, odur aşiqə tərəfdar,**
**Gühərin var isə, Arif nisar et bu cəh-cəlalə,**
**Salavat o gül cəmalə!**

Şeri oxuyarkən gözlərmiz qarşısında Quran dəryasına dalmış, bu kitabın hər səhifəsində sevimli din rəhbərinin mənəvi əxlaqi fəzilətləri və ilahi tərənnümü ilə qarşılaşan bir şəxs canlanır. Sanki o «Taha» və «Yasin» surələrinə

çatdıqda peyğəmbərin məqamını dərk etməyin zirvəsinə yaxınlaşır, onun mustəsna şəxsiyyətinin heç kəs və heç nə tərəfindən inkar edilə bilməyəcəyinə tam yəqinliklə inanır. Bədii parçanın peyğəmbərə salavat çağırışı ilə bitməsi isə əsərə xüsusi poetik, gözəllik verir.

Peyğəmbər sorağlı çağdaş ədəbiyyatımızdan başqa bir nümunəyə diqqət yetirək!

**Zülməti-dünya tükəndirdi hidayət şəmini,**
**Kürə fərq etməz fəqət, qoy gözlülər can ağlasın!**
**Eşq getdi, elm getdi, getdi Quran məktəbi,**
**Hicri-Yasində «Qələm», Tahada «Furqan» ağlasın!**

Bu iki beyit Dahi Almaslının peyğəmbərmizin vəfatına həsr etdiyi bir qəzəlindən seçilmişdir. Burada Yasin və Taha birbaşa peyğəmbərmizin adları kimi işlədilmişdir. Şeriyyət baxışından beş surənin («Hicr», «Yasin», «Qələm», «Taha», «Furqan») adlarının bir misraya sığışdırılması xüsusən maraqlı və cəlbedici görünür, bütün bunlarda məqsəd isə təkcə insanların deyil, Quranın belə peyğəmbərin vəfatından, ayrılığından kədərləndiyini, qan yaşı axıtdığını oxucuya çatdırmaq, onun bəsirət gözünün yumulmasının qarşısını almaqdır.

Həzrəti Muhəmmədin(s) mənəvi əxlaqi bütövlüyünün, bəşəriyyət üçün kamil insan örnəyi olmasının göstəricilərindən biri onun tarixdə ədalət rəmzi kimi ad qazanmasıdır. Tarixi bilgilər sevimli peyğəmbərimizin yalnız müsəlmanlar

arasında deyil, müsəlmanlarla başqa dinlərə mənsub şəxslər arasında baş verən münaqişələrdə də həmişə ilahi ədalət ölçülərini gözlədiyini göstərir. O ən yaxın qohumları və dostları, hətta ailə üzvləri ilə münasibətlərində belə bu tələblərə sadiq qalmışdır. Ədalətlə bağlı onlarla tanrı hökmünün qəlbinə nazil olduğu, özünün də «Göylər və yer ədalət üzərində bərqərradır» və ya «Qızım Fatimə belə oğurluq etsə, əli kəsilməlidir» buyurluğu şəxs ədalət rəmzinə çevrilməyə bilməzdi. Şeyx Nizami Gəncəvi bütün bunları nəzərə alaraq «Leyli və Məcnun» əsərinin sonuncu peyğəmbərin tərifinə ayırdığı fəslində belə yazır:

**Ey əqlin və canın fövqündə duran,**
**Sənə səcdə qılır yerlə asiman**
**Yer göyə dönmüşdür dininlə gerçək,**
**Yox-yox, döşəməndir bu sonsuz fələk.**

Nizami dünyagörüşündə din və ədalət bir-birindən ayrılmaz anlayışlardır. «Yer göyə dönmüşdür dininlə gerçək» - deyən mütəfəkkir şair bütün cismani və ruhani gözəlliklərin zirvəsinə yüksələn kamil şəxsiyyətin təbiət aləmində, yer üzündə ilahi ədalət səltənətinin yarada biləcəyinə ürəkdən inanır və bunun nümunəsini əsri-səadətə, peyğəmbərin qurduğu xilafət dövlətində görür.

Füzuli yaradıcılığı ilə yaxından tanış olduqda onun da Həzrəti Muhəmmədin(s) əsasını qoyduğu ədalət sistemin-

dən, milli, dini, irqi fərqlərin heç bir rol oynamadığını idarə etmə məktəbindən ilham aldığını görürük:

**Qaim olmazdı nizamü nəsəqi-əsli-vücud,**
**Verməsəydin əsəri-ədl ilə dünyaya rəvac.**

Şairin «Ey cübari-qədəmin ərşi-bərin başına tac» misrası ilə başlayan məşhur nətindən götürülmüş bu beyitdə adil şəxsiyyət və ədalətli idarə üsulu qarşısındakı böyük heyranlıq duyğuları bədii əksini tapmışdır. Füzuliyə görə, bütün varlığı ilə tanrısına bağlı olan, elmi ilə əməli, sözü ilə işi bir-birini tamamlayan kamil, məsum bir insan çox şeyə qadirdir; o elə bir ədalətli qayda qanunlar, sarsılmaz nizam-intizam təlimi yarada və həyata keçirə bilər ki, bütün varlıq aləmi onun təsirinə düşər, ondan nümunə almağı zəruri sayar. Beytin alt qatında haqqı, ədaləti tapdalayan zülmkar zəmanə hakimlərinə qarşı sənətkar etirazı, onların Allah və onun yer üzündəki elçisi qarşısında utanmalı olduqları fikri də gizlənməkdədir.

Hazır ki dövrümüzün tanınmış din xadimlərindən və ədəbi simalardan olan Hacı Soltan Əlizadə də öz yaradıcılığında peyğəmbər ədaləti mövzusuna toxunmuşdur:

**Xoş ki gəldin, eylədin dünyanı bərpa ədl ilə,**
**Həq sənə xatəmliyi etdi əta, ya Mustafa!**

Göründüyü kimi şerdə Həzrəti Muhəmmədin(s) ədalət sifəti «sonuncu peyğəmbər» anlayışı ilə qırılmaz bağlılıqda təqdim olunur.

Müəllif bununla demək istəyir ki, Həzrəti Muhəmməd(s) son tanrı elçisi olduğu kimi, haqqın, ədalətin, qərəzsizliyin də zirvə nöqtəsidir.

Hüseyn Kürdoğlu isə məsələyə daha açıq, daha birbaşa münasibət bildirir:

**İndidə bizimlədir ədalət yürüşündə,**
**İslam səltənətinin ilk sultanı Muhəmməd.**

Şair müasir dünyamızda baş verən haqsızlıqlara qarşı etirazını bildirir, insanları ədalət mücəssəməsi olan Həzrəti Muhəmməddən(s) dərs alaraq öz hüquqları uğrunda mübarizəyə səsləyir. Bu sözləri oxuyarkən əziz İslam rəhbəri təkcə ruhən və mənən yox, cismən də gözlərmiz qarşısında canlanır, onun ölməz varlığı bir daha təsdiqini tapır.

Azərbaycan ədəbiyyatında İslam peyğəmbəri ilə əlaqədar mövzuların zəngiliyini və rəngarəngliyini göstərməkdən ötrü qısaca da olsa, meracla bağlı bəzi bədii parçalara nəzər salaq.

Hər şeydən öncə bunu deməliyik ki merac hadisəsi Qurani-Kərimin nazil olma məqsədlərinə və xüsusi üslubuna uyğun olaraq əsasən «İsra» və «Nəcm» surələrində müəyyən qədər əksini tapmışdır. Hadisənin geniş təfərrüatları isə səhih-doğru hədislərdədir.

«Merac» sözü ərəb dilində «göylərə yüksəlmə» və ya «göyə qalxmaq üçün alət anlamına gəlir. İstilahi mənada bu

söz Həzrəti Muhəmmədin(s) məşhur bir möcüzəsini-Allahın izni və əmri ilə yer kürəsindən ayrılaraq ən qısa bir müddətdə cismən və ruhən göyün ən uca qatlarına yüksəlməsini və dərhal yer aləminə qayıtmasını bildirir.

Bu bənzərsiz hadisə Azərbaycan şairləri üçün misilsiz bir ilham mənbəyinə çevrilmişdir, bütün şərq ədəbiyyatında olduğu kimi milli poeziyamızda da meracnamələrin və ayrı-ayrı gözəl bədii parçaların yaranmasına səbəb olmuşdur. Yenə də usdad Nizamidən başlayaq:

**O gecə meraca at səyirdəyərək**
**Fələyin donuna vurdu min bəzək.**
**Gecə-meracının çətrindən sayə,**
**Göy- o nərdivandan kiçik bir payə**

«İskəndərnamə»dən alınmış bu beyitlərdə meracın başlanğıc mərhələsi əlvan bədii boyalarla, parlaq təşbeh və bənzətmələrlə təsvir olunmuşdur. Kainatı bürümüş zülmət gecəni adi bir çətir kölgəsinə, göyləri isə kiçik nərdivan pillələrinə bənzətməklə şair tanrıdan başqa hər şeyin Muhəmməd əzəməti, Muhəmməd qüdrəti qarşısında cılız və gücsüz olduğunu göstərmək istəyir.

Nəsimi dünya görüşü daha çox fəlsəfə səciyyə daşıdığından onun bu ilahi peyğəmbərlik möcüzəsinə bədii yanaşması bir qədər fərqlidir. Şairin «Aşiq bəla yolunda gərək kim, həmul ola» misrası ilə başlayan arifanə bir qəzəlinin son beyti belədir:

**Meraca çıxdı ruhi-Nəsimi buraq ilə,**
**Şol laşədən nə faidə kim, lazəlul ola?!**

Nəsimi təfəkküründə, Nəsimi dünyagörüşündə Merac, hər şeydən öncə, ruhani bir yüksəliş, mənəviyyat aləminin uca göylərində seyr etməkdir. Buna əsla meracın maddi cismani yönlərinin inkarı kimi, baxmaq olmaz. Sadəcə olaraq, mütəfəkkir şair insanlıq anlayışının ilk növbədə ruhi-mənəvi fəzilətləri əhatə etdiyini, yersiz maddi və cismani tələblərin bəşəri və bəşəriyyəti məhvə sürüklədiyini önə çəkmək istəmişdir. Bu ali məqsəd üçün o sevimli peyğəmbərinə aid bir möcüzəni poetik baxımdan özününkləşdirməkdən belə çəkinməmişdir. Görkəmli dövlət xadimi, bacarıqlı sərkərdə və rəvan təbli şair kimi tarixdə ad qazanmız Şah İsmayıl Xətai də öz yaradıcılığında canından çox sevdiyi din rəhbərinin bu möcüzəsinə dönə-dönə müraciət etmişdir. Bir nümunə göstərək:

**Qaldı sidrəl-müntəha, keçdin fələkdən ta zəmin,**
**Kim yetər bu qədr həqqə, müntəhadır, ya Nəbi!**

Burada biz Həzrəti Muhəmmədi(s) meracın zirvə nöqtəsində görürük. Ancaq bu bir şəxsin təsəvvürə sığmayan cismani hərəkəti deyildir; söz yox ki, bu maddi cismi öz ardınca aparan yenilməz bir ruhi mənəvi qüdrət – Muhəmməd şəxsiyyəti daha önəmlidir. Xətai demək istəyir ki, hər bir gözəlliyin yetkinlik nöqtəsi Həzrəti Muhəm-mədə(s) məxsus olduğu kimi, peyğəmbərlər arasında merac

dağının ən ucva zirvəsini fəth edən də odur. Xətai demək istəyir ki, keçmiş və gələcək nəsillər içərisində heç kəs bu qədər həqiqətə, Allaha yaxın olmamış və olmayacaqdır.

Həbibi, Füzuli, S. Təbrizi, Seyyid Əzim, M. Ə. Sabir, H. Cavid, M. Hadi və bir çox başqa klassiklərimiz, eləcə də Aşıq Qurbani, A. Tufarqanlı, Xəstə Qasım, Molla Cümə, Aşıq Ələsgər və s. bu kimi el sənətkarlarımız merac hadisəsinə dair müxtəlif həcmli bədii əsərlər yazıb yaratmışlar. Onlardan hər biri öz məna-məzmun dolğunluğu, bədii incəlikləri ilə seçilsədə, təəssüf ki, burada o ədəbi nümunələr haqqında söz açmağa imkan yoxdur.

Sevindirici haldır ki, merac mövzusu bu gündə unudulmamışdır. Nazim Səlami, D. Almaslı, Seyyid Nurəddin, Hacı Yusif Qulammirzə oğlu, A. Buzovnalı, Ənvər Nəzərli, Ələmdar Mahir, Hacı Soltan, Yaşar Cahid, Nizami Zöhrabi və.s kimi qələm sahibləri az-çox bu mövzuya üz tutmuş, bədii töhfələrini verməyə çalışmışlar. Nümunə üçün bir, iki beyit göstərək:

**Yer üzündən asimana eylədin meracı sən,**
**Ərşdə mehmanın oldu Mürtəza, ya Mustafa!**

«Ya Mustafa» rədifli şerindən götrdüyümüz bu beyitdə Hacı Soltan Əlizadə həm merac hadisəsinə ümumi işarə edir, həm də İslam peyğəmbəri ilə Həzrəti Əli(ə) arasındakı xüsusi məhrəmanə münasibətləri, həqiqi din qardaşlığını oxuculara çatdırır. Şeri oxuyarkən gözlərimiz qarşısında

təkcə Həzrəti Muhəmmədin(s) göylərə ucalan surəti deyil, həm də Muhəmməd-Əli münasibətləri ilə bağlı bir çox tarixi hadisələr gizlənir; Dostluğun, sədaqətin, din qardaşlığının və fədakarlığın meracı – ən yüksək nöqtəsi bu iki misilsiz şəxsiyyət arasındakı ülvü münasibətlərdədir.

Dahi Almaslı isə merac hadisəsini qısaca olaraq belə qələmə alır:

**Büraqa əyləşərək fəth qıldı ərzü səmanı,**
**Səyahət eylədi bir ləhzə içrə ərşi-xudanı.**
**Nəbilər içrə görən varmı böylə zövqü səfanı?**
**Vicudi-pak ilə can verdi asimanə Muhəmməd.**

İlk iki misra daha çox təsvir səciyyəsi daşıyırsa, sonrakı beyit əsasən meracın tərənnümünə, bədii dəyərləndirilməsinə xidmət edir. Divan ədəbiyyatı ənənələrinə sadiq qalmağa çalışan müəllif bir tərəfdən Həzrəti Muhəmmədin(s) merac baxımından da bütün peyğəmbərlərdən üstün olduğunu, digər tərəfdən daim ulu yaradana yaxınlaşmağa, ona doğru ucalmağa can atan kamil şəxsiyyətin yalnız adi bəşər övladına deyil, fələklər və mələklər aləminə də həqiqi həyat bəxş edə biləcəyini səmimi ürək çırpıntıları ilə irəli sürür.

Bütün bu deyilənlərdən aydın olur ki, həm merac möcüzəsi, həm də Həzrəti Muhəmmədin(s) həyat və mübarizəsi, bənzərsiz şəxsi keyfiyyətləri ilə bağlı mövzular Azərbaycan poeziyasında geniş və önəmli yet tutur. Söz yox

ki, çağdaş qələm sahiblərimizin əsərləri Nizami, Nəsimi, Füzuli, Seyyid Əzim kimi ustad sənətkarların yaratdıqları ilə eyni ədəbi-bədii səviyyədə deyil. Tədqiqatçı Qrabağ müharibə əlili Həsən Hüseynov bütün ədəbi-dövrləri əhatə etmək, peyğəmbərlə bağlı mövzuların zənginliyini və rəngarəngliyini göstərmək üçün bədii baxışdan nisbətən zəif olan bir sıra çağdaş qələm nümunələrini də topluya daxil etməyi lazım bilmişdir. Ümid edirik ki, oxucular yuxarıda sadalanan tələbləri nəzərə alaraq bəzii nöqsanları təbii qarşılayacaq, öz böyüklüklərinə bağışlayacaqlar. Biz İslam dini və onun əzəmətli peyğəmbəri Həzrəti Muhəmmədlə(s) bağlı bütün mövzularda yazıb-yaradan çağdaş şairlərimizə də, tədqiqatçı Həsən Hüseynova da gələcək fəaliyyətlərində uğurlar arzulayır, ədəbi-bədii və elmi nailiyyətlər qazana-caqlarına ürəkdən inanırıq.

***Mirzə Vərağa Almasov***
***Filologiya elmləri namizədi.***

## TƏRTİBÇİDƏN

***Bismillahir rəhmanir rəhim***

Əziz oxucu, insan mənəviyyatının ən böyük təməl daşı olan müqəddəs dinimiz və dinin bəşər tarixinə bəxş etdiyi uca şəxsiyyətlər hər bir zamanda olduğu kimi,bu gün də bizim ictimai-mənəvi həyatımızın aparıcı istiqamətlərindən biridir. Özünü dərk etməyə çalışan, bu yollada onu yaradan və idarə edən sonsuz qüdrətə doğru can atan bəşər övladı müasir dövrümüzdə dini dəyərlərə və ruhani anlayışlara daha çox diqqət yetirməlidir. Çünki elm və texnikanın görünməmiş tərəqqisinə baxmayaraq bütün dünyada bir mənəvi tənəzzül prosesi, əxlaqi və ideoloji eniş hiss olunmaqdadır, bunun təbbi nəticəsidir ki, biz zaman-zaman islam dininə və onun müqəddəs şəxsiyyətlərinə qarşı gizli və açıq hücumların, böhtan və təhqir səciyyəli televiziya verlişlərinin, qəzet və jurnal məqalələrinin, insanlıq adına uymayan eybəcər rəsm əsərlərinin şahidi oluruq.

Məhz, belə bir dövrdə biz əziz islam peyğəmbərinin həyat və mübarizəsini özündə əks etdirən ədəbi-bədii bir toplu yaratmaq təklifini aldıq. Bu təklif bizi nə qədər sevindirdisə bir o qədər də üzərimizə ağır məsuliyyət qoydu, çünki dini anlayışlar və islam dünya görüşü ilə vahid bir orqnaizm kimi qaynayıb-qarışmış Azərbaycan ədəbiyyatından peyğəmbər mövzusuna həsr edilmiş bütün əsərləri seçib bir kitabda toplamaq bəlkədə mümkünsüz bir işdir. Bu baxımdan sizə təqdim olunan bu kitaba ilk cəhd, dəryadan bir damla kimi baxmaq lazımdır.

Bu kitabda həm klassiklərimizin, həm də çağdaş şairlərimizin Həzrəti Muhəmmədin(s) həyatına və əxlaqi üstünlüklərinə dair bir sıra əsərləri toplanmışdır. Kitabın fəsillərində islam peyğəmbərinin həyat tarixçəsinə uyğun müəyyənləşdirilmişdir.

İlk fəsildə peyğəmbərin dünyaya gəlməsinə dair mövludnamələr toplanılmışdırsa, ikinci fəsil məbəs hadisəsinə və peyğəmbərliyin ilk dövrlərinə ayrılmışdır, üçüncü fəsil Həzrəti Muhəmmədin(s) ən məhşur möcüzələrindən olan meracla bağlı bədii nümunələri əhatə edir. Bu bölümdə siz bir tərəfdən Nizami və Füzuli kimi söz nəhənglərinin, digər tərəfdən də qəlbləri peyğəmbər sevgisi ilə çağlayan indiki qələm sahiblərinin meracnamələri ilə tanış ola biləcəksiniz.

Sonrakı üç fəsil islam peyğəmbərinin həyatındakı ən keşməkeşli dövrlərə dair bədii əsərləri özündə birləşdirir. Dördüncü fəsildəki əsərlərdə peyğəmbərimizin ana yurdu Məkkədən Mədinəyə ağır və şanlı hicrəti təsvir və tərənnüm edilmişdirsə, beşinci və altıncı fəsillərə salınmış sənəd nümunələrində cahad əmri gəldikdən sonra aparılan müharibələr və peyğəmbərimizin müxtəlif dövlət başçılarına göndərdiyi məktubların taleyi ilə bağlı maraqlı haisələr öz bədii əksini tapmışdır.

İslam tarixində peyğəmbərimizin Vida həcci və bundan dərhal sonra baş verən, tarixdə böyük Əhli-Beyt(ə) bayramı kimi şöhrət qazanmış Qədiri-Xum hadisəsi də özünə məxsus geniş yer tutur. Əlimizdə olan toplunun yeddi və səkkizinci hissələrində bu hadisələrə həsr olunmuş bədii parçalar verilmişdir.

Həzrəti Muhəmmədin(s) anadan olması, iyirmi üç illik

peyğəmbərlik həyatı və mübarizəsi nə qədər çətin və şərəflidirsə onun vəfatı da bir o qədər can yandıran və əzəmətlidir. Kitabın növbəti fəsli, məhz bu böyük kədərdən doğan ürək çırpıntılarını səmimi aşiqanə duyğuları özündə əks etdirir.

Nəhayət toplunun son bölümündə peyğəmbərlə bağlı müxtəlif mövzuları əhatə edən şerlər onun mənəvi-əxlaqi fəzilətlərini tərənnüm edən nətlər klassik və müasirlərimizin sonuncu Allah elçisinə həsrətdən və yanğından yoğrulmuş bədii çağırışları verilmişdir.

Bünüt bunlardan məqsəd şerin dili ilə bir daha Azərbaycan vətəndaşına, doğma soydaşlarımıza və dindaşlarımıza səslənmək, onların milli-dini, və mənəvi-əxlaqi dəyərlərimizin keşiyində möhkəm durmağa çağırmaqdır. Ən böyük arzumuz, istəyimiz odur ki, bu kitabı əlinə alan hər bir şəxsin qəlbində sonsuz Allah və peyğəmbər sevgisi çağlansın, kainatın fəxri, yaranmışların ən şərəflisi olan Həzrəti Muhəmmədin(s) həyat və mübarizə tarixi ilə ədəbi bədii tanışlıqdan sonra hər bir Azərbaycan gənci bu böyük məktəbdən dərs alaraq torpaqlarımızın düşmən işğalından azad edilməsi, dövlətimizin və sərhədlərimizin möhkəmləndirilməsi, əxlaq və mənəviyyat müqəddəsliyimizin yad təfəkkür və baxışlardan qorunması uğrunda daha ürəklə, daha qeyrətlə çarpışsın.

Digər tərəfdən, bu toplunun nəşri çağdaş yazıçı və şairlərimizi İslam peyğəmbərinin və başqa din böyüklərimizin həyatına, mübarizəsinə, mənəvi-əxlaqi üstünlüklərinə dair yeni əsərlər yazmağa həvəsləndirə bilər. Bununlada klassik

ədəbiyyatımızın mühüm bir qolu ilə yetmiş illik sosializm quruluşu dövründə zəifləmiş, qırılmış əlaqələr yenidən canlanar və bərpa olar. Bu isə milli mənəvi özünü dərkimiz, özümüzə qayıdışımız üçün son dərəcə gərəklidir.

Əziz və sevimli oxucular, islam peyğəmbəri mövzusunda Azərbaycan ədəbiyyatından seçilmiş bir sıra nümunələri əhtə edən bu toplu artıq sizin ixtiyarınızdadır. Təbii ki, bu səpkili ilk məcmuə olduğuna görə kitab nöqsansız deyildir. Öz təsuratlarını bizimlə bölüşəcək bütün oxuculara bəri başdan təşəkkürümüzü bildirir, ədəbi-mədəni ictimaiyyətin fikr və rəylərini gələcək işlərimizdə nəzərə almağı özümüzə borc sayırıq.

Son olaraq, kitabın naşirlərinə, redaktoruna, uzunmüddətli və gərgin iş prosesi zamanı maddi və mənəvi yardımını əsirgəməyən bütün şəxslərə dərin ehtiram və razılığımızı bildiririk. Qoy uca Tanrı hamımızdan razı olsun və bu kiçik zəhməti öz böyüklüyü ilə bizdən qəbul etsin!

***Qarabağ Müharibəsi Əlili***
***Həsən Hüseynov***

## N. GƏNCƏVİ
### *MİNACAT*
**1**

Ey Tanrı, dünyaya sənsən padşah,
Biz kiçik bəndəyik sən böyük allah.
Tək sənə sığınır, hər yüksək, alçaq,
Hər varlıq yoxluqdur, sən varsan ancaq.
Yuxarı, aşağı-hər gözə çarpan
Nə varsa, onları sənsən yaradan.
Sənsən hər biliyi bizə öyrədən,
Torpağın köksündə qələm işlədən.
Sənin varlığına tapınca bürhan,
Ağıl ilk inandı sənə, yaradan.
Sən ağlın gözünü işıqlandırdın,
Sən doğru yollarda çıraq yandırdın.
Göyləri sən qurdun, ucaltdın, allah,
Ona yer üzünü etdin güzərgah.
Sənsən bu aləmdə bir damcı sudan
Günəşdən işıqlı gövhər yaradan.
Gövhəri lütfünlə etdin aşikar,
Sərrafın əlinə sən verdin açar.
Daşların bağrına düzdün gövhəri
Rənglərlə boyadın hər bir cövhəri.
Buludlar yağdırmaz, sən deməsən:«Yağ»
Sən «bitir!» deməsən, bitirməz torpaq.
Özündə kimsədən kömək almadan

Yaratdın nə gözəl, səfalı cahan.
İstidən, soyuqdan, qurudan, yaşdan
Yoğurub yaratdın gözəl bir cahan.
Nə gözəl naxışlar vurdun xilqətə,
Ağıllar heyrandır bu məharətə.
Bu sirri mühəndis axtarır hər an,
Bilməyir ən əvvəl başladın hardan.
Uca sənətini seyr edirik biz,
Yeməkdir, yatmaqdır yalnız işimiz.
Hər nəyi bəzədin, var etdin yoxdan
Onlara ehtiyac duymadın bir an.
Sən elə qurdun ki, yerin işini,
Göyün, ulduzların bu gərdişini,
Göyə ucalsa da düşüncə, fikir,
Bu kəmənddən başı çıxa bilməyir.
Sən vardın varlıqlar olmayan zaman,
Onlar yox olacaq, sən qalacaqsan.
Sən düzdün göylərə şux ulduzları,
İnsanla bəzədin hər bir diyarı
Fələyi uca bir hasara aldın.
O yerdə idrakı kəməndə saldın.
Elə bir tağ vurdun daşsız, dirəksiz,
Düşüncə o yerə yol tapmaz, şəksiz.
Zatına düşüncə, ağıl əl atmaz,
Böyük qüdrətinə qüdrəti çatmaz.

Sənin varlığındır o laməkandan
İdrak elçisini hər an daşlayan.
Dağınıq deyilsən ki, birləşəsən,
Artıq da deyilsən, əskiləsən sən.
Xəyal da, nəzər də yolunda məhrum,
Nə qədər axtarsa deyilsən məlum.
Ey tanrı, sən hansı başı ucaltsan,
Əyə bilməyəcək onu bir insan.
Qəhrinlə hər kimin əysən boynunu,
Kimsənin köməyi dikəltməz onu.
Biz sənə bəndəyik, sənindir fərman,
Hər kömək səndəndir, sənsən əl tutan.
Fildə, qarışqada, zəiflik, qüvvət
Sənin əmrindədir, ey ulu qüdrət.
Sənin qüdrətindən qüvvət alınca
İlanı məhv edən zəif qarınca.
Yollardan tüstünü qaldırsan əgər,
Bir çibin Nəmrudun beynini yeyər.
İstəsən əzilsin düşmənin beli,
Quşlarla qırarsan əshabi-fili.
Gah kiçik nütfəyə qoydun qızıl tac,
Gah xırda çərdəkdən yaratdın ağac.
Gah Xəlil alırsan bütxanələrdən,
Gah dost yaradırsan biganələrdən.
Qiymətli cəvahir doğan bir evdən

Əbutalibi də çıxaran sənsən.
Kimdə var cəsarət, qorxundan sənin
Təslimdən başqa bir kəlam söyləsin?
Yanına yol tapmaz məxluqun əli,
Gizlin bir xəzinə sevməz məşəli.
Əsrarın hər zaman qalmaqçın gizlin
Bağlarsan dilini əsrar bilənin.
Sən məni yaratdın qara torpaqdan,
Sən verdin işıqlı ürək, təmiz can.
Aludə olsam da məndə yox təqsir,
Torpağın peşəsi aludəlikdir.
Günahdan qaçsaydı bu üzüqara,
Bəs kim yol tapardı bağışlanmağa?
Olmasaydı mənim günahım hərgah,
Sənə kim deyərdi: «Ey qəfur allah!»
Gecələr, gündüzlər, hər axşam, səhər
Qəlbimdə,dilimdə bir sənsən əzbər.
Yuxuya getməzdən əvvəl, hər gecə
Mübarək adını çəkərəm öncə.
Gecələr yuxudan qalxınca başım,
Anaram səni, hey axar göz yaşım.
Sənə üz çevirrəm hər səhər erkən,
Gecə də, gündüz də pənahım sənsən.
Hər zaman köməyə çağırram səni,
Qapından ümidsiz qaytarma məni.

Ey tanrı dərdimə sən eylə əlac,
Bu möhtac kəslərə olmayım möhtac.
Hər zaman bəndəlik yoluyla gedən,
Zatına könüldən pərəstiş edən
Olsun bu dünyada xəzinənlə şad.
Qiyamət günündə əzabdan azad.
İnsanı dünyaya sənsən gətirən,
Öldürən də sənsən, dirildən də sən.
Əldə nə hesabım, nə kitabım var,
Yalnız sən bilirsən nə hesabım var.
Yaxşının, yamanın açarı sənsən,
Yaxşılıq səndəndir, yamanlıq məndən.
Bağışla bir süçüm varsa, ey allah,
Məndədir yamanlıq, məndədir günah.
Nə ki ilk naxışın sərgüzəşti var
Səndəndir, son söz də sənə qayıdar.
Kəsərli ayəni öyrətmək səndən,
Şeytanın gözünü tikməksə məndən.
Adın mehribanlıq etsə bir qədər,
Mənimlə oynaya bilərmi divlər?
Yararmı söz açmaq səninlə məndən.
«Sən» demək, sonra da söyləmək ki, «mən».
Ya qaytı içində, ya sakit, aram,
Nə cür yaratdınsa, o cür yaşaram.
Ey tanrı, ümidim bunadır ancaq,

Bu köhnə dəzgahdan düşərsəm uzaq,
Elə ki, pozular tərkibim mənim.
Dəyişər qurduğun tərtibim mənim
Əsdikcə tozumu dağıdar yellər,
Pak olan canımı görməz bir nəfər,
Halımı arayıb, edəndə töhmət,
Varıma yox deyə, edərkən töhmət,
Sən yoxdan əlinə ver elə açar,
Bilsin ki, bu yatan ölməmiş, yaşar.
Sənin varlığına bu gücsüz əlil
Göstərmiş nə qədər tutarlı dəlil.
Ölürsəm bunu sən hamıya bildir:
«Bədəni yatmışsa,canı diridir».
Elə bir mətanət qızışdır məndə,
Şad ürəklə gəlim sənə gələndə.
Mənimlə qapıya qədərdir dostlar,
Məzara girdimi, düşməndir onlar.
Tərk edər məni bu gözüm, qulağım,
Bədəndən ayrılar əlim, ayağım.
Ey tanrı, mənimlə yalnız sən varsan,
Əliboş qaytarma məni qapından.
Qapında üzümü sürtərəm yerə,
Bir tacla əvəz ver bu səcdələrə.
Bu başı qapından əsirgəmədim,
Sən ona qılınc yox, tac ver, ey rəbbim.

Əzəldən verdiyin hökmlər sönməz,
Yazdığın silinməz, qələmin dönməz.
Hökmündə hazıram canla-başla mən,
Təsəlli tapıram yalvarışla mən.
Sən dedin: dar gündə köməkçi mənəm,
Hər dilək istəsən,qəbul edənəm,
Sənsən acizlərə hər zaman pənah,
Mən də bir acizəm kömək ol, allah.
Tək sənin işindir bəndəpərvərlik,
Mənim vəzifəmdir etmək bəndəlik.
Qırdı varlığımı, əzdi bu fələk,
Bütün şənliyimi sovurdu külək.
Tək sənsən qurtaran bu sınıqlıqdan,
Qırsan da yenə sən verirsən dərman.
Zülmətin qəlbindən üzümə yol aç,
Fəzilət ayından yoluma nur saç.
Məni yol kəsəndən sən özün qurtar,
Elə et, üstümə gülməsin əğyar.
Əvvəl şükrə çatdır, sonra dövlətə.
Əvvəl səbrə çatdır, sonra zillətə.
Səbrimi tükədən bəlaları sən
Uzaq et, ey tanrı, sən ki adilsən.
Məni hər bəlaya etsən mübtəla,
Əvvəlcə səbr ver,sonradan bəla.
Qırsan da, səlamət qoysan da, ancaq

Tələbin bir ovuc tozdur, ya torpaq.
Çürüyüb toz kimi dağılsa bədən,
Yenə əl çəkmərəm bəndəliyimdən.
Düşsəm hər bucağa səni anaram,
Səni mən hər yerdə tanrı sanaram.
Bütün varlıqların heçlikdir sonu,
Tək sənə biçilmiş varlığın donu.
Kim səni arasa əlində açar,
Əli boşa çıxar, dolanar naçar.
Kim sənə gözünlə baxarsa əgər
Ömrü vərəq kimi yellərə verər.
Səni tapmaq olur səninlə ancaq,
Boşdur hər qapıda yüyən partlatmaq.
Mənzili göz tanır buraya qədər,
Buradan keçdikdə taparsan xətər.
Varımı, yoxumu tapşırdım sənə,
Hesabım aydındır o xəlq edənə.

### *MİNACAT*
### *2*

Kimsəm yox, ey bizə böyüklük verən,
Pənahım da sənsən, köməyim də sən.
Çıl-çılpaq gəlmişəm, ey pərvərdigar,
Hər şeyim sənindir, mənim nəyim var?
Sən verdin mənə bir işıqlı çıraq,
Onu hər küləkdən özün et iraq.

Əkməyə sən verdin sağlam bir qüvvət,
Mənə əkdiyimdən ayır bir qismət
Təpələr ucadır, sellər çağlayan,
Çevirmə yüyəni bəxtin yolundan.
Məni bu sellərdən sən elə qurtar,
Körpünü qırmasın bu daşqın çaylar.
Gəlmişəm qapına, üzümdür qara,
Bağışla,ey tanrı, yaxma odlara.
Üzümü ağ elə sən, ey yaradan,
Ümidsiz qaytarma uca qapından.
Torpaqdan yoğurub yaratdın məni,
Təmiz, natəmizdən etdin bədəni.
Tiynətcə yaxşıyam, yamanamsa mən,
Bu nəqşi sən mənə vurdun əzəldən.
Biz aciz bəndəyik, sənsən yaradan,
Sənin qüvvətinlə yaşayır insan.
Yaranmış hər bir şey baxıb görənə
Yaradandan verir xəbəri yenə.
Mən sənə ağlımla salıram nəzər,
Yolunu görməmək olarmı məgər?
Hər bir yaranmışın sənsən mənası,
O ancaq məxluqdur, sənsən ustası.
Ağıl nəzərindən keçən hər surət
Deyilmi nəqqaşı göstərən höccət?
Arada məsafə olduqca uzaq,

Səni tək səninlə mümkündür tapmaq.
Yerlərdə, göylərdə qoyulan əsas
Ağıl ölçüsündən kənara çıxmaz.
Bələdçi olmağa çəhd edər xəyal,
Əndazədən kənar yol tapmaz hər hal.
Yaramaz payədən kənarə çıxmaq,
Hədsizin sonuna qoyulmaz ayaq.
Kainat hüdudu başa yetincə,
O səmtə yol tapmaz aciz düşüncə.
Düşüncə bu qədər yol tapar ancaq,
Sən başqa bir şeysən, hüduddan uzaq.
Ey tanrım,umuram, öz hikmətinlə,
İşıq yol açarsan məsləhətinlə.
Qarşıma elə bir yol çıxr, bunlan
Mən nicat tapım ki, razı qalasan.
Başqa ğir çarəm yox, təslimən ancaq,
Qəzadan olurmu boyun qaçırmaq?
Etdiyim duadan yazaram bir xətt,
Üstündü möhrünü qoysun Məhəmməd.
Həm də dörd xəlifə şəhadətiylə,
Yüzlərcə eşq olsun dördünə belə.
Qanlını qurtaran xətt sənəd kimi,
Qolumda qala bir bazubənd kimi.
Başlarkən qılınctək kəsən məhkəmən,
Məhşərlə qiyamət qarşı gəlirkən,

Hər kəsin boynunda nameyi-əmal,
Mən də bu naməni çıxarram dərhal,
Göstərrəm, insafla hökm verənsən,
Bununla hökm ver, çün hakim sənsən.
Ümidim sənədir, ey ulu tanrı,
Qapından ümidsiz qaytarma barı.
Atımı həddimdən uzaq salmışam,
Yolunda mən yarı yolda qalmışam.
Taxtımı qapında düşür, yaradan,
Məni azdırma öz doğru yolundan.
Səndən yol göstərmək, məndən aramaq,
Mən cana gəlmişəm, sən can ver ancaq.
Sevdiyin ayinlə, ey pərvərdigar,
Sən mənsiz bəzədin mənə bir bazar.
Bu zinət naxşını salma rövnəqdən,
Mənə öz xəznəndən bir pay ayır sən.
Bu zəif varlıqdan nədir istəyin?
Elə bil əvvəldən yoxmuş bu miskin.
Sən əziz tutmusan, yandırma məni,
Nəzərin məndəykən qovma bəndəni.
Sən verdin mənə bu uca rütbəni,
Sən də bu zindandan gəl qurtar məni.
İndi ki vermisən böyüklük, ad-san,
Kömək ol mənə,ey adil yaradan.
Hər kimin başına qoydunsa külah,

Salma toz-torpağa, əziz tut, allah.
Qapının sirdaşı olan bir qəlbi
Qoyma hər qapıda dilənsin, rəbbi.
Sən mənim işimi alma nəzərə,
İşimə əncam çək ədlinə görə.
Nizami bu uca dərgahda ancaq
Ulu Mustafanı şəfi tutacaq.[1]

[1] Н. Эянъяви. «Шяряфнамя»

## AXUND HACI SOLTAN HÜSEYNQULU OĞLU

### *MÖVLUDNAMƏ*

Eydi – mövludundu var özgə səfa, ya Müstəfa!
Zövqüdən ziynətlənib ərzü səma, ya Müstəfa!

Cəm olub hamı keçirsin bu gözəl ali günü,
Hər iki dünyanı tutmuş səs – səda, ya Müstəfa!

Xoş ki gəldin, eylədin dünyanı bərpa ədl ilə,
Həq sənə xatəmliyi etdi əta, ya Mustəfa!

Baisi aləm özünsən ,səndədir hər çarəmiz,
Ehtiyackardır sənə şahü, gəda, ya Müstəfa!

Öylə bir gündür, bu gün ki,var sevincə ixtiyar,
Küfr edər kim ki, edər ahu nəva, ya Müstəfa!

Sən bizə Quranı bəxş etdin Xudadan töhfə tək,
Cəhlidən məxmur gözə verdin ziya, ya Müstəfa!

Yer üzündən asimana eylədin meracı sən,
Ərşidə mehmanın oldu Mürtəza, ya Müstəfa!

Öylə bir övlad yetirdin dəhrə ki, yox bənzəri,
Hər iki mülkə bəzək Xeyrənnisa, ya Müstəfa!

Onda oldu tam əba əhli,yazıldı lövhədə,
Müctəba ilə şəhidi – Kərbəla, ya Müstəfa!

Həm Nəbisən , həm vəlisən, həm Həbibi – kirdigar,
Hacətin səndən dilər hər binəva, ya Müstəfa!

Bu gözəl gün xətrinə hifz et cəfadən mömini,
Lüft göstər, qıl himayət, ver şəfa, ya Müstəfa!

Bu mübarək gündə təbirikim var əhli – aləmə,
Mehdiye – Sahib zaman olsun riza, ya Müstəfa!

Soltanam, bir bəndəyəm həqqə, sənin əmrindəyəm,
Tək mübarək adıva canım fəda, ya Müstəfa!

Hər bu gün qeyd olsa şükrüm var Xudaya min kərə,
Sübhü ta şəb söylərəm, ya Müstəfa, ya Müstəfa!

## *HƏZRƏT MUHƏMMƏDİN(S) MÖVLUDU MÜNASLBƏTİLƏ*

Ey əhli – bəşər şad ol, Mövludi – Peyəmbərdir,
Hər cövürdən azad ol, Mövludi – Peyəmbərdir,
Şovqi – dilə səyyad ol, Mövludi – Peyəmbərdir,
Bu qissəyə ustad ol, Mövludi – Peyəmbərdir.

Bir gündü ki, göz açmış dünyaya bəşər şahi,
Həm alilərə ali, həm də dahilərə dahi,
Kimdir o? O kəsdir ki, dərk eylədi Allahi,
Yad eylə onu, yad ol, Mövludi – Peyəmbərdir.

Dünya özü heç nəydi, o oldu ona zinət,
Nə bəxtəvərik dini olmuş bizə də qismət,
Üz tut o qədrnakə, elmindən elə ibrət,
Bərbadsən abad ol, Mövludi – Peyəmbərdir.

Bu gün nə gözəldir ki, bütlər aradan getdi,
Həq nuru əyan oldu küfrün gecəsi bitdi,
Kim ki bu adı tutdu, şeytan onu tərk etdi,
Gəl tazədən icad ol, Mövludi – Peyəmbərdir.

Şənində olub nazil, Quranda neçə ayə,
Rəhmət buludu salmış, hər dəm başına sayə,
Bu şəxsə hərim olsan, getməz əməyin zayə,
Saleh sözünə “şad” ol, Mövludi – Peyəmbərdir.

Bir kəsdi ki, peyğəmbər həm dahidi, həm sadə,
Insanlığa mənadır, hər hikməti dünyadə,
Sən də buna cəhd eylə, şövq ilə yetiş dadə,
Xalqa əsil övlad ol, Mövludi – Peyəmbərdir.

Bir ildə neçə xoş gün, Soltan bu günə mail,
Sərdarı peyəmbərdir, Həzrət Əliyə qail,
Şənində bu bayramın bir söz dedi bir aqil:
Öz nəfsüvə cəllad ol, Mövludi – Peyəmbərdir.

## *MÖVLUDU – PEYĞƏMBƏR*

Mövludu – peyğəmbərdi əcəb zövqü – səfadır,
Bu hal ilə başımda mənim özgə həvadır.
Kim bu havanı bilməz işi cövrü – cəfadır,
Hər kim ki, bu gün şaddı o kəs əhli – vəfadır.

Qoydu qədəmin dəhrə əcəb Əhmədi Muxtar,
Dinsizlərə din verdi o halsızlara kirdar,
Əmr etdi Xuda taki Muhəmməd ola Sərdar,
Gün hər sözü, hər kəlməsi bimarə dəvadır.

Quş saldı qanad göydə fərəhdən bu məqamda,
Əks oldu üzü əndə kövsər dolu camda,
Doğdu əbədi həqq günəşi sübhi – tamamda,
Mat qaldı cahan əhli bu nə sirri – Xudadır.

Cibril xəbər verdi bütün əhli – behiştə,
Pişvaz elədi huri pəri cinnü firiştə,
Allah hədəfi vardı bu hikmətli gəlişdə,
Həqdəndi bu rəhmət bizə, həqdən bu rəvadır.

Qurani ona bəxş elədi Həzrəti Xaliq,
Tək bildi bəşərdən onu Xatəmliyə layiq,
Məbudinə xidmət elədi sidqilə aşiq,
Hər bir nəfəsi zikrü dua həmdü sənadır.

Ondan hələ ol həzrəti Zəhra gələcəkdir,
Lütfilə Əli Kövsərə səqqa gələcəkdir,
Mərdanə Həsən ayəti –üzma gələcəkdir,
Bu yerdə Hüseyn ilə olar ali - əbadır.

Soltan, bizə bayramdı bu gün eylə ibadət,
Et Mehdiyi dövranə bu təbriklə sədaqət,
Bu ali olan gündə bir aləmdi şərafət,
Mövlud güni insanlar üçün ruzi – şəfadır.

## NİZAMİ ZÖHRABİ

### *MUHƏMMƏD(S) UŞAQLIQ İLLƏRİ VƏ ANASININ VƏFATI*

Körpə çağlarından beş yaşa kimi
O, başqa bir evin oldu sakini.
Həlimə döşündən verdi ona süd,
Aldı o, Harisdən nəsihət, öyüd.
Həzrət çox sevirdi süd anasını,
Allah Özü versin o dünyasını.
O da bağlanmışdı uşağa möhkəm,
Ondan ülfətini etməyirdi kəm.
Muhəmməd bu evə gəldiyi çağdan
Əskik olmayırdı qazan ocaqdan.
Bərəkət olmuşdu nazil bu evə,
Artdı qoyun – quzu, çoxaldı dəvə.
Burda Muhəmmədi sevirdi hamı,
Indi gur yanırdı bu evin şamı.
Çatırdı Badiyə həyatı sona,
Məkkədə oğlunu gözləyən ana
Sevincdən gözləri hey dola – dola
Çıxıb boylanırdı uzanan yola.
Intizar çəkirdi indi Şeybə də,
Nəhayət, göründü dəvə bu vədə.
Muhəmməd yenidən döndü Məkkəyə,

Şeybə qaldıraraq başını göyə:
-Şükr olsun, İlahi, -deyə söylədi,
Yeriyib, dəvəni özü əylədi.
Bərk – bərk nəvəsini o, qucaqladı,
Dözmədi, sevincdən qoca ağladı.

* * *

Həzrət altı yaşa çatdığı zaman
Çökmüşdü ananın başına duman.
Yox idi saçında bir qara teli,
Dərddən bükülmüşdü yazığın beli.
Addımı olardı onun bir qarış,
Gözəl sifətini basmışdı qırış.
Daha gözlərində qalmamışdı nur,
Hər gözü udmuşdu bir qara çuxur.
Batmışdı xanımın çöhrəsi qəmə.
Bir gün üz tutaraq Ümmi Əymənə
Dedi: -Mədinədə bir qərib məzar
Düz altı ildir ki, çəkir intizar,
Səfərə çıxırıq sabah hazırlaş.
Muhəmməd keçirtdi içində təlaş,
Xəbər olduğundan bir qədər qəfil
Sevincindən bilmirdi neyləsin tifil.
Qaçdı sübhə kimi yuxusu gözdən,
Durdu yatağından lap səhər tezdən.

Düzəldi sübh çağı yola bir karvan,
Çəkdi asta – asta dəvəni sarvan.
Yayıldı ətrafa zənglərin səsi,
Dəvələrin uzun əyri gölgəsi
Sürünüb getdikcə qumların üstdə,
Məkkəni arxada qoyurdu dəstə.
Qatıb bir – birinə gecə - gündüzü,
Geridə qoydular bu qumlu düzü.
Gəlib Mədinəyə çatdılar bir gün,
Artıq axşam düşür, saralırdı Gün.
Səhəri gəldilər qəbiristana,
Hönkürüb ağladı dözmədi ana.
Muhəmməd çox yazıq bir görkəm aldı,
Quruyub qalmışdı, sanki o, laldı.
Qalxmışdı uşağın tükləri biz – biz,
Ziyarət qəlbində saldı dərin iz.
Ilk dəfə hiss etdi atasızlığı,
Ananın oğluna gəldi yazığı.
Səfər başa çatdı ay tamamında,
Nə qədər qalasan qohum yanında?!
Görünür, bu sayaq yazılıb bəxti,
Yetişdi geriyə dönməyin vaxtı.
Karvan yola düşdü Məkkə səmtinə,
Gəlib yetişdilər Əbva kəndinə.
Möhkəm xəstələndi Aminə gecə,

Üşütmə canına saldı vicvicə.
Əsirdi bədəni, dönmüşdü buza,
Qalıb əzrayılla ana üz – üzə,
Süzdü körpəsini başdan ayağa,
Əzrayıl vermədi əman qonağa.
Söyləyə bilmədi ana sözünü,
Bu fani dünyaya yumdu gözünü.
Çəkdi əcəl adlı bir ahənrüba
Ömür günəşini onun qüruba.
Uşağın qəlbində qopdu fırtına,
Keçdi ağrı onun yeddi qatına.
Muhəmməd çatanda altı yaşına
Soyuq su qatıldı bir də aşına.
Göyə ümid dolu saldı bir nəzər,
Gözünün yaşına qarışmışdı tər.
Qana boyanmışdı gözünün ağı,
Əsirdi körpənin dili, dodağı.
Baxır gah soluna, gah da sağına,
Gözündən axırdı yaş dodağına.
Acı göz yaşını uşaq içirdi,
İlahi, qəlbindən nələr keçirdi?!
Elə bil od tutub içi yanırdı,
Kömək axtarırdı, o, boylanırdı.
Zar – zar ağlayırdı "ana vay" – deyə
Uzalı qalmışdı əlləri göyə.

## *MUHƏMMƏDİN (S) MÖVLUDU*

Bəşər görməmişdi belə bir gecə,
Onu təsvir edim, İlahi, necə?!
Dərin yuxudaydı Məkkə o axşam,
Sönmüşdü evlərdə işıq saçan şam.
Bulud göy üzünə çəkmişdi pərdə,
Görünməz olmuşdu yol da, çəpər də.
Gözə dəyməyirdi kimsə küçədə,
Bir qeyri – adilik vardı gecədə.
Aminə özü də bilmirdi nədən
Yatağa girmişdi o gün ertədən.
Elə bil o gün Əsmai – Hüsna
Xanımın qatmışdı bal yuxusuna.
Oyandı yuxudan gecə yarısı,
Qəflətən tutmuşdu onun ağrısı.
Tək idi, yanında yox idi heç kəs,
Canı ağrısada çıxartmırdı səs.
Gəzirdi otaqda xanım narahat,
Beləcə ötüşdü bir neçə saat.
Dözə bilməyirdi ağrıya daha,
Sevinc qarışmışdı köksündə aha.
Xanım gah düzəlib, gah bükülürdü,
Baxdı pəncərədən: dan sökülürdü.
Üfüqlə elə bil qızarırdı köz,

Vururdu ulduzlar bir – birinə göz.
Çəkirdi zülməti bərk – bərk dara dan,
Sıyırıb çıxırdı dünya qaradan.
Elə bil o anda külək də qəsdən
Qovub buludları şəhərin üstdən,
Gecənin zülfünə çəkirdi tumar,
Yerə boylanırdı ay xumar – xumar.
Vardı kainatda özgə yaraşıq,
Yer Göyə müştaqdı, Göy Yerə aşiq.
Gecənin bağrını bir nur dəlirdi,
Mələklər salama Yerə gəlirdi.
Azacıq qalanda açan səhərə
Qoydu bari – həmli Aminə yerə.
Körpə doğulanatək kəsildi ağrı,
Yarıldı zülmətin bir anda bağrı.
Qaranlıq dağılıb söküləndə dan
Göndərdi dünyaya Böyük Yaradan
Axır elçisini – son Peyğəmbəri,
Açıldı dünyanın yeni səhəri.
Dünya yarandığı ilk gündən hələ
Onun açmamışdı səhəri belə.
Yoxdu bu səhərin özgə bənzəri,
Göylərin dikildi Yerə nəzəri.
Bəşər yeni dövrə atırdı qədəm,
Hələ Adəmdən də çox illər əqdəm

Adı həkk olunan Lövhi – Məhfuzə
Indi zuhur edib çıxırdı üzə.
Min illər həsrətdə qalan cahan da
Vüsala yrtirdi həmin o anda.
Üfüqdən qalxırdı Gün yavaş – yavaş,
Ayrı görkəmdəydi torpaq, ağac, daş.
Dünya görməmişdi belə ehtişam,
Nə bir belə gündüz, nə belə axşam.
Olmuşdu yerlərlə göylər həmahəng,
Göy Yerin boynuna asırdı çələng.
Ən xoş günü idi ayın, ilin də,
Üzürdü kainat şəfəq selində.
Şadlıq içindəydi Göydə mələklər,
Cahana yayırdı xəbər küləklər.
Quşlar nəğmə deyib ötürdü dil – dil,
Bərq vurub yanırdı aləm elə bil.
O gün dəyişmişdi Yerdə mənzərə:
Tamam bürünmüşdü çöl – çəmən zərə.
Güllərin üzündə  sayrışirdi şeh,
Düzlərin üstündən əsdikcə bir meh
Yarpaqlar astadan pıçıldaşırdı,
Dünyanın sevinci həddən aşırdı.
Bu tifil dünyaya göz açan zaman
On dörd sütun aşdı Kisrada haman.
Necə ki, döğuldu körpə, o vədə

Dəydilər üzüstə bütlər Kəbədə.
Söndü ocaqları məcusilərin,
Uddu bu cəhənnəm odunu sərin.
Kim verdi bu əmri birdən alova?
Niyə birdən – birə qurudu Sava?
Çökdü İran taxtı, Bizans şöhrəti
Əridi, heç oldu Çinin qüdrəti.
Söndü dinsizliyin odu, atəşi,
Üfüqdə parladı haqqın Günəşi.
Xaçpərəst zorbası, zərdüşt qüvvəti
Tablaşa bilmədi önündə qəti.
Hamıdan şad idi o gecə Şeybə,
Çəkildi büsbütün kədəri qeybə.
Xəbər tutan kimi qoca həmin an
Kəsdirdi uşağın adına qurban.
Verdi bir ziyafət evində baba,
Gəlib təbrik etdi onu el – oba.
Uçmağa yox idi onun qanadı,
O, qoydu körpəyə Muhəmməd adı.
Qonaqlar getdilər, Şeybə qaldı tək,
Körpənin yanına gəldi sevincək.
Baba qucağına aldı uşağı,
Süzdü diqqət ilə başdan aşağı.
Vardı bu tifildə ruhani görkəm,
Allah heç yerini qoymamışdı kəm.

Məsum yaranmışda olan bu füsun
Qaçırtdı o gecə onun yuxusun.
Körpənin belində görəndə xalı
Qocanın bir xeyli dəyişdi halı.
Baxdıqca Allahın şah əsərinə
Fikri qanadlanıb getdi dərinə.
Kipriyi qonmadı kipriyi üstə,
Gəzişdi sübhəcən ayrı həvəsdə.
Sevinci çıxmışdı lap əndazədən,
Saldı nəvəsinə nəzər təzədən.
Sürtərək əlini onun belinə
Şükr etdi qəlbində, sonra dilinə
Gətirdi: -Nəhayət oldu aşikar,
Şükr olsun hökmünə, ey Pərvərdigar!
Silib əli ilə sevinc yaşını,
Allah hüzurunda əydi başını.
-Doğdu Muhəmmədin, -dedi – ulduzu,
Qurtuldu həsrətdən bəşərin gözü.
Balaca cüssəli böyük varlığa
Baxıb davam etdi minnətdarlığa:
-Bildin bu şərəfi Sən layiq bizə,
Əyilib qarşında çökürəm dizə.
Seçdin Haşimidən Rəsuli – Nəbi,
Bu böyük hikmətin sirri, səbəbi
Ya Rəbb, aşikardır Özünə təkcə,
Əzminlə çıxartsın bəşər nəticə.

Min alqış, İlahi, min alqış Sənə,-
Deyib şükr elədi o, dönə - dönə.

## *ƏBU TALİBİN MUHƏMMƏDİ (S) HİMAYƏ ETMƏSİ*

Dərd bükdü Şeybəni, itmişdi başı,
Qurumaq bilmirdi qanlı göz yaşı.
Ələnib üstünə dərdləri çin – çin,
Dağıdıb köksünü, yeyirdi için.
Bu yetim körpəni o, düşündükcə
Ağlardı, hər axşam çəkilib küncə.
Qoca haqlamışdı səksən ikini,
Çəkə bilməyirdi dərdin yükünü.
Cəm edib qövmünü başına bir gün,
Nəzərdən keçirdi onları süzgün.
Hamı bir – birinin baxdı üzünə,
Başladı aramla Şeybə sözünə:
-Eylədim sizinçün öz ömrümü şam,
Çatıb indi vaxtım, mən qocalmışam.
Əcəl yuvasını üstümdə salıb,
Ağır günlərimə mənim az qalıb.
Ancaq Muhəmmədən nigaranam çox,
Ona hər baxanda sancılır bir ox
Mənim bu nisgilli, dərdli bağrıma,
Yadlar şərik olmaz mənim ağrıma.
Sizi toplamışam vəsiyyət üçün,

Hansınız altına girər bu yükün?
O, Əbu Ləhəbə tez çevirdi üz,
Gözünün içinə baxdı onun düz.
Dedi: -Çox olsa da sərvətin, varın,
Yoxdur qədərincə qeyrətin, arın.
Ona doğma kimi salmazsan nəzər,
Uşaq əməlindən inciyər, bezər.
Başın çox qarışar qumara, eyşə,
Sən yem eyləyərsən onu Qureyşə.
Abbası bilirəm bu işə layiq,
Onun keşiyini o, çəkər sayıq.
Ancaq ki, külfəti onun böyükdür,
Başqa yeyən ağız onunçün yükdür.
Bu vaxt Əbu Talib keçdi irəli,
Şeybənin önündə düşdü sərəli:
-Uşağı heç kimə, -dedi –verməərəm,
Sinəm Muhəmmədsiz bağlayar vərəm.
Düzdür, az olsa da varım, sərvətim,
Ancaq tükənməzdir rəhmim, şəfqətim.
Qoy mənim yanımda bu əmanəti,
Nə üçün ayıraq dırnaqdan əti?
Aparıb yanımda özüm saxlaram,
Onunla bir gülüb, birgə ağlaram.
Keçdi Əbu Ləhəb ələkdən saca,
Bir qədər dikəldi yerində qoca.
Riqqətə gətirdi söz ürəyini,
Dedi: -Sahibkarın bilək rəyini.

Əminin boynundan uşaq asıldı,
Onun sinəsinə bərk – bərk qısıldı.
Oldu Əbu Talib – doğma əmisi
Rəsuli Əkrəmin indi hamisi.
Həmin hadisədən bir həftə keçdi,
Şeybə bu dünyaya göz yumdu, köçdü.
Muhəmməd ağlayır, qan – yaş tökürdü,
Bəni – Haşimilər sanki çökürdü.
Şeybə qoyulandan qara tabuta
Bəni – Haşimilər getdi süquta.
Üməyyə övladı qabağa keçdi,
Əbdül Müttəlibsiz Haşimi heçdi.
Uşaq ümidini babadan üzdü,
Ağladı bir qədər, buna da dözdü.
Yaşı az olsa da, zəkası böyük,
Muhəmməd olmadı, əmisinə yük.
Yarıyıb əminin hər bir işinə,
Dözürdü həyatın keşməkeşinə.
Əmisi sevirdi onu doğmatək,
Qıymırdı üstündən ta əsə külək.
Bir il örüşlərdə qoyun otardı,
Sübh tezdən oyanıb o, gec yatardı.
Qatlaşdı Muhəmməd halal zəhmətə,
Xəyanət etmədi o, əmanətə.
Heç zaman heç kimi qoymadı darda,
Bir quzunu belə vermədi qurda.
Kənar dayanmışdı haram şeylərdən,

Baxıb həzz alırdı uca göylərdən.
Xəyalən göylərdə o, dolaşırdı,
Qəlbində ülvi bir dünya yaşardı.
Riyadan, hiylədən gəzərdi uzaq.
Aralı durmuşdu zövqü – səfadan,
Hanı belə kamil, belə saf adam!!!

## *MUHƏMMƏDİN (S) ƏMİSİ İLƏ TİCARƏTƏ GETMƏSİ*

Əmisi məşğuldu ticarət ilə,
Keçirdi həyatı bu adət ilə.
Ticarət etməkçün çıxıb səfərə,
O, Şama gedərdi ildə bir kərə.
Bir gün o, səfərə hazırlaşarkən
Muhəmməd yuxudan oyandı erkən.
Yarandı bir arzu onun canında,
Gəlib əmisinin durdu yanında.
Acizanə etdi fikrini bəyan:
-Məndən bir kimsəyə toxunmaz ziyan.
Təvəqqe edirəm, apar məni də,
Etiraz etmədi ona əmi də.
Səfər çəksə də çox, olsa da çətin,
Xətrinə dəymədi o, Muhəmmədin.
Tacirlər düz bir ay yol eyləyib qət,
Busraya çatdılar bir gün nəhayət.

Bu kənddə xaçpərəst məbədi vardı,
Orda bir qoca rahib yaşardı.
Adına Büheyra söyləyərdilər,
Ehtiram göstərib baş əyərdilər.
Dünyalar görmüşdü, savadı vardı,
Dərin düşüncəli bir ixtiyardı.
Bir gün Muhəmmədi burda görüncə
Quruyub yerində qaldı bu qoca.
Tanıdı Həzrəti əlamətindən.
Əgər kəssəydilər onun ətindən
Inan ki olmazdı qəti xəbəri,
Seyr üçün çəkildi bir qədər geri.
Yazıq itirmişdi tamam özünü,
Birtəhər əliylə sildi gözünü.
Uşaq aparmışdı ağlını başdan,
-Özüdür, -söylədi qoca yavaşdan.
Baxdı bir soluna, bir də sağına,
Sonra yavaş – yavaş gəldi yaxına.
Dedi: -And verirəm Uzzaya, Lata,
Olmasın sözündə sənin bir xəta,
Mənə söylə ancaq sözün düzünü...
Muhəmməd kəsərək onun sözünü
Söylədi: -İnamım yox mənim bütə,
Düşmə nahaq yerə sən əziyyətə.
Əzəldən olmuşdur xislətimə yad
Cansız heykəllərə qılmaq etiqad.
Mən elə tanrıya and içərəm ki,

O, təkdir, yox Onun başqa şəriki,
Hamıdan güclüdür, hamıdan qadir,
Indi söylə görüm sualın nədir?
Başını Bureyha salıb aşağı,
Süzdü altdan – altdan bir də uşağı.
Fikrində sözləri bir – bir əl	ədi,
Sonra Muhəmmədə sual elədi.
Sual bir – birini etdikcə əvəz
Uşaq cavab verdi dərmədən nəfəs.
Aldığı cavabdan şad oldu rahib,
Gördü bu uşağı hər elmə sahib.
Yox oldu qocanın şübhəsi bütün,
Titrətdi bu uşaq onun vücudun.
Çox dərin bir sükut çökdü araya,
Çatdı Əbu Talib bu vaxt oraya.
-Bu kimdir? – soruşdu əmidən qoca,
-Oğlumdur, -o, cavab verdi astaca.
-Çoxdan haqlasa da doxsanı yaşım,
Hələ ki, yaxşıdır mənim yaddaşım.
-Verilib “İncil”də xəbər zühuru,
Sən boğa bilməzsən saçan bu nuru.
Səmavi kitabın olmaz xətası,
Bilirəm, uşağın yoxdur atası.
Doğulub, bilirəm, o fil ilində,
Xalı olmalıdır onun belində.
Yazılıb haqqında kitablarda çox,
O, haqdır, danmağın bir mənası yox.

Zülmət gecədə də almaz, firuzə.
Parlayıb özünü verər biruzə.
Gəl, məni çalışma sən çaşdırmağa,
Dirəmə, ay oğul, üzümü dağa.
Mənə düzünü de, kimdir bu uşaq?
Qoca sual etdi bir az yumuşaq:
-Çuvalda gizlətmə sən gəl cidanı,
Kimdir bu səadət, şərəf fidanı?
Etdi Əbu Talib xeyli götür – qoy,
Vermədi yalana doğru –dürüst boy:
-Qardaşım oğludur, atası yoxdur,
Hər adi baxışı sinəmdə oxdur.
Onu saxlayıram səkkiz yaşından,
Bircə əmanətdir o, qardaşımdan,-
Deyib, Əbu Talib bir köks ötürdü,
Qəlbini narahat fikir götürdü.
Rahib hiss elədi onun halını,
Dedi: -Heç dəyişmə sən əhvalını.
Mənim niyyətimi düzgün anla, gəl,
Açma öz əlinlə başına əngəl.
Bil ki, yetməz məndən sizə bir xətər,
Ancaq səfəriniz buracan yetər;
Uyma sən alverin verdiyi xeyrə.
əlavə eylədi bir də Büheyrə:
-Yaxşı bax sən ona, gözlərini sil,
Bu uşaq Xatəmül –Ənbiyadır, bil,
Yaranış yeridir Əflaku – Əflak,

Yaradıb xilqətcə Allah onu pak.
Bərq vurur üzündə nuri – İlahi,
Hanı onun kimi ikinci dahi?!
Vücudu Allahın nurundan qopub,
Cümlə xoş sifətlər qanına hopub.
Özüm oxumuşam bunu “İncil”də
Odur sonuncu da, odur öncül də.
Adəm də yox idi, hələ Həvva da,
Ruhu dolanırdı onun Məvada.
Varlığı müqəddəs nur parçasıdır,
Bütün yaranmışın bu şəxs xasıdır.
Köməyə çağırıb Adəmdən bəri
Bütün peyğəmbərlər bu Peyğəmbəri,-
Deyib bir qədər də əyidi qoca,
Həzrəti ziyarət etdi doyunca.
-İmtina eyləyin Şama səfərdən
Uzaqda dayanın şərdən, xətərdən,-
Deyə rahib verdi belə məsləhət.
Dinləyib qocanı onlar, nəhayət,
Qərara aldılar: dönsünlər geri,
Nə hacət uzatmaq mövhüm səfəri?!
Karvan getdi Şama onlar qaldılar,
Lazımı şeyləri burda aldılar.
Səhər açılmamış, söküləndə dan,
Məkkəyə düşdülər yola Busradan.

## *MUHƏMMƏDİN (S) XƏDİCƏ İLƏ İZDİVACI*

Muhəmməd böyüyüb dolurdu yaşa,
Əmisi etdikcə ona tamaşa
Qəlbində dərin bir fərəh duyurdu,
Axan sevinc yaşı dərdi yuyurdu.
Bu cavan olmuşdu əmiyə dayaq,
Keçirdi onların ömrü bu sayaq.
Hər işdə əmiyə kömək edirdi,
Onunla bölürdü sevinci, dərdi.
Daha öyrənmişdi alış – verişə,
Tacirlik olmuşdu onunçün peşə.
Səhər şehi kimi pakdı imanı,
Sonsuz bir ümmandı rəhmi, amanı.
Nəfsini etmişdi əsir özünə,
Bir yalan qatmazdı o, haqq sözünə.
Qoymazdı qarışsın haram halala,
Özünə halaldan qurmuşdu qala.
Özü qaranlıqda qalsa da axşam,
Sönən ocaqlarda yandırardı şam.
Onun əməlində yoxdu bir xəta,
Odur ki, çatmışdı şana – şöhrətə.

* * *

Məkkədə bir nəcib qadın yaşardı,
Şöhrəti dillərdə çox dolaşardı.

Vardı malı – mülkü həddən ziyada,
Xədicə sahibdi çox böyük ada.
Hamı bələd idi xasiyyətinə,
Hər kəsin düşsəydi işi çətinə,
Gəlib bu xanımdan alırdı kömək.
Xədicə dul idi, yaşayırdı tək,
Elçi çox gəlsə də getmirdi ərə.
Bir qulu var idi – adı Meysərə,
Sirdaşı – Nəfisə Münyənin qızı-
Heç biri deyildi ondan narazı.
Sərmayə verərək bir neçə kərə
Həzrəti göndərdi xanım səfərə.
Alverdə Həzrəti o, sınadı çox,
Gördü ki, düzlükdə onun tayı yox.
Şərikli ticarət işi yapdılar,
Qazanc əldə edib, xeyir tapdılar.
Muhəmməd doğrultdu etimadını,
Riqqətə gətirdi o, pak qadını.
Xanımın duyğusu çevrildi eşqə,
Yoxdu sevdiyi kəs Həzrətdən başqa.
Açdı öz qəlbini o, sirdaşına,
Dedi: -Bir ağıl qoy mənim başıma.
Nəfisə Həzrətin yanına getdi,
Onu məsələdən xəbərdar etdi.
Ehtiyac qalmadı çox götür – qoya,
Başlandı o gündən hazırlıq toya.
Bir axşam şad – xürrəm, danışa – gülə

Gəldilər elçilər Xədicəgilə.
Ziyafət başlandı, məclis quruldu.
Danışıb güldülər, ovqat duruldu.
Şərbət də içildi, yeyildi aş da,
Süfrə arxasında yuxarı başda
Oturdu Məkkənin ağsaqqalları.
Əbu Talib süzüb bir – bir onları,
Üz tutdu Varağa ibni Nofələ,
Sözünə aramla başladı belə:
-Ehtiyac duymuram mən artıq sözə,
Nəslimiz, kökümüz bəllidir sizə.
Burda tanımayan yox Muhəmmədi,
Hər yerdə hörmətlə çəkilir adı.
Ağlı, düşüncəsi, fəziləti var,
Bunlar olan yerdə nə dövlət, nə var!
Olmayıb var – dövlət əbədi heç vaxt,
Insan əməl ilə qurmalıdır taxt,
Əməldə tanınar yaxşı ilə pis.
Xüveylidin qızı Xədicəyə biz
Elçilik etməkçün gəldik buraya.
-Siz əgər getsəniz hansı saraya,
Heç kəs rədd eləməz, "yox" deməz sizə,
Qohumluq sizinlə şərəfdir bizə.
Xədicə bir zərdir, Muhəmməd zərgər,
Olar Xədicəyə o, layiqli ər.
Varağa sözünü söylədi kəsə,
Çökdü bir anlığa sükut məclisə.

Sonra dirsəklənib tük mütəkkəyə
Dedi: -Car eləyin bütün Məkkəyə,
Əbu Talib ilə bir əhd bağladıq,
Onları bu gündən biz nigahladıq.
Qoy iki bədəndə yaşasın bir can,
Vursunlar birlikdə ömrü başacan
Çəkək dul sözünün üstünə qələm,
Dursun Xədicədən uzaq dərd, ələm.
Muhəmməd çatanda iyirmi beşə,
Xədicə qoyanda qədəm qırx yaşa,
Dəyişdi bu evdə hər şey kökündən,
Başlandı bir məsud həyat o gündən.
Girdi astanadan evə səadət,
Burdan yan keçməzdi bir gözəl adət.
Xoşbəxtlik onların oldu nəsibi,
Özünə şah seçdi varlı kasıbı.
Quştək çalardılar birlikdə qanad,
Biri başqasına etməzdi inad.
Körpələr dünyaya gəldikcə bir – bir
Yanırdı bu evdə çıraq daha gur.
Sayca çoxaldıqca onun külfəti,
Daha da artırdı mehri, ülfəti.
Çatdı uşaqların altıya sayı,
Allah həm qız verdi, həm oğul payı.
Bu evdə hər kəsin vardı öz yeri,
Sözsüz anlayırdı xanımı əri.
Hamı bildiyindən vəzifəsini,

Heç kəs qaldırmazdı zilə səsini.
Düzgün verərdilər qiymət hər işə,
Evdə yaranmazdı heç münaqişə.
Əgər açılsaydı bir müzakirə,
Hörmət saxlanırdı daim bakirə.
Bu evdə təşəkkül tapdı müsavat,
Birgə verərdilər haqqa hesabat.
Bir yerdə daddılar zəhəri, balı,
Birgə yaşadılar ömrü mənalı.

## HACI YUSİF QULAMMİRZƏ OĞLU

## *HƏZRƏTİ PEYĞƏMBƏRİN DÜNYAYA GƏLMƏSİ VƏ UŞAQLIQ İLLƏRİ*

Muhəmməd dünyaya gəlməmiş hələ,
Tarixi kitablar göstərir belə,
Onun mövludundan iki ay qabaq,
Atası Əbdullah hazırlaşaraq,
Ticarətlə bağlı gedir səfərə,
Şam adında məşhur qədim şəhərə.
Yükünü tutaraq qayıdan zaman,
Yəsrib şəhərində köçür dünyadan.
Nə Əbdullah gördü əziz körpəsin,
Nə də oğlu duydu ata nəfəsin.
Onun mövlud günü sübh vaxta düşdü,
Sanki bir anlığa aləm dəyişdi.
Cahan birdən – birə nura bələndi,
Bütlər parçalanıb yerə ələndi,
Küfrün yer üzündə laxladı adı,
Kəsranın eyvanı çat – çat çatladı.
Söndü ibadətgah olan ocaqlar,
Sava gölü batdı, məhv oldu nə var.
Ağıllı kahinlər xəbər verdilər:
-Haşimin nəslindən gəldi Peyğəmbər.
Allahın hökmünə boyun əyəcək,
“La – ilahə - illəllah” o deyəcək.

Münəccimlərdən də deyən oldu:
“Bu gecə Əhmədin ulduzu doğdu”.
Bilmirəm o günü vəsf edim necə,
Tarix görməmişdi belə bir gecə.
Buludlar çəkilib açdı göyləri,
Ay da öz nuruyla bəzədi yeri.
O gecə islamın parladı taxtı,
Məkkənin qütbündən ulduzlar axdı.
Əbdül Müttəlib də nəvəsi üçün,
Ziyafət eylədi düz yeddinci gün.
Qohumlar – yaxınlar sordular: -nədən
Muhəmməd ismini verdin ona sən?
Bu adı nəslində yoxdu daşıyan:
-Röyada bunları gördüm bir zaman.
Belimdən bir böyük ağac göyərdi,
Budaqları qərbə, şərqə dəyirdi.
Bütün ölkələrə kölgəsi düşür,
Get – gedə bu ağac daha böyüyür.
Hər yerdən axışıb insanlar gəlir,
Ağaca sitayiş, səcdə edilir.
Ayılıb özümü alanda ələ,
Yuxumu yozanlar söylədi belə:
-Rəbbinə həmd –səna eyləsən əgər,
Nəslindən dünyaya bir uşaq gələr,
Allahın ən yaxın bəndəsi olar,
Onun ətrafına hamı yığılar.
Odur ki, adını qoydum Muhəmməd,

Bu ad, "bəyənilmiş" deməkdir, əlbət.
Özüm görməsəm də edirəm güman,
Bu əziz nəvəmi gələcək zaman,
Göydə Haqq, yerdə xalq çox sevəcəkdir,
Onunla çoxları fəxr edəcəkdir.
Məkkə şəhərində bir qayda vardı,
Çox zaman havası ağır olardı.
Körpə uşaqları şəhərdən kənar,
Səfalı yerlərdə saxlayardılar.
Ərəb adətincə Muhəmməd üçün,
Süd anası tapdı babası bir gün.
Həlimə adında qadına verdi,
O da obasına aldı gətirdi.
Muhəmməd onlara gələndən bəri,
Kasıb ailənin güldü üzləri,
O evə qədəmin qoyandan Həzrət,
Özüylə gətirdi xeyir, bərəkət.
Uşaq da meylini saldı qadına,
"Mənim anacığım" deyirdi ona.
Muhəmməd beş yaşda olduğu zaman,
Yaşıdları ilə oynadığından,
Badiyədən kənar çıxırlar düzə,
Qəfildən baş verdi belə möcüzə.
Cəbrail yanında bir neçə mələk,
Həmin uşaqlara yaxın gələrək,
Birincisi sordu: -Gör o hansıdır?
Ikincisi göstərib dedi: -Bax odur!

Cəbrail ahəstə:-Gətirin, dedi.
Tarixdə olmayan hadisə idi.
Uşaqlardan kənar etsinlər deyə,
Tədricən aldılar onu dövrəyə.
Cəbrail işarə verdiyi zaman,
Mələklərin biri hiss olunmadan,
Allahın əmriylə qəlbinə girir,
Köksünü açaraq genişləndirir.
Kindən, vəsvəsədn qəlbini yuyur,
Elm, hikmət, iman nuru doldurur,
Sonra kürəyinin tən ortasından,
Möhür irilikdə vurdular nişan.
Onun süd qardaşı bunu görərək,
Bir baş evə qaçdı divanələrtək.
Ata – anasına çatdırdı xəbər,
Onlar da bu işdən heyrətləndilər.
Eşitdiklərindən qorxuya düşən
Həlimə həyacan içində ikən.
Onda görünəndə qeyri – adi hal,
Uşağı Məkkəyə gətirdi dərhal.
Baba nəvəsini alıb sevindi.
Həlimə bəxşişlə evinə döndü.
Həzrət altı yaşa çatdığı zaman,
Anası Aminə köçdü dünyadan,
Iki il babası saxladı onu,
Bilmədi yetimlik nə olduğunu.
Babasının ömrü çatmışdı sona,

Vəsiyyət eylədi oğlanlarına:
-Mən daha gedirəm, bu nəvəmi siz,
Incidib qəlbini üzməyəsiniz.
Abbasın külfəti böyükdür – dedi,
Əbu Ləhəbəsə belə söylədi:
-Zənginsən, ancaq çox daş ürəklisən,
Bunu hiss edirəm hərəkətindən.
Bu yetimi sənə etsəm etibar,
Səndə nə məhəbbət, nə mərhəmət var.
Zalımsan, qorxuram məndən sonra sən,
Uşağın qəlbini qıra bilərsən.
Kobud hərəkətin könlünə dəyər,
Nədan rəftarından bezib inciyər.
Bu müdrik qocanın sözləri haqmış,
Sanki ilahidən qəlbinə axmış,
Əbu Ləhəb ilə həm Əbu Cəhl,
Ömrü boyu ona düşmən oldu, bil.
O necə də bilmiş keçəcək zaman,
Nəvəsinə nazil olanda Quran,
“Əbu – Ləhəb” adlı surə enəcək,
Onun ayəllri belə deyəcək:
“Əlləri qurusun Əbu Ləhəbin.
Qurudu da” onun əlləri, lakin,
“Alovlu atəşə o girəcəkdir,
Cəhənnəm odunda yandığı zaman,
Övrəti olacaq onun daşıyan”.
Babası uşağı vermədi ona,

Üzünü çevirdi başqa oğluna.
Əbu Talib dedi: -And olsun sənə,
Göz üstə saxlaram, onu ver mənə.
Mənim az olsa da varım, sərvətim,
Qardaşım oğluna var məhəbbətim.
Atası oğlundan razılıq etdi,
Uşaq əmisinin evinə getdi.
Əbu Talib oldu ona mehriban,
Ayırmadı onu övladlarından.
On iki yaşında olanda uşaq
Əsla xoşlamazdı oyun, oyuncaq.
Şərəfli işlərə həvəsi vardı,
Bir işi görəndə çox zövq alardı.
Əmisinə kömək məqsədi ilə,
Qoyun otarmağa gedərdi çölə.
Bir dəfə əmisi səfərə getdi,
Onu da özünə yardımçı etdi.
Gəlmişdilər Busra adlı şəhərə,
Gördülər burada başqa mənzərə.
Bahira adında bir rahib keşiş,
Muhəmmədi görüb belə söyləmiş:
-"Lat və Üzza" haqqı bir sualım var,
Cavabını düzgün de mənə aşkar.
Uşaq dedi: -Bütə mən and içmirəm,
Bütpərəstliyə də nifrət edirəm.
Buheyra Allaha and verdi ona,
Sual cavabını çatdırdı sona.

Dedi: -Kitablarda var belə xəbər,
Gələcək axirəzzaman Peyğəmbər.
Kürəyində gərək nişanın də var,
Mübarək kürəyin açıb baxdılar,
Rahib görən kimi baş əydi ona,
Allahın sevimli son Rəsuluna.
Əmisinə dedi: -Şama getmə sən,
Getsən bu uşağı itirəcəksən.
Şamda yəhudilər duyuq düşərlər,
Çünki onlarda da var belə xəbər.
Gəlibdir islamın son Peyğəmbəri,
Xətaya düşərsən, qayıdın geri,
Əbu Talib elə o gün, o axşam
Alış – verişini eylədi tamam.
Inandı rahibin buyurduğuna,
Qorxudan etiraz etmədi ona.
Gördü ki, ağıllı məsləhət verir,
Karvanı Məkkəyə tərəf döndərir.[1]

[1] "ALLAHIN ELÇİSİ"

## *MÜXƏMMƏS*

Mövludi – Mübarəkdi bu gün, sevgili gündür.
Bayramdır, əziz gündü, müsəlmanlar üçündür.
Hər kim bu zifayətdədi, hər anı şirindir.
Yad eylə onu, bir sələvat ilə sevindir.
Çünki, bizə vermiş belə imkanı Muhəmməd!

Dünyaya O gəlməzdən əzəl küfr idi hər yan,
Çirkablıq içində boğulurdu Ərəbistan.
Qızlar doğulantək verilir torpağa qurban,
Var, sərvəti yoxdursa, qul olmuş belə insan.
Qəflətdən oyatdı Ərəbistanı Muhəmməd!

Saysız nəbilər xəlq eləyən dahi Sənətkar,
Xəlq eyləmədi bir nəfər olsun ona oxşar.
Bir dürr – yetim tapdı, sədəfdən edib aşkar,
Ad verdi ona Mustafa, həm Əhmədi – Muxtar.
Oldu bəşərin fəxri, şərəf, şanı Muhəmməd!

O Nuru – İlahi nuru Rəbbindən alardı,
Gündüz, gecə bilməzdi, ibadətdə olardı.
Pərvərdigarın da quluna rəğbəti vardı,
Qəlbin yudurub bir gecə Meraca apardı.
Bərq eylədi öz nuruna dünyanı Muhəmməd!

Məktəb, oxumaq, yazmağı bilmirdisə hərgah,
Xaliq özü etdi onu hər elmidən agah.
Ondan ötəri xəlq edib aləmləri, vallah.
Heç vaxt demədi saxta olan bütlərə Allah.
Olmuş O gözəl Tanrının heyranı Muhəmməd!

Çox möcüzələr var idi onda, biri Quran,
Hər vəhyi gələndə edib insanları heyran.
Kafirlər isə istədilər möcüzə ondan,
Barmaqla ayı böldü iki hissəyə bir an.
Coşdurdu ürəklərdəki imanı Muhəmməd!

O, xətmi – Peyəmbərdi, peyəmbərlərə sərvər,
Tanrı yaradandır, O, yaranmışlara rəhbər.
Yoxdur elə bir kəs ona əxlaqda bərabər.
Tovhid dinini yaymağa O oldu müyəssər.
Nəqş eylədi öz qəlbinə Quranı Muhəmməd!

Ondan sora dünyaya Peyğəmbər gələ bilməz,
Heç kim o çatan mərhələyə yüksələ bilməz.
Daim O ürəklərdədi, heç vaxt ölə bilməz,
Vermişdir əmanət bizə, o incələ bilməz.
Nurani gəlib, getdi də nurani Muhəmməd!

Ya Rəb, bizi qane eləyir Səndəki qüdrət,
Çün Mahmudu göndərmisən aləmlərə rəhmət.
Məhşər günü möminlərə ondandı şəfaət,
Kovsər kənarında onu görmək elə qismət,
Səndən diləsin Yusifə rizvani Muhəmməd!

## HACI ƏLƏMDAR MAHİR

### *1. PEYĞƏMBƏRİN (S) MÖVLUDU MÜNASİBƏTİLƏ*

Nə xoş gündür bu gün, ey dil ki, aləm laləzar oldu,
Fərəhdən rişeyi – ömrüm üzüldü, tar – tar oldu.
        Nə gündür ki, onu bayram edər yeksər müsəlmanlar,
        Nə gündür ki, onu dərk eyləyənlər huşyar oldu.
Kimin gülzari – hüsnündən bu dünya oldu pürzinət,
Kimin zülfi – pərişanından aləm müşkbar oldu.
        Bu gün mövludi – paki – Əhmədi – Mürsəldir, ey qafil,
        Bu gündən hökmi – Xaliq, dini – İslam paydar oldu.
Açıldı bir güli – xoşbu, müəttər qıldı dünyanı,
Nübuvvət gülşənində onda ki fəsli – bahar oldu.
        Bütün dünyanı tutmuşdu cəhalət, ya Rəsulillah,
        Sənin nurinlə aləmdə həqiqət aşkar oldu.
Sənə min afərin, əhsən, bu mövludun mübarəkdir,
Cahanə gəldiyin gündən ədalət bərqərar oldu.
        Güli – ruyin xəyaliylə səadət tapdı aşiqlər,
        Ümüdi – şərbəti – vəslinlə ariflər xumar oldu.
O gündən ki, ədalət bargahın eylədin abad,
Büsati – izzəti zülmün dağıldı, tarmar oldu.
        Sənə çox bütpərəstlər tən edərdi, gəldi bir dövran
        Nəinki bütpərəstlər, həm də bütlər şərmsar oldu.
Səni Allah özü vəsf eyləmiş “TA-HA”vü “YASİN”də
Kimin vəssafi bəzmi – eşqdə Pərvərdigar oldu?

Böyükdür rütbeyi – zatın, səni biganə dərk etməz,
Nə olsun ki, səninlə bir nəfər də yari – ğar oldu.
O kimdir ki, sənin tək layiq oldu bəzmi – canana,
O kimdir ki, şəbi – Meracdə Rəf-rəf səvar oldu?
Səri – kuyi – nigarə sən gedən yollardan, ey mövla,
Qübari – məqdəmin tapdı fələklər, tacdar oldu.
Səni hər kim ki mövla bildi, keçdi cümlə varından,
Şərafət tapdı, izzət gördü, sahibixtiyar oldu.
Nə sultansan ki, təxtü tacsız təzimə layiqsən,
Gədayi – kuyin olmaq şahlara bir iftixar oldu.
Bu mövludun səfasından gəlib pəjmurdələr canə,
Bu gün Mahir tapıb yol kuyi – yarə bəxiyar oldu.
Şəfii – nuzi – məhşər sənsən, ey şəfətli sultanım,
Işim vəslin xəyaliylə dəmadəm ahu zar oldu.
Şəfaət etməsən yoxdur ləyaqət məndə dərgahə,
Bu dərdi – möhnət ilə şişeyi – ömrüm qübar oldu.
Bağışlanmaq dilərsən, ey könül, əl çək bu canından,
Qazandı məğfirət hər kəs bu yolda, cannisar oldu.
Nə Məcnunəm, nə Fərhadəm sevəm Şirini, Leylanı,
Məni məftun edən ancaq sənin tək gülüzar oldu.

## *2. PEYĞƏMBƏRİN(S) MÖVLUDU MÜNASİBƏTİLƏ*

Mahi – müniri etdi xəcil ruyi – ənvərin,
Qəddin əyibdi qəddini sərvü sənubərin,

Soldurdu müşkün ətrini zülfi – müəttərin,
Ey qaldıran sədasını  Allahu Əkbərin.

Qoydun o gün ki, xakə mübarək ayağını,
Söndürdü ədl yelləri zülmün çırağını,
Çox şahlar unutdu bütün təmtərağını,
Ey fəth edən ürəklərini çox müzəffərin.

Mövludi – pakın aləmə yaydı səfasını,
Dünya geyindi izz ilə bayram libasını,
Qoydun səadət ilə ədalət binasını,
Oldun vəfalı sərvəri Səlmanü, Buzərin.

Sənsən fəsih ləhcəsi abi – həyat olan,
Sənsən vücudu zinəti – ömri həyat olan,
Sənsən siyahrulərə babi – nicat olan,
Sənsən Rəsuli – möhtərəmi Həyyi – Davərin.

Gördün cahanda hər işi Allah rizasına,
Dözdün bu yolda səbr ilə nadan cəfasına,
Mülki şəriətin qurulub can bahasına,
Axmış bu yolda qanı neçə yarü yavərin.

Oldun ətirli qönçəsi bağı – nübuvvətin,
Ən doğru yoldu adəmə rahi – şəriətin,

Heç yerdə, heç məkanda sənin yoxdu nisbətin,
Bir zati – paksən ki, tapılmaz bərabərin.

Daim şəfaət eyləmisən binəvalara
Göstərmisən vəfa yolunu bivəfalara
Biz də səni qəsəm veririk, aşinalara
Qismət olaydı həşrdə ruyi – münəvvərin.

Dərk etmək istəmiş ülәmalar kəmalını,
Vəsf etmək istəmiş şüəralar cəmalını,
Hər Mahirəm deyən tanımaz xəttü xalını,
Hər naşı vəsfin eyləyə bilməz  Peyğəmbərin.

## *3. MƏHƏMMƏDİN(S) MÜBARƏK MÖVLUDU MÜNASİBƏTİLƏ (TƏRKİBBƏND)*

Ey qoyan aləmə izzətlə qədəm,
Göstərən hər qədəm atdıqca kərəm,
Ey verən aləmə mövludu səfa,
Eyləyən dəhri gülüstani – irəm,
Yeksər aşiq, ürafa, abidlər,
Əhli – təqva, üləma,əhli – qələm.
Ey bütün başlıların sultanı,
Ola xaki – qədəmin qurbanı.

Aləmə hökm verən insanlar,
Hər yerə hökmü yetən sultanlar,
Xeyirxahlıqla bu insanlar üçün
Gecə – gündüz yazılan fərmanlar,
Bu cahan xəlq olunandan bu yana
Özün adil tanıyan xaqanlar,
Ey adətlilərin xaqanı,
Ola ədlin,kərəmin qurbanı.

Kim ədəb göstərib imana yetə,
Ağla sığmaz qədəri şanə yetə,
Rəhi – hikmətdə ömür sərf eləyə,
Elimdə rütbeyi – Loğmana yetə,
Tapa səy ilə həqiqət yolunu,
Mərifətdən keçib irfanə yetə,
Ey kecən mərtəbeyi – irfanı,
Ola elmin, ədəbin qurbanı.

Hamı viranələr abad eləyə,
Yığışib hamı qul azad eləyə,
Bir şərəfdir deyə məzluma kömək,
Varlılar yoxsula imdad eləyə,
Müxtəsər əhli – cahan bir yerdə,
Hərə bir cür çalışıb ad eləyə,

Ey fəzilətlilərin zişanı,
Ola fəzlin, şərəfin qurbanı.

Eşqdə əhli – vəfa var nə qədər,
Vəsli – cananə fəda var nə qədər,
Mübtəla eyləyən aşiq qəlbin
Üzü gül, zülfü qara var nə qədər,
Toplayıb bir yerə cəm eyləyələr,
Dəvar mahliqa var nə qədər,
Ey pəriçöhrələrin xubanı,
Ola xali – siyəhin qurbanı.

Harda ki, hüsnünə mail vardır,
Harda ki, əmrinə qail vardır,
Cahil insan səni əsla tanımaz,
Harda ki, söz bilən aqil vardır,
Səni vəsf etməyə acizdir dil,
Harda ki, vəsf deyən dil vardır,
Ey ləbi dərdlilərin dərmanı,
Ola ləli – ləbinin qurbanı.

Göylərin sabitü səyyarələri,
Yerlərin sevgili məhparələri,
Hamıdan sadiqi aşiqlərdə,
Mahvəşlərdə gözü qarələr,
Nəki Fərhad ilə Məcnun, Vamiq,

Rəhi – eşqin bütün avarələri,
Ey məhəbbətdə sədaqət kanı,
Ola sadiqliyinin qurbanı.

Yüz gülüstanda güli – tər boy ata,
Hər bahar laleyi – əhmər boy ata,
Yağa göydən yerə rəhmət yağışı,
Baş çəkə göylərə ər – ər, boy ata,
Hər yerin sərvi ya şümşadı ola,
Yüz o cür sərvi sənubər boy ata,
Ey gözəllik bağının bağbanı,
Ola sərvi – qəddinin qurbanı.

Ey olan küfrü dağitmaq hədəfi,
Adəmin  çox sevilən bir xələfi,
Görməmiş sən kimi bir dürri – yetim
Bəhri – xilqətdə nübuvvət sədəfi,
Çox şükür ki, mənə də qismət olub
Bu gözəl məclisə gəlmək şərəfi.
Şad olar Mahir əgər ki, canı
Ola bu şad günün qurbanı.

### *4. PEYĞƏMBƏRİN (S)- MÖVLUDU MÜNASİBƏTİLƏ*

Ey vücudi nəsli – Adəm tinəti,
Zatı külli aləmin mahiyyəti.

Ey cəmali kainatın zivəri,
Allahın ən sevgili peyğəmbəri.
Ey nəbilərdən həbibi – Kirdigar,
Əhli – halə töhfeyi – Pərvərdigar.
Ey nihali – hikmətin tər pöhrəsi,
Ey risalət bağının gülçöhrəsi,
Ey cəmiyyən ənbiyanın sərvəri,
Övliyanın, ətqiyanın rəhbəri,
Ey şəbi – əsrardə merac edən,
Asimanə xaki – payin tac edən,
Ey ədalət mülkünü abad edən,
Zülm evin birdəfəlik bərbad edən!
Lütf edib Tanrım bu gün rəhmət bizə,
Oldu mövludun yenə qismət bizə.
Çün gərəkdir ehtiram olsun sənə
Ya Rəsullillah, salam olsun sənə!
Bir təbarəkdir bu mövludun  sənin,
Çox mübarəkdir bu mövludun sənin!
Müjdə verdi ətri – zülfündən səba,
Ətri – zülfündən tapıb aləm səfa.
Gəlməsin dünyadə üstün xeyrə şər,
Xəlq edib Xaliq səni Xeyrülbəşər.
Kim qoyub dünyayə sən tək xoş qədəm,
Varmıdır dünyadə sən tək xoşqədəm?
Bu mübarək, bu fərəhəfza günün,

Bu lətafətli, bu pürməna günün
Feyzi tapmışdır səfasından cahan,
Nurə qərq olmuş ziyasından cahan.
Gəldi mövludin hamı bayram edər,
Varlılar yoxsullara ənam edər.
Ondan ötrü bəxş olub insanə dil
Böylə bayramda aça şükranə dil.
Ey fəqirə müjdeyi – cənnət verən,
Surəti cənnətlərə zinət verən.
Hansı dildir vəsf edə rüxsarını,
Hansı mizandır çəkə rəftarını?
Hansı arifdir ola vaqif sənə?
Baxdı heyran oldu çox arif sənə.
Vəsfinə hərçənd çatmaz qüdrətim,
Leyk var səndən söz açmaq niyyətim.
Ey şəriət, ey inayət sahibi,
Ta əbəd sənsən vilayət sahibi.
Adəmə sənsən şəfaət bəxş edən,
Ruzi – məhşərdə səadət bəxş edən.
Nuhə sən verdin o tufandan nicat,
Xızra verdi ləblərin abi – həyat.
Tapdı Musa Turdə  səndən nişan,
Nuri – pakındır olan İsayə can.
Səndən ötrü xəlq olubdur kainat,
Olmasan sən heç nəyə dəyməz həyat.

Həm rəsulsan, həm nəbisən, həm xəlil,
Həm həbibsən, həm əxihi – Cəbrəil.
Həm ədalət, həm səxavət rəmzisən,
Həm şücaət, həm rəşadət rəmzisən.
Dil necə vəsf etsin, ey mövla səni?
Vəsf edər YASİN ilə TAHA səni.
Kim ki, səndən zərrə iman kəsb edib,
Zərrəsindən elmi – ürfan kəsb edib.
Izz ilə qoydun qədəm bu xilqətə,
Sayə saldın leyk baği – cənnətə.
Sərv qəddin eylədi sərvi şikəst,
Ləblərindən oldu çox peymanə məst.
Yaydı ətri – zülfünü badı – səhər,
Verdi güllər gül cəmalından xəbər.
Üzbəüz dursan məhi – taban ilə,
Şübhəsiz ki, ay qalır nöqsan ilə.
Hansı sərraf tapdı əsli qiymətin?
Hansı rəssam çəkdi misli – surətin?
Eylərəm iqdam cəmalın vəsfinə,
Açmışamsa dil kəmalın vəsfinə.
Mahirəm etdimsə cürət əfv qıl,
Verməsəm layiqli qiymət əfv qıl.
Cox da ki, coxdur cahanda aşiqin,
Hər yetən aşiq olurmu layiqin?
Mən də bir, şahım, günahkar bəndəyəm,

Asitani – yardə şərməndəyəm.
Doğrudur, cox – cox günahım var mənim,
Sən kimi ümmidgahım var mənim.
Istəyim səndən şəfaətdir bu gün,
Umduğum ancaq şəfaətdir bu gün.
Tut əlimdən payimalın bil məni,
Biz üzüqarə Bilalın bil məni.
Ol şəfi ruzi – qiyamət Mahirə,
Həşrdə eylə şəfaət Mahirə.

## MUSƏVİ

### *MÖVLUDİ HƏZRƏTİ RƏSULİ ƏKRƏM(S)*

Bəh – bəh nə gözəl gündür, bu gün ey Həqqi rəhman,
Peyğəmbəri əkrəm eyləyib dəhri Gülüstan.

Bir gül açılıb, ətri tutub kai məkani,
Düşmənlərin ərşə ucalıb ahu fəğanı.

Mislin bu gülün dideyi dünya görə bilməz,
Həşrə kimi heç şaxə belə gül verə bilməz.
Bu güldən alar hamı güllər hüsni təravət,
Ətrin ala hər kimsə tapar xeyir səadət.

Din gülşəninə bu gülü lütf eylədi xaliq,
Əhkami gövhərbarinə etdi buni faiq.

İsbat elədi bu gülün aləmlərə zatın,
Təkmil elədi bu gülə Xaliq sifatın.

Bu gül görünür nuri Xudanin əzəlidür,
Əlbəttə Xuda əzəlinün o öz Əlidür.

Bu nuri çıxan dəmdə işıqlandı bu aləm,
Bu nur ilə mövcudə gəlib Həzrəti Adəm.

Bu nur çıxanda yıxılıb taği – mədain,
Dördüncü səmadən yerə əzl oldu şəyatin.

Bu nur ilə olub illəti – icadi xəlaiq,
Bu nur ilə nurani edib aləmi Xaliq.

Bu nuri İlahidi salıb pərtövi – sərməd,
Əflakidə adlandı Əbül Qasimi Əhməd.

Lovhi – əzələ səbt olunub adi Məhəmməd,
Məxluqə şəfəq salır bu aləmdə  Məhəmməd.

Bu nur, bu din üstə çəkib, çoxlu əziyyət,
Altımış üç il  ümmət ona verdilər  zəhmət.

Bu şəmsi hidayət ki, bu gün tapdı viladət,
Köneyinidə  oldi  bəşərə xeyli səadət.

Verrəm qəsəm Allah səni bu zatı cəlilə,
Möhtac eyəmə Musəvini qüdrət əliylə.

## HÜSEYİN KÜRDOĞLU

### *MƏHƏMMƏD VƏ SÜD ANASI HƏLİMƏ*

Uşağı görən kimi heyran oldu Həlimə,
Sanasan bir paracıq gündü, aydı Məhəmməd.

Bir yaz səhəri kimi nur saçılır üzündən,
Tay – tuşunun içində kimə taydı Məhəmməd?!

Bağrına basdı onu: - süd anan mənəm, - dedi,
Mehr saldı qadına, ana saydı Məhəmməd.

Bir döşü kor olmuşdu Həlimənin nə vaxtdan,
Onun gizli dərdini necə duydu Məhəmməd?!

Sağ döşün gilәsinә yetişincә dodağı
Əlini kor məmənin üstə qoydu Məhəmməd.
Südlə doldu quru döş, Həlimə heyrətdədir,
Bəlkə uca fələkdən yerə paydı Məhəmməd.

Ilahi sevgisiydi ana döşünə gələn,
Ilahi sevgisini əmdi, doydu Məhəmməd.

Bu sevgiylə böyüdü islamın peyğəmbəri,
Allahın kəlamını ərzə yaydı Məhəmməd.

## NAZİM SALAMİ
### *PEYĞƏMBƏRİN MÜBARƏK TƏVƏLLÜDÜ*

Əbdül – Mütəllibin şöhrəti vardı,
Haqqında hörmətlə danışılardı.
Bəni – Haşimilər, onu sevirdi,
Özünə ağsaqqal, başçı bilirdi.
Bir tikə çörəyi o, tək yeməzdi,
Kimsədən köməyin əsirgəməzdi.
On oğlu olsa da iki qadından,
Əl tutmaq çıxmazdı onun yadından.
Ikinci arvadı onun Leyladan,
Iki oğul verdi böyük yaradan.
Biri Əbu – Talib, biri Abdulla,
Hər ikisi gedirdi haqqın yoluyla.
Leyla nənəsiydi, rəsulun bilin,
Nənəsi sayılır, allah şirinin.
Ötdü Abdullanın iyirmi yaşı,
Atası tez tapdı ömür yoldaşı.
Aminə adında bir gözəl aldı,
Dəvələr kəsilib nəzir paylandı.
Üç dörd ay keçməmiş, bu toy düyündən,
Abdulla səfərə yollandı birdən.
Düzüldü dəvələr, çıxdılar yola,

Getdi ticarətə o, Suriyaya.
Əcəli orada haqladı onu,
Sən demə - çatmışdı ömrünün sonu.
Çatdı Aminəyə belə bir xəbər,
Didib üz – gözünü, eylədi qəhər.
Xeyri .yox əcəldən qaçasan hara,
Sən gəl olacağa, axtarma çara.
Aminə ağlayıb, çəkirdi qüssə,
Elə bil qəlbində deyirdi  kimsə.
Bir səs söyləyirdi bəsdir ağladın,
Ay ana, qəlbini didib dağladın.
Elə ki, ağrısı onun yetişdi,
Anası o saat bildi nə işdi.
Ayrı bir otağa onu saldılar,
Qaçıb bir mamaça tez çağırdılar.
Hələ gəlməmişdən mamaça qadın,
Gördü ki, Aminə bir quş qanadın,
Çəkdi yavaş – yavaş, qarnının üstə,
Bir mələk dayandı başının üstə.
Otaq işıqlandı, çıraqban oldu,
Içəri müşk qoxu bir anda doldu.
Oğlan olduğunu hamısı bildi.
Mütəllib babası yaman sevindi,
Xəbər gətirən də muştuluq aldı,
Plov bişirildi, halva çalındı.

Körpə gördülər ki, əhli – sünnətdir,
Dedilər: İlahi bu nə hikmətdi?
Məhəmməd ad verdi ona babası,
Sevinc içindəydi, bütün tayfası.
Tərifə layiqsən Məhəmməd özün,
Tərifdir mənası elə bu sözün.
Yatıb bir gün baba gördü yuxuda,
Məhəmməd dayanıb geniş bir yolda.
Çiynində bir ağac qol – budaq salıb,
Yuxudan ayılıb heyrətə dalıb,
Tapşırdı uşaqdan muğayat olun,
Onu gözləriniz üstə qoruyun.
Sonra Məhəmmədi alıb qoluna,
Üz tutdu getməyə, Kəbə yoluna.
Gəlib o, bir azdan Kəbəyə çatdı,
Bütün fikirləri başından atdı.
Dolandı Kəbəni düz yeddi dəfə,
Dua eylədi baba hər dəfə.
Allahın evidən, evinə gəldi,
Babanın əhvalı xeyli düzəldi.
Üç il gəlib keçdi az bir zamanda,
Baba inciyirdi yetim sayanda.
Bir gün gördü nəvə çox arıqlayıb,
Istədi aparıb kənddə saxlasın,
Havasın dəyişib o, gəlsin cana,

Tapdılar Həlimə adında ana.
Dayə də, uşağı balası bildi,
Məhəmməd çəməndə oynadı, güldü.
Yoxsuldu varlandı, Həlimə ana,
Ruzi gətirmişdi Məhəmməd ona.
Artdı keçilərin südü bollaşdı,
Həlimə ərinə belə danışdı...
Bu uşaq bizlərə ruzi gətirdi,
Nə yaxşı rəbbimiz onu yetirdi.
Onda elə bil ki, möcüzə vardır,
Yoxsa bizim evdə dövlət hardandır.
Evdə Məhəmmədi əzizlədilər,
Ailədə dördüncü övlad bildilər.
Gəlib beş yaşına çatdı Məhəmməd,
Bəzən də deyirdi babası Əhməd.
Bir gün göy çəməndə oynayan zaman,
Yaxşını – yamanı qavrayan zaman
Göründü qanadlı iki ağ mələk,
Enib qanadlarını yerə əyərək,
Gəlib Məhəmmədə yaxınlaşdılar,
Öpdülər üzündən xoş danışdılar.
Sonradan uçaraq gözdən itdilər,
Uşaqlar qorxudan evə getdilər.
Gəlib Həliməyə verdilər xəbər,
Onu əhvalatdan agah etdilər.

Həlimə tapşırdı uşaqlarına,
Sirri açmasınlar qoy ona – buna.
Aradan elə ki, bir qədər keçdi,
Nəhayət Həlimə qəti yol seçdi.
Verdi Məhəmmədi öz babasına,
Qaytardı uşağı öz obasına.
Öpdü üz – gözündən, aparıb verdi,
Üstəlik yalvardı, göz olun dedi.
Məhəmməd boy atdı ata yurdunda,
Allahın elçisi deyildi onda.
Üz verdi qəm – qüssə yenidən ona,
Anası ömrünü yetirdi sona.
Yaxşı ki, Mütəllib babası vardı,
Məhəmməd babayla bir yerdə qaldı.
Qoymurdu gözündən onu getməyə,
Qatırdı başını fikir etməyə.

## ƏBDÜL – MÜTƏLLİBİN ÖLÜMÜ

Dünyaın qəribə işləri vardır,
Birini güldürür, birin ağladır.
Görürsən birinə sevinc pay verir,
Kimi də yalvarır, o, nə hay verir.
Beləcə Məhəmməd dolaraq yaşa,
Babayla bir yerdə qalardı qoşa.

Sakit oturardı tənha guşədə,
Quş kimi çırpardı qəlbi şüşədə,
Üzünü Kəbəyə tez – tez tutardı,
O, haldan düşərdi, zəif olardı.
Söylədi, hər şeyi odur yaradan
Rəngi ağarardı danışan zaman
Deyirdi, sən təksən, rəhmin də çoxdur
Sənin əvəzin yox, şərikin yoxdur
Dilində bir sözdü daima əzbər:
Doymurdu deməklə allahu – əkbər!
Günlər bu minvalla xeyli ötüşdü,
Babası Mütəllib yatağa düşdü.
Yanına çağırdı Əbu – Talibi,
Dedi: unutmasın ulu xaliqi.
Söylədi, dünyadan köçürəm artıq,
Balı zəhərlidir, xeyir dadmadıq.
Mənim sözlərimi diqqətlə dinlə,
Oğul tək Məhəmməd qalsın səninlə,
Bu gündən ata ol, sən Məhəmmədə,
Allah vergisidir, kiçik Əhmədə.
Mütəllib oğluna dedi bu sözü,
Kəbəyə dönərək, yumuldu gözü.

## SEYYİD NURƏDDİN DƏRAFƏRİN
## *MÖVLUDİ – PEYĞƏMBƏR (S)*

Ey ismi – şərifi olan aləmlərə rəhmət, ey babi həqiqət,
Mövludun ilə tapdı bütün yer üzü ziynət, həm şanu – şərafət.

Gəldin, gəlişinlə bütün aləm təzələndi, rəhmətlə bələndi,
Can gəldi solan güllərə, kəsb etdi təravət, canlandı təbiət.

Ay etdi hicab nuruna, ol nurunu görcək, Sənsən demə gerçək,
Ulduzlar həmən şəb elə bilşəkdi xəcalət, ki, oldula xəlvət.

Mövluduva həm göydə mələklər də sevindi, göydən yerə endi,
Cəbrili - əmin eylədi qundağuva xidmət, başlandı Ziyafət.

Təkbiri səsi göylərə yerdən ucalandı, yer nura boyandı,
Oldun bütün aləmlərə Sən, xətmi – Nübuvvət, yox şənüvə nisbət.

Kəsra sarayı bir gəlişinlə yaralandı, rüknü paralandı,
Bütxanələrə lərzə gəlib tapdı xəsarət, var kimdə bu cürət.

Atəşpərəsin səcdəgahı, atəşi söndü, dini külə döndü,
Həqq gəldisə, batil gedəcəkdir, budur əlbət, ayati – Həqiqət.

Həm elminə, həm Dininə mat qaldı dühalar, cümlə ürəfalar,
Bir ay kimi Sənsən edən İslamidə tələt, ünvani – Hidayət.

Kim sevdi Səni, misli ki, Allahını sevdi, dərgahını sevdi,
Xoşbəxt o adamdır ki, tapıb böylə səadət, əyyami – cəhalət.

Acizdi bu dil, vəsfini izhar eləməkdə, iqrar eləməkdə,
Cahildə nə cürət ki, verə şəninə qiymət, yox onda ləyaqət.

Qırx il birinə olsa öz Allahı müəllim, həm eyləsə təlim,
Görməz belə Şəxsi daha bir də bu cəmiyyət, ta ruzi – qiyamət.

Ey kani – kəramət, dilə dərgahi – Xudadan, ol nuri – Hüdadan,
Cün Məkkə, Mədinə ola bu “Seyyidə” qismət, gər olsa səlamət.

**ZƏKİ İSLAM**
***PEYĞƏMBƏR(S) DOĞULANDA OLAN ƏHVALATLAR***

Bütxanada bütlər özü – özünə
Sürüşdü, yıxıldı arxa üzünə.

Fars vilayətində Nüşirəvan taxtı
Oyandı yerindən saray bu vaxtı.

Bütə Allah deyən, çoxallahlılar,
Gecənin sirrinə heyran qaldılar.

Sarayda on dörd tac düşdü yerindən,
Istəxr şəhərində min – min illərdən

Bəri yanan şamın söndü işığı,
Fars vilayətinin pir yaraşığı.

Dəhşətlər bürüdü Hindi, Firəngi
Bütlərin uçması Nüşirəvan cəngi.

Savə gölü həmin gecə qurudu,
Səmavə vadiyə su doldu, durdu.

Xəbər çatdı, Nüşirəvan qaraldı,
Xəyal – fikrə getdi, qəlbi daraldı.

Çağırdı vəziri bir tədbir görsün,
Belə dəhşətlərdən tez xəbər versin.

Vəzir yetişərkən şah hüzuruna
Şah əmr eylədi, tez tədbir buna.

Vəzir diz çökərək şahın önündə:
-Ataş sönüb, Allah qırılıb yerində.

Bu gecə vəyğada belə bir hikmət
Görmüşəm, ey şahım, söyləyim əlbət.

Bizim dəvələri bir ərəb atı
Qatıb qabağına, keçdi Fəratı.

Daranıb farsların məmləkətinə,
Dəvələr düşüblər yaman çətinə.

Bu hadisələrin nəticəsinə
Tədbir lazım, iş olmaya tərsinə.

-Cavab ver, münəccim, yeyib yatırsan
Indi də, bilmirəm, cavab tapırsan?

-Ərəblərdə bir hadisə baş verir,
Həmin hadisəni farslar da görür.

Nüşirəvan dərhal Nöman münzirə
Bir alim göndərdi, gəlsin tədbirə.

Nöman şah əmrinə itaət etdi,
Əbdül – Məsih alim şahlığa getdi.

Görülən yuxuya, olan işlərə,
Yalanlar söyləyir, yalanlar hələ.

Bizim bu işlərə varsa əlacın,
Şahdan payın olar həm taxtı – tacın.

Dəhşət yaman alıb, yamanca bizi,
Gülmür vilayətdə heç kəsin üzü.

Əbdül – Məsih hali oldu, düşündü:
-Şama getməliyəm, dedi, mən indi.

Şamda dünya görmüş bir kahin qoca,
Səteyh adlı münəccimdi, çox uca.

Bu işləri bilsə - bilsə, o, bilər,
O, doğru danışar, o, doğru deyər.

Əbdül məsih çatdı Şam şəhərinə,
Yetirdi özünü kahin evinə.

Evi tapıb daxil oldu içəri,
Salam verdi, gördü bircə nəfəri.

Gördü o kahin gözləri görmür,
Qulağı eşitmir, salam da vermir.

-Ey şeyx, cəmi xalqın böyüyü sənsən,
Məni məyus etdin, danışıb dinsən.

Ax, nə eşitmirsən, nə də görmürsən,
Hüzurunda qulam, cavab vermirsən.

Kahin Səteyh tez açaraq gözlərin
Əbdül – Məsih deməmişdən sözlərin.

Qoca kahin ağız açdı söhbətə,
Nüşirəvan üçün gəldi minnətə.

Onun eyvanının titrəməsindən,
Farsın atəşinin tez sönməsindən.

Baş vəzirin yuxusundan sorağa,
əb atı girən Farsi torpağa.

-Dəcləni, Fəratı keçən atdanmı,
Fars vilayətnə girən atdanmı?

Bu sözlərin, yuxunun da mənası,
Çıxart xəyalından daha Xənnası.

Get ey, Əbdül – Məsih, söylə şahına
Yetən olmaz amanına, ahına.

Ərəblərdən haqq peyğəmbər döğuldu,
Yanan atəşlərin şamı boğuldu.

Allah tərəfindən kitab nazili,
Ərəb fərzəndinə, Farsda Fazili.

Atəşgahlar din deyil ki? Çürüyər,
Islam dini bu dünyanı bürüyər.

Bu şahlıqdan sonra on dörd şah olar,
Bax belə buyrulub Allahdan bunlar.

Bu xəbərə Nüşirəvan sevindi,
“Hələ on dörd şahlıq”- deyərək dindi.

Islam dini yayılacaq hər yana,
Müqəddəs tək bu müqəddəs cahana.

## KAMİL SƏRBƏNDİ
## *HƏZRƏTİ MUHƏMMƏDİN(S) –MÜBARƏK MÖVLUDU MÜNASİBƏTİLƏ*

Bəşər övladına, ey lütfi – Xudavəndi – Kərim
Sənə qurban ola can ilə iki çeşmi – tərim!

Ümmətin qeyd edir hər yerdə təvəllüd gününü
Çox mübarəkdi bu mövlud günün, ey taci – sərim!!

Səni ol gün ki Xuda sərvəri – dövran elədi,
Xilqətə sonsuz olan lütf nümayan elədi.

Zülmətin pərdəsini ərzü səmadən götürüb,
Şöleyi – şəms ilə aləmləri rəxşan elədi.

Çevirib başına təxtin qaniçən Kəsranın,
Zülm ilə abad olan qəsrini viran elədi.

Artdı hər yerdə mübarək qədəminlə ruzi,
Qurumuş köhnə bulaqlarda su cövlan elədi.

Dəhri həq cənnətə döndərdi sənin xatirinə,
Rəyin ilə bu cahan mülkünü  sahman elədi.

Elə bir xətt ilə xal, hüsnü cəmal verdi sənə
Ki, onun nuru tamam aləmi heyran elədi.

Kim ki gördü üzünü oldu əsiri – eşqin,
Qəlb içində səni öz canına həmcan elədi.

Bəşər övladına bir lütfi – Xudasən ki, sənin,
Şəfqətin cümlə cahan dərdinə dərman elədi.

Doğmadı kimsə sənin mislini, ey dürri – yetim,
Sənə Allahi – Kərim ayrıca fərman elədi.

Öylə ki göylərə çıxdı şəbi – merac, Xaliq
Hamıdan lütfünü artıq sənə ehsan elədi.

Çatmadı mərtəbeyi – şəninə Musa şəni,
Nə də İsa o yerə yetməyə imkan elədi.

Rəbbimə əl götürüb şükr edirəm şamü səhər
Ki, səninlə bizə dünyanı gülüstan elədi.

Bəndeyi – müztər ikən, Kamilin, ey Xətmi – Nəbi,
Adını qaldırıb eşqin göyə, sultan elədi.

## ƏLƏSGƏR VAGİRİ
## MÖVLUDİ PEYĞƏMBƏRDİ BU

Ey möminani müsliman, bir neməti davərdi bu,
Allah mübarək eyləsin, mövludi Peyğəmbərdi bu.

Görcək bu bayram şamını, hər kəs bilər eyhamını,
Zikr eyləyərlər namını, şamü – səhər əzbərdü bu.

Gəldik bu bəzmə könlü şad, ta eyləyək mövludu yad
Hər bir Peyəmbərdən ziyad, öz ümmətin istərdi bu.

Heyran olubdu el tamam, söylər səlavəti səlam,
Dini gedər yövmi qiyam, Xurşididən ənvərdi bu.

Bir fəxridir merac ona, lövlak olubdur tac ona,
Peyğəmbəran möhtac ona, cümləsinə sərvərdi bu.

Hər hikmətə agahdır, çünkü Həbibullahdır,
Nəsrunminəllah şahıdır, soltanı hər kişvərdi bu.

Fəxri zəmini asiman, baisi icadi cahan,
Əmrində miftahi cinan, həm sahibi kövsərdi bu.

Xəlq azmış idi bir zaman, ol xaliqi kövnü – məkan,
Göndərdi dəhrə hökmüran, bəs doğru yol göstərdi bu.

Məhmudi Əhməd adıdır, Həsən, Hüseyn övladıdır,
Şiri – Xuda damadıdır, Zəhraya taci – sərdi bu.

Əlqabidür xeyrülbəşər, onsuz keçılməz xeyri – şər,
Ali-Əbayə müxtəsər, həm üzvüdür, həm sərdi bu.

Çün nazil oldu "innəma", hökmündədir ərzü – səma,
Ümmətdən ötrü daima, ədlü vəfa pərvərdi bu.

Düşməzdi  xakə sayəsi, nur idi əsl mayəsi,
Quranın hər bir ayəsi şənindədir, əzhərdi bu.

Küllü ülumə şəhridir, elmi tükənməz bəhridir,
Kani səxavət dəhridir, mümtazi Peyğəmbərdi bu.

Hər sözü bir ecazdır, əltafü – həqq fəyyazıdır,
Alah da ondan razıdır, kani – düri – gövhərdi bu.

Qismətdi bu günlər bizə, heç bir zəval yoxdur düzə,
Eylərdi xəlqə moizə, kim sahibi minbərdi bu.

Hər kəs onu həqq bilməsə, mövludda üzü gülməsə,
İmkanı olsa, gəlməsə, heç şübhəsiz, kafərdi bu.

Ey Vagiri, olma məlul, bu bəzmi həqq etsin qəbul,
Bihəqqi mövludu rəsul, bir töhfeyi əhqərdi bu.[1]

## SİMUZƏR BAXIŞLI
## *TANRI ELÇİSİ*

### Müqəddəs Peyğəmbərmizin mövlud günü münasibətilə

Dünyalar xəlq edən böyük hökmüran,
Sən ey böyük Allah, ülvi yaradan!
Sevgidən yaratdın cümlə – bəşəri,
Qismət verdin ona xeyiri, şəri.

İltifat göstərdin bəndələrinə,
Dərd verdin, gərməyə dözümlü sinə,
Ağıl, qüdrət, idrak, cəsarət, hikmət,
Kədər, qüssə, sevinc, dözüm, səadət,

İnsana min verdin, Mələyəsə bir,
Tükənməz bu qüdrət Tanrım, sənindir

[1] "İslam" qəzeti Qafqaz müsəlmanları idarəsinin nəşri 3 sentiyabr 1992 –ci il №17

Haqqdır ölüm, həyat, sənin sirrindir,
Insanı Şeytansız qoymadın ancaq,

Nə qədər insan var, Şeytan olacaq,
Şeytanın gücüdü məkri, hiyləsi,
İnsana ağılı sən nicat verdin
Bəlada susanda vicdanın səsi
Varlığı zəkaya amanat verdin.

Ötüb aylar, illər, ötüb əsrlər,
Adəmdən, Həvvadan qalan nəsillər.
Bütün Peyğəmbərlər hər an, hər zaman,
Qorumuş insanı şərdən, Şeytandan.

Varlığa, idraka səpələnib nur,
Elçi Yaradanın görən gözüdü.
Iblisdən uzaq qaç, sən yarat, sən qur,
Elçi Yaradanın hökmü, sözüdü.

Son Rəsul yetişdi, haraya, haya,
Həzrəti Muhəmməd gəldi dünyaya.
Tanrının Rəsulu insançün yandı,
Bəndə xaliqinə, haqqa inandı.

Dini İslami ilə qüvvətdi Rəsul,
Bəşərə Tanrıdan hörmətdi Rəsul,

Elçi xilaskarın qəti sözüdü,
Müqəddəs varlıqdı, haqqın özüdü.

Bir adı xeyirdi, bir adı adil
Şeytana uymayıb, şərdən qaçıbdı.
Aradan keçsə də, min il, milyon il,
Mənalı kitabdı, hikmət saçıbdı.

Sonuncu Rəsuldu, sonuncu Elçi,
Hikməti cahanda oldu birinci,
Qurani Kərimdi diri möcüzə,
Ilahi kəlamdı, o, verdi bizə.

Ululardan ulu, əfv elə məni,
Hüsnünü, nurunu öymək çətindi,
İlahi, xoşbəxtlik sevməkdi səni,
Simuzərəm, dedim bir neçə kəlmə,
Acizəm qarşında, günahkar bilmə.

## ARİF BUZOVNALI
## *HƏZRƏTİ MUHƏMMƏDİN(S) MÖVLUDU MÜNASİBƏTİLƏ*

Gözün aydın, ey müsəlman, sənə üz verib səadət,
Ki, bu gün gəlib cahanə şəhi – aləmü vilayət,
Qəmi tərk elə, sevin, gül, fərəhə nədir qənaət?
Səni qəm çəkən məqamda çəkəsən görüm xəcalət,
Belə gündə heç yaraşmaz üzə özgə bir əlamət,
Kimi Xaliq eyləyib xəlq, düşünüb gətir xəyalə,
Salavat o gül cəmalə!

Sözü aləmin Muhəmməd, gözü aləmin Muhəmməd,
Gətirən həmin Muhəmməd, yetirən həmin Muhəmməd,
Nədir istəyin, de, çəksin cana məlhəmin Muhəmməd,
Sənə hər nəfəsdə versin Məsihin dəmin Muhəmməd,
Yox edər olarsa sidqin, qəminin cəmin Muhəmməd,
Bu gün ol Nəbiyə mehman, yetiş ən gözəl vüsalə,
Salavat o gül cəmalə!

O doğulmamışdan əvvəl neçə səs – səda doğuldu,
O doğulmaq ilə ədlü ədəbü vəfa doğuldu,
Yəni ismi pak Zəhra, yəni Müctəba doğuldu,
İki aləm iftixarı  Şəhi – Kərbəla doğuldu,
Xələt istə Mürtəzadan ki, o canfəda doğuldu,

Ona etdi Həqq – Təala bütün aləmi həvalə,
Salavat o gül camalə!

Odur əfzəli cahanın, odur aləmin nicatı,
Bu gün əmr alıb Xudadan qurulur onun büsatı,
Olunar xilas Kəbə, dağıdar Latı, Mənatı,
Gəlib Allahın Rəsulu edə məhv türrəhatı,
Sevin, ey müsəlman, oldu sənə həsr onun həyatı,
Nə fəğan, nə ah, nə fəryad, deginən çəkincə nalə,
Salavat o gül camalə!

Adına Həbibi – Allah deyilir əgər, bu bəsdir,
Bəşərə risalət üçün seçilən sonuncu kəsdir,
Bu məhəbbətimdi, qafil, demə sözlərim əbəsdir,
Sözə çevrilən məhəbbət ucalan ən ülvü səsdir,
Ürəyim yanan ürəkdir, nəfəsim şirin nəfəsdir,
De mübarəkə mübarək, yetiş əcr ilə kəmalə,
Salavat o gül camalə!

O müqəddəs alişanın uca nəfəsin nə kim var,
Gəhi "Taha"etdi elan, gəhi "Yasin"eylədi car,
Gözü kor, dili lal olsun onu kim edərsə inkar,
Nə gərəkdir özgə munis, nə gərəkdir özgə dildar,
Odur eşqdə səbəbkar, odur aşiqə tərəfdar,
Gühərin var isə, Arif, nisar et bu cəh – cəlalə,
Salavat o gül camalə!

## *HƏZRƏTİ MUHƏMMƏDİN*(S) *MÖVLUDU MÜNASİBƏTİLƏ*

Eydi – mövluddur, könül şad olmaq adətdir bu gün,
Qüssəvü qəmlərdən ayrıl istirahətdir bu gün,
Hər bəşər övladı üçün bir səadətdir bu gün,
Xaliqə şükür etmək ən vacib ibadətdir bu gün,
Allahın lütfü cahana binəhayətdir bu gün,
Bizlərə biz bilməyən gündən əmanətdir bu gün.

Gün bu gün təşrif edib dünyaya zahid bir könül,
Həm mülayim, həm mübariz, həm mücahid bir könül,
Ədldə, təqvada hər bir şəxsə aid bir könül,
Tam edib hər könlü oldu dəhrə varid bir könül,
Şadlanır cümlə müsəlmanlarda vahid bir könül,
Söz deyib bir könlü sındırmaq qəbahətdir bu gün.

Hamı aşiq muştuluq eylər Əmirəlmöminə,
Çoxluğundandır sevincim hər nəfər istər dinə,
Toplanıb ərzü səma, insü məlaik bəzminə,
Eydi – mövludi – nəbi xoşdur nəinki möminə,
Çox günahkar kimsəni Xaliq götürmüş zaminə,
Nar içində od tutan zalim də rahətdir bu gün.

Gün bu gün ulduzlara bir mahı Xaliq tac edib,
Xilqəti ol mahrunun mehrinə möhtac edib,

Bizlərə Allah o şəxsin eşqini amac edib,
Hansı ki, lütfilə həqqin göylərə merac edib,
Bir həkimdir ki, cəhalət dərdinə illac edib,
Cəhldən yatmış şüurlarçun qiyamətdir bu gün.

Ey müsəlman, hali ol, çox qalmayıb son mənzilə,
Ağır oldu əhli – eşqin haləti ildən – ilə,
Qaldı dünya bir sürü qəflətdə yatmış cahilə,
Müstəfa ismiylə hər bir yerdə olsan gəl dilə,
Çoxdan alt – üst olmalıydı bu günahü cürm ilə,
Hörmətindəndir onun dünya səlamətdir bu gün.

Ya Rəsulallah, nə gizli sirr var agahisən,
Biz sənin məddahinik, sən Xaliqin məddahisən,
Sən Xanım Zəhra atası, sən Əlinin şahisən,
Biz kimik qədrin bilək, sən dahilərçün dahisən,
Əldə Qurani – Kərim kövni – məkan izahisən,
Bizlərə ən adi kəlmən istiqamətdir bu gün.

Ya Muhəmməd, şad günündür, keç mənim əfğanımı,
Lütf edib vəslət meyin məxmur elə hicranımı,
Nola cahillər edir viran sərü səhmanımı,
Xoş bu ki, eşqin qəmin fövqündə saxlar canımı,
Isminə bir şeir yazdım, əfv qıl nöqsanımı,
Arifəm, ariflərə susmaq cinayətdir bu gün.

## *HƏZRƏTİ MUHƏMMƏDİN(S) MÖVLUDU MÜNASİBƏTİLƏ (BƏHRİ-TƏVİL)*

Eydi – mövludun mübarəkdir sənin, ey həqqə sərvər, ey sözü Pərvərdigarın dərgəhindən müjdələr bəxş eyləyən sadiq hünərvər, ey cahanın daimi şahi, mükəddərlər pənahi, ey cəmali səhfeyi – Quran, kəmali bəhrü ümman, xilqətin azadlığı, əxlaqı, insaniyyəti uğrunda canın eyləyən hər ləhzə qurban, ey bütün aşiqləri şadü firavan, düşməni zarü pərişan, söyləsəm ifratı olmaz varlığın təkdir sənin,

Ya Muhəmməd, eydi – mövludun mübarəkdir sənin.

Həqqini dünyada, ey kani – vəfa, hər kim ki dandı, fani cismi heç cəhənnəm görməmiş od tutdu yandı, kim səni dərk etdi bildi, kim əzizdi, kim əsildi, ruhuna həqqin fəzilət mülkünün ecazı gəldi, anladı kimsən, iki aləmdə hakimsən, əzəlsən, alisən, kainatda cümlə mümkün sirlərdən halisən, çün surətü məna da sənsən, aşiqi – şeyda da sənsən, alimü dana da sənsən, şahi-bipərva da sənsən, xilqətə mövla da sənsən, hikmətinlə cəhli qəflətdən edən ehya da sənsən, alivü əla da sənsən, olduğun aləmlərin fövqündə bişəkdir sənin,

Ya Muhəmməd, eydi – mövludun mübarəkdir sənin.

Ey gözüm, nə məndə vardır öylə cürət, nə qələmdə öylə qüdrət ki ola vəssafın, ey sahibmürüvvət, gər tutubdur qarşısında xülqünün dünyanı heyrət, neyləyim mən bikəsü

biçarəvü pərvanəxislət, yox gücüm ki mədh edim kirdarın, ey Qurantəbiət, “Yasin” ü “Taha” sənə vəssafdırsa, Şahi-Mərdan şöləsində varlığın şəffafdırsa, birbəbir fövqəlbə-şərlər kəlmənə sərrafdırsa, mən kiməm bir zərrə vəsfindən olum şad, bu yetər mən binəvayə eyləyim daim səni yad, çünki  hər yad olmağın insanə örnəkdir sənin,

Ya Muhəmməd, eydi – mövludun mübarəkdir sənin.

Vaqifi – aləmsən, artıqdır gileylənmək sənə dövri-

zamandan, bir də bu dünya nədir ki söz açım qarşında ondan, kim sənə həmsöhbət olsa ayrılar cümlə cahandan, Arifi-zarəm göz üstə hər kəlamın saxlaram mən, harda olsam ehtiramın saxlaram mən, niyyətim var bir öpüb qəbrin olaydım zairin kaş, lütf göstər var isə bu qismətində şairin, ey hüsnə nəqqaş, xoş ki sən dünyaya gəldin, artdı dəhrin zinəti, sən gəzən dünyada çünki gəzməyin var hikməti, bildim qəti, anlayançün varlığın hər yerdə gərçəkdir sənin,

Ya Muhəmməd, eydi – mövludun mübarəkdir sənin.

## *HƏZRƏTİ MUHƏMMƏDİN(S) MÖVLUDU MÜNASİBƏTİLƏ*

Eydi – mövludun mübarək, ya Muhəmməd Müstəfa,
Şəninə layiq bilib şerim əhibba, gəlmişəm.

Kuyinə vəslin təmənnasilə gəldim hər dəfə,
İndi hicrindən düşüb gen, bitəmənna gəlmişəm.

Surətimdən aşikar olmazsa da könlüm qəmi,
Gəlməyimdə görmüşəm bir gizli məna, gəlmişəm.

Qismət olmaz hər kəsə etsin əməl fərmanına,
Eyləyib bir əmrini vaxtında icra, gəlmişəm.

Gəlməyimlə gen düşər sandım məkanından riya,
Boş görüb, zəbt etməyə ta kuyin ədna gəlmişəm.

Çeşmimə qəlbim nişan vermiş məkanın, ey həbib,
Kuyinə açmış sirişkim seyli məcra gəlmişəm.

Hər iki yoldan ötüşdüm yetmək üçün beytinə,
Surətü – məna keçib, misrabəmisra gəlmişəm.

Gəlməyi çün eyləmişdim arizu – həqq adına,
Eyləyib əsmayi – hüsni dildə bərpa, gəlmişəm.

Tən toxunmuş çox kələfdən xoş bilib can köynəyin,
Bu libasi – Misr ilə olsam da rüsva, gəlmişəm.

İsminin təkrarı ilə kəşf edib İsa dəmin,
Eyləyib ölmüşləri yadınla ehya, gəlmişəm.

Bir zaman Xaliq məni tapşırmış idi lütfünə,
İndi də yol göstəribdir ərşi – əla, gəlmişəm.

Bircə əfvin pakbinlikçün yetər eşq əhlinə,
Biqüsur olmaqçün, ey zati – mübərra, gəlmişəm.

Kuyinə, zövq olsa da aşiqlərimdən heç biri,
Bunca dərd ilə gəlib çıxmazdı əsla, gəlmişəm.

Çinü Maçindən yaxındır xülqi – pakizən mənə,
Bəs ki, əxlaqın veribdir elmə fitva, gəlmişəm.

Sinəmə bir pak nəfəsçün ətri – dünya yetmədi,
Almaq üçün buyi – cənnət, ey dilara, gəlmişəm.

Ya Rəsulallah, qəbul eylə məni – biçarəni,
Bezdiribdir ruhumu bu mülki – ifna, gəlmişəm.

Mənliyim azad olub cismanivü – ruhanidən,
Bilmirəm, gerçəkdi bu, yainki xülya, gəlmişəm.

Arifəm, bir şəhsüvarəm ləşkəri – eşqində mən,
Sürəti – vəslünlə eylib tərki – dünya gəlmişəm.

* * *

Ey Xuda hökmiylə daim göstərən xidmət cahana,
Bir mübarəkbad qədəmlə, ey verən zinət cahana.

Ey kamalı cümlə xəlq olmuşlara ali nümunə,
Ey camalı hər məqamda artıran izzət cahana.

Ya Rəsulallah, bizə həsr etdiyin ömrün, həyatın,
Bir həyatdır, eyləsəm şərhin olar ibrət cahana.

Bu cahan bir heçdir, amma onda sən varsan odur ki,
Hər kimin ki əqli vardır eyləməz nifrət cahana.

Həqq səni seçib bəşərdən ən müqəddəs, ən təmiz, pak,
Onda ki hökm eyləyirdi eyş ilə işrət cahana.

Binəhayət, zülmə dözdün, dönmədin həqqin yolundan,
Həqqi batil eyləməkçün vermədin fürsət cahana.

Yerlə yeksan Kəbədə etdin cəhalət bütlərin sən,
Adil Allahı tanıtdın şəfqətə həsrət cahana.

Nitqin Allahın kəlamın ayə – ayə etdi elan,
Tazə məna, tazə məntik verdi bu hikmət cahana.

“Yasin”ü “Taha”da vəsf etdi səni Xəllaqi – aləm,
Ta bilinsin ki, kimi Xaliq edib qismət cahana.

Ali sənsən, hali sənsən, hami sənsən, ey şəhənşah,
Varlığınla doğmalıq bəxş eylədin qürbət cahana.

Həqqin isbatında durdun üzbəüz kafirlər ilə,
Onda ki İslamı məhv etmək idi niyyət cahana.

Gah sözünlə, gah qılncınla nizam etdin bu dəhrə,
Ədl ilə sənsən verən azadəlik, himmət cahana.

Ən böyük tərif Vətən haqqında səndən oldu zahir,
Eylədin izah kəlamınla nədir qeyrət cahana.

Sən Qədiri – Xummdə etdin Əlini canişin ki,
Rehlətindən sonra da kəm olmasın rəhmət cahana.

Yoxdu səndən sonra peyğəmbər, fəqət sənsən sonuncu,
Sən cahana gəlmək ilə gəldi ülviyyət cahana.

Ya Rəsulallah, qəsəm həqqə, qəsəm Ali – Əbaya,
Qoyma dinsizlər tapıb imkan verə zillət cahana.

İcz ilə sən ol duaçı Tanrıya, istə şəfaət,
Həqq – Təala görməsin çox nurunu zülmət cahana.

Arifəm, vəsfində dil – dil dövr edər dünyanı şerim,
Ta yetincə başə Allah verdiyi müddət cahana.

## MİRZƏ ƏLƏKBƏR SABİR
### *EYDİ – MÖVLUDİ – NƏBİ*
### *(M.Füzuliyə təsdis)*

Şükrü – lillah ki, bizə şamil olub lütfi – Xuda,
Bu mübarək günü dərk etməyə ömr etdi vəfa,
Eydi – Mövludi – Nəbidən gözümüz tapdı ziya,
Qılın, ey ümməti – mərhumə bu gün vəcdü səfa.

Əşrəqət min – fələkil – bəhcəti – şəmsün və biha,
Mələəl – aləmə nurən və sürurən və bəha.

Aləmə zahir olub mərhəməti – xaliqi – küll,
Aşikar oldu bu gün batini – Qurani – müdill,
Doldu afaqə səfa, oldu cahan gülşəni – gül,
Mülki – dünyayə qədəm qoydu o hadiyyi – sübül.

Çıxdı bir gün ki, ziyasında təmamiyyi – rüsul,
Oldu məhv, eylə ki, xurşidi ziyasında süha.
Çöhreyi – hur işıqlandı cəmalına görə,
Taci – Kəsra yıxılıb taqi – hilalına görə,
Qızarıb rəngi – şəfəq arizi – alinə görə,
Bəzənib cənnəti – firdovsi vüsalinə görə.

Rütbeti – hikməti – merac kamalinə görə,
Hükəma – firqeyi – dun, fəlsəfə cəmi – süfəha.

Bu günün meymənətindən açılıb babi – Nəim,
Bu günün hörmətinə bağlanıb əbvabi – cəhim.
Bu günün məsədətindən saçılıb dəhrə nəsim,
Bəzənib dürri – nübüvvətlə bu gün beyti – hərim.

Oldu bazari – cahan rövnəqi bir dürri – yetim,
Ki, deyil iki cahan, hasili ol dürrə bəha.

Sabira, tök fərəhindən üzünə əşki – tərin,
Sınsa bazarı nolur əşginə nisbət kühərin,
Asitanı – şəhi – bəthayə nisar eylə sərin,
Sidqilə tut ətəyin Həzrəti – Xeyrül – bəşərin.

Ey Füzuli, rəhi – şərini tut ol rəhibərin,
Bu təriq ilə zəlalətdən özün eylə rəha.

## HACI AZƏR XIRDALANLI
## *MÖVLUDNAMƏ*

Ey o kəs ki, səndən ötrü xəlq olub cümlə cahan,
Vacib olmuş əmrivə müti ola insülə can,
Xoş o qəlbə ordakı eşqin salıbdır aşiyan,
İsmi-pakindir dilimdə, virdi-zikrim hər zaman
Bəlkə bu yolla tapa qəlbim təravət Ya Rəsul!
Zikri-ismindir mənə eyni ibadət Ya Rəsul!

Gər nübuvvət bir sədəfdir, sən isə dürrü-yetim,
Göndərilmisən sübutdur çün ki, Qurani-həkim,
Hikmətindən yəni Quranın bizə məlumdu kim,
Rahibər vermiş səni dünyaya xəllaqü-əzim,
Bir zaman tutmuşdu dünyanı cəhalət Ya Rəsul!
Xəlqi sən etdin fəqət həqqə hidayət Ya Rəsul!

Sən qəmin çəkdin edib bu ümmətə qəmxarlıq,
Dərdinə həmdərd olub etdin bu yolda yarlıq,
Aqibət sonda göründü böylə minnətdarlıq,
Əhli-beytə göstərildi öylə bir qəddarlıq,
Gər dilə gəlsə, çəkər dil də xəcalət, Ya Rəsul!
Məndə izhar etməyə yoxdur cəsarət, Ya Rəsul!

Tanrının əmriydi səndən sadir olmuş hər qərar,
Təyin etdin canişin, şəninə gəldi bir şüar,
“La fəta illa Əli, la seyfə illa Zülfüqar.”
Qədri-Xumda gərçi biət etdi qövmi-zülmükar,
Rehlətindən sonra oldu çox xəyanət, Ya Rəsul!
Əhli-beytə etdilər zülmü-ədavət, Ya Rəsul!

Dil necə izhar qılsın qəlbinin qovğasını,
Saxlayır daim içində Əhli-beytin yasını,
Eyləyib rehlət dəyişdikdən sora dünyasını,
Vurdularmı söyləsin peyğəmbərin Zəhrasını,
Zülm ilə övladına yetdi xəsarət, Ya Rəsul!
Ərşidə titrətdi yəqin ki, bu halət, Ya Rəsul!

Bir zamanlar ki, Sənə, Allaha üsyan etdilər,
Sonra Zəhraya, Əliyə qarşı tüğyan etdilər,
Zəhr ilə oğlun Həsən bağrını al qan etdilər.
Kərbəladə həm Hüseyni qanə qəltan etdilər,
İndi də mövcuddu o əhli-qəsaət Ya Rəsul!
Əhli-kin, əhli-əda, əhli-rəzalət, Ya Rəsul!

Gəl eşit bu şad gündə qəmli ahu-zarimi,
Dərd əlindən zar-zar qan ağlayan əşarimi,
Gər xətakarəmsə əfv et, bu xətalı-karimi,
Azdı qurban eyləsəm uğrunda cümlə varimi,

Şənivu bəsf etməyə yox məndə qüdrət, Ya Rəsul!
Eydu-mövludun mübarəkdir nəhayət, Ya Rəsul!

Qəmli könlüm qəmdədir, qəmxarı gözlər gözlərim,
Zülmü nabud eyləyən, sərdarı gözlər gözlərim,
Dil çəkilmiş darə, çün dildarı gözlər gözlərim,
İsmi ismindən olan, bir yarı gözlər gözlərim,
Sayəsində aləmi tutsun ədalət, Ya Rəsul!
Qismət olsun Azərə, bəlkə şəfaət Ya Rəsul!

**MİRZƏ DAHİ**
***İKİ ALƏM GÖZƏLİ***
***MÖVLUDNAMƏ***

Eşq bəzmində bu gün şura gəlib əhli – vəfa
Bu necə bəzm, nə işrət, nə səadət, nə səfa?!

Dolanır saqi əlində meyi vəhdət camı
Qətrə - qətrə süzülür qəlblərə nuru hüda

Bu nə sevda ki, çəkib sehrinə üşşaqı tamam
Qalmayıb dəhrdə bir aşiqi – sadiq güya.

Bisütunundan enib, atdı külüngün Fərhad
Əlvida söylədi səhralara Qeysi – rüsva.

Kərəmin yanmağı əfsanə imiş bilməmişik
Vamiqi, sən demə qərq eyləmyibmiş dərya.

Dolanır hər biri  bir nəşəli pərvanə kimi,
Şam tək şölə saçır ortada Şahi – Bətha.

Bu gözəlliklər onundur, bu şərafətdə onun,
Gün o gündür ki, gəlib yer üzünə nuri – Bəqa

Nuhu, İbrahümü, Musavü, Məsiha nuru,
Nuru – Tövratü Zəbur, İncülü Qurani – Xuda.

Iki aləm gözəli, kamili hər əsrü zaman,
Əvvəlü  axürü – dünyayə olan rahnüma!

Göylərin Əhmədi – Muxtari, Əbulqasimi – ərz.
Ənbiya xətmi, şəhi Rənctəni – ali - əba!

Gəldi ölmüş bədənə ruhi rəvan tək, can tək.
Quru bir ad idi aləm, ona gəldi məna.

Qəsri – Kəsranın o gün dözmədi on dörd tağı.
Düşdülər səcdəsinə Latü Mənatü Üzza.

Qurudu Savə gölü, rüşəsi küfrün qurudu.
Söndü atəşkədlər, gerçəyə döndü röya...

Gəldi bir şanlı səda, nurlu şəfəq tək gəldi
Susdu batil, kor olub qaldı yerində hükəma.

Oldu Allahın evi pak, vücudu hər dəm
Şərəfü – şanını vəsf eylədi "Yasin" "Taha".

Ləkəsiz qəlbinə vəhyin ışığı dolduqca,
Dirlik çeşməsi tək çağladı dünya – dünya.

Mərifət zirvəsini fəthi "Ləqad kanə ləkum".
"Ləəla xulqin əzim" şərhi məqami - əla.

Haqqa ayina olub, verdi cahan əhlinə dərs,
Yox zaval hikmətinə, hökmünə ta ruzi – cəza.

Neçə min aləmi seyr eylədi vəhdət gəcəsi,
Ola bilməzdi bu surətdə mələklər hətta.

Anla şəqqül – qəmərin hikmətini göylərə dal,
Demə dəryanı əsasıyla bölürmüş Musa.

Şanlı Quran ki, bu möcüzlərinin şahididir
Özü bir möcüzə kim, zərrəsidir ərzu səma

Möminin qəlbi də bir möcüzədir, Qurantək.
O təmiz qəlb ilə dərgaha yönəl, eylə dua:

Bu günün hörmətinə, şahi cahan hörmətinə
Yaradan üzzü kəramət edə İslama əta!

Dini haqqın şərəfi ruhuna verdikcə qida.
Bəzmü-üşşaqı edə Dahi də hərdəm ehya.

## HACI ŞIXƏLİ TUTİ
### *QƏSİDƏ*

Qıldı dünyanı münəvvər, tələti peyğəmbərin,
Verdi mövcudata surət, surəti  peyğəmbərin.

İlləti ğaiyyi – külli – mümkünanat etdi zühur,
Tutdu Turi – kainatı sərbəsər, zərrati – nur,
Şəmsi – həq nurundan əda oldu çün, xəffaş – kur,
Olcağın zahir cahanda, xilqəti peyğəmbərin.

Aləmi – təcridü təkvinə səbəb, bu nuri – pak,
Nuri – pakiylə ədəm mülkün qılıbdır, çak – çak,
Fəxr edən ərşü bərində dəmbədəm, bu tirə xak,
Görcəgin geymiş vücudi, xələti peyğəmbərin.

Nurbəxş olmuş vücudi – zatı, narü nuridə,
Məhv edib  Musayi – eşqin, cilvəgahı – Turidə,
Çün yədi – bəyza, ziyabəxş oldu çeşmi – kuridə,
Pürziya etdi vücudi, həzrəti – peyğəmbərin.

“Əşrəqəl – ərzə binuri – vəchə”, nöh əflakdən,
Qoydu taci – izzət, abaü ülüvvi – xakdən,
Geydi xələt, dari – imkan, həzrəti – lövlakdən,
Məqsədi – mucid vücudə, həzrəti – peyğəmbərin.

Sahibi – taci – kəramət, maliki – xülqi – əzim,
Mədəni – elmü hidayət, saliki – şəri – qəvim,
Rafii – küfrü zəlalət, mühyiyi – üzmi – rəmim,
Məhzəri fəyyaz məzhər, xisləti peyğəmbərin.

Eydi – mövludi – nəbüdür, ey güruhi – xasu am,
Var yeri, ərşi – bərin olsun zəminə, bir qulam.
Müjdə olsun sizlərə, ey əhli – islami – kiram,
Kim, nəsib olmuş sizə, bu dövləti peyğəmbərin.

Yövmi – mövludi – nəsidə, oldu aləm kamiyab,
Aləmi – mənadə ey ümmət, yetər hər an xitab,
Əlbəşarə, əlbəşarə, milləti – ali cənab,
Bəxtiyar etdi sizi, bu hörməti peyğəmbərin.

Zati – alisi bu gün, dünyani purnur eylədi,
Savə dəryasin, cahan mülkündə məstur eylədi,
Taği – Kəsra sınmağın, aləmdə məşhur eylədi,
Sanma cayi –uçubdur, bu sərvəti peyğəmbərin.

Cəhli məhv etdi təmamən, elmi qıldı aşikar,
Zülmi nabud eyləyib, məzlumi etdi payidar,
Nasixi – ədyani – küll oldu, bu dürri – şahivar,
Ta əbəd baqi qalar, bu şöhrəti peyğəmbərin.

Feyziyab ol, ey əzizim, feyzi – bipayandən,
Tut təriqi – həqqi, kəsbi – elm qıl Qurandən,
İbrət al yövmi – miadə, Buzərü, Səlmandən,
Gör nə hikmət zahir etmiş, hikməti peyğəmbərin.

Eyd olubdur bizlərə, mövludi – xətmi – ənbiya,
Eylərik nami – Hüseyn ilə, əzayə iktifa,
Tutiya, hüzzarilən versün xuda, əcru cəza,
Ruzi – məhşərdə, behəqqi – hörməti peyğəmbərin.

## ƏLİHÜSEYİN CƏFƏRİ
### *QƏZƏL*

Peyğam ilə Ya Mustafa, bizdən salam olsun sənə,
Səndən bizə lütfi – səfa, bizdən salam olsun sənə.

Xətmi – nübüvvət bəxş edib Allah mübarək ismüvə,
Sənsən cahanə rəhnuma, bizdən salam olsun sənə.

Pürnuri – şəmsi – surətin dəhri münəvvər eylədi,
Qərq oldu nurə övliya, bizdən salam olsun sənə.

Səd afərinlər söyləyirik Allaha kim, xəlq eyləmiş,
Sən tək şərəfdarı – ziya, bizdən salam olsun sənə.

Elm əhlini qurani – həq öz hikmətilə mat edib,
Hər ayədə vardır xəfa, bizdən salam olsun sənə.

Ta yüz iyirmi dörd min ol peyğəmbərin əşrəfisən,
Ey mehribani - ənbiya, bizdən salam olsun sənə.

Hər gün rukuyi – səcdədən sonra, xudayə üz tutub,
Şükr ilə söyləyir aşina, bizdən salam olsun sənə.

Mehri məhəbbətlə sənin yad eylərik ismüvi,
Çün olmuşuq əhli – vəfa, bizdən salam olsun sənə.

Hicri – vüsalun mömini – sadiqlərin canın üzür,
Vəslündən özgə yox şəfa, bizdən salam olsun sənə.

Qətli - əzabü zülm ilə varüslərün oldu şəhid,
Çox çəkmişik cövrü cəfa, bizdən salam olsun sənə.

Ta kainati – aləmin hər nöqtəsindən sidq ilə,
Ərşə çıxır şükri – səda, bizdən salam olsun sənə.

Lütfən salavat zikr edən əhli – ibadət dəhridə,
Eylər sənə cani fəda, bizdən salam olsun sənə.

Peyğam yetirməkçün sənə, hər gün Xudayə yalvarıb,
Biz eylərik həmdü səna, bizdən salam olsun sənə.

Mövlud yövmün tək əziz gün yox cəhanda Ya Rəsul,
Eydə şərifsən, mərhəba! bizdən salam olsun sənə.

Şeri – lətifin Cəfəri həsr etdi ismü şənüvə,
Ey salehi – Ali – Əba, bizdən salam olsun sənə.

## KƏRƏM KÜRQIRAXLI
### *QƏZƏL*

Anadan olduğun gün bayramdır, ya Muhəmməd!
Xalqın sevgisi sənə ümmandı, ya Muhəmməd!

Şairlər söz qoşurlar bu gün gözəl şəninə,
Sözə qiymət verilən dövrandı, ya Muhəmməd!

Min dörd yüz ildən bəri xilqət səni yad edir,
Haqqın bu sirri sənə əyandı, ya Muhəmməd!

Böyük Yaradan sənə müdam hörmət eyləmiş,
Bu günlər din əhlinə meydandı, ya Muhəmməd!

Hamıdan çox sevərdin Fatimeyi – Zəhranı!
O da indi yanında mehmandı, ya Muhəmməd!

Neçə ildi yurdumda şəhid qanı sel olub,
Tökülən göz yaşları leysandı, ya Muhəmməd!

Öz ümməti yolunda Qurban getdi Hüseyn,
O da cəm müsəlmana soltandı, ya Muhəmməd!

Kərəm öz ilhamıyla bu gün səni vəsf edir,
O sənə öz canıyla qurbandı, ya Muhəmməd!

## PƏNAH GÖYÇƏLİ

### *NƏT*

Son dəfə qələmi alıram ələ;
Qarışıb könlümdə sevinc nisgilə.
Axı, hazırlanır beşinci kitab;
Mübarək adına sonuncu xitab.
Durulub qəlbimdə səcdənə gəlir,
Qələmim sevinclə durub müntəzir.
Ey ulu Məhəmməd, ey müqəddəs Zat,
Ey adı cahanda ən sevimli ad!
Sənin doğulduğun mübarək gündən,
Aləmi çulğayan toydan, düyündən,
Yerdəki, göydəki o ehtişamdan,
Qızıl dan yerindən, xoşbəxt axşamdan,
İstərəm soz açım ürək dolusu,
Çevrilsin sözlərə könlün duyğusu.
On dörd əsrdir ki, nə qədər şair,
Qələm işlədibdi o günə dair.
Şəksiz hər zamanın öz sözü vardır,
Bu mövzu həmişə bir ilk bahardır.
Asan ələ gəlmir ancaq niyyətim,
Çox zaman gecikmək olub qismətim;
Bu gün söz mülkünün dərilib barı,
Nizami Zöhrabi[1] seçib onları.
Qismət qane etsin gərək insanı,
Alıb uralayım yerdə qalanı.

---

[1] Низами Зющрабинин «Мяккядян доьан эцняш» ясяриня ишарядир.

Doğuldun cahana Günəşlə qoşa,
O gün qoşa Günəş verdi baş-başa.
Günəş sən Günəşi salamlayırdı,
Aləmə sevinclə şəfəq yayırdı.
Artmışdı cahanın nuru neçə qat,
Füsünkar bir libas geymişdi həyat.
Səs-səsə vermişdi nəğməli quşlar,
Hər biri eşqini edirdi izhar.
Çəmənə gəlmişdi özgə təravət,
Nərgizlər, süsənlər sanki bir afət.
Mehə könül verib rəqs edirdilər;
Hər tərəf füsünkar, hər gül təzə, tər.
Alışıb yanırdı lalə yanağı,
Bütün qönçələrin qaçmış dodağı.
Deyirdi, möcüzə doğacağam mən,
Minbir rəngli idi o səhər çəmən.
Üz ürdü səmada tək-tək buludlar,
Yerə məhəbbətlə baxırdı onlar,
Çiləndi onlardan sevinc yaşları,
Rafael o anı çəkəydi barı.
Yuyundu, darandı hər gül təzə-tər,
Oldular daha da təzə-tər qəşəng.
Sənə boylanırdı günəbaxanlar,
Varlıq yaşayırdı ən şirin anlar.
Cahan görməmişdi belə bir səhər,
Sevincdən məst idi yerlər və göylər.
Üfiqə enmişdi bir qövsi-qüzeh,
Minbir ətirliydi əsən sərin meh.

Yatmış gözəlliklər oyandı o gün,
Səadət rənginə boyandı o gün.
Enmişdi dünyaya əmin-amanlıq,
İtib yox olmuşdu pislik, yamanlıq.
Yox idi qovulan, yox idi əsir,
Qoşa dayanmışdı dovşan ilə şir.
Cahan yaşayırdı möcüzə bir gün,
Hər bir an gəlirdi daha da üstün.
Batmaq istəmirdi o axşam Günəş;
Tək qalmasın deyə yerdəki Atəş.
Doğuldu o axşam ondördgünlük Ay,
Başında ulduzlar qurmuşdu halay.
Yerə məhəbbətlə baxırdı onlar,
Onların hər biri seçdi Səni yar.
Sehrə, əfsunla doluydu hər yan,
O gün gecəyə də vuruldu cahan.
Səninlə cahana gəlibdi bahar,
Nəbilər nəbisi sənsən, Məhəmməd!
El sevinc, səadət, ədalət arar,
Onların cəminə tənsən, Məhəmməd!
Beyinlərdən çəni Sən siləcəksən,
Axı möcüzənə yoxdu gələn tən.
Əbədiyyət adlı bir gələcəksən,
Həyatda ən sağlam dənsən, Məhəmməd!
Bir zaman vardı ki, komsomol idim,
Heçliyə yönəlmiş misgin yol idim.
Pənah, xəzan vurmuş sısqa kol idim,
Həyata qaytardın Sən, Sən, Məhəmməd!

## NAZİM SALAMİ
## *İLK SƏFƏR*

On iki yaşına çatdı Məhəmməd,
Həyatda sevirdi o, halal zəhmət.
Bəzən bütün günü bu kiçik oğlan,
Istidə səhrada, heç yorulmadan
Çəkib dəvələri hey aparırdı,
Susuz səhralarda o, su tapırdı.
Bir gün Əbu – Talib, onun əmisi,
Yol üçün ayırdı "səhra gəmisi"
Xeyli dəvələri qoşub karvana,
Onları tapşırdı, qoca sarbana.
Düşdü Məhəmmədlə Dəməşqə yola,
Bəsrədən çox uzaq deyildi bura.
Yol üstü bir qədər dincəlmək üçün
Qalıb karvan əhli Bəsrədə bütün.
Yaxında nəsranı kilsəsi vardı,
Gecə müsafirlər ora yollandı.
Istidən təndir tək torpaq yanırdı,
Karvan axşam yola hazılanırdı.
Bir bulud göründü göydə bu zaman,
Günəşdən oğlanı qorudu yaman.
"Gizlətdi" günəşin hərarətindən,
Kilsənin başçısı Boheyra birdən,

Diqqət yetirərək buna soruşdu,
Bu uşaq söylədi mənə tanışdır?
Əmisi qürürla mənimdir dedi,
Kahin o, dəqiqə yalanı bildi.
Əmi məcbur olub dedi düzünü,
Kahinin həyəcan örtdü üzünü.
Baxdı Məhmmədin o, kürəyinə
Təsəlli yol tapdı tez ürəyinə
Baxdı, kürəyində bir qara xal var,
Gördü yumurtaya eynilə oxşar.
Dedi: bu peyğəmbərlik əlamətidir,
Allahın hökmüdür, kəramətidir.
Isanın dediyi peyğəmbər budur,
Xatəmi – peyğəmbər eşidin, odur.
Tapşırdı əmisi muğayat olsun,
Xatadan – bəladan onu qorusun.

## *PEĞƏMBƏRLİK*

Elə ki, Məhəmməd qırx yaşa çatdı,
Bütün iş gücünü bir yana atdı.
Bu dövür gənclikdən son nişanədir,
O, insan ömründə bir kaşanədir.
Hər il ramazanda “Hirə” dağında,
Günəşin qüruba enən çağında

Tənha mağarada gecələyirdi,
Sübhədək orada dua edirdi.
Yorulmaq bilmədən, o,danışırdı,
Üfüqdə bir işıq hey alışırdı.
Səhər qayıdanda evə o, tezdən,
Mələklər qoymazdı, bir an da gözdən.
Cəbrayıl uçaraq başının üstə,
Onu ötürərdi evə ahəstə.
Bir gün o, ibadət edərkən dağda,
Bir işıq parladı, yandı uzaqda.
Oxu, bərkdən oxu, bir səs eşitdi,
Qeybdən gələn səs belə əmr etdi.
Böyük hökmdarın adıyla oxu,
Nütfədən yaradıb o, varı yoxu.
Həmin səs dedi: ey haqqın rəsulu,
Mənəm, Cəbrayılam, tanrının qulu.
Allahın rəsulu, evinə getdi,
Evdə Xədicəyə belə nəql etdi.
Xədicə təsəlli verib bu zaman
Dedi ki, peyğəmbər bilib yaradan.
Ona peyğəmbər tək inananlar,
Xədicə, Əliynən, Zeyd idi bunlar.
Peyğəmbər hamıyla söhbət edirdi,
Dilindən ətrafa dür səpilirdi.
Yaman narahatdı, arıqlamışdı,

Yeməkdən – içməkdən tamam qalmışdı.
Gördü ki, titrəyir, uzanıb yatdı,
Yorğanı başının üstünə atdı.
Bu zaman otaqda eşitdi bir səs
Dedi: yorğanına ay bürünən kəs,
Tez ol, ayağa qalx, uzanma, çalış,
Öz hökmdarından, hamıya danış.
De ki, din göndərir, rəbbimiz bizə,
Itaət eyləmək, vacibdir sizə.
Bu din islam dini, gözəl bir dindir,
Itaət etsinlər bu dinə, bildir.

## *TƏQİB*

Peyğəmbər yenidən tapşırıq aldı,
Bütün dinsizləri dinə çağırdı.
Məkkə müşrikləri daş atdı ona,
O, yenə səbirlə dözərək buna,
Tapşırdı Allahın yoluyla gedin,
Əhli –kitab olun, butu tərk edin.
Kəbədə butləri o, qırıb atdı,
Əli də, bu işdə köməyə çatdı.
Bir dəfə peyğəmbər namaz qılanda,
Alnını müqəddəs daşa vuranda,
Əbu –Cəhl adında, onun əmisi,

Dəvə bağırsağı, heyvan dərisi,
Atıb namaz üstə ayaq altına,
Istədi qəsd edə o, həyatına.
Görürdü günbəgün təzyiq çoxalır,
Bircə çıxış yolu getməyə qalır.
Yığıb dostlarını bir gün yanına,
Göndərdi, Mərakeş krallığına.
Özü getməyərək Məkkədə qaldı,
Vaxt gəldi, düşmənə qələbə çaldı.
Üz verdi yenidən müsibət ona,
Ömrünü Xədicə bitirdi sona.
Bir qızı Fatimə qaldı yadigar,
Ona ana deyir bütün qadınlar.
Elə ki, dünyadan köçdü əmisi,
Dedi düşmənləri :  batdı gəmisi.
Qərar qəbul edib sonradan belə:
Keçib peyğəmbərin, olduğu yerə,
Onu öz evində həlak etsinlər,
Sakitcə aradan çıxıb getsinlər.
Yaxşı ki, dostları bildilər bunu,
Şəhərdən həmin gün çıxardıb onu,
Əli yola saldı Əbu – Bəkrlə,
Gecə yol getdilər min bir fikirlə.
Nə bir dincəldilər, nə də yatdılar,
Gəlib Tur dağına səhər çatdılar.

Həmin gün yerində Əli yatmışdı,
Müşriklər qapını qırıb atmışdı.
Hamı doluşaraq otağa birdən,
Əlini gördükdə donub qaldılar,
Ondan peyğəmbəri xəbər aldılar.
Dedilər Məhəmməd özü hardadır,
Əli cavab verdi çoxdan yoldadır.
Bütün ələk – fələk edib hər yeri,
Səhradan döndülər yenə də geri,
Qumlu təpələri keçib aşdılar,
Gedib mağaraya yaxınlaşdılar.
Allah hörümçəyə etmişdi əmr,
Çəksin mağaraya topundan "dəmir".
Qoyub yumurtasın, otursun ora,
Gəlməsin kimsənin gumanı bura.
Allah nə demişdi, hörumçək etdi,
Ayaq ləpirləri silinib getdi.
Elə ki, müşriklər oraya çatdı,
Hörümçək onları yaman aldatdı.
Bir nəfər içəri keçmək istədi,
Əbu – Cəhl üstünü bulama dedi.
Yenə kor – peşiman düşdülər yola,
Atları bilmirdi sürsünlər hara.

## AXUND HACI SOLTAN HÜSEYNQULU OĞLU
### *MƏBƏS BAYRAMI*

Eydi – məbəsdi peyənbər seçilən gündü bu gün,
Xaliqin həq qapısından keçilən gündü bu gün.

Kuhi – hiradə nüzul etdi cənab Cəbrail,
Mustəfa payinə göylər açılan gündü bu gün.

“İqrəbismi” dedi peyğəmbər əzəl nitqində,
Bir neçə cümləyə dünya kiçilən gündü bu gün.

Ən şirin bayramıdır müslimin eydi – məbəs,
Yadi – cənnət ilə şərbət içilən gündü bu gün.

Gəldi təsdiqə Əli ilə Xədicə əlhəq,
Islamın nuru cahana saçılan gündü bu gün.

Ey müsəlman, belə xoş gündə pərişan olma,
Çünki, hər qüssəvü  qəmdən qaçılan gündü bu gün.

Soltan, eşq əhli bilər Məbəs gününün,
Kafərin başinə bütlər uçulan gündü bu gün.

## HACI YAŞAR CAHİD
### *MÜXƏMMƏS*

Oxu ey aşiqi həq canilə cananım oxu,
Oxu ey hər iki dünyadakı sultanım oxu,
Oxu bu ayəni ey bülbüli xoş-xanım oxu,
"İqra bismi rabbikə"- dedi yazdanım oxu,
Oxu Allahın adıyla oxu, ey cananım oxu.

Gördü Əhməd ki, odur, durmuş o Cibrili əmin,
Həyəcanlandı qaçır sanki, ayaq altda zəmin,
Dedi Cibril ona qorxma, oxu ey mahi cəbin,
Məni katib eləyibdir sənə rəhmanım oxu,
Oxu Allahın adıyla oxu ey cananım oxu.

Ya Muhamməd:- səni peyğəmbər edib xəlqə xuda,
Qalx camaata xəbər ver ki, odur rahi huda,
Qoy yayılsın bütün aləmlərə bir böylə səda,
Birdir Allah, bir Allahına qurbanım oxu,
Oxu Allahın adıyla oxu, cananım oxu.

Gör necə elmə verib qiyməti Allahın özü,
Başlayıb "iqra" ilə ayəti əvvəldə sözü,
Bəşər övladının elmilə açılmışdı gözü,
Vardır imkanın əgər, yox demə imkanım oxu,
Oxu Allahın adıyla oxu, cananım oxu.

Budur axır sözümüz elm oxu, hədyan oxuma,
Oxuma ləhvü-ləəb, kəlmeyi-şeytan oxuma,
Oxu o elmi ki, haqq razıdı kufran oxuma,
Həqqi de, həqq oxu ey qareyi quranım oxu,
Oxu Allahın adıyla oxu, ey cananım oxu.

Anla bu məbləbi olmaq diləsək gər tələbə,
Elmi öyrənməyə get Çin ola, yaxud Hələbə,
Çalmaq istərsən əgər elmidə hərgiz qələbə,
«Cahidna» söyləmiş ol xaliqi-sübhanım oxu
Oxu Allahın adıyla oxu, ey cananım oxu.

## NİZAMİ ZÖHRABİ
## *HƏZRƏT ƏLİNİN PEYĞƏMBƏRİN (S) EVİNƏ KÖÇMƏSİ VƏ İSLAMI QƏBUL ETMƏSİ*

Muhəmməd Əliyə çox salmışdı mehr,
Sanki eyləmişdi uşaq ona sehr.
Həzrət olduğundan ürəyi yumşaq
Yaman alışmışdı ona bu uşaq.
Hələ körpəlikdən, uşaq çağından
Düşməzdi Həzrətin o, qucağından.
Ondan əl çəkməzdi bu boyu bəstə,
Çıxıb oturardı dizləri üstdə.
Qolunu boynuna onun salardı,
Həzrət də onunla nəfəs alardı
Bu sevgi sığmırdı heç bir qəlibə.
Bir gün üz tutaraq Əbu Talibə
Təkidlə eylədi o, müraciət:
- Mən bir fikrə gəlib eyləmişəm qət.
Dedim ki, səninlə bir əhd bağlayım,
Aparıb Əlini özüm saxlayım.
Əvvəla, böyükdür, əmi, külfətin,
Sənə yedizdirmək gəlir çox çətin.
Bir də, yaxşılığın olub mənə çox,
Çəkdiyin zəhmətin say – hesabı yox.
Yoxdur atam, anam, bacım, qardaşım,

Bircə sən olmusan könül sirdaşım.
Mən övlad bilmişəm sənə özümü,
Eşit, yerə salma indi sözümü.
Qoy qalsın yanımda Əli əmanət,
Görürəm mən onda başqa əlamət.
Qoy verim Əliyə özüm tərbiyə,
Hazır edim onu elmi – hərbiyə.
Alıb Əbu  Talib dərindən nəfəs
Dedi: - Ya Muhəmməd, mənə qulaq as.
Bilirsən, əzizdir xətrin mənimçün,
Bu qədər üzülüb yalvarmaq neyçün?
Necə şirin olsa mənimçün bala,
Əliboş dönməzsən evimdən dala.
Heç vaxt gətirmərəm sənə bəhanə,
Söylə, istəyirsən məndən daha nə?
Razıyam mən sənin, oğul, fikrinə,
Öyrənək, Əlinin görək fikri nə?
Əli gözləyirdi sanki bu sözü,
Qaçdı dodaqları, parladı gözü.
Dözmədi, sevincdən uşaq ağladı,
Gəlib atasını o, qucaqladı.
Sonra təzim edib o, çökdü dizə,
Ehtiyac qalmadı daha heç sözə.
Nə ata danışdı, nə oğul dindi,
Lal sükut çökmüşdü araya indi.

Mühəmməd maraqla süzdü uşağı,
Yadına düşdü öz uşaqlıq çağı.
Göz – gözə dayandı bu iki məsum,
Qondu üzlərinə şirin təbəssüm.
Sonra əmisiylə Həzrət görüşdü,
Götürüb Əlini o, yola düşdü.
Sevincindən dönüb baxmırdı dala,
Bağrı çatlayırdı onun az qala,
Körpəni sıxmışdı bərk – bərk köksünə,
Kömək aparırdı Həzrət özünə.
Tapmışdı özünə o, doğma qardaş,
Donub asılmışdı kipriyindən yaş.
Darısqal yollarla, keçə - keçə
Bilmədi evinə yetişdi necə

Təzəcə olanda dörd yaşı tamam
Köçdü Həzrətgilə gələcək imam.
Əli göstərirdi çox şeyə maraq;
Tamam uşaqlardan fərqli olaraq
Yaddı xislətinə oyun, oyuncaq,
O, təlim alırdı Həzrətdən ancaq.
Çox erkən öyrəndi at oynatmağı,
Yaydan ox çəkməyi, nizə atmağı.
Bir kimsə yox idi yıxsın Əlini,
Qatlasın qolunu, büksün belini.

Meydan gəzdiridi kiçik pəhlivan,
Gedirdi hər işi olduqca rəvan.
O, həm də olurdu elm ilə məşğul,
Özünü etmişdi elmə müti qul.
Bəzən yatmayıb o, gecə sübhədək,
Seçərək sözləri beynində tək – tək,
Düzürdü nizamla birbəbir səfə,
Hər sözdə gəzirdi məna, fəlsəfə.
Yorulmaq bilmirdi bu haqq yolçusu,
Onunçün hər şeyin vardı ölçüsü.
Odur, yanaşırdı hər şeyə ciddi,
Haqq ilə həmrəydi, küfr ilə ziddi.

Niyaz edirdilər Allaha gecə
Rəsuli Əkrəmlə xanım Xədicə.
Həzrət Əli Feyzi bu halı gördü,
Uşağın qəlbini fikir götürdü.
Balaca olsa da deyildi naşı,
Gəlib Muhəmmədlə durdu yanaşı.
Dinlədi sonacan onları, birdən
Dedi: - Agah edin məni bu sirdən,
Mənim təlaşımı çatdırın sona.
Muhəmməd hər şeyi danışdı ona:
-Dolandım dünyanı haqq sorağında,
Gördüm ləkəsi var gözdə ağın da.

Hər düzün önündə gördüm bir əyri,
Tapmadım ayrı haqq Allahdan qeyri.
Hər varlıq nisbidir, bir Allah mütləq,
Edir bu barədə xəbərdar "Ələq".
Bütün məbudlara ondan savayı
Qılınan səcdəni saydım havayı.
Allahdır yaradan bu kainatı,
Ona şərik qoşan Latı, Mənatı
Verər öz ömrünü ancaq fənayə, -
Deyib oxudu o, bir neçə ayə.
Titrədi Əlinin bütün varlığı,
Heyran etdi səsin ecazkarlığı.
Gördü ki, bu sözlər adi söz deyil,
Yarandı islama ürəyində meyl.
Rahat buraxmadı onu bu niyyət:
-Görürəm bu dində düzlük, əmniyyət.
Qoy məni atamın yanına gedim,
Onu məsələdən xəbərdar edim, -
Deyərək çəkildi bir xəlvət yerə,
Qəlbində götür – qoy etdi min kərə.
Varlığı qərq oldu islam nuruna,
Qayıtdı Rəsulun o, hüzuruna.
Dedi: _ Ya Mühəmməd, sən məni eşit,
Gəlməsin dediyim bu sözlər bəsit.
Faili – muxtarlıq xasdır insana,

Çalışsa, çətin də dönər asana.
Allahın verdiyi ağıl, düşüncə
Məgər ki, torpaqdır qoyula dincə?
Məgər Tanrı məni yaradan zaman
Razılıq vermişdi atam, ya anam?
Mən niyə onlardan soruşmalıyam?
Vaxt yubatmadan qovuşmalıyam
Məni xəlq eyləyən Ulu varlığa,
Yol verə bilmərəm xətakarlığa.
Elədi islamı qəbul o gecə,
Sayca müsəlmanlar yetişdi üçə.
Çox illər keçsədə bu əhvalatdan,
Həzrət çıxartmırdı o günü yaddan:
-Qəbul eyləyəndən islamı Əli, -
Deyirdi, - bərkidi dinin təməli.
Olmaz Əli kimi imanlı bir şəxs,
Iman qazanmağı ondan edin əxz.
Odur bu dünyada haqqın məhvəri,
Onun dostlarını behiştdir yeri.
Qiymətə mindirər ləli əyarı,
Insanın elmidir onun meyarı.
Hər kəsin qiyməti elmi qədərdir,
Başqa məziyyətlər heçdir, hədərdir.
Allah öz elmindən ona verib pay,
Ərşdən mənbəyini götürüb bu çay.

Əlinin elminin olmaz nöqsanı.
Tək ona verilib yüzdən doxsanı.
Bəşərə verilən onu da yüzdən
O, bilir dərindən, qalanlar – üzdən,
O, elmin qapısı, mənəm – şəhəri,
Ancaq bu qapıdan girin içəri.
Hər kəs ki, axtarsa ayrı bir qapı,
Buraxar əlindən haqq olan sapı.
Dərk eyləyə bilməz heç zaman elmi,
Savadı olsa da, kəm gələr helmi.
Əlləri boş qalar onun hər zaman,
Zəmidən dən deyil, götürər saman.
Əlinin dalınca belə bir şərəf
Üzünü çevirdi qul Zeydə tərəf.
Dinin təməlinə o da qoydu daş,
Artdı həmin gündən daha bir dindaş;
Ruhuna salavat eyləyək zikir.
Tərəddüd etmədi heç Əbu Bəkir,
Rəsuli Əkrəmdən təklif alanda
Islamı eylədi qəbul bir anda.
Bələddi Həzrətin o Inamına,
Salmadı heç şübhə öz gümanına.
Malik olduğundan çox böyük ada,
O, təsir eylədi doğmaya, yada.
Vacibdir eyləmək bir məqamı qeyd:

Həbbab ibni Ərət, Səid ibni Zeyd
Agah olan kimi bu böyük sirdən,
Götürüb nümunə Əbu Bəkrdən,
Rəsuli Əkrəmə gətirib iman,
O gündən hamısı oldu müsəlman.

## VƏHYİN KƏSİLMƏSİ VƏ MUHƏMMƏDİN(S) *İNTİZARI*

Yerlə Göy arası çəkildi hasar,
Düz qırx gün peyğəmbər qaldı intizar.
Olmadı bir müddət vəhy nazil Yerə,
-Bəs niyə kəsildi o, birdən – birə?
Nə oldu, yoxsa öz qulunu Xaliq
Uca mərtəbəyə bilmədi layiq?
Bəlkə mən deyiləm hazır bu işə? –
Muhəmməd düşərək dərin təşvişə
Tez – tez soruşardı özü özündən,
Yuxusu qaçmışdı onun gözündən.
Anlıya bilmirdi bu necə sirdi,
Həzrətin artmışdı birə - beş dərdi.
Gəzib – dolanırdı daim narahat,
Otura bilmirdi evdə bir saat.
Çəkilib gedirdi o, tez – tez dağa,
Ilahi çəkirdi onu sınağa.

Ona dar gəlirdi ev də, şəhər də,
Nəhayət, çatdı vaxt, çəkildi pərdə.
Dan yeri sökülüb açanda səhər
Cəbrail gətirdi ona şad xəbər:
Göydən nazil oldu Yerə "əz – Zuha".
Bu hikmət sahibi, bu böyük düha
Unutdu bir anda dərdi – sərini,
Göylərdən çəkmədi o, nəzərini.
Üç il dəvət etdi dinə gizlicə;
"Şüara" surəsi ona gəlincə.
Rəbbi əmr elədi öz Rəsuluna:
- Qövmünü dəvət et haqqın yoluna.
Çevir müşriklərdən artıq üzünü,
Xalqa açıq – aşkar söylə sözünü.
Başlandı o vaxtdan yeni mərhələ,
Çox iş gözləyirdi qarşıda hələ.

## *MUHƏMMƏDİN (S) ÖZ QÖVMÜNÜ İSLAMA DƏVƏT ETMƏSİ*

Yaxın adamları evinə dəvət
Eyləyib, Muhəmməd verdi ziyafət.
Gəldi əmiləri bir – bir hamısı,
Başda Əbu Talib - əziz hamisi.
Gəldi Əbu Ləhəb, Abbas və Həmzə,

Oturdu məclisdə hamı üz – üzə.
Süfrəyə cürbəcür xörək düzüldü,
Üstündən içməyə şərbət süzüldü.
Əlini çəkərək Həzrət üzünə
Başladı nəhayət vacib sözünə:
-Allahdan aldığım son əmrə görə
Bu gün toplamışam sizi bir yerə.
Ayırın, həzərat, ağı qaradan,
Bilin şəriksizdir Böyük  Yaradan.
Qoşmayın bütləri siz Ona şərik,
Xəlq edən tək Odur, bizlər bəşərik.
Sizə nicat olmaz taxtadan, daşdan,
Biryolluq çıxarın bu fikri başdan.
Qorxun yapdığınız şərdən, nahaqdan,
Mərhəmət diləyin o Ulu Haqdan.
- Çöküb qarşımızda bayaqdan dizə
Nağıl danışırsan, Muhəmməd, bizə,-
Deyib, Əbu Ləhəb durdu ayağa,
- Sən indi bütləri qoymusan lağa?
Müvafiq deyildir yaşın yaşıma,
Ağılmı qoyursan mənim başıma?
Baha başa gələr buraxdığın səhv,
Mən səni heç zaman eyləmərəm əhv.
Eyləyə bilməyib həqiqəti dərk,
Etdi Əbu Ləhəb bu məclisi tərk.

Bir həftə keçməmiş həmin o gündən,
Həzrət qurtulmaqçün Haqqın yükündən
Bir axşam Əliyə verdi göstəriş:
-Mənim boynumdadır onsuz da bu iş,
Tədarük eylə sən ziyafət üçün,
Allahın əmrini yubatmaq neyçün?
Günəş qürub edib düşəndə axşam
Muhəmməd evində açdı yenə şam.
Yemək çatdı başa, yığıldı süfrə:
-Hamınız son qoyun günaha, küfrə, -
Deyərək Muhəmməd başladı sözə,
-Borcumdur çatdırmaq xəbəri sizə.
Allah əmr eləyib Yerdə quluna,
Dəvət etsin sizi Haqqın yoluna.
Allaha baş əyib etsəniz ixlas,
Onda olarsınız cəzadan xilas.
Yalnız O, qadirdir verməyə nicat,
Inad göstərməyə varmıdır hacət?
Hansınız hazırdır, deyin, bu işə?
Düşdü məclis əhli yenə təşvişə,
Beyinlər qızışdı, çoşdu ehtiras
Etdilər Həzrətə yenə etiraz.
Yararaq məclisi keçib irəli
Həzrətə üz tutub söylədi Əli:
-Necə cilalasan sarı bürüncü,

Ondan nə ləl olar, nə də bir inci.
Nə qədər desən də sözü naşıya,
Baxar eyni gözlə lələ, kaşıya.
Burda az olsa da hamıdan yaşım,
Eşitsin qoy məni qohum – qardaşım:
-Hazıram ölməyə Haqqın yolunda.
Gücüm az olsa da hələ qolumda,
Olaram bu işdə mən sənə arxa,
Razı olmaram ki, mən baxa – baxa
Bir kimsə toxunsun qəlbinə sənin,
Istər yadlar olsun, istərsə əmin.
Düşmənin – düşmənim, dostun dost mənə,
Arxayam, köməyəm, qardaşam sənə.
Əl bizdən qoy olsun, Allahdan qüvvət,
Baş tutsun əzmiylə Yerdə nübuvvət.
Çoxları Əlinin güldü sözünə,
Qəzəbdən qan doldu onun gözünə.
Həmin əhvalatdan bir qədər əqdəm
Əli on üç yaşa atmışdı qədəm.
Ürəkdən olmuşdu Allaha bağlı,
Yaşı az olsada çox idi ağlı.

### *AŞKAR DƏVƏT*

Safa təpəsinə çıxıb bir dəfə
Muhəmməd hay vurdu hər bir tərəfə.

Eşidib səsini elə o saat
Yanına toplaşdı onun camaat.
Həzrətin düşmüşdü fürsət əlinə,
Üzünü tutaraq Məkkə əhlinə
Dedi: -Əsəd oğlu, Mahmud övladı,
Dəvət etməmişdən islama yadı,
Allahın verdiyi əmrə müvafiq,
Sizin qarşınızda açılan üfüq.
Edin həm təbərra, həm də təvəlla,
Gedin haqqa tərəf həqiqi yolla.
Hamınız anlayın, təsdiq edin ki,
Allah təkdir, Onun yoxdur şəriki.
Yoxdur Ondan başqa kimsədə qüdrət
Verə bu dünyanı, verə axirət.
Allahdan savayı yox gümanımız,
Onun əlindədir bizim canımız,
Külli – aləm alır pərvəriş Ondan.
Əbu Ləhəb durub baxırdı yandan,
Pörtmüşdü hirsindən, dedi bir təhər:
-Bizim günümüzü eylədin zəhər.
Bizləri topladın sən buna görə?
Mən sənə deyirəm sonuncu kərə:
-Bunca camaatı yormağın bəsdir,
Usan, təbliğatın bil ki, əbəsdir.
Etdin gen dünyanı başımıza dar,

Tutduğun əməlçün olsun sənə ar.
Ataraq bir addım Həzrətə tərəf,
Yerdən daş götürüb rəzil bişərəf
Çırpdı Muhəmmədin düz dabanına.
Onu qəltan etdi qızıl qanına.
Baxdı əmisinə Muhəmməd səssiz.
Allah heç bir işi qoymaz əvəzsiz.
Odur qiymət verən yaxşıya, pisə,
Allah lənət etsin Özü iblisə.
Hamı çıxıb getdi, Muhəmməd qaldı,
Göylərə üz tutub xəyala daldı,
Bu vaxt nazil oldu Cəbrail Əmin,
Dedi: - Ya Muhəmməd, olmasın qəmin.
Bir olan Allahdan sənə var salam,
Yerə gətirmişəm göylərdən kəlam.
Allah lənət deyir Əbu LƏhəbə.
Bil ki, səninlədir sonda qələbə.

## HACI YUSİF QULAMMİRZƏ OĞLU
## *HƏZRƏTİ PEYĞƏMBƏRİN MƏBƏSİ*

Həzrətdə ilahi bir qüvvə vardı,
Müqəddəs sözləri qəlbə yatardı.
Fikri, danışığı aydın işıqlı,
Geyimi tər – təmiz, çox yaraşıqlı,
Üzü günəş kimi şəfəqli, nurlu,
Heç nə görünməyir onda qüsurlu.
Təmizliyi oldu dillərdə əzbər,
"Əmin" ləqəbini ona verdilər.
Əxlaqı yüksək əmalı ilə,
Fitri istedadı, kəmalı ilə,
Islamiyyətə o gətirdi şərəf,
Hamını çəkirdi özünə tərəf.
"Həzrəti Adəmin dürüst əxlaqı,
Həzrəti Davudun xeyirxahlığı,
Nuhun ağlasığmaz mərd cəsarəti,
İbrahimin hikmət, həm mərhəməti,
Həzrəti İsanın dönməz inadı,
Yusifin misilsiz gözəl siması,
Yəqubun dərk etmə məhaarəti də,
Musanın sarsılmaz dəyanəti də,
Ismailin aydın söz danışığı,
Lutun heyrətamiz göz açıqlığı,"

Bu əlamətlər ki, Həzrət də vardı,
Onu dinləyənlər məftun olardı.
Bir neçə məkkəli Rəsulüllahdan,
Bir möcüzə tələb edir bu zaman:
-Peyğəmbər olmağın doğrudur əgər,
Musa, İsa kimi möcüzə göstər.
Ucalt qarşımızda qızıl saraylar,
Ölüləri dirilt, ya buna oxşar,
Korlara şəfa ver, gözlərin aç sən,
Inanaq Allahın Peyğəmbərisən.
Həzrət başa saldı o adamlara,
Hər zaman möcüzə gəlməyir kara,
Görülən möcüzə daim qalarmı?!
Qurandan da böyük möcüzə varmı?!
Bu kitab elə bir dildə yazılmış,
Allahın nurundan mayasın almış.
Gətirilən bütün dəlillər elə,
Şəksiz - şübhəsizdir cinlər də belə
Bunun oxşarını yarada bilməz,
Belə bir möcüzə görməyib heç kəs.
Böyük möcüzədir Qurani – kərim.
Allah kəlamıdır qədimdən qədim.
Əbu Ləhəb, Əbu Cəhl kimilər
Başqa möcüzələr tələb etdilər.
Həzrət barmağını uzatdı aya,
Gördülər bölünüb iki parçaya.

"Əl – Qəmər" surəsi subutkən buna,
Bu ki "sehirbazdır" – dedilər ona.
Bunu görə - görə kafirlər yenə,
Son qoymadı alçaq əməllərinə.
Əbu Ləhəb əsla çəkinməyirdi,
Çirkin niyyətini davam edirdi.[1]

[1] "ALLAHIN ELÇİSİ"

## NƏBİ XƏZRİ
## *HİRA DAĞINDA DÜŞÜNCƏLƏR*
## *"MƏBƏS"*

Günəş sağ əlimdə, Ay sol əlimdə,
Dinimi susmayan səda eylərəm.
Allahımın adı düşməz dilimdən,
Rəbbimə canımı fəda eylərəm.
Ürəkdən – ürəyə nur yaya – yaya,
Dini çatdıraram bütün dünyaya.
Bir əldə qılıncım, bir əldə Quran,
Gərək sözüm xalqa inam gətirə.
Quran deyəcək ki, haqqa gəl, insan,
Göz dağı çəkəcək qılınc kafirə.
Şeytan yer üzündə nifaq törədir,
Kafirlər – şeytanın şagirdləridir.
Kim haqqı Allahın sözündə görsə
Mən onun yoluna işıq çilərəm.
Kim mənə bir addım yaxın gələrsə
Ona mən on addım yaxın gələrəm!
Dediyim hər kəlam Allah əmridir,
Peyğəmbər – mərhəmət Peyğəmbəridir,
Rəbbim kəsəcəkdir düşmən əlləri,
Ancaq dost əlləri mənə qüvvətdir.
Haşim oğulları, Qureyş elləri,
Bütlərə səcdəniz məğlubiyyətdir.

Doğmadır – kim haqqa can qurban eylər,
Allah dönükləri pərişan eylər.
Insan, sən ümmətçin elə çalış ki,
Elə bil heç zaman ölməyəcəksən.
Insan, axirətçin elə çalış ki,
Sanki sabah göyə köç edəcəksən.
Desəm, "La ilahə illəllah” – haqdır,
Cənnət qapıları açılacaqdır!
Ədalət kamanı əgər gərilsə
Hər ox düşmənlərə layiq cavabdır.
Ömründən bir gecə elmə verilsə
Üç aylıq orucdan daha savabdır.
Elmlə, imanla, əməllə insan,
Keçəcək cənnətin qapılarından.
Ömür – tale toyu, tale yasıdır,
Kədərli, zillətli yollar keçərsən.
Dünya axirətin öz tarlasıdır –
Burda sən nə əksən, orda biçərsən!
Iman – inananın ilk qismətidir,
Iman – Rəbbimizin səxavətidir
...Peyğəmbər müqəddəs andını içdi,
“Yox – dedi bəşərin qaranlığına.
Allah buyurduğu haqq yolu seçdi
Düşdü bu əzablı yolun ağına.
Yaxlaşır məşəqqət gətirən qışlar,
Bu an nəfəsini aldı dərindən.
...Mübarək alnına həzin qırışlar

Qonub kafirlərin təhqirlərindən.
Sənsizlik içində ildırım çaxdı.
Rəbbim, bu səhəri sən aç uğurla!
...Gözləri yuxulu, ruhu oyaqdı,
Yarırdı zülməti O, parlaq nurla,
Sirli səs düşürdü dünya üzünə:
-Ya Rəbbim, qəlbini aç mənə söylə.
Qulaq kəsilmişdi Allah sözünə,
Allah danışırdı öz elçisiylə.
Səslər gah bəm olur, gah zil olurdu,
Quran ayə - ayə nazil olurdu.

## *HİRA DAĞINDA*

Muhəmməd həmişə Hira dağına,
Gedərdi tək – tənha ora, dağına,
Dağın zirvəsində haqq sorağına,
Getdikcə hər qaya, hər daş səslənir,
Salam verir, salamlayır dillənir.

Dağın zirvəsində darca zağa var,
Duruşu, baxışı Kəbəyə baxar,
Müqəddəsdi müqəddəsi saxlayar.
Muhəmmədin çox sevdiyi məkandı,
Kimsə burda Muhəmmədə həyandı.

İyirmi yeddisi rəcəb ayının,
Muhəmmədə gələn Allah payının,
Gətirən müqərrər mələk Cəbrayılın
Gördü sifətini duruxdu, durdu,
Sən kimsən, nəçisən – deyə buyurdu.

Sən haqq Peyğəmbərsən, mən vəhy gətirən,
Allah dediyini sənə yetirən,
Adildi, qadirdi hər şeyi görən.
Muhəmməd, Rəsulsan bəni insana
Allah elçisisən iki cahana.

Miladi tarixi altı yüz onda,
İlin əvvəlində Hira dağında,
Cəbrayıl göründü mələk donunda,
Əlində bir vərəq tutdu Cəbrayıl:
Ayıl ya Peyğəmbər, qəflətdən ayıl.

Dedi:ya Peyğəmbər, oxu varağı,
Bu dünyanın var qarası, var ağı,
Pərvərdigar sənə etmiş marağı,
Oxu, Muhəmməd – Rəsul – Allah, oxu,
Oxu, Əliyyən – Vəliyullah, oxu.

Oxu, Allah birdi, əvəzsizdi bil,
Oxu, Allah birdi, bənzərsizdi bil,

Allah yaradandı, çox əzizdi bil,
Allah yaranıbdı, bir də yaranmaz,
Müşriklər nə bilməz, nə də ki qanmaz.

Allah rəhmdildi, kərəmlidi de,
Adildi, qadirdi, qüvvətlidi de,
Böyükdü, uludu, qüdrətlidi de,
Oxu, ya Muhəmməd, öyrən həqiqət,
Səndən öyrənəcək tam bəşəriyyət.

Muhəmməd buyurdu: -Oxu bilmirəm,
-Oxu, öyrən, oxuyarsan bilirəm.
Oxu, ya Muhəmməd, dərsin verirəm,
Haqq – Talanın əmridi, oxu, yaz,
Oxu, öyrən, öyrən oxut, oxu, yaz.

Muhəmməd yenidən gəldi özünə,
Bismillah deyərək keçdi sözünə:
-Mənnən salam yetir haqqın özünə,
Denən Muhəmməddi daimi qulun,
Daim yolçusudu dediyin yolun.

Cəbrayıl qeyb oldu, görünmür gözə,
Bir az əvvəl danışırdı üz – üzə,
Lap yaxın əyləşmiş mənlə diz – dizə,
Bu nə işdi, nə gərdişdi, ya Rəbbi?
Deyərək düşünür Allah Həbibi.

Muhəmməd Hiradan Kəbəyə gəldi,
Ya Allah, deyərək səfə düzəldi,
Namaz vaxtı yenə bir səda gəldi:
-Denən Peyğəmbərəm, Allahu əkbər,
"Lailəhəillələllah" söylə bərqərar.

Ibadət qurtardı gəldi evinə,
Xədicə sevinclə baxdı ərinə,
Üz – gözündən nur çilənən pirinə,
Salam verib, salam aldı gülərək:
-Nə gözəl ruhdasan, günün mübarək.

Muhəmməd danışdı gördüklərini,
Mələkdən eşidib bildiklərini,
Sən haqq Peyğəmbərsən, dediklərini:
"Mən vəhy gətirənəm, mən Cəbrayılam
Sən Rəsulsan, Peyğəmbərsən, halıyam."

Dedi: ya Muhəmməd, eşit ya Rəsul,
Sən Allah dostusan, Allaha bir qul,
Allah belə deyib, Allaha qəbul,
Bu günnən Kəbədə, de, Peyğəmbərəm,
Allahın Rəsulu, Rəsul bəndəyəm.

## HÜSEYN CAVİD
## *BİSƏT*

Aydın və yıldızlı bir gecə. Məkkə yaxınlığında Hira dağı, ətrafda mağaralar, yalçın qayalar, sari enişlər, qorxunc uçurumlar...Peyğəmbər əli alnında dərin düşüncələrə dalmış...O, gecənin sükutunu oxşayan həzin və bayıldıcı bir ud zümzüməsi dinləyərək uyuyur kimi, özündən keçmiş. Bu sırada pənbə, mavi, bənövşə nurlar içində altun qanadlı, füsunkar bir mələk enər və ilahi bir ahənglə Peyğəmbərə xitab etməyə başlar.

***Mələk***

Ulu dahi, sən ey böyük rəhbər!
Qalx, oyan! İştə hər tərəf, hər yer,
Həp təbiət dalıb da röyayə,
Cəlb edər ruhu şerü sevdayə,
Gecə, yıldızlarilə nürxülya.
Səni dinlər sükut içində fəza...

***Peyğəmbər***

(başını qaldırır, heyrət və iztirab ilə)

Yenə röyamı gördüyüm əcəba?
Sən nəsən, söylə?

***Mələk***

Mənmi? Heç sorma!
Əzəliyyət şəfəqlərində açan
Tazə bir qönçə, pənbə bir yıldız.
Əbədiyyət üfüqlərində uçan
Tanrı qoynunda bəslənən bir qız.
Şerü hikmət, zəka ilahəsiyəm,
Ulu dahilərin nədiməsiyəm.
Ayrı olsaq da iştə hər ikimiz
Bir rübabın inildəyən səsiyiz.

***Peyğəmbər***

Nə için gəldin anlamam yenə sən?

***Mələk***

(göyə doğru)

Ona qaldırmaq istərəm səni mən.

***Peyğəmbər***

Ah, sən daima gəlir də mana,
Sonra həp göstərirsən istiğna.
Mən kiməm, söylə? Sən nəsən? Göstər!

***Mələk***

Mən mələk, sən də, sən də peyğəmbər.

***Peyğəmbər***

(şaşqın, geri çəkilir)

Ya! Demək sən mələkmisən? Heyrət!

***Mələk***

Mən sənəm, sən də mən, şaşırma, əvət
Mən sənin əqlinəm, fəqət daim
Bu qiyafətlə zahir olmadayım.

***Peyğəmbər***

Gəl, yaxın gəl, aman nə dilbərsən!
Yox, saqın, gəlmə, dur, nə söylərsən.
Yenə sarsıldı müztərib ruhum,
Dur, aman, sanki qəlbi – məcruhum
Şövqü həsrətlə rəqs edər, sızlar,
Onu bir qəhr – xəndə yaldızlar.
Qopuyor ta içimdə bir tufan,
Beynim atəş saçıb durur hər an.
Yanıyor mənliyim, düşüncələrim,
Çarə bul, yoxsa məhv olub gedərim.

***Mələk***

Ən gözəl çarə: iştə əzmü səbat,
Olma əsla əsiri hissiyyat,
Buraxıb əczi durmadan yüksəl,
Yüksəl, ey şanlı qəhrəman, yüksəl!
Ərşi – lahutə doğru aç şəhpər,
Daima yüksəl, ey böyük rəhbər!

***Peyğəmbər***

Yox, qanad yox! Mən iştə bir aciz
Yolçuyam kimsəsiz, təsəllisiz.
Çevrəm issız mağaralar, yalçın
Qayalar, sarp enişlər, ah, azqın
Uçurumlar, alov saçan ovalar.
Ruhu qəsvətlə yıldıran havalar...
Bir çəmən yox, axar su yox, heyhat!
Göz, qulaq burda duymaz eşqü həyat.

***Mələk***

(göyə doğru)

Bax, bu əngin fəza, bu quytu dəniz...
Nə qədər xoş, nasıl gözəl, ləkəsiz...
Uçuşur hər tərəfdə yıldızlar...

Rəqs edir sanki nazənin qızlar.
Həp birər şer, sən də bir şair,
Hər tamaşası eşqə aiddir.

***Peyğəmbər***

Ah, bu almasparələr sərpən
Gecə çox möhtəşəm... fəqət onu mən
Seyrə daldıqca sanki məhv olurum.
Qəlbin oynar da, çırpınır ruhum.
Anlamam bir bu ölçüsüz, bu dərin,
Bu qaranlıq, çiçəkli pərdə neçin?
Məni yalnız düşündürən bu məal.
Həp bu, yalniz bu, daima bu sual.
Bu siyah çarşaf ən böyük əngəl,
Uça bilsəydim, iştə ən əvvəl
Onu yırtar da, parçalar da həmən.
Qovuşardım o hüsni – mütləqə mən.

***Mələk***

Onu dərk eyləmək qolay...Ancaq
Ver içindən gələn sədayə qulaq,
Dinlə pəh kainatı, seyr eylə,
Hər günəş ondan iştə bir şölə...
Hər ufaq zərrə, hər kiçik yarpaq
Sənə söylər bu rəmzi parlaq.

***Peyğəmbər***

Məncə dünyada ən sevimli dilək
Ona qoşmaq,onunla birləşmək...

***Mələk***

O da mümkün, düşün də haq yolu tut,
Atalardan qalan nə varsa unut!
Yıx xurafatı, əski bütləri qır,
Kim yol azmışsa haqqa doğru çağır.
Nərdivanlar yapıb könüllərdən,
Parla, yüksəl vücudi – mütləqə sən!

***Peyğəmbər***

Öylə bir əsr içindəyəm ki cahan
Zülmü vəhşətlə qovrulub yanıyor.
Üz çevirmiş də tanrıdan insan,
Küfrü haq, cəhli mərifət sanıyor.
Dinləməz kimsə qəlbi, vicdanı,
Məhv edən haqlı, məhv olan haqsız...
Başçıdır xalqa bir yığın cani,
Həp münafiq, şərəfsiz, əxlaqsız.
Gülüyor nura daima zülmət,
Gülüyor fəzlə qarşı fisqü fücur.
Ah, ədalət, hüquq və hürriyyət
Ayaq altında çeynənib gediyor.

***Mələk***
Əlverir səndə olsun əzmü səbat
Bu qaranlıq mühiti, get, parlat!
Haqqı anlat da, olma heç məyus.

***Peyğəmbər***
Məni bir kimsə dinləməz əfsus.

***Mələk***
Tanrı fərmanıdır bu, get söylə!

(Göyə işarətlə.)

Söylə ancaq onun lisanilə.

***Peyğəmbər***
Hangi möcüzlə? Mən ki, çox aciz
Bir qulam kimsəsiz, müdafiəsiz.

***Mələk***
(altun qablı bir kitab verir)

Haqqı təbliğ üçün sənin ancaq
Rəhbərin sənəti – kəlam olacaq.

Saçma, həp saçma başqa möcüzələr,
Bu kitab iştə ən böyük rəhbər:
Bəhs edər busədən, məhəbbətdən,
İncilər sərpər elmü hikmətdən.

Bu sırada bir skelet gah qorxunc və boğuq, gah müstəhzi və soyuq qəhqəhələrlə, torpaq rəngində bir ridayə bürünmüş olduğu halda Peyğəmbərin qarşısına çıxır.

***Skelet***

Nə qədər şairanə, dadlı xəyal,
Həp çocuqluq, əvət, xəyali – məhal!
(Ridasının altından sıyırılmış bir qılınc çıxarır)
İnqilab istəyirmisən, mənə bax!
İştə kəskin qılınc, kitabı burax.
Parlayıb durmadıqca əldə silah,
Əzilərsən qanın olar da mübah.
Eyləməz yardım incə hikmətlər,
Həp sönər busələr, məhəbbətlər.
Əvət, ancaq qılıncdadır qüvvət!
Bundadır haq, şərəf və hürriyyət!
(Çəkilmək istər)

***Peyğəmbər***

Sən nəsən ? Söylə !

***Skelet***

Mənmi ? Piri – nədim.
Rəmzi – tarix, o filosifi – qədim.
Qucağım oldu hər dəhayə beşik
Səni mən etmək istərəm təbrik.
Əvət, alnında parlayan yıldız
Məni cəlb etdi, şimdi sən yalnız
Dinləyib dərsi – hikmət al məndən.
Yoxsa könlündə yapdığın gülşən
Açmadan həp solub xərab olacaq.
Umduğun hər dəniz sərab olacaq...

Acı qəhqəhələrlə çəkilir. Peyğəmbər sarsılmış bir halda düçüncəyə dalır.

***Mələk***

(dadlı təbəssümlərlə)
Yenə bilməm neçin – neçin daldın?
Nə düşündün, neçin şaşıb qaldın?
Sevgidən xoşmu səncə atəşi – kin?
Yox, qılınc söz qədər deyil kəskin.
Tanrı keçmişdə həp qan istərkən,
İmdi məmnun fəqət məhəbbətdən.

### *Peyğəmbər*

Mən məhəbbət əsiriyəm... hər an,
Hər zaman özlərəm bir öylə cahan
Ki, bütün kainatı eşq olsun.
Könül uçduqca etila bulsun.
Rəqs edib orda möhtəşəm bir hiss,
Yasa batsın da, ağlasın iblis.
Qandan əsla görülməsin də əsər,
Saçsın al qönçələr şəfəqli səhər.
Orda üz bulmasın işkəncə, kədər,
Oxşasın ruhu pənbə röyalər.
Mənə gülsün də həp o nazlı xəyal,
Ah, o, yalnız o qayeyi – amal...

* * *

Onu duymaq, duyurmaq istərkən,
Gərirəm hər bəlayə köksümü mən.
Daş, tikən, ox, qılınc, tokat, yumruq
Həpsi xoş, hər nə gəlsə dönmək yox...
Kin, qərəz fışqırarsa vulkanlar,
Büğz, ədavət saçarsa tufanlar,
Çarpışır, of deməm, əvət məni sən
Çəkinər sanma heç mübarizədən.

Çünki həp mənliyim, kəmalım onun,
Hər düşüncəm, bütün xəyalım onun.
Məni həp cəzb edər o incə məal.
Ah, o, yalnız o qayeyi – amal!..

Peyğəmbər son sözləri söylərkən əllərini köksündə çarpaz edərək diz çökür, məftun və məczub bir tövrlə başını göyə doğru qaldırır. Mələk isə ilahi bir baxışla, ağır və duyulmaz bir hərəkətlə yüksəklərə çəkilir.

## HÜSEYİN KÜRDOĞLU

### *MƏHƏMMƏD (S)*

Qaranlıq kahasında qoca Məkkə dağında
Heyrətlə dinləyirdi asmanı Məhəmməd.

Cəbrayilin diliylə göydən ayə gəlirdi,
Təzədən tanıyırdı bu dünyanı Məhəmməd.

Ucadan dedi mələk: "Allahın rəsulusan,
Həkk eylə yaddaşına sən Quranı, Məhəmməd!

Sən bütün zamanların, məkanların oğlusan,
Nə məkanı hüdud bil, nə zamanı, Məhəmməd!"

Mələk qalxdı göylərə nurlu qanadlarıyla,
Sanki görmüş kimiydi Yarandı Məhəmməd.

Bir zaman sarvan olub dəvə karvanı çəkdi,
Indi gövhərlə yüklər o karvanı Məhəmməd.

Çilənməsin qan gərək haqqın iman yoluna,
Necə kəssin dünyadan nahaq qanı Məhəmməd.

Insanın xislətindən çıxsa tamah şeytanı,
Yeddi göyə ucaldar nərdivanı Məhəmməd.

Endi qayalı dağdan göylərdən enmiş kimi.
Səma rəngində gördü boz səhranı Məhəmməd.

Qayıdırdı Məkkəyə həyəcanlar içində,
Andırırdı günəşli bir tufanı Məhəmməd.

Qardaşlığa çağırdı bütün əhli – dünyanı,
Aləmə ayna tutdu pak vicdanı Məhəmməd.

Ağzı haça qılıncın sahibinə güvəndi,
Sevdi o yenilməyən qəhrəmanı Məhəmməd.

Sevdi Şahimərdanı əziz bir övlad kimi,
Kainatın günəşi, şərəf – şanı Məhəmməd.

Indi də bizimlədir ədalət yürüşündə
Islam səltənətinin ilk sultanı Məhəmməd.

Biçarə Kürdoğlunun keçəydi günahından
Şairlərin şairi, kərəm kanı Məhəmməd.

## AYDIN HÜSEYNOĞLU
## *PEYĞƏMBƏR*

Məkkə şəhərində, səzhra düzündə
Bir cavan var idi, nur çöhrəsində
Görənlər deyərmiş, qəmli gəzərdi,
Sanki, bu aləmin dərdin çəkərdi.

İllər dəyişirdi,ötürdü zaman
Artıq yaşlaşırdı bizim bu cavan.
Qırxı adlamışdı yaşı bir qədər
Bilmirdi başına gələcək nələr.

Üz tutdu səhraya Həra dağına
O müqəddəs yerə,Haqq dərgahına,
Üstündə oturdu iri bir daşın,
Səmaya qaldırdı mübarək başın.

Yenə də səs gəldi uca səmadan,
Bir daha çağırdı, Böyük Yaradan
Ey qulum, ey bəndəm, Mənəm Allahın,
Nə odu ki, sənə dəyişdi halın.

Diz çöküb alnını qoydu torpağa,
Bilmədi nə desin Ulu Tanrıya

- Allahım, mən zəif adi bəndəyəm,
Sənin də yanında xəcalətliyəm.

- Qüsurun olsaydı, səni seçməzdim,
Bu yüksək məqama heç yüksəltməzdim.
Musanın, İsanın və İbrahimin,
Yaqubun, İbrisin, gözəl Yusifin.

Hər birinin ayrı məqamı vardı
Səninsə məqamın daha ucadır,
Bu bəşər içində əzizsən mənə,
Hər zaman həmd söylə, tərif de mənə.

Həbibullah olacaq sənin ləqəbin
Mənası budur ki, «Mənim sevimlim».
Artıq seçdim səni, bil müqəddəssən,
Mənim tərəfimdən bir Peyğəmbərsən.

Olmazdı bu dünya sən olmasaydın,
Daim ucalmışdır səmada adın,
Şəninlə yaratdım mən bu aləmi,
Torpaqdan qaldırdım o ilk Adəmi.

Günəş kölgə olur sənin yanında,
Müqəddəs nurum var gül camalında,

Çiçəklər gül açır keçdiyin yerdən,
Kainat zövq alır sənin ətrindən.

Bütün hər şeylərdən pak etdim səni,
Günün beş çağında yad elə məni
Yadından çıxartma bu sözləri sən,
Nəbilər içində «ulul-əzim»sən.

Çatdır sözlərimi sən ümmətinə,
Yetişsinlər haqqa, Allah rəhminə,
Cənnəti onlara bəxşiş verərəm,
Verdiyim vədəni əməl edərəm.

Yer üzü hər zaman rəhmlə dolsun.
Bu gözəl məqamın mübarək olsun!

## Ş. İ. XƏTAİ

*MƏBƏS*

Təalallah, gəl ey gör kim, yenə nuri-xuda gəldi,
Cəmin-ənbiya xətmi Məhəmməd Mustafa gəldi.

Sevindi cani-aşiqlər, açıldı bəxti sadiqlər,
Oyandı ruhu-möminlər, səfa gəldi, səfa gəldi.

Zəminlərdə, zəmanlarda səlahül-xeyr məqdəmdir
Fələklərdən, mələklərdən hezaran mərhəba gəldi.

İrişdi mürşidi-kamil, qamü-əhli aman oldu,
Sevindi ğazilər cümlə ki, xətmi-ənbiya gəldi.

Həqə məzhərdürür Adəm, sücud et, uyma iblisə
Ki, Adəm donuna girmiş Xuda gəldi, Xuda gəldi.

Firişdə endi göglərdən, bəşarət əhli-ürfanə,
Xəvaricə əcəl yetdi, Yezidlərə bəla gəldi.

Zəlalət içrə zülmətdə itirmişdin çırağını,
Gözün aç, çıx bü zülmətdən ki, bir bədr-düça gəldi.

Xəlilullah donUn geymiş, verilmiş adı İsmail,
Ona qurban olun canlar ki, Allahdan nida gəldi.

Gözəl şahım, qəmər mahım, muradgahım, könülxahım,
Cəmali məzharüllahım, kərimi övliya gəldi.

Əzazil adlı şeytanın, yetər, təqlidinə uyma,
Əlin Tut, həqq yolun görsət, imami-rəhnüma gəldi.

Cəhani sehr ilə Firon ozünə tabe etmişdi,
Oları yutmağa Musa əsası əjdəha gəldi.

Bahadır qazilər qoydu, başında taci-dövlət var,
Budur Mehdi zəman dövri, cahan nuri bəqa gəldi.

Gözü sadü dili taha, yanağı qaf vəlquran,
Qaşü nunü, saçı vəlleyl, yüzi şəmsüz-züha gəldi.

İmami-Heydər, oğluna dilü candan riza ver gəl
İmamım Cəfəri Sadiq, Əli, Musa, Riza gəldi.

Xətai xəstə şol şahin cəmalın vəslini istər,
Rəvan ver can satun algil ki, elmi-can bəha gəldi.

## QULAMƏLİ AZƏRİ
## *MİSLİ BUGÜLÜN GƏLMƏYƏCƏKDİR*

Doldurdu bu gün nur ilə dünyanı Məhəmməd,
Təkmil elədi payeyi-imanı Məhəmməd.

Bütlər yıxılıb, heyrətə dinsizləri saldı,
Bu möcüzü hər kimsə görüb, behiştdə qaldı,
Kafirlərin əldən güc ilən qüdrətin aldı,
Heyran elədi kafərü nadanı Məhəmməd.

İran şahı görcək tağı viran arasında,
Heyrətdə qalıb kax ilə eyvan arasında.
«Aya, nə olub,» - söylədi – «İran arasında?»
Xofvə salıb ol gün şəhi-Sasanı Məhəmməd.

Nuşirəvana gördü bu iş dağdan ağırdı,
Bilmib nədir illət, vəzirin fövri çağırdı.
Od başladıra şahların ol gündə yağırdı,
Qəmnak elədi zalımı, tərsanı Məhəmməd.

Şah gördü vəziri gəlir xürrəmı xəndan,
Narahat olan gözləri baxdı ona heyran.
Buzərc görüb şah oturubdu çox hərasan,
Qəmgin eləyibdir, şəhi-dövranı Məhəmməd.

Şah söylədi: «Aya, nədir illət, gülüsən sən?
Odlar niyə xamuşdı, söylə, bilisən sən!

Tağım yıxılıb, indi gözünlə görüsən sən!»
Ərz etdi: «Çıxıb mehri-dirəxşani Məhəmməd.»

İstəklidi bu Xaliqinə, nuri-əzəldi,
Bir güldü üzü, Yusifi-Kənanə məsəldi.
Hər bil sifəti,bir şəha ondan da gözəldi,
Xəndan edəcək dəhrdə nadanı Məhəmməd.

Əxlaqi salar heyrətə aləmləri, şaha!
İslah eləyər dəhrdə adəmləri, şaha!
Təbdil eləyər şadlığa matəmləri, şaha!
Nahaq tökülə qoymayacaq qanı Məhəmməd.

Qəlbi sınanın könlün alıb şad edəcəkdir,
Məzlumlara hər yerdə o imdad edəcəkdir.
Yoxsulları ehsan eləyib yad edəcəkdir,
Şad eyləyəcək halı pərişanı Məhəmməd.

Bir gün edəcək şahları öz dininə dəvət,
«Allahı bilin tək» - deyəcək, - «vardı Qiyamət!»
Pak eyləyəcək hər nə ki var, harda cəhalət,
Hamvar edəcək məzluma meydanı Məhəmməd.

Bir güldü ki, misli bü gülün gəlməyəcəkdir,
Dünya üzü bir də belə gül görməyəcəkdir.
Dini, rəvişi həşrə kimi ölməyəcəkdir,
İsbat edəcək xaliqi-yektanı Məhəmməd.

## N.GƏNCƏVİ
## *PEYĞƏMBƏRİN MERACI*
### *(”Sirlər xəzinəsi” poeması)*

O cənub hökümdürı – peyğəmbər gecə yarı
Məşəl çəkib, nurlatdı dibsiz qaranlıqları.

Doqquz fələk apardı ona ənginliklərə,
Məşəl tutan oldular yolunda Ayla Zöhrə.

Göyün hərəm evindən keçdi onun sürəti
Yeddi iqlimi, altı tərəfi, dörd cəhəti.

Mübarək çöhrəsini görüncə gün qaraldı,
Gecə rəqsə başlayıb, özgə bir ahəng aldı.

Ağır yuxuya getdi yad gözlər yaman gözlər,
Uyğu üzəngisini çəkdi... tapdı peyğəmbər.

Can qəfəsilə birgə onun könlünün quşu
Uçdu dünya torundan, nə gözəldi uçuşu.

Dərhal büküb atdılar, görüncə çöhrəsini,
Mələklər qanadını, fələklər xirqəsini.

Onun can qəfəsində uçan qanadlı quşdu,
Can qəlibi qəlbindən xeyli yüngül olmuşdu.

Addım – addım can atır sanki yar nəfəsinə,
Allah çəkir onları vüsal məsafəsinə.

Ona dikib bu yolda iki cahan gözünü,
Səcdəsinə qapandı görən kimi üzünü.

Başı hər cür rütbədən çox uca olduğundan,
Bir mənzil əvəzinə yüz mənzil kəsdi, inan.

Hündür axurlu Rəxşi göyü tərlə islatdı,
Yəhəri son mövqedə şax bir çiyinə atdı.

Göylər – dəniz sədəfi, o sədəfin gövhəri,
Başına tac qoymağa apardılar irəli.

O ətirli gecədə çərx öküzü nə çaldı?
Bəlkə yer öküzündən min – min gövhəri aldı.

Səmavi yolçuluğun muştuluğu gör nədən:
Kəməri – Cevza bürcü tacı – Xərçəng bürcündən!

Başaq bürcü parladı, nur salxımı yaratdı,
“Sünbülə” ni götürüb arslan bürcünə atdı.

Tərəzinin düzəldib Zöhrə bir cüt pərini,
Ölçdü qutlu gecənin vəznini, dəyərini.

Silqətinin önündə səcdə qıldı tərəzi.
Daşdan, tərəzidən də ağırdı onun vəzni.

Qalxdı, əqrəb bürcünün yanaşdı quyruğuna,
Susənbər nəfəsindən bir məlhəm verdi ona.

Yay bürcü kamanından ov yıxan bir ox atdı,
Çəpiş Çudək bürcünü zəhirmardan çıxartdı.

Balıq qarnına girmiş Yunistək hut bürcündən,
Dolça bürcündən keçdi, Yusif doğdu hüsnündən.

Təxti Sürəyya təki quzu bürcündə qurdu,
Dərhal çöllərə çıxdı çiçəklər ordu – ordu.

O cənnət bağçasının gülü, laləsi yandı,
Yer üzü başdan – başa yaz rənginə boyandı.

Gecə gündüzə döndü,günorta günü par – par,
Sərvlər gül açdılar, möcüzəli bir bahar.

Dönüb bağa baxmalı, görməkçün nərgizləri,
Sürməylə sürməlendi onun nərgiz gözləri.

Yeddi qatlı göylərdən ədəb dərsi öyrənən
Peyğəmbər üzr istədi bütün peyğəmbərlərdən.

Neçə ulduz pərdəsi qədəmində dərbədər.
Bayrağını daşıyar ağ çiynində mələklər.

Gecənin göbəyində dil – dodağının mişgi,
Atının ayağında aypara bir nal təki.

Bu qaranlıq gecədə atəşmidir parlayan?
Yoxsa şimşək saçılır Bürağın dırnağından!

Firuzə qübbələrdən çıxdı yeddinci qata,
Əl - əl gəzən gül kimi çatdı tanrısal taxta,

Qolsuz bir köynəkmidir Sidr ağacı əyninə?
Ərşin yaxası dəyir onun əl – ətəyinə.

Üzgün yoldaşlarını yormuşdu göy yolları,
Bükülüb qanadları, qırılmışdı qolları.

O, azmış qəribə kimi heyrət içrə yüyürdü,
Yalnız ulu tanrının qapısını döyürdü.

Keşik çəkən mələklər izlədilər yolunu,
Çəkilib, kəcavədə təkcə qoydular onu.

O yolçusu olmayan yolda təkcə açıb iz,
Gedirdi, bir qədəmi o birindən xəbərsiz.

O, əsrar pərdəsinin bayıldı qapısında,
Ondan başqa heç bir kəs çatmamışdı bu qata.

Ayağı kainatın başınada bir qızıl tac,
Ərşin özü də bu cür ülvi nemətə möhtac!

Üstündən qələm çəkdi hər nə varsa cahanda,
Ərş üstündə ucaltdı bayrağını bir anda.

Can qorxusu içində sayıqlarkən kainat,
Verdi can ölkəsini bədən mülkünə sovqat.

Ərşin son nöqtəsində yolçuluq başa çatdı,
Ürək, can işləri də cana, ürəyə yatdı.

Hansı yerdən gəlibsə, həmən yerə çapdı ruh,
Xəyal tapa bilməyən bir gözəllik tapdı ruh.

Addım – addım yüyürdü, mənzilə ilk çatdı o,
Göylərin libasını əynindən çıxartdı o.

Gücü gəldikcə getdi,çixdi hünər yolları
Bu sonsuz təbiətin yaxasından dışarı.

Əzəməti, hümməti pak bir aləm yaratdı,
Mənzili bilinməyən ülvi bir qata çatdı.

Qurşağından yapışıb onu ucaltdı qeyrət,
Yüyənindən yapışıb, guşədən çəkdi heyrət.

Yürüsə də, canında bir yorğunluq duymadı,
Aradı həndəvəri, gəzdiyini bulmadı.

Mənliyindən keçincə, tapdı arzu – kamını,
Tanrı mərtəbəsində aldılar salamını.

Vüsal əli döşündə, aldı töhfə gülünü,
Cah – cəlal sarayının qaldırdı ağ tülünü.

Ayaq gedib gəlməyi həvalə etdi başa,
Qəlbin gözü nə gördü? İlahi bir tamaşa!

Seyr etdiyi o nurun harda tayı, misli var?
Nə zaval deyə bilər, nə xəyal onu qavrar.

Aşiqliyi elə bil gözünə işıq verdi.
Görünməyən tanrını aşiq gözüylə gördü.

Lakin, onu görməyin məkanı, zamanı yox,
Zamandan və məkandan çünki çox ucadır,çox!

O idrakın gözündən gizlənə bilməz heç vaxt,
“Onu görə bilmərik!”deyənlər kordu ancaq.

Tapındığını görmək bir səadətdir, bəli,
Mütləq görülməlidir O, mütləq görülməli!

O pərdəni görməyə məkan varmı? Məkan yox.
Yürüməyə, çatmağa zaman varmı? Zaman yox.

O pərdənin ardını görməyi bacaranlar,
Məkanı tapmasa da, laməkana yol tapar.

Tanrı sifətlərini inkar küfrüdür Sakın.
Cahil olma, nə yönü, nə yeri var allahın.

Tanrı var, fəqət onun mənzili, məqamı yox,
Məkana möhtac olan Tanrı sayılarmı? Yox!

Həzrət Məhəmməd onu başqa ölçüylə gördü:
Ürək, idrak gözüylə, zəka gücüylə gördü.

Haqqın hazırladığı meydən içdi Peyğəmbər,
Bizim də qəlbimizə damızdırdı bir qədər.

O, tanrının lütfünü nəfəsində sanırdı,
Tanrı çəkir nazını, o, isə nazlanırdı.

Şəkər təbəssüm ilə süslənib dodaqları,
Dua etdi Tanrıya: - Bizə nicat ver barı!

Xəzinədən zəngindir onun hümməti qat – qat,
Qəlbindəki hər murad açdı o gün qol – qanad.

Elə ki, qüvvət aldı Tanrının qəbulundan,
Yenə emal evinə üz qoydu müdrik insan.

Eşqin cazibəsilə qət etdiyi səfəri
Bircə nəfəs içində bitirib, döndü geri.

Ey sözü dilimizin duzu, qəndi peyğəmbər!
Canımıza dərmandır saçdığın ətir, ənbər.

Səxavətin nurlatsın bu dünyanın gözünü,
Nizamiyə yardım et, tamamlasın sözünü.

## N.GƏNCƏVİ
### *PEYĞƏMBƏRİN MERACI*
### *(“Leyli və Məcnun” poeması)*

Sən, ey mənaların meracı olan,
Sənin meracındır sonsuz asiman.
Yeddi xəzinəni açaraq bir dəm,
Dörd gövhər üstünə basmısan qədəm
Sığmadın zamanın dar sinəsinə,
Ucaldın göylərin son zirvəsinə.
Gecə qara bayrağ tutduğu zaman
Oldu qara atın mənzilə rəvan.
O vaxt qanad açdı sənin ayağın,
Göyün xəlvət yeri oldu dayağın.
Bu fani dünyada sən yüksələndə.
Sən Ümmi Haniyə qonaq gələndə,
Cəbrayil gətirdi sənə şad xəbər.
Dedi: - Qulluğuna hazırdır göylər,
Göylərdə mələylər səf – səf düzülmüş,
Bütün göy aləmi seyrinə gəlmiş.
Oyan, yuxu vaxtı deyildir, haray,
Sənintək Günəşə müntəzərdir Ay.
Yerini Ütarid bilməyəcəkdir,
Düşərgən hər yerdən daha yüksəkdir.
Şabaş sinəsini qaldırmış Zöhrə,

Deyir: "Şərq batacaq al şəfəqlərə".
Günəş də incəlib olmuşdur hilal,
Yolundan çəkilmiş sanki bir xəyal.
Mərrix qulluqçudur yataq evinə,
Üzəngindən tutan uşaqdır sənə.
Müştəri yoluna doğandan bəri
Yanıb qamaşdırır yaman gözləri.
Keyvan qulağına halqa taxaraq,
Qul kimi qaldırmış bir qara bayraq.
Bu cürə qulların köməyilə sən.
Getdiyi yolları xoş keçəcəksən.
Qədr gecəsidir bu gecə, tələs,
Onun qədrini bil gecikmə əbəs.
Bu gecə hüsnüdür əbədiyyətin,
Merac gecəsidir bu Muhəmmədin.
O gecə nə qədər xoşbəxtdi, bilsən,
Gündüztək parladı ilk qədəmindən.
Bu qara torpağa qoyub da pərgar,
Gəzdin göy üzünü sən diyar – diyar.
Ildırım Buraqı mindin dünyada,
Sənin gedişindən yumuşaldı o da.
O bakir yaranan taxt üstündə sən
Bir səadət kimi açmışdı yelkən.
Minib bu tək ata göylərdə çaxdın,
Cüt atlı rüzgarı dalda buraxdın.

Fələklər bağına girən zaman sən,
Ağlı, qırmızılı xoş meyvələrdən
Qapına minlərcə salxım yollandı,
Sənin gözündəydi eşqin son andı.
Qalxanda göylərin yeddi qatına,
Nə pərçəm, nə də bir tac qurdu ona,
Yırtıldı göylərin bulud qabağı,
Sınıb parçalandı Ayın tabağı
Tovuz qanadlılar çıxıb göylərdən
Qarşında qol – qanad tökdülər birdən.
Cəbrail səninlə gedə bilmədi,
Allaha tapşırıb, yaxşı yol, - dedi:
Mikayıl yer verdi sənə başında,
Israfil qul kimi durdu qarşında,
Özünü kölgətək ayağa saldı,
O, da yarı yolda yorulub qaldı.
Bir Rəfrəf səninlə mənzilə vardı,
O, Sidrə taxtına səni apardı.
Sidrənin üstündən keçən zaman sən
Hədis dəftərini yazdın əlinlən.
Yeddi qat göylərdən keçib yüksəldin,
Yüksəlib ən uca zirvəyə gəldin.
“Sübbuh”söylədilər göy sakinləri,
Kölgənin nurunda çimdi min pəri.
Əşrin çadırında uşdun yenə sən,

Üzünü göstərdin teyniş pərdədən.
Çıxdın tərəflərin zülmətlərindən.
Yüksəyin , alçağın zəhmətlərindən.
Qutardın paltarın ağırlığından,
Tacı da, taxtı da atdın o zaman,
Xeyməni götürüb iki aləmdən,
Tanrı gərdəyini eylədin məskən.
Həm böyük Allahı ziyarət etdin,
Həmdə Haqq sözünün sirrinə yetdin.
Sənin eşitməyin, birdə görməyin
Ağıldan, idrakdan uzaqdır, yəqin.
Açdın ürəyini sən sərin – sərin,
Adına layiqdir istədiklərin.
Verdi istəyini böyük Yaradan,
Sən razı qayıtdın Tanrı yanından.
Alnın nar gülütək açıldı yenə,
Kərəm fərmanını aldın əlinə.
Sənin xatirinə o böyük Tanrı
Əhf etdi biz kimi günahkarları.
Şahımız , kölğədən tutmuşuq qərar,
Bizim bu dünyada nə dərdimiz var!
Sən bizə ruh verən Günəşsən artıq,
Daima parlasan, bizdə solmarıq.
Vicdanım mürvvət dənizidir, bil,
Nübüvvət göyləri sənin tərindir.

Sənsiz mürvət də, göylər hakimi,
Xalqa görünməzdi nübüvvət limi.
Səndən uzaq düşən hər kəs, hər nəfər
Səadət üstündən bir qələm çəkər.
Vəfa kəmərini belə bağlayan
Düşməz əbədiyyət taxtından bir an.
Baxıb İrəm bağı bu vüqarına,
Ətir xərac verir ruziğarına.
Göylər baratını yazıb göylərə,
Bir xəzinə kimi qayıtdın yerə.
Göyləri keçdiyin o sürətlə sən,
Nolar, Nizamiyə bir söz söyləsən.
Çoxmu qalacqsan sən bu niqabda?
Çoxmu yatacaqsan o rəxti – xabda?
Bir oyan, üzündən bu örtünü at,
Şahını şahmatın taxtında oynat!
O yük dalındakı süfrəni göstər,
Xəyalım aləmi pərdəsiz istər.
Ağ ilə qaranın rəngini sil sən,
Qaldır ziddiyyəti dörd təbiətdən.
Iki həvasızın əhdini bir et,
Bu dörd ayaqlını özün əlbir et.
Həyatı kəmala verəndən bəri,
Həll etdin aləmdə çətinlikləri.
Nafəndən küləyə bir ətir versən,

Bizə də hay düşər bu nemətindən.[1]
Əzəi lövhəsini bilirsən əzbər,
Ondan bir ayə də bizimçün göndər.
Zəhmətsiz tapdığın elmdən bir az
Biz kimik, nəçiyik, aç göstər artıq,
Büt qayıranmıyıq, büt qıranmıyıq?
Ey mənim işimi düzəldən qüdrət,
Sənsən Nizaminin qəlbinə qüvvət.
Könül, gəl, bununla qənaət elə!
O böyük Tamrıdan şəfaət dilə!
Ta ki bu pərdəni almasın bizdən,
Bu pərdə qalxmasın hec üzümüzdən.

[1] N.Gəncəvi"Leyli və Məcnun" poeması

**N.GƏNCƏVİ**
***PEYĞƏMBƏRİN MERACI***
***("Yeddi gözəl" poeması)***

Onun sığışmırdı cahana tacı,
Taxtını ərş üstə qurdu meracı.
Cəbrail gətirdi Büraq: - Qalx, - deyə,
Bu alçaq torpaqdan o yüksək göyə.
Dedi: "Min küləyə, yer oğlu, atlan,
Göylər adamına çevril, qanadlan,
Keşik çəkmək üçün bütün gecəni
Seçdilər bu gecə yataqdar səni.
Ildırım yerişli Büraq sənindir,
Otur ki, bu gecə yataq sənindir.
Mən sənə gətirdim yataq qisməti,
Min ki, yel kimidir atın sürəti.
Taxtını göyə çək, özünsən hilal,
Şahsan, ulduzlara tələsib yol al.
Altı cəhəti üz yeddi kökündən,
O doqquz fələyi çarmıxa çək sən.
Səmakdan atını çaparaq, ucal,
Bakir mələkləri tut, kəməndə sal.
Göyün ulduzları izləyir səni,
Yaşıl geyimlilər gözləyir səni.
Göylərin o misri nazəninləri,

Yusifin aşiqi o dilbər pəri,
Züleyxa kimi, bax, vurulmuş sənə,
Olmuş eşqə dustaq, vurulmuş sənə.
Səni görmək üçün, gəl, göyə yüksəl,
Doğrasınlar turunc, doğrasınlar əl.
Ayağın altına al asimanı,
Bəzənsin nurunla göyün eyvanı.
Parla qönçə verən yaşıl bağ kimi,
Işıq sal göylərə çilçıraq kimi.
Dua zamanıdır, sənindir gecə,
Istəyin olacaq öz diləyincə.
Mələklər yurdunun fərşini bəzə,
Göylərin fövqündə çadır qur təzə.
Nur saç ki, parlasın ərşin gözləri,
Parçala zülməti, aydınlat yeri.
Tac sənə layiqdir, alginən tacı,
Başçısan, göylərə eylə meracı.
Ucalt öz başını, bu himmətinlə!
Hər iki aləmi bəxtiyar eylə.
Yolunu təmizlə, qoyma toz ola,
Tanrı dərgahına yönəl, düş yola.
Alsın öz haqqını ayağın sənin,
Ucalsın hər yerdə bayrağın sənin!”
Açantək bu sirri Cəbrayıl ona,
Muhəmməd bu sözdən gəldi həycana.

Huşunu itirib ətrafa baxdı,
Qulluq sırğasını qulağa taxdı.
Peyğəmbər əmindir, Cəbrail əmin,
Onları qorxutmaz nə şeytan, nə cin.
Tanrı kəlamını o nazil edər,
Bu, sözdə, dəlildə aqil, mötəbər.
O dedi Allahın hər peyğamını,
Bu duydu elçinin sirr – kəl amını.
Qaranlıq gecədə o parlaq çıraq
Alınca Tanrının əmrindən soraq,
Olmadı halqalı kəməndə yağı,
Tapılmaz belə bir zər boyunbağı.
Minib də Büraqa ildırımvarı,
O cumdu göylərə əldə tatarı.
Şahin qanadıyla basınca ayaq
Sıçradı yerindən o, kəkilsayaq.
Qəşəng ayaqları hilal vururdu,
Başında Keykavus taxtı qururdu.
Uçurdu, çox iti sürəti vardı,
Dörd şahın dalınca qanad salardı.
Hər şey dalda qaldı, öndə o təkdi,
Gecə təpik yedi, ay cilov çəkdi.
Gördünmü xəyalı yeriyən zaman,
Şimşəyi parlayıb çıxanda qından
Dünya gəzən ağlın sürətini sən,

Gənclikdə həyacan qüvvətini sən?
Hamısı axsadı, yolda ləng oldu,
Geniş addımları döndü təng oldu.
O çapdıqca belə göy üzündə at,
Qaldı cənub qütbü, şimal qütbü mat.
Yolda göstərdi Səmak cədvəli,
Ona gah ramehi, gah da Əzəli.
Onun Büraqının oynaq ayağı,
Yazıb bitirincə bu göy varağı.
Açdı cahan ona darvaza, getdi,
Göylərin dövrünə pərvaza getdi.
Uçduqca yüksəldi, keçdi fələklər,
Baş yolda mələktək açmışdı şəhpər.
Onun xoş sifəti, gözəl camalı,
Nura qərq eylədi göydə hilalı.
Parlaq Ütaridi o zərgər aldı,
Gümüş kürəsinin rənginə saldı.
Dön, məhtab rəngində sən də ol, deyə,
Gümüş pərdə çəkdi parlaq Zöhrəyə.
Yolunun tozundan, edərkən merac,
Günəşin başına qoydu zərli tac.
Yaşıl geydiyiçin xəlifəyi – şan,
Geyinsin söylədi qırmızı, Bəhram.
Müştəri xəstədir gördü, əlbəəl,
Çəkdi bədəninə naxoşun sənbəl.

Keyvan ayaq öpdü qapanıb yerə,
Çevrildi bayrağı dərhal ənbərə,
Köhləni elə bil zəncirli şirdi.
O, səhər yelitək çapıb gedirdi,
Başa çatdırmayıb bu çataçatı
Yoruldu yoldaşı, yoruldu atı.
O gəlib çatınca uzaq mənzilə,
Gördü bağlanmışdır yol Cəbrailə.
Keçdi Mikayılın taxtından haman.
Suri – İsrafilin rəsədgahından
Ötdü daha əngin yüksəkliklərə,
Qaldı öz yerində Rəfrəflə Sidrə.
Yol yoldaşlarını qoyaraq dala,
Keçdi qətrə - qətrə həmin dəryanı,
Öyrəndi hər şeyi, hər bir mənanı.
Ərşin zirvəsinə elə ki yetdi,
Niyaz kəməndini nərdivan etdi.
Nurlu ərşi ötüb keçdi dərinə,
Ilahi sirlərin qorxunc yerinə.
Çatınca, bürüdü qəlbini heyrət,
Gəlib cilovunu saxladı rəhmət.
Sıxılmış kəmanı açıldı dərhal,
Ayrılıq qurtardı, üz verdi vüsal.
Nurdan pərdələri yırtarkən özü,
Pərdəsiz bir nura sataşdı gözü.

Keçdi varlıqından bir az o yana,
Rast gəldi o zaman vahid rəhmana.
Elə ki gözüylə gördü məbudu,
Hər nə görmüşdüsə, tamam unutdu.
Gözləri tutmadı bir yerdə məqam,
Çünki hər tərəfdən eşitdi salam.
Aşağı – yuxarı, dal – qabaq, sol – sağ –
Altı cəhət oldu bir cəhət ancaq.
Bir yerdən ki qaça cəhətlə cahan,
Orda altı cəhət taparmı meydan?
Cəhətsizin işi cəhətsiz aşar,
Odur ki, cəhətsiz oldu o pərgar.
Çəkməyincə gözü cəhətə pərdə,
Qəlbi düşdü qəmə, qorxuya, dərdə.
Bir yerdə ki, gözdən gizlənir cəhət,
Cəhətsizi görmək mümkündür, əlbət.
Nəbidən qalmışdı ancaq bir nəfəs,
Təkcə Allah idi, yoxdu başqa kəs.
Hər şeyi əhatə edən aləmi
Cəhət əhatəyə cürət edərmi?
Ixlas badəsindən içərək şərbət,
Həqdən bərat aldı geydi xələt.
Səadət – bir qədəh, mərifət – saqi,
Içdi, bir qətrə də qoymadı baqi.
Yüz minlərlə salam ötürdü onu,

Asimandan yerə gətirdi onu,
O nələr almışsa hey vara – vara,
Verdi dostlarına – günahkarlara.
Ey Nizami, bəsdir, dünyadan çək əl,
Alçaldığın yetər, göylərə yüksəl.
Çalış axirətdə qur öz yurdunu,
Muhəmməd dinində taparsan onu.
Ağlına əqidən olsa pasiban,
Şəriət nuruyla xoşbəxt olarsan.[1]

[1] "Yeddi gözəl poemasından"

**N.GƏNCƏVİ**
***PEYĞƏMBƏRİN MERACI***
***("Şərəfnamə" poeması)***

Göy gecə məclisi qızışdırmışdı,
İşıqdan gecənin gözü qamaşdı.
O yeddi fələyə o yeddi ülkər
Çin ipəklərinə düzmüş dürr, gövhər.
Cənnət keşikçisi huri, pərilər
Hər köşkə vurmuşdu yaraşıq, zivər.
Bu taxtın soltanı olan Məhəmməd,
Keçən elçilərdən odur vəliəhd.
Müşkünü saçaraq "Beyti əqsayə"
Məkkədən ucaldı ərşi – əlayə.
Cismini qurtardı dünya dərdindən,
Etdi ərş əhlinin qəlbində məskən.
Yetmiş yollu yurddan köçünü vurdu,
Çadırı yeddinci fələkdə qurdu.
Doqquz hücrəsini bir an buraxdı,
Göyün doqquzuncu tağına qalxdı.
Yeddinci əflakə çapdığın zaman
Dişarı atıldı dördkünc daxmadan.
Altında şimşəktək şığıyan Büraq,
Günəşə qərq olmuş yəhərlə yaraq.
Ərəb səmasında bir Süheyl çapdı,

Yəmən gönü ondan yeni rəng tapdı.
Dırnağı inciydi, quyruğu ipək,
İpəyin üstündə oynar incitək.
Göbəyi müşk,ceyran deyildi, bişəkk,
Bir düzüm inciydi ceyran dişitək.
Yüyəni xəyalə gələndən yumşaq,
Yürüşü oxdan da kəskin və qıvraq.
Ən kəskin, ən mətin xəyal şəhpəri
Ondan yetmiş addım qalırdı geri.
Aləmlər aşmaqda bir firiştəsən,
Aləmlər çəkirsən öz arxanda sən.
Gecə otlağından, sərxoş olaraq
Ay kimi gəlmişdi əldə şəbçıraq.
Elə bir sürətli addımlar atar,
Hərəkə edincə mənzilə çatar.
Ən kəskin nəzərlə uçar yan – yana,
Nəzəri alırdı ayaq altına.
Məhəmməd peyğəmbər atı çapırdı,
O səyyar dənizdən toz qoparırdı.
Özü yol biləndi, atı yeriyən,
Bu ata, o şaha olsun yüz əhsən.
Evindən qapıya qalxdığı zaman
Əlindən təzə don geydi asiman.
Onunla qaranlıq göy oldu gülzar,
Ondan nur alırdı sönük ulduzlar.

Pak olan bu təmiz pərdədə gərək
Vücuddan cismani tozları silmək,
Çatdı hər dənizə yeddi ülkərdə,
Yeddi  yol yuyundu o dənizlərdə.
Cismindən verdi hər ulduza maya,
Yuxu beşiyini buraxdı aya.
Ütarid ulduza verdi qələmi,
Əlinə qələmi alarmı ümmi?
Cismani şəhvəti Nahidə verdi,
Şükr üçün kükəni Xurşidə verdi.
Mərrixə buraxdı qəzəb və acıq,
Acıq burda getməz irəli artıq.
Müştəri ulduza kibri buraxdı,
Üzüyə ən parlaq yeni qaş taxdı.
Ünsürü Keyvana tərəf ataraq,
Özüylə pak gövhər götürdü ancaq,
Hər mənzil başında bəxşiş verərək
Qaldı varlığından yalnız bir ürək.
Nəbilər hörmətlə baş əydi ona,
Əl çəkdi yəhərin saf quncuğuna.
At sürdü yollardan, dağlardan keçdi,
Bir sıra təpəni bir anda biçdi.
Yanında qasiddi Xızr ilə Musa,
Atının önündə gedirdi İsa.
Bir nəfəs alınca, kirpik vurunca,

Yaxud bir göz açıb dərhal yumunca
Göyün günbədini aşdı arada,
Yerləri, göyləri qoydu arxada.
Elə bir sürətlə parlatdı yüyən,
Ətrafdan olmazdı tozunu görən.
Onun bu yürüşdə atdığı oxdan
Fələk neçə ox da geriydi çoxdan.
O uzaq göylərdə nurani adı
Ruhani kəslərə nur bağışladı.
Cığırsız bir yola, artıq yol saldı,
Həm atı yoruldu, həm yükü qaldı.
O yolda qol – qanad tökdü Cəbrail,
Qorxudan durmayıb qaçdı İsrafil.
Rəfrəfdən keçərək bir neçə fərsəng
Gördü o pərdədə müxtəlif ahəng.
Sidrədən ərşin pak səqfinə qədər
İsmətdən bir kilim döşədi dilbər.
Ərş divangahını sürətlə keçdi,
Dərcin də yolunu bir anda biçdi.
Çatdı son nöqtəyə cəhət diyarı,
Bitdi o nöqtədə dövran pərgarı.
Yer oğlu göylərdə hey at oynatdı,
Yerləri, göyləri arxaya atdı.
Mücərrəd dolanmaq çatdı bir yerə,
Cismani varlığı itdi bilmərrə.

Yoxluq yollarında edərkən cövlan
Büsbütün ayrıldı öz varlığından.
Ruhani dairə gərdişlərində
Başıyla ayağı düşdü bir bəndə.
Çatdı altı, üstü olmayan yerə,
Çünki altı, üstü bilməz dairə.
Siyasət pərdəsi atıldı birdən,
Hücrə təmizləndi biganələrdən.
O yerdə ki, idrak tapmayır məkan,
Salam Məhəmməddən, qəbul tanrıdan
Ağızdan çıxmayan səsi eşitdi,
Görünməz simanı ziyarət etdi.
Elə pak göründü o sahibcəlal,
Nə cəhət nəzərə çarpdı, nə xəyal.
Vücudu nərgiztək bir gözə döndü,
Bir kirpik qırpmadan tanrıya çöndü.
Yoxsa bu bağdakı sırf nərgiz olan
Gözünə bir sürmə çəkmiş “mağaz”dan.
Keçdi bir dost kimi süfrə səmtinə,
Yedi, pay ayırdı öz ümmətinə.
Ürəyi allahın nuriylə doldu,
Bir yetim, bax, necə padişah oldu.
Dünyaya qayıtdı çöhrəsi parlaq,
Hər elmə, hikmətə vaqif olaraq.
O yolu tez getdi, tez döndü yenə,

Bu sürət heç kəsin sığmaz fikrinə.
Şimşəktək şığıdı eylə sürətlə,
Dönərkən yatağı istiydi hələ.
O gecə adi bir gecə deyildi,
O bir gecəydimi, yaxud bir ildi?
Bəs bizim ruhumuz məgər bir anda
Dolaşa bilmirmi bu asimanda?
Ruhumuzdan zərif olan bu insan
Bir anda aləmi seyr etdi, inan.
Gözəldir, səpərək can gövhərini,
Tərifə başlasam dörd yavərini.
Dörd gövhər satan var, dörd gövhər alan,
Artıq – əskiyinə qarışmaz satan.
Əlinin eşqində sabit qədəməm,
Ömər sevgisindən uzaq deyiləm.
Hər iki nur ilə nurlanır dimaq:
Əbubəkr bir şamdır,Osman bir çıraq.
Bu dərviş sifətli dörd böyük soltan,
Dünyaya olmuş dörd təkbir oxuyan.
Nəbilər önündə gedənə alqış,
Üzrləri qəbul edənə alqış.
Sənsən yaranışda birinci xilqət,
Dövranın sonunda sonuncu ayət.
Hər iki aləmə mübarək sənsən,
Sənə bir tay varsa, o da tək sənsən.

Sənsən xəzinələr qıflına açar.
Yaxşını, yamanı edən aşikar.
Ən gözəl günündə "ümmətim" deyə,
Şəfaət edirsən suçlu bəndəyə.
Bir ovuc torpaqam mən dərgahında,
Artıq bir şikaram şikargahında.
Nizami tutmuşdur Gəncədə məkan,
O, məhrum olmasın salamlarından.[1]

[1] N. Gəncəvi "Şərəfnamə"

## M. FÜZULİ
## *BU, ŞƏBİ – MERAC BƏYANİDİR VƏ TÜLUİ – AFTABİ – ASİMANİDİR*

**1.** Çün feyzi – vücudun ilə, ey pak,
Rəşki – fələk oldu ərseyi – xak,
Didarını görməyi mələklər,
Pabusuna yetməyi fələklər,
Çox eyləyib iztirab peyda,
Allahdan etdilər təmənna.
**2.** Bir yaxşı zaman, şərəfli saət
Rəf oldu dualərə icabət.
Cibril yetib, yetirdi fərman,
**3.** Key sərvi – riyazi – elmü irfan!
Xurşidini ərşə sayə qılğıl!
Meraci büləndpayə qılğıl!
Ey qədri bülənd padişəh, dur!
Lütf et, şəbi – qədr qədrin artır!
Rəf eylə hicabi – masəvani,
Seyr eylə məkani – laməkani!
Müştaqi – cəmaldır mələklər,
Möhtaci – vüsaldır fələklər.
**4.** Eyvani – süpehrdə sitarə
Min – min göz açıbdır intizarə.
Xoş ol ki, minib Büraqi xoşhal,

Buldun dərəcati – izzü iqbal.
Basdın ayağın bu çar tağə,
Çıxdın dərəcati – möhrəvağə.
**5.** Nəleyninə sürdü üz məhi – növ,
Xurşid rüxündən aldı pərtöv.
Göstərdi Ütarid* ehtiramın,
Xət verdi ki, mən sənin qulamın.
Nahidin edib füzun nişatın,
Bəzmi – tərəb eylədin büsatın.
**6.** İqbalın olub qərini – xurşid,
Öyrətdi Məsihə rəsmi – təcrid.
Tiğində bulub nizam əyyam,
Təlimi – şücaət aldı Bəhram.
**7.** Bürseysə* - müsaid oldu iqbal,
Feyzi – qədəmindən oldu xoşhal.
Keyvan* şəbi – qədrin eylədin ruz,
Oldun ona şəmi – məclisəfruz.
**8.** Rəyət – səfi – sabitatə çəkdin,
Ol məzrəə mehr toxmun əkdin;
Qıldın fələk ətləsini rəngin,
Ol məhfilə verdin özgə ayin.
**9.** Lövhü qələmi müzəyyən etdin,
Kürsi ilə ərşi rövşən etdin.
Cibrili qoyub, Büraqı saldın.
Tövhid yolunda fərd qaldın.

Rəf oldu sənə hicabi – mabeyin.
Nüzhətgəhin oldu qabi – qövseyin.
Getdin o yerə ki, getmək – olmaz,
Yetdin o yerə ki, yetmək olmaz.
**10.** Bizdən həqə ərzlər yetirdin,
Həqdən bizə müjdələr gətirdin.
Lüft etdi sənə inayəti – həq;
Tövfiq nifazü əmri – mütləq;
Həm məxzəni – mərifət kilidi,
Həm nemətü mərhəmət ümidi.
**11.**  Dəryadə olub ğəni gühərdən,
Zövq ilə dönəndə ol səfərdən
Gərm idi hənuz xabgahin,
Cünbüşdə ğübari – xaki – rahın.
Insaf həmin ola siyahət,
Böylə səfər ilə istirahət.
**12.** Oldu sənə feyz bunca hasil,
Bu vaqiədən zəmanə ğafil
Ğafilləri eylədin xəbərdar,
Əsrari – nihani etdin izhar.
**13.** Açdın dəri – iltifatü ənam,
Verdin gərəyincə hər kəsə kam.
Çün şəfqəti – amin oldu məqsum,
Lütf eylə məni, həm etmə məhrum.
**14.** Biçarə Füzuliyəm ki, zarəm,

Zülli – günəh ilə şərmsarəm.
Tədbirdə süstəmü səbükray,
Sən bir mədəd etməsən mənə, vay!
**15.** Ey məşəleyi – təriqi – tarik,
Vey rahnümayi – rahi – barik!
Ehsanını hadiyi – təriq et,
Bir feyzi – nəzər mənə rəfiq et,
Kalayişi – ixtilafdan pak,
Peyrəvliyin eyləyim tərəbnak,
Gülzari – vücudum edə seyrab,
Barani – riyazi – alü əshab!

## AÇIQLAMA
## *BU, MERAC GECƏSİNİN TƏSVİRİ VƏ GÜNƏŞİN GÖYƏ ÇIXMASIDIR*

1.Ey pak, sənin varlığının bərəkətinə göylər qısqanarkən, mələklər səni görməyi, fələklər ayağını öpməyi Allahdan dilədilər.

2.Bir xoş və şərəfli saatda duaları qəbul olmuşdu. Cəbrayıl gəlib fərman gətirdi:

3.Ey elm və ürfan bağçalarının sərvi, ey uca dəyərli padşah, qalx , günəşin göylərin kölgəsi olsun,

meracını yüksəlt, lütf elə qədr gecəsinin qiymətini artır, göylərin pərdəsini aç, sonsuz məkanı seyr elə, mələklər camalının həsrətindədir, fələklər görüşünün möhtacıdırlar,

4.Göylərin qatlarında səyyarələr sənin intizarını çəkir! Yaxşı ki xoşhallıqla Buraqa minib izzət və iqal dərəcəsinə qalxdın, dörd tağlı doqquz qatlı göylərə yüksəldin.

5.Yeni ay sənin  başmaqlarına üzünü sürtdü, günəş parlaqlığını sənin yanaqlarından aldı, Ütarid hörmət göstərərək " mən sənin qulunam" dedi, Zöhrənin sevinci aşdı – daşdı, əyləncə məclisi düzəltdi.

6. Bəxtin günəşə yaxınlaşıb İsaya təklik yolunu öyrətdi. Dövran sənin qılıncından nizama düşdü və Bəhram ondan şücaət dərsi aldı.
7. Bürceysin üzünə bəxt güldü, sənin qədəminin feyzindən xoşhal oldu. Keyvanın qədr gecəsi gündüzə çevrildi və onun məclisinə işıq verən şamı sən oldun.
8.Sabitlər cərgəsində bayraq qaldırdın, mərhəmət toxumu əkdin, göylərin atlasını rəngbərəng etdin, o məclisə başqa bir şəkil verdin.

9.Lövhəni və qələmi bəzədin, kürsünü və ərşi işıqlatdın. Cəbrayılı orada qoyub, Buraqı sürdün. Allahın birliyi yolunda tək qaldın. Sənin üçün aradakı pərdə açıldı. Gəzib dolaşdığın yer iç – içə girmiş iki yay arası qədər yaxın oldu. Gedilməyən yerlərə getdin, çatılmayan yerlərə çatdın.

10. Haqqa bizdən xəbər apardın, haqqdan bizə müjdələr gətirdin. Hörmətinin və əmrinin kəsərinə yoldaş eyləyən haqq sənə lütf eyləyib kömək göstərdi – həm bilik xəzinəsinin açarını, həm də nemət və mərhəmət ümidi verdi.

11. Dəryada incidən doyub, zövq ilə o səfərdən dönərkən yatağın isti idi. Cənnətdə isə ayağının tozu var idi. İnsafla desək, elə yolçunun belə də istirahəti olmalıdır.

12.Sənə bu bərəkət yetişdikdə zəmanə bundan xəbərsiz idi. Gizli sirrləri açaraq qafilləri xəbərdar elədin.

13.İltifat və neymətlər qapısını açıb hər kəsi muradına yetirdin. Hər kəsə qaib şəfqətini böləndə, mərhəmət elə, məni də unutma.

14.Biçarə Füzuliyəm, ağlayıram , günahkaram, xəcalətliyəm, düşüncədə zəif, əməldə yanlışam. Sən mənə kömək etməsən, vay halıma!

15.Ey qaranlıq və dar yolun məşəli, mənə verdiyin ehsanı doğru yola yönəlt və məndən nəzərini çəkmə. Qoy qarışıqlıq və dolaşıqlardan pak olum, sevinərək sənin arxanca gedim. Vücudumun gülşənini peyğəmbər və onun ali əshabının razılıq yağmuru sulasın.

**QƏZƏL**
***AÇIQLAMASI İLƏ***

Zəhi, cəvahiri – ehsani – amə mədəni xas,
Düri – şəfaət üçün bəhri – rəhmətə ğəvvas!
(Nə xoş, nə gözəldir ki, hamıya yaxşılıq cəvahirləri üçün yataqsan, şəfaət incisi üçün bağışlanma dənizinin dalğacısan.)

Yetib hüzurinə merac vəqti, bulmuşlar
Qəmər hüsuli – müəssir, Süheyl kəsbi – xəvas!

(Merac vaxtı sənin hüzuruna gəlməklə ay təsiredicilik əldə etmiş, Süheyl də öz xassələrini qazanmışdır.)

Fələk həm ol gecə bulmuş səfa ki, sufi tək
Qərar tutmayıb olmuş o bəzmdə rəqqas!
(O gecə fələk də sevinc içində olmuş sufi kimi, bir yerdə dayana bilməyib o məclisdə rəqsə gəlmişdir.)

Rəhi – mütabiətindir təriqi – fövzi nəcat,
Həvayi – mərhəmətindir ümidi – xeyrü – xilas!
(Sənə tabe olmaq yolu – uğur və qurtuluş yoludur, sənin mərhəmətinə can atmaq xeyir və xilas ümididir.)

Təfaxür eylə, Füzuli kim, ondan özgə degil,
Sənə zəmanədə nəqşi – səhifeyi – ixlas!
(Füzuli, öyün ki, bu zəmanədə sənin üçün mənəvi saflıq səhifəsinin naxışı bir başqası yox, məhz odur.)

## AXUND HACI SOLTAN HÜSEYNQULU OĞLU
## *PEYĞƏMBƏR NƏSLİ*

Hansı nəsildəndir cənab peyğəmbər,
Gərək böyük, kiçik eyləsin əzbər.
Həm tanımaq üçün həmin cənabı,
Həm qazanmaq üçün böyük səvabı.
Bu nəsil gər salsaq tarixə nəzər,
Yetişib Həzrəti Adəmə qədər.
Tam belə adlanır Allah rəsulu,
Həzrəti Muhəmməd Əbdüllah oğlu.
Babasının adı Əbül Müttəlib,
O da budünyaya Haşimdən gəlib.
Sonra Əbd Mənaf, sonra Quseyydir.
Sonra Kilab, Mərrə, Kəb, Lüveyydir.
Qalib, Fəhr, Malik həmin nəsildir,
Nəzrdə həmən bu sıradan gəlir.
Nəzrə Qureyş adın verib camaət,
Çünki tayfa içrə yaratdı vəhdət.
Kənan və Xəzimə Mədrəkət, İlyas,
Növbəylə geydilər şahanə libas.
Onlardan da qabaq Müzər və Nəzar,
Qəbilə təxtini etdi ixtiyar.
Məd getdi ərəbin dadına müdam,
Ədnanla bu nəslə verildi xitam.

Belə buyurub ki, cənab peyğəmbər,
Yad edin nəslimi Ədnana qədər.
Peyğəmbər əmrinə edib riayət,
Əvvəlki nəsildən açmırıq söhbət.
Amma belə fikir tarixdən gəlir,
Ki, bu nəslin sayı olub əlli bir.
On yeddisi rəsul, on yeddisi şah,
On yeddi nəfəri vəsiyyi – Allah.
Bu əlli bir kəsdən düz yeddi nəfər,
Olubdur ümmətə mürsəl peyğəmbər.
Ismail, İbrahim, Nuh ilə İdris,
Şeys, Adəm, yazılıb tarixə səlis.
Xəbərlərdə belə oluruq təsvir,
Tarixən İslamı ediblər təqdir.
Onlarla başlanıb həqqin zühuru,
Üzlərində olub Muhəmməd nuru.
Soltan tək tarixdən gəl ibrət götür,
Elmi o nəsildən bu nəslə ötür.
Elm üzrə qurulub bütün kainat,
Həyatsız elm yox, elmsiz həyat.

## ƏTTAR TƏBRİZİ
## *PEYĞƏMBƏRİN MERACI*

Əbədiyyət şövqü ilə o bir gecə gülərək,
Nəşələndi, şadlıq etdi cavanlıq günləritək.

Bir gül kimi qönçəsinə sığınaraq şövqilə,
Ümmihani yatağında uyumuşdu zövqilə.

Kirpikləri tikan kimi ətəyi yırtığından,
Qönçə kimi yorğanına bürünmüşdü bu zaman.

Nərgiz kimi qapanmışdı yuxu xumar gözünü,
Ürək odu, lalə kimi qızartmışdı üzünü.

O gülüzlü sərvə tərəf sürətilə gəldi bil,
Salam verib ehtiramla təzim etdi Cəbrəil.

Gülər üzlü gülə baxıb nəvazişlə yanaşdı,
Yuxusundan oyatmadı ona gizli söz açdı.

Dedi: Xoşluq bağçasının tər fidanı, qulaq as,
Bu dünyanın bəxti sənsən, sənə yatmaq yaraşmaz.

Nərgiz kimi xumarlanmış gözünü aç, diqqət et,
Bir gül kimi çıx varlığı qönçəsindən nəhayət.

O sirlər bostanında çiçəklənən peyğəmbər,
Meyvə kimi göründü öz budağında müənbər.

Buraqını gördü durmuş ildırım tək, xuruşan,
Üzəngisi, noxtası və yəhəri var qızıldan.

Filosoflar xiyalıtək fələklərdə uçardı,
Fəqirlərin duası tək göydə qanad açardı.

Sevilənlər vüsalıtək ürəkləri bəzərdi,
Aşiqlərin göz yaşıtək üfüqlərdə gəzərdi.

Qalxdı atın belinə o fərəhilə, sevincək,
Sanki qapdı gül yarpağın sürətlə əsən külək.

O səhərin küləyindən sanki sürət qaparaq,
Haman gecə o, Sidrəni ötüb keçdi çaparaq.

Dostlarını yerdə qoyub tənha uçdu göylərə,
Gözlərinin qarşısında necə sirli mənzərə.

Ruhlar onun qabağında düzülüb keçdi səf – səf,
Elə ovcə yüksəldi ki, önünə çıxdı Rəfrəf.

Cismü canın sərhəddini ötüb getdi durmadan,
Mənzil oldu nihayətdə ona sonsuz laməkan.

Dünyaların sərdarı o bir ox kimi yüksəldi,
Qabə - qovseyn məqamına çatıb ruhu dincəldi.

Çatdı Allah dərgahına yüksək durdu günəşdən,
Göy üzündə mələklər də sevindi bu gəlişdən.

Məhrəm oldu xəlvətsəra adlanan bir xas yerə,
Muhəmmədin şərafəti artdı birə - min kərə.

Kəlamını eşitdi o səssiz – səmirsiz bütün,
Cəmalını seyr elədi niqabsız nur mülkünün.

Xahiş etdi ümmətini əfv eyləsin kirdigar,
Hesab günü bağışlansın ümmətdəki günahlar...[1]

[1] Ə.Təbrizi "Mehr və Müşbəri"

## MƏSİHİ
### *BƏYAN EYLƏR BU MERACİ – RƏSULİ XAS İLƏ AMƏ*

Çün nəqşi – cəmalın, ey düri – pak,
Pərtov salub oldu zinəti – xak.
Verdükdə bu şərbəndi – imkan,
Çərx əhlinə imtidadi – hicran.
Kərrubiləri yaqub fəraqə,
Qüdsiləri nari – iştiyaqə.
Ərvahi – müqəddəsü mükərrəm,
Əqdasü müəzzəzü müəzzəm.
Əflakü behiştü hürü rizvan,
Lövhü qələmü hicabü qılman,
Bir gecə əl açdilər niyazə,
Ərz eylədilər o çarə sazə.
Key faidə xasü amə səndin.
Ta necə qıla zülali – heyvan,
Ləb təşnələri zəmini – rəyyan.
Nola yetişə səhabi – rəhmət,
Salə bizə dəxi zilli – rafət.
Toxm əldə hənuz sayəpərvər,
Göstərdi nəhali – arzu bər.
Əndi yerə ruhi – qüdsi – təyid,
Bir baqmaqdə çün ziyayi – xurşid.
Pərvanə yetişdi şəmi – cahə,

Qoyduqda qədəm o bargahə,
Pəs dedi əda qılub təhiyyət,
Ey xosrovi – təxti – mülki – izzət.
Dur kim sənə yetdi vəqti – merac,
Nəlini firəqi – ərşə qıl tac,
Qoy cümlə təəllüqi kəranə,
Sür Rəxşi məkani – laməkanə,
Nöhrağı burax, bu nöh rəvaqə,
Axir verə görgilən fəraqə.
Qoy tişrə qədəm bu çar sudin,
Dur kam götür gəl arzudin.
Bir bəzm səninçün oldu tərtib,
Bir keyf sənünçün oldu tərkib,
Kim görməmiş ani çeşmi – didə,
Hər nə desin andin ol guzidə.
Həmpey özün, ey büti – yeganə,
Həm züllə götür bu xakdanə.
Durmuş fələki – həzar didə,
Pabusinə qəd qılub xəmidə.
Ta edə nisar çərxi – əxzər,
Almış başa ol təbəq – təbəq zər.
Şayəd ki, görə səni sitarə,
Tikmiş yola dideyi – nəzarə.
Ta kim bula rütbə payeyi – ərş,
Düşmüş yoluna özün qılub fərəş.

Ta yetişə paybusi – yarə,
Səf çəkdi məlayik intizarə.
Ey məhrəmi – bəzmi – sirri – ülfət,
Ta olmiyə fovt  vəqti – fürsət.
Atlan bu Büraqi – bərqrahə,
Yetir özüni o barigahə.
Ver ziynəti – nöh süpəhri – əxzər,
Ol əhli – səmayə sayə göstər.
Xoş ol ki, minüb Büraqi – razə,
Əqsayə yetüb durub niyazə.
Basdun qədəm andin asimanə,
Verdün məhə möhrünü nişanə.
Rəyin dili – Tirə verdi nuri,
Nahidə sürur ilə hüzuri.
Qədrün çü yetişdi afitabə,
Zərbəft ona bağladı əsabə.
Bəhramə yetişdi bəhrə səndin,
Fərman yeridüb o şəhrə səndin.
Bərcisə açub dəri – məunət.
Verdün ona qayəti – rəunət
Durdu çü hüzurinə müqabil,
Həll etdi Zühəl təmam müşkil.
Qıldun dili – sabitati rövşən,
Ol gülxən olundu tazə gülşən.
Gördükdə səni rəvaqi – sadə,

Qıldı durub ətləsinü sadə.
Lövhü qələmə sürur verdün,
Kürsi ilə ərşə nur verdün.
Payanə yetüb cəhati – həsti,
Dövranə yetişdi təngdəsti.
Şövq eylədi çün sənə dəlili,
 Saldun o Büraqü Cəbrəili.
Ta rahləsin qıla səbükvar,
Hər mənzilə yetdi qoydu bir bar.
Bir növ mücərrəd oldu ol nur,
Ta özün özündən eylədi dur.
Rəf oldu hicabü qaldı rəfrəf,
Yetişdi mükəllifə mükəlləf.
Didarə çü mərhəm olmadı eyn,
Oldu yüzə pərdə qabi – qövseynş
Ol pərdə durur pür əmri – hariq,
Ta anlana sirri – xəlqü xaliq.
Ol əmr əgər olsa idi haciz,
Mümtaz idi imtiyazə aciz.
Gər görmədi ani çeşmi – didə,
Haşa ola qürbidən rəmidə.
Əlbəttə, bu dideyi – zəmani,
Görməz şəhi – mülki – laməkani.
Tən didəsidür həmişə tənbin,
Can çeşminədür bir özgə ayin.

Ney – ney qələtəm ki, çeşmi – heyrət,
Yadlığ kilidin kim etdi röyət?!
Bi kər aça qeyrə didə babın,
Görməz dəxi ol yüzün kitabın.
Verdükdə hərimi – pərdədari,
Məhbubinə rütbeyi – cəvari,
Hər növ ona açdı üqdeyi – raz,
Hər razdə bin kəlam edüb saz,
Söz zahirü sözidin xəfadə,
Künd oldu qələm bu macəradə.
Caari nə zəban o göftguyə,
Avaz nə aşina gəluyə.
Nə bir tərəf ol kəlamə qail,
Nə bir cəhətə səda müqabil.
Xamuş, Məsih, kəs bəyanın,
Saxla ədəbin yığub zəbanın.
Keyfiyyəti – hali – razi – biçun
Di, qandadurur bəyanə məşhun?!
Ol sirrə kim oldu de xəbərdar,
Bəsdür sənə bu nümunə izhar.
Yoxdur sənə çün bu yolda həmrah,
Yek döndərəsin bu rahdən rah.

## MƏSİHİ
### *BUDUR İSBATİ – SEYRİ – SÜRƏTÜ MERACİ CİSMANİ*

Ey Xosrovi – kişvəri – səadət,
Gəncuri – zəxireyi – şəfaət.
Qət etdügünə sənin mənazil,
Binayiyi – didə oldu racil.
Gözün dilədi görə liqasın,
Ta göz aça gördü öz qəfasın.
Ta kim baxa dideyi – zəmanə,
Çıxdun o məkani – laməkanə.
Ayininə düşdü pərtovi – həq,
Kəşf oldu rümuzi – kari – mütləq.
Əsrari – həqiqət oldu zahir,
Iqrari – məhəbbət oldu bahir.
Əhkami – əvamirü nəvahi,
Təlqin olunub sənə kəmahi.
Həqdin sənə yetdi çox təhiyyət,
Səndin həqə iltimasi – ümmət.
Bəsdür bizə olmaduq fəramuş,
Oldu sənə yadımız həmağuş.
Nə qəm əgər ola yüz məasi,
Ol yad verür bizə xilasi.
Çıxdun orayə ki, çeşmi – idrak,

İdrakidədür zəlilü qəmnak.
Ey fərqinə taci – qürbi – əfsər,
Çün oldun ol arzuyə həmsər,
Bu heyəti çərxü kuyi – aləm,
Mənzurun olub çü nəqşi – xatəm.
Gördün qəmu bir nəzərdə asan,
Saldun hər firqiyə zilli – ehsan.
Döndün gerü eyləyüb ticarət,
Düzdün füqəra içün bəzaət.
İnsaf degilmi zadeyi – gil,
Qət eyləyə munceyi – mərahil.
Axmaqda hənuz kuzədin ab,
Cünbüşdə hənuz həlqeyi – bab.
Əxyarə əruci – əmri – məzkur,
Cism elədür etiqad məşhur.
Bəzisi əruci – ruhə qail,
Olmuşlar əslü fərə qafil.
Yox reyb ki, çox güruhi – islam,
Təhqiqlərindin olmuş əlam.
Kim cismdurur qəmu məlayik,
Hər birisidür bir əmrə salik.
Göz yumub açıncə mümkünati,
Seyr eyləyələr o şeş cəhati.
Ruhin yerədür nüzuli – vəhyi,
Göstərmək özün misali – vəhyi.

Əsraruni ol nikü xəsayil,
Gördü qəmusini zişəmayil.
Cinnilərin ol süluki – rahi,
Sürətdə kəmali – dəstgahi.
Bilqeys sərirdən hekayət,
Nəss oldu o nəqlidin rəvayət.
İsayi – Məsihə çün zəmanə,
Yar olmadı çıxdı asimanə.
Bunlar qəmudur səhihü caiz,
Ol rəhrövi de nə qıldı aciz?!
Bu zahir anın ki, cismidür can,
Can qəti – məsafət etmək asan.
Dəxi nola düzsə xərqi – adət,
Ol həzrətə rütbeyi – ziyadət.

## QÜDSİ
### *MERACNAMƏ*

Açıldı sübhi – səadət cəhan olub pür – nur,
Cənabi Heydəri Kərrar tapdı feyzi – zühur.
Açıbdı dürci – gühərbari xazəni – cinan,
Bu noi eylədin, ey şah göhəri qəltan.
Mübarək olsun, əya şah, eylədin merac,
Qübart – xaki rəhun oldi ərş başinə tac.
Kəmal heyrətilən bəs soruşdi peyğəmbər,
Bu sirri kim sənə izhar qıldi, ya Heydər.
Cəvab verdi bilirsən ki, mən Yədullahəm,
Cəmi əsrar pur nihanidən mən əllahəm.
Mənəm ol zeyğəmi – Quran əya süpəhri – kərəm,
Kəmal lütfilə qıldun əta mənə xatəm.
Açdı dürci – fəsahət töküldi dürri – gühər.
Təmami sirri – nihani əyan edib Heydər.
Ki, verdi Xatəmi Xətm Rəsulə şir o bər.
Baxıbdu mat dil ərayə afitabi – həda,
Bu noi qıldı tərənnüm əminü vəhyi – Xuda.
Səndə qıldı cilvə cananın sənin,
Ya Əli, aləmdür heyranın sənin.
Nüqteyi əvvəl sən ey qütbü hüda,
Nöh fələk dövrani dövranın sənin.
Dini həqq olmazdı aləmdə rəvac,

Olmasaydı tiqi – bürranın sənin.
Küfr zülmatini etdi payimal,
Pərtövi – xurşid tabanun sənin.
Neməti üzma vücudundi yəqin,
Şərh edib Quranda Yəzdanun sənin.
Saqiyi – kövsərdən ey arami can,
Aləmə şamildü ehsanun sənin.
Əndəlib “Qüdsi”oldi nəğməsaz,
Gördi ta gülbərgi – xəndanun sənin.

## MƏŞƏDİ RÜSTƏM SAMİT
### *MERACNAMƏ*

Ey həqqin dərgahinə merac edən,
Ey məlahət rahinə merac edən!

Məndə yox qüdrət səni vəsf eyləyim,
Bu piyadə kilk ilə mən neyləyim.

Ya Nəbi, ol dəstgiri aşiqin,
Mən sənin eşqin əsirin, aşiqin.

Istərəm nəqş sifatın eyləyim,
Yəni təsviri – həyatın eyləyim.

Ənbiyani xəlq edəndə kirdigar,
Əvvəl, həm axır səni vermiş qərar.

Layiqi – merac səni etmiş qəbul,
Həq özü bilmiş ki, olmazsan məlul.

Dərgahi həqqə Muhəmmədsən vəli,
Bu vəfa aşiqisən, ey nur heykəli,

Şənüvə gəlmiş səmadən həq səsi
Ya Nəbi, təşrif Yasin surəsi.

Möcüzati həq budur kim, kaf – nun,
Sureyi vəsfində olmuşdur sükun.

Sən rəsuli həqsən, ey ali əba,
Kim, sənə eylər Nəbilər iqtida.

Vəsfüvə Yasinü Tahadır dəlil,
Həm sənə nazil olubdur Cəbrəil.

Şənüvə gəlmiş siratəl müstəqim,
Ümməti – islamə sən oldun əzim.

Xəlqi – rahi ədlə çəkdin, ya Nəbi,
Oldu islam bir ədalət məktəbi.

Mən də bu məktəbdə təhsil almışam,
Hübbi həqqi qəlbə burdan salmışam.

Ya Rəsulallah, kömək et Samitə,
Ruzi məhşərdə qıl himmət Samitə.

## AŞIQ ƏLƏSGƏR
## *PEYĞƏMBƏRİN MERACI*

Aşıqlar qövl ilə, arifü aqil,
Dörd dəfə peyğəmbər meraca getdi.
Otuz altıyla cəm olubdu on yeddi,
Xəstə dilim bu yollara bələddi.

Şiə məzhəbində süludin beşdi,
Üç müqərrər mələk bilmədi, keçdi.
Fərmani – qüdrətdən nida yetişdi:
- Həbibim, nəleynin ərşə zinətdi.

Hər yandan səs gəldi: "Ya Muhəmməda!".
Məscidi – Əqsaya yetişdi səda.
Musa ərz eylədi: "Ey bari xuda,
Nə qurğu mənzilət, nə fəzilətdi!?".

Haqdan peyğəmbərə yetişdi salam,
Gəldi şirü birinc, qoyuldu təam,
Üz tutdu dərgaha həyyi – layənam..
-Yalqız təm yemək bizə əziyyətdi.

Pərdeyi – hicabdan bir dəst gəldi,
Təamı yedilər, almanı böldü.

Nütfəsi, xilqəti, zatı gözəldi,
İnan, bu sözlərim, bil həqiqətdi.

Nuri – irəhmətdən aldı dəstəmaz,
İki rikət əda eylədi namaz.
Üz tutdu dərgaha izd ilə niyaz:
- Xudaya, tavaqqam səndən ümmətdi.

Həbibullah  mindi İrəfrəf atın,
Xaliqi – ləmyəzəl verdi baratın,
Bizə vacib olan sövmü səlatın,
Üç hissəsin qoydu, birisin gətdi.

Əşrəfi – məxluqat, aləm sərvəri
Oxudu təşəhhüd, qayıtdı geri.
Huri, qılman, mələk, neçə min pəri...
Əmr eylədi haqq, göyləri bəzətdi.

Bağışlandı ümmətlərin günahı,
Şadü xürrəm oldu islam pənahı.
Gəldi bir arslan, tutdu irahı,
Mustafa görəndə, xatəmin atdı.

Yetişdi hücrəyə əzizü əzim,
Şahi – Mərdan dedi: “Meracın qədim!”

Göstərdi almanı, etdi təbəssüm,
Buyurdu: "Hər işin sirri – qüdrətdi".

Şairin sinəsi haqq bazarıdı,
Satdığı kəlmələr ləl – mirvaridi.
Alimin elmilə helmi yarıdı,
Həcvü hədyan demək nahaq söhbətdi.

Yazıq Ələsgərəm azdı kamalım,
Vacibdi ki, bir ustaddan dərs alım,
Dərs aldım, öyrəndim oldu öz malım,
Bizdən də ustada nəfi – rəhmətdi,

## NÖVRƏS İMAN
## *HAQDAN CƏBRAİLƏ YETİŞDİ FƏRMAN*
**(meracnamə)**

Haqdan Cəbrailə yetişdi fərman,
Nəzər eylə, bax sən əmri – xudaya.
Ey peyki – dərgahım, sən ol yol rəvan,
Yetir salamımı ol Mustafaya.

Saxla hörmətini, xidmətində dur,
Mənim haqq rəsulum, istəklim odur,
O şahi – ümmətə məqsudum budur,
Müraciət qılsın ərşi – əlaya.

Eşitdi Cəbrail əmri – ilahi,
Endi yer üzünə, tutdu o rahı,
Haqq salamın verdi, gördü ol şahı,
Buyurdu: can sana gəldi fədaya.

Xatəməl – mürsəlin aldı salamı,
Qəbul etdi haqq dini – nizamı,
Üz tutdu dərgaha dildə kalamı,
Tamaşa qıl sən bu sirri – üzmaya.

Həbibi – ilahi mindi Buraqı,
Mələkələr tutdu solunan sağı,
Yüz min ikramilən əziz qonağı,
Açdı bulud pərin, xub saldı sayə.

Peyğəmbər yetişdi dördüncü göyə,
Əmr oldu hatifdən küllən mələyə,
Vurdular zinəti ərşi – fələyə,
Həm xəbər verildi cəm ənbiyaya.

Tamamən ənbiya qaldılar heyran,
Dil açdı, hamısı söylədi bəyan .
Bu necə cəlaldı, ey qadir sübhan,
Nə şurdur, düşür ərzü səmaya!?

Cəmi ənbiyalar verdilər salam,
Aldı rəsul – haqq yerbəyer tamam.
Yenə suvar oldu o fəxrül ənam,
Mindi İrəfrəfi, getdi vəfaya.

Ərşi – ilahidən qüdrəti – rəhman
Öz hikmət əliylə apardı əyan.
Dayandı hicabda o şahi – cahan,
Haqdan salam gəldi, bil, iqtidaya.

Sual – cavab, çox sirrlər danışdı,
Əl – əhdi – vəfadan xeyli tutuşdu,
Ümmətin halını bildi, yetişdi,
Dil açdı biz üçün rəbbi – əlaya.

Şəfaət, risalət rəsuli – üməm
Ümidvar yolundan qəlbi olub cəm.
Kəlmə kəsdi, haqq söylədi dəmbədəm,
Bilindi meracı, cəm gəldi ayə.

Qoyuldu hüzura taami – ləziz,
Əta qıldı xaliq bir alma əziz,
Tək meyl etmədi, bilginən hənuz,
Gör sirri – xudanı, gəl tamaşaya.

Bir əl gəldi kömək pərdə dalınnan,
Eşit hökmü peyğəmbərin dilinnən.
Yedilər taamı, böldü əlinnən,
Verdi yarı alma yədi – beyzaya.

Şəhadət söylədi fəxri – kainat,
Şad oldu, ümmətə cəm aldı barat.
İstədi xudadan, tapmışdı nicat,
Üz tutdu mənzilə qılsın qəzaya.

Əmiri – möminin, aləm sərvəri
O da gəzmiş idi, yəqin, göyləri.
Kəsdi qabağını ol peyğənbəri,
Necə vəhmə saldı, durdu haraya.

Şir donunda aldı xatəmin yəqin,
Gəldi rəsul – Allah mənzilə həmin,
Sirrini açdı ol zati – bərgüzin,
Söylədi işləri ol Mürtəzaya.

Ol şahi – zülkərəm göstərdi xatəm,
Buyurdu: əmoğlu, çəkməyəsən qəm,
Alma bölən, taam yeyən, bil, mənəm,
Sirr qaldı peyğəmbər əmri – mövlaya.

Biçarə İmanam, söylərəm aşkar,
Əl üzmərəm ətəyindən, kirdigar,
O şahın haqqına nə günahım var
Bağışla gələndə ruzi – cəzaya!

## NİZAMİ ZÖHRABİ
## *MERAC*

Məscidül - Həramda bir dəfə axşam
Taxçaya qoyulmuş balaca ağ şam
Xısın – xısın yanıb tüstülənirdi,
Tüstüsü tavana lap dirənirdi.
Seçmək olmayırdı ağı sarıdan,
Artıq keçmiş idi gecə yarıdan.
Bir – bir durub getdi evinə hamı,
Peyğəmbər üfürüb söndürdü şamı.
Həsirin üstünə saldı bir palaz,
Qıldı yatmamışdan üç rükət namaz.
Soyunub çıxartdı tez libasını,
Sonra dörd qatlayıb o, əbasını
Mübarək başının altına atdı,
Getdi şirin - şirin yuxuya, yatdı.
Indi hər tərfdən yel buludları
Qovub aparırdı Həraya sarı.
Uzaqda çaxırdı hərdən ildırım,
Yerə süzülürdü nur şırım – şırım.
Bir qədər keçməmiş əsdi bərk külək,
Sayrışdı ulduzlar səmada tək – tək.
Elə bil ağappaq süddü kəhkəşan,
Bu gecə çox şeydən verirdi nişan.

Muhəmməd olarkən dərin yuxuda
Yerə elçisini göndərdi Xuda.
Cəbrail sakitcə düşdü Buraqdan,
Seyr etdi məscidi bir az qıraqdan.
Yeridi yaxına, baxdı bacadan,
Bir vəhy qulağına gəldi ucadan:
-İcazə olmadan bir addım atma,
Qoy yatsın, sən onu hələ oyatma.
Necə ki, Cəbrail göstəriş aldı
Sakitcə yerində dayanıb qaldı.
Rəbbi öz qulunu əzizləyirdi,
Mələk çöldə durub vəhy gözləyirdi.
Artıq keçmiş idi xeyli aradan,
Birdən vəhy göndərdi ona Yaradan.
-Buyur, ya Cəbrail, tez içəri keç,
Onu oyatmağa yaxşı məqam seç.
Olaraq Rəbbinin əmrinə qail
Məscidin içinə girdi Cəbrəil.
Getdi yavaş – yavaş bir az irəli,
Uzandı Həzrətə onun bir əli.
-Bismillah, -söyləyib – salavat çəkdi,
Həzrətin yanında o, dizə çökdü.
Mələk öz Rəbbinə edib təvəkkül,
Uzatdı Həzrətin burnuna bir gül,
Dəyəndə burnuna gülün qoxusu

Asqırdı Peyğəmbər, qaçdı yuxusu.
Açdı gözlərini o, yavaş – yavaş,
Bürüdü canını həyacan, təlaş.
Muhəmməd eşitdi olduqca mübhəm
Bir səda: - Olmasın zərrə də şübhən.
Tez dur, ya Muhəmməd, gözlərini sil,
Bütün gördüklərin aşikardır bil.
Cəbrail bir az da yaxın gələrək
Dedi: -Şad olasan, Muhəmməd, gərək.
Rəbbin hüzuruna aparır səni,
Onunçün göndərib yanına məni.
Sənə göstərməkçün bir çox şeyləri
Pəyəndaz eyləyir uca göyləri.
Peyğəmbər diksindi belə xəbərdən,
Çalışdı ayağa durmağa yerdən.
Xəbər gözlənilməz olduğu üçün
Toplaya bilmədi bir yerə gücün.
Elə bil üstünə yıxılmışdı dağ,
Əsirdi Həzrətin vücudu zağ – zağ.
Cəbrail qaldırdı tez Peyğəmbəri,
Uzatdı Həzrətə müşkü - ənbəri,
Dedi: -Al, Muhəmməd, bədəninə vur,
Qoy dolsun sinənə iman dolu nur.
Peyğəmbər üzündən silərək təri
Aldı Cəbraildən müşkü - ənbəri.

Tez tökdü ovcuna, üzünə vurdu,
-Ya Allah, - söyləyib ayağa durdu.
Sonra əbasını atdı çiynınə,
Çilədi ənbəri tamam əyninə.
Çıxdılar həyətə onlar yanaşı,
Burada qarışdı Həzrətin başı.
Qədəmini asta o, ata – ata
Maraqla baxırdı ildırım ata.
Yeriyib Cəbrail mindi Burağa,
Çıxanda həyətdən Həzrət qırağa
Toxundu qapıya ayaqqabısı,
Açılıb yelləndi həyat qapısı,
Dəydi mis kuzəyə, onu aşırdı,
Su qabın içindən çölə daşırdı.
Gəlib o, əyləşdi Buraqa rahat,
Şığıdı göylərə tez ildırım at.
Yumub – açan kimi Həzrət gözünü
Məscidul Əqsada gördü özünü.
Etdilər Əqsada Allaha niyaz,
Birlikdə qıldılar üç rükət namaz.
Yox oldu canından onun vahimə,
Sonra baş çəkdilər Beyti – Ləhimə.
O merac gecəsi həmin əsnada
Oldu Muhəmmədlə mələk Sinada,
Sanki ulduzlar da almışdı soraq,

Göydə sayrışırdı göydə çılçıraq.
Peyğəmbər maraqla göyə baxırdı,
Başları üstündən ulduz axırdı.
Ayrı bir gözəllik vardı səmada,
Uçmağa durmuşdu Buraq amada.
Elə ki, o vurdu Yerə bir təkan,
Həm zaman dəyişdi, həm də ki, məkan.
Həzrəti bürüdü misilsiz maraq.
Açıldı önündə Göy varaq – varaq.
Onu çulğamışdı dərin bir heyət,
Gördü ki, çoxalıb – artdıqca sürət
Ölçülər kiçilir, vaxtsa ləngiyir,
Zamanın nəfəsi çatmır, ləngiyir.
Girmişdi zamanla sürət yarışa,
Sığırdı min illik yol bir qarışa.
Baxıb seyr etdikcə o, asimanı
Gördü eyni vaxta hər üç zamanı:
Həm indi, həm keçmiş, həm də gələcək
Gözləri önündə dayandı gerçək.
Buraq şığıyırdı, sanki ildırım
Açırıdı köksündə göylərin şırım.
Qalxdı varlığın Həzrət fövqünə
Rəbbinin olurdu valeh zövqünə.
Tamam başqa idi burdakı qayda,
Məkan ölçüsü də, vaxtakı say da.

Aləmlər olmuşdu burda nura qərq,
Yox idi gecəylə gündüzdə bir fərq.
Çıxıb həm ulduzlar, həm Ay, həm Günəş,
Naşı gözlə baxan eyləyərdi qəşş.
Heyrətdən dil açıb danışırdı lal,
Əsla seçilmirdi cənubdan şimal.
Yox idi səmada nə qərb, nə də şərq,
Məkan nisbətində itmişdi bu fərq.
Nəhayət, birinci göyə çatdılar,
Həzrəti Adəmə əl uzatdılar.
Qalxdı öz yerindən babamız Adəm –
Sağ gözündə sevinc, sol gözündə qəm.
Namizəd olanlar behişt bağına
Burda toplaşmışdı onun sağına.
Onlara baxanda üzü gülürdü,
Onun sol gözündın yaş süzülürdü.
Durmuşdu solunda əhli – cəhənnəm,
Odur qurumurdu gözlərində nəm.
O merac gecəsi Sahibi – Dərgah
Qulunu çox şeydən eylədi agah.
Gördü o, Yunusu, gördü İsanı,
Görüşüb bağrına sıxdı Musanı.
Gəzdi yeddi Göyü Muhəmməd bir – bir,
Eşitdi hər yandan sədayi – təkbir.
Hər Göydə dayanıb mələklər səf – səf,

Əsmayi – Hüsnanı seçərək hədəf,
Baş vurub şövq ilə söz gülşəninə
Təqdis deyirdilər Onun şəninə.
Allah qüdrətindən gələrək vəcdə
Hamısı edirdi Xaliqə səcdə.
Həzrət yetirirdi diqqət hər şeyə,
Qalxdılar, nəhayət, yeddinci Göyə.
Yanırdı burada rənglər cürbəcür,
Vəhdət yaratmışdı iman ilə nur.
Ilahi, necə də gözəldi bura!!!
Söykəyib belini Beytul – Məmura
Onu göləyirdi İbrahim burda,
Verib ayrı görkəm Allah bu yurda.
Oldu bu görüşdən o, çox xətircəm,
Bir azdan oldular peyğəmbərlər cəm.
Gəldi Harun, İsa, Süleyman, Musa,
Birisində təsbeh, birində əsa.
Gəldi Yusif, İdris, Yəhya və Adəm,
Quruldu bir məclis burda həmin dəm.
Hamısı birlikdə alıb dəstəmaz
Yeddinci səmada qıldılar namaz
Muhəmməd – Allaha ən yaxın bəndə,
Durmuşdu bu anda hamıdan öndə.
Necə çatdırdılar namazı sona
Cəbrail Məvanı göstərdi ona.

Tamam başqa idi burdakı ahəng,
Yanırdı ilahi nurlar rəngbərəng.
Nə ağlı edirdi, nə gözü inkar
Mənzərə görməyib belə füsunkar!
Nura qərq olmuşdu Cənnətdə hər yan,
Qapının ağzında durmuşdu Rizvan.
Gəlib salam vedi, göstərdi izzət,
Verirdi bu görüş ona da ləzzət.
Tamaşa etdilər belə büsata,
Yenidən mindilər ildırım ata.
Məvadan Sidrətül – Müntəhayadək
Müşayət eylədi Həzrəti mələk.
Oradan Cəbrail qayıtdı dala,
Peyğəmbər tək qalıb daldı xəyala.
Qəlbindən eylədi Rəbbinə niyaz,
Sonra yeriyərək qabağa bir az
Gəlib o, əyləşdi burda Rəfrəfə,
Yönəltdi səmtini at Ərş tərəfə.
Ərş ilə Sidrənin çatdı səddinə -
Qalxdı maddiyyatın uca həddinə.
Bu şərəf olmayıb heç kəsə nəsib,
Haqq gəlir imanla düz mütənasib!!!
Sidrə yerləşirdi Ərşdən aşağı,
Qucub kainatı, körpə uşağı
Sıxır öz köksünə necə ki, ana,

O da elə çalır lay – lay cahana.
Kainat Sidrədən asılıb ipsiz,
Üstü tavansız Ərş, ətəyi – dibsiz.
Ondan o tərəfə qapılar bağlı,
Işləməz orada heç bəşər ağlı.
Oradan başlanıb qaibanəlik,
Onu dərk etməyə bizdə yox bilik.
Orda nə peyğəmbər olub, nə mələk,
Sirri aşıkardır Rəbbimizə tək.
Qalıb Muhəmməddən aşağı cahan,
Burda verəcəkdi indi imtəhan.
Etdi Rəbbi onu agah çox sirdən,
Gördü on səkkiz min aləmi birdən.
Təsvir etmək üçün hər bir aləmi
Acizdir bəndənin dili, qələmi.
Gördü uzaqlarda səyyarələr var,
Onlardan deyildi bəndə xəbərdar.
Düzülüb ayrı bir müstəvi üstdə,
Süzürlər səmada rəvan, ahəstə.
Durub bu məqamda Həzrət baxırdı,
Gözləri önündən onun qalxırdı
Şahidi – Məsturin əsrar pərdəsi,
Köksündə donmuşdu xofdan nəfəsi.
Xalid çəkmiş idi pərdə aradan,
Üzdə Muhəmməddi, dalda Yaradan.

Arada olsa da məsafə lap az,
Allah həm yaxındı, həm də əlçatmaz.
Peyğəmbər edərkən Ərşə tamaşa
Rəbbindən vəhy gəldi ona birbaşa.
Kimsə görünmürdü Həzrətə gözlə,
Rabitə var idi arada sözlə.
Səda hardan gəldi, kimin idi səs?
Bilmir, bilməyəcək heç zaman heç kəs!
Tanrı hikmətidir merac, oxucu,
Bu sirli kələfin bizdə yox ucu.
Olmayıb söhbətə bir kimsə şahid,
Bilinmir Rəsula nə deyib Vahid.
Batindir söhbətin təfərrüatı,
Bəllidir üzdəki nazik bir qatı.
Nəyə ki, vermişdi Qabiz icazə
Onu da bürüyüb mübhəm məcaza.
Şükr olsun, İlahi, böyüklüyünə,
Sahibsən min belə sirli düyünə!
Aciz bəndələrik, qalmışıq naçar,
Vurduğun kilidə düşməz bir açar.
Acizdir elmindən bildiyim nücum,
Bu sirri açmağa yetişməz gücüm.
Tək elçin elmindən oldu payidar,
Dedi: -Sirr Sənindir, Sənə qayıdar.
Ya Rəbb, Özün oldun onun ustadı,

Əziz olduğundan ona dost adı,
Qəlbindən bu sirri yaşatdı sirdaş,
Düşmədi qurduğun qaladan bir daş.
Sən sahib eylədin qulunu səbrə,
Apardı bu sirri özüylə qəbrə.
Quranda verilən cüzi işarə
Ümmandan damladır cümlə bəşərə.
Çatıb onun bizə bir inikası,
Onu tam qavramaz insan zəkası.
Ağlına güc gəlib kimin marağı,
Kifayət etməyib elmi yarağı.
Hər kəs cəhd eyləyib bu sirri aça,
Zəka zirvəsindən qalxmayıb uca.
Bir vaxt buna edib səy ibni Sina,
Ustad haram qatıb öz yuxusuna.
Ancaq boşa çıxıb göstərdiyi cəhd,
Bilməyib bağlanıb orda necə əhd.
Maraq güc gəlsə də mütəfəkkirə,
Heç güzəşt etməyib Haqq təfəkkürə.
Doğub hər sualdan suallar min – min,
Düsturu başqadır görüb bu elmin.
Bilib vara bilməz sirrin içinə
Güvənən dünyəvi elmin gücünə.
Bilib dərk olunar merac imanla,
Dəyməz yürütməyə fikir gümanla.

Keçib təsvirində odur ki, üzdən,
Ki, xəta gəlməsin dediyi sözdən.
Qorxub əməlindən günah qazana,
O da bənzədilə yoldan azana.

* * *

Nə oldu meracın hədiyyəsi bəs?
Deyildi bu səfər təsadüf, əbəs!
Allah həbibinə verdi o gecə
Cənnət müjdəsini hər şeydən öncə.
Bildi, ümmətindən şirk qoşmayan şəxs
Alar qiyamətdə asudə nəfəs.
Yetişdi o  gecə sona "Bəqərə",
Namaz vacib oldu gündə beş kərə.
Bu oldu Həzrətə verilən üç şey,
Tutdu bu müjdədən xəbər yeddi Göy.
O gecə deyilmiş elə söz də var
Rəbbi Muhəmmədə verib ixtiyar:
Istəsə, köksündə salar məhbəsə,
Danışar, ürəyi əgər istəsə.
Yaxşı bildiyindən sözün yerini
O, hər üç kəlmədən deyib birini.
O Merac gecəsi sayılıb vacib

Görülən iş üçün vermək məvacib.
Özgənin malını kim eyləsə qəsb,
Etməz heç əməli xoş bir məna kəsb.
Qonşunun haqqını tapdasa hər kim,
Verər cəzasını o Mütləq Hakim.
Yalan danışarsa əgər ki, şahid,
Yeri cəhənnəmdir olsa da zahid.
Həm ata, həm ana, bir sözlə, böyük
Olar qocalanda övladına yük.
Övladı çəksə də hər qədər əzab,
Səbr ilə gətirsin gərək buna tab.
Övlad bir çörəyə olsa da möhtac,
Gərək ki, qalmasın ata – ana ac.
Verməsə onların övlad borcunu,
Qalar qocalanda boş öz xurcunu.
Gərək ata qoya övladına ad,
Verə ona çörək tərbiyə, savad.
Uşaq öz – özünü eyləyəndə dərk
Çəkməyə ad üçün xəcalət gərək.
Verməsə uşağa döşdən ana süd,
Ona təsir etməz nəsihət, öyüd.
Olsa ata – ana övlada qatil,
Olar ibadəti onların batil.
Bir nəfər eyləsə əgər ki, zina,
Od tutar, kim ayaq qoysa izinə.

Hər kəs ki, olmasa əhdində doğru,
O kəsdən min dəfə yaxşıdır oğru.
Hər kəs ki, aldatsa daş tərəzidə,
Satar imanını, bilməz özüdə.
Yetimin malına hər kəs diksə göz,
Allah sinəsinə onun basar köz.
Əgər biri görsə kor – koranə iş,
Sancılar gözünə axır onun şiş.
Heç kəsə ucalıq gətirməz qürür,
Bəzəyir insanı ancaq iman, nur.
Hər kəs ki, aparsa özünü lovğa,
Açar əməlləri başına qovğa.
Gərək səxavətdən seçilsin israf,
Qədərindən artıq eyləsən məsrəf
Tükənər dağda qar, qayalıqda daş;
Israfçı sayılar Şeytana qardaş.
Hər kəs ki, axıtsa nahaqdan qanı,
Alsa İlahinin verdiyi canı,
Olunar onunla axır haqq – hesab;
Alar cəzasını əməlində bab.
Belə əmr olundu ona o gecə,
Bu oldu meracdan doğan nəticə.

* * * *

Həzrətin Xaliqlə söhbəti bitdi,
Geriyə dönməyin məqamı yetdi.
Yeriyib təzədən o, ata mindi,
Göz açıb – yumunca Məkkəyə endi.
Şeytana uyanlar edər buna şəkk,
Hələ isti idi yatdığı döşək.
Üstdən keçməmişdi nə gün, nə həftə,
Hələ yellənirdi qapıda cəftə.
Hələ də kuzədən süzülürdü, su,
Gəlirdi məsciddən müşkün qoxusu.
Oxucum, söylədim üzdə olanı,
Batindir, açılmaz sirdir qalanı.
Ötüşdüm məlumu sadalamaqla,
Qorxdum ki, korlayam ona yamaqla.
Peyğəmbər boylanıb üfüqə baxdı,
Gəlib yetişmişdi namazın vaxtı.
Dönüb ətrafına salanda nəzər,
Gördü Əli ilə gəlir Əbuzər.
Meracdan tutdular xəbər birinci,
Sığmırdı onların qəlbə sevinci.
Təbrik eylədilər Həzrəti tək – tək,
Dedilər; -Meracın olsun mübarək.
Yayıldı bu xəbər dərhal şəhərə,
Meracı bir cürə yozurdu hərə.
Xəbər çatan kimi Əbu Bəkrə,

Düşmədi zərrəcə o, ayrı fikrə.
Qaldırıb başını, o, baxdı göyə,
Şükr edib qapandı sonra səcdəyə.
Qurtarıb səcdəni, yerindən durdu,
Məscidül – Hərama təşrif buyurdu.
Elə ki, xəbəri Salman eşitdi,
Bilmədi nə təhər məscidə getdi.
Həzrət yer göstərdi ona sağında,
Görüşüb oturdu Salman yaxında.
Həzrət müjdələdi özü Salmanı,
Cənnət nişanəsi olan almanı
Kəsdi, bir dilimin Salmana verdi,
Allah, o nə xoşbəxt, nə bəxtəvərdi!!!
Təsadüf deyildi Həzrətin payı,
Az adam olardı Salmanın tayı.
Güclü olduğundan onun imanı,
Həzrət dost seçmişdi özü Salmanı.

* * * *

Gəlirdi adamlar məscidə tək – tək,
Söhbət çəkdi burda günortayadək.
Günorta mürəxxəs olub namazdan
Kəbəyə getdilər onlar, bir azdan
Ətrafdan axışıb gəldi camaat,

Həzrət danışırdı, Qureyş qalıb mat.
Qulaq asırdılar sanki nağıla,
Sığmırdı bu hikmət dayaz ağıla.
Yoxdu sözlərində Həzrətin təbdil,
Gözün gördüyünü danışırdı dil.
Allah qüdrətinə inanırdı kim,
Ona bəs edirdi yavaşca bir him.
Allahın elminə inanmayanlar
Meracın sirrini nə təhər anlar?
Kimin ki, doğruya yoxdu marağı,
Əfsanə sayırdı odur Burağı.
Necə eyləsin ki, Muhəmməd, ya Rəbb,
Onu dərk eyləsi bədəvi ərəb?!
Bəşərə deyildi məlum nisbilik,
Yox idi Qureyşdə o dərin bilik
Eyləyə bilmirdi bu hikməti dərk,
Odur yapışmışdı inadından bərk.
Cılız qəlblər edə bilmir təsəvvür
Ki, nəyə qadirdir böyük Müsəvvir.
Ayırıb ağzını, döyür gözünü,
Qanmırdı Həzrətin Qureyş sözünü.
Qandırmaq çətindi sözü naşıya,
Çıxıram, oxucum, burda haşiyə:
Bəşər çalışırkən haqq danmağa,
Allah imkan verdi ona qanmağa.

Saldı beyinlərə cüzi bir işıq,
Qoymadı haqq düşə şərlə dolaşıq.
Isbat eyləyəndə bu fikri Albert[1]
Inad göstərənlər qaldılar lal, pərt.
Sübut olunanda bu nəzəriyyə
Hamı inam ilə baxdı geriyə.
Gördülər ucadır merac nücumdan,
Dala çəkildilər onda hücumdan.

[1] Albert Eynğteynin nisbilik nəzərlyyəsinə iğarədir

## NAZİM SALAMİ

### *MERAC*

Bir gün ibadətdən qayıdan zaman,
Peyğəmbər hiss etdi haLsızdır yaman.
Kiçik bir xalçada yerini saldı,
Taqətdən düşərək o, huşsuz qaldı.
Gördü ki, Kəbənin yanında durub,
Bir at da dayanıb boynunu burub.
Peyğəmbər eşitdi, bu zaman birdən,
Onu salamlayır Cəbrayıl göydən.
Cəbrayıl uyurdu ona gərək sən,
Bu gün "nur" sarayda keşik çəkəsən
Peyğəmbər Buraqla səmaya qaxdı,
Ulduzlar sayrışan göylərə baxdı.
Əvvəlcə Adəmi gördü, görüşdü,
Sonra İbrahimi tapdı öpüşdü.
Musa salam verib yanaşdı buna,
Göründü dördüncü təbəqə ona.
İsa peyğəmbərlə xeyli danışdı,
Cəbrayıl az qala nurdan alışdı.
Söylədi aparsam irəli səni,
"Nurun" şəfəqləri əridər məni.
Kainat sirrini gördü lövhədə,
O, lövhü –məhfuzu oxudu bir də.
Dolandı yetmiş min nur saçan qəsri,

Öyrəndi keçmişi, gələn nəsili.
Sonra Buraq onu endirdi yerə,
Böyük hökmdarın əmrinə görə.

## HACI YUSİF QULAMMİRZƏ OĞLU
## *HƏZRƏTİ PEYĞƏMBƏRİN MERACI*

Meracın mənasın bilmək üçün sən,
Isranın mənasın gərək biləsən.
Merac göyə çıxmaq, yüksəlmək demək,
Isra gecə vaxtı səfər eyləmək.
Meraca getməzdən əvvəl Peyğəmbər,
Səfər eyləmişdir Qüdsiyə qədər.
Bu böyük hadisə gecə edilmiş,
Odur ki, Quranda "İsra" deyilmiş.
Hicrətdən təxminən altı ay qabaq,
Hərəmi şərifdə Həzrət yataraq,
Bu zaman Cəbrail, o böyük mələk,
Rəsuli - əkrəmə yaxın gələrək,
Onunla bir kəlmə söz danışmadan,
Qolundan astaca tutur mehriban,
Səfa təpəsinə tərəf apardı,
Burada əcaib bir heyvan vardı.
Səfər eyləməyə Buraqa minir,
Beytül Müqəddəsə tərəf yol gedir.
Yol üstü Sinada Beytülləhmədə,
Düşüb namaz qıldı həmin yerlərdə.
Yenə də yolların davam etdilər,
Bir göz qırpımında Qüdsə getdilər.

Buraqın gedişi şimşək sürəti,
Bəlkə də şimşəkdən gedirdi iti.
Məscidul Əqsaya girdiyi zaman,
Başladı müəzzin verməyə əzan.
Adamlar cərgədə durmuşdu səf – səf,
Cəbrail dedi: -Keç qabağa tərəf.
Namaz qılanlara olaraq imam,
Onlarla namazın eylədi tamam.
Cəbrail soruşdu: -Ya Muhəmməd, sən
Bu namaz qılanlar kimdir, bilirsən?
Dedi: -Tanımıram, görməmişəm yox.
-Allahın yanında məhəbbətin çox.
Səndən əvvəl gələn nəbilər yeksər,
Yığılıb arxanda səcdə edirlər.
Sonra da Cəbrail gətirdi üç qab,
Biri süd, biri su, birində şərab.
Cəbrail buyurdu: -Ya Muhəmməd, sən
Hansını istəsən içə bilərsən.
Südə əl uzadıb götürdü Həzrət.
Cəbrail bəyənib söylədi: -əlbət,
Suyu götürsəydin ümmətin sənin,
Suda qərq olardı, bunu bil yəqin.
Şərabı alsaydın yolun azardı,
Əzaba, zillətə düçar olardı.
Sonra da növbəsi çatdı o yerə,

Meracı başladı onun göylərə.
Həzrəti Peyğəmbər Cəbrail ilə,
Yuxarı qalxırdı pilləbəpillə.
Birinci səmaya çatdığı zaman,
Cəbrail: -Aç dedi, qapıda duran:
-Sən kimsən? O dedi: -Cəbrailəm mən!
-Sənin yanındakı o, kimdir gələn?
Gələn Muhəmməddir –Cəbrail dedi:
-Ona peyğəmbərlik verilibdimi?
-Bəli verilibdir! Açıldı qapı.
Yayıldı: -Xoş gəlib, buyur sədası,
Daxil olunmağa izin verdilər,
Birinci səmaya onlar girdilər.
Sağında, solunda xeyli adamlar,
Bir kişi gördülər üzündə nur var.
Sağına baxanda gülümsər olur,
Soluna baxanda gözləri dolur.
Peyğəmbəri görəcək salam söylədi:
-Xoş gəldin, ey Saleh övladım! –dedi.
Həzrət Cəbraildən sordu: -Bu kimdir?
Ağlamağı nədir? Gülməyi nədir?
Cəbrail dedi: -Ey Rəsuli - əkrəm,
Bu ilk peyğəmbərdir –Həzrəti Adəm!
Sağında Cənnətə gedəndi bunlar,
Solunda Cəhənnəm əhli günahkar.

Odur ki, sağına baxanda gülür,
Soluna gözünün yaşı tökülür.
Sonra da yolların davam etdilər,
Ikinci səmaya tərəf getdilər.
Yeddi təbəqəni keçdikcə onlar,
Qapılar ağzında eyni sual var...
Adını soruşub edirlər dəvət,
Hansı peyğəmbəri görəndə Həzrət,
"Salam Saleh oğlum, Saleh Peyğəmbər,"
Deyərək, Həzrətlə görüşürdülər.
Ikinci səmada Yəhya və İsa,
Üçüncüdə Yusif, o –gözəl sima.
Dördüncüdə İdris əleyhissəlam,
Beşincidə Harun söylədi səlam.
Altıncı səmaya qalxdığı zaman,
Həzrəti Musanı o gördü bu an.
Yeddinci səmada dayanıb durdu,
Burada İbrahim Xəlil dururdu.
Kürəyin söykəmiş Beytulməmura,
Mələklər namaza gəlirlər bura.
Ibadət evidir bi Beytulməmur,
Kəbədə düz onun altında durur,
O, göydə yerləşən ibadətgahdır,
Kəbəyə bənzəyən ziyarətgahdır.
Həzrət namazını qıldı burada,

Cənnət bağlarını gəzdi arada
Bağlar kənarında çayları gördü,
Bir çay üzərində qəsr üzürdü.
Həzrət əlin suya vurduğu zaman,
Müşk qoxusunu hiss etdi ondan.
Cəbraildən sordu: -Bəs bu çay nədir?
-Bu çay ən qiymətli Kovsərdir deyir:
-Çayı da qəsri də, böyük Yaradan,
Səninçün qoruyub, saxlayır hər an.
Sonra Cəhənnəmə baxdı uzaqdan,
Cəza çəkənləri gördü bu zaman.
Bir az da yuxarı qalxdı göylərə,
Siqrətülmüntəha adlı bir yerə,
Orada ilahi nurlar yanırdı,
Hər tərəf rəngbərəng parıldayırdı.
Oradan yuxarı onlar daha,
Hamısı məlumdur yalnız Allaha.
Ondan o tərəfə nə mələk, nə də
Elə bir peyğəmbər olmayıb gedə.
Cəbrail dedi: -Ya Rəsuli - əkrəm,
Mən daha yuxarı gedə bilmərəm.
Sidir ağacından o yana əgər,
Getsəm qanadlarım yanıb tökülər.
Cəbrail bu yerdə onu buraxdı,
O, Ərşi əlayə rəfrəflə qalxdı.

Tanrı dərgahına əlin uzatdı,
Tək – tənha sonuncu məqamə çatdı.
Çatanda Allahin yaxınlığına,
Istədiyi vəhyi vermişdi ona.
O qədər yaxınlıq vardı orada,
Iki ox məsafə qaldı arada.
Nə bir vasitəçi, nə də bir mələk,
Pərdə arxasında onlar təkbətək,
Sonra nə danışıb, nələr dedilər,
Bir Allahı bilir, bir də Peyğəmbər.
Ona üç ərməğan verdilər bunu,
Birinci "Bəqərə" surənin sonu.
Ikinci Allaha şərik qoşmayan,
Cənnət müjdəsini alacaq ondan.
Üçüncü meracdan hədiyyə olan,
Beş vaxt namaz qılmaq olundu əyan.
"İsra" surəsi də sübutdur buna,
"Allah əyalətlərin göstərdi ona."
Həzrəti Peyğəmbər əleyhissəlam,
Kəbəyə yerinə qayıdır axşam,
Olan hadisəni danışır səhər,
Yox canım, belə şey olmaz dedilər:
-Qüdsə bir ayadək gedir karvanlar,
Bir aya da geri qayıdır onlar.
Muhəmməd bu uzaq yolu nə təhər,

Bir gecəyə gedib qayıda bilər.
Möminlər tərəddüd etmədi buna,
Müşriklərsə sual etdilər ona,
Əbu Cəhl dedi: -Həqiqətsə bu,
Qüdsə getmisənsə sübut et bunu.
Danış bizə yolda gördüklərindən,
Beytül müqəddəsi təsvir eylə sən.
Həzrət dedi: -Yolda bir neçə karvan,
Onları mən gördüm Şamdan qayıdan,
Çərşənbə axşamı sizin karvanlar
Yəqin ki Məkkəyə yetişər onlar.
Yüklərin də nədən olduğunu dedi,
Beytül müqəddəsi təsvir eylədi.
Əbu Bəkr: -Bunu Muhəmməd deyir,
Demək həqiqətdi, doğru söyləyir.
Şübhəli heç nə yox dediklərində,
Qüds şəhərini görmüşəm mən də.
Gördüklərin aydın eylədi təsvir,
Təsdiq eyləyirəm yalan deyildir.
Həzrətin göylərə merac etməsi,
Bəşər tarixinin bu hadisəsi,
Ən mürəkkəb olan hadisəsidir.
Allahın sirr qalan möcüzəsidir.[1]

[1] "ALLAHIN ELÇISI"

## MƏMMƏD ASLAN

*MERACA APARAN YOL*

Ürəyinin nurunda
Peyğəmbər yol gedirdi.
Bu vaxt yol kənarında
Bir qərib səhnə gördü:

Çocuqlar oyun qurmuş
Oxuyan kim, çalan kim...
Biri də boyun burmuş
Eh, könlünü alan kim?!

Hüznüylə ürək yaxan
Atəş kimi bir çocuq.
Utancaq gözlə baxan
Bir dənəcik, bircəcik.

Hansı yöndən baxınca
Yetim olduğu bəlli.
Qarşı gəlsin bir uca –
Yetimə bir təsəlli.

Bir zirvə göydən endi
Bu yetimin xətrinə.

Yetim dərhal bələndi
Peyğəmbərin ətrinə.

Yetim baxıb don qaldı:
Nə gəlişdi bu gəliş?!
(Ürəklərdən yön aldı
Haqqa doğru yüksəliş).

Gözünü yumub açdı
Yenidən yumdu yetim...
Zatən bu da Meracdı!
Titrədi titim – titim:

- Sənmisən ya Peyğəmbər?
Səni görən bəxtiyar!
Ətirləndi Səma, Yer,
Mənə oldu bəxtim yar.

Görüşün səadətdi,
Səni görən göz aydın!
Peyğəmbər sual etdi:
- Məni necə tanıdın?!

- Ətrindən, ya Rəsulallah!
Səni tanımamaq,

Bilməmək günah.
Rəbbimin həbibisən!

Sən mənə mən kimisən!
Çocuğun ixlasından
Peyğəmbər çiçək – çiçək!
Çocuğun dünyasından

Dünyamız da güləcək.
Çocuq – cənnət qoxusu!
Çocuq coşqun rübabdı.
Ömrün bahar yuxusu:

Ayıldımı, sabahdı.
Sual etdi Peyğəmbər:
Sən nədən oynamazsan?
Yetimi boğdu qəhər.

Dedi:
Ey böyük insan!
Onlar zəngin çocuğu,
Bu bağ – bağça, bu cünbüş,

Bu yer, bu göy, bu qurğu
Sanki onlar üçünmüş.

Mən yetimlər yetimi,
Görkəmimdən cin ürkər.

Kəsərlər taqətimi,
Ora yaxınlaşsam əgər.
Ora məni qoymazlar,
Mənə oyun qıymazlar...

Qəlbinə peyğəmbərin
Qor yağmuru ələndi.
Düşündü dərin – dərin,
Məhəbbətlə dilləndi:

Sən də mənimlə oyna,
Mənim ilə danış, gül.
Ülfətlə yaşar dünya,
Asanlaşar hər müşkül.

Bir şey oldu çocuğa,
Nə eşitdi, nə gördü.
Halına baxa – baxa
Peyğəmbər bir də sordu:

Mənə oğul olsaydın
Nolar məni sevindir.

Bilərdim məni saydın:
Evim sənin evindir.

Çocuq dondu bu yerdə:
“Bu uyqumu, gerçəkmi?!
Göz açıb yumsam, bir də
Göz onu görəcəkmi?!”

...Peyğəmbər evə döndü,
Yetim də gölgəsincə.
Dünya cənnət göründü,
Insan ucadan – uca!

Çocuqlarda sükunət,
Utancdan əllər üzdə.
Qəlblərdə eyni həsəd:
“- Yetim olsaydıq bizdə!:”

## QÖVSİ TƏBRİZİ
### *MERACNAMƏ*

Ey ruhi – pak, aləmü adəm fəda sana,
Ey kəbeyi – ümmid, iki aləm fəda sana.

Meraca vari yetdilər, ol dəm ki, etdilər
Ərvahin ənbiyayi – müqəddəm, fəda sana.

Yarəb, ola ki, mərqədi – pakində eyləyə,
Gövhərlərini dideyi – pürnəm fəda sana.

Hərçənd can qapında mətai – həqirdir,
Neylim gər etməyim onu hər dəm fəda sana.

Merac əzmin eylədin ol qürbi – zat ilə
Kim, bir dəm ola İsavü Məryəm fəda sana.

Ərz etmişəm muradi – dilim cani – şininə,
Ol kim özini etdi dəmadəm fəda sana.

Bir yol məni sifariş ana eylə, ya nəbi,
Ey nəqdi – ruh, həm anəvü həm fəda sana.

Yoxdur əgərçi rütbəsi Qövsinin, istərəm
Kim, ola cümlə xəlqdən əqdəm fəda sana.

## ŞAHİN FAZİL
### *NƏT*

“Hu!” oldu birinci söz bu Nətə,
Bu “hu” bəzək oldu, Yahu, Nətə.
Ya “hu” deyilir Sənə, ya “Yahu”,
“Yahu” deyirəm özüm də, ya “hu!”.
Hər bir sözə bu yazıldı başda,
“Hu!” başdı ki, “hu!” yazıldı başda.
Ey Nəti qiraət eyləyən kəs,
Ey mən kimi “Yahu!” söyləyən kəs,
Nadan nə bilir nədir “hu”, Yahu,
Baş sözdü bu Nətimə bu, Yahu!
Mən Nətimə min xəyalət ilə
İqdam elədim minacat ilə.
Çünki, Sənə bağlıdır xəlayiq,
Biz – xəlq olunan, Sən isə – Xaliq.
Çünki, Sənə mütidir bu aləm,
Bir “Ol!” deməyinlə oldu aləm.
Çünki, hər işin başı özünsən,
Çünki, üzüyün qaşı özünsən.
Çünki, əzələ əzəl özünsən,
Hər bir təmələ təməl özünsən,
Hər bir şəhə şəh ki var, özünsən,
Hər bəndəyə şəhriyar özünsən.

İcad eyləyən üsuli, ya Rəbb,
İrsal eləyən rəsuli, ya Rəbb.
Hər bir nəbi ki, rəsul deyildir,
Hər bir rəsul isə bir nəbidir .
Çünki, rəsulu nəbi edən – Sən,
Əhməddi, rəsulluq aldı Səndən.
Ən türfə kitabı göndərən – Sən,
Dünyayə Muhəmmədi verən – Sən.
Əhməddi, dönüb Muhəmməd oldu,
Cəhlin qabağında sərhəd oldu.
Sən sərvər edibsən ol cənabı,
Peyğəmbər edibsən ol cənabı.
Sən qət elədin o – rəhbər olsun,
İdrakinə afərinlər olsun!
Əfv eylə ki, cürətə gəlib mən
İnşa elədim qəzəl dilindən:

Nə qədər varsa – məkanı bilirəm, bildirirəm,
Və məkan içrə zamanı bilirəm, bildirirəm.
Bu cahan aləmi zənn eyləməyin vahiddir,
Neçə min böylə cahanı bilirəm, bildirirəm.
Elə sirr var ki, bir insan onu idrak etməz,
Hər şeyi mənsə əyani bilirəm, bildirirəm.
Hər nihanın mənə, əlbəttə nihanı məlum,

Hər nihan içrə nihanı bilirəm, bildirirəm.
Neçə isbatı güman eyləyən adəm çoxdur,
Cümlə isbatı, gümanı bilirəm, bildirirəm.
Yaxşı iş hər nə qədər çoxsa, yaman iş həm var,
Nə qədər yaxşı – yamanı bilirəm, bildirirəm.
Aləmin aliminin hər biri məlumdu mənə,
Nəyə laiqdi çobanı bilirəm, bildirirəm.
Kafəri yaxmağa atəşdə cəhənnəm gözlər,
Doludur qırla tiyanı bilirəm, bildirirəm.
Əlinin oğlu Hüseynin qanı islama şərəf,
Verib əldən niyə canı bilirəm, bildirirəm.
Elə kəs var ucalır həzzi göyə, kəs həm var
Ucalır ərşə fəğanı bilirəm, bildirirəm.
Cavan insanı qoca eyləyən illət nədədir?
Qoca eylər nə cavanı bilirəm, bildirirəm.
Deməsin kimsə olur boş yerə tənbeh, fələyin
Kimə tuşlandı kamanı bilirəm, bildirirəm.
Laməkan olduğuma şəkk eyləyənlər bilsin:
Laməkanəm və məkanı bilirəm, bildirirəm.
Vaxtlı – vaxtında tapındım Sənə mən, Allahım,
Şahinəm, xeyrü ziyanı bilirəm, bildirirəm.

Ey müslimə şan olan Muhəmməd,
Ey hökmü rəvan olan Muhəmməd,

Ey əqli əyan  olan  Muhəmməd,
Ey fəzli bəyan olan Muhəmməd,
Ey qəlbə şəfa olan Muhəmməd,
Ey dərdə dəva olan Muhəmməd.
Quran ki, bir kitabdı nadir,
Quran ilə Allah oldu zahir.
Quranı qiraət eyləyən çox,
Qurana "səmavidir" deyən çox.
Hər rəmzə cavabdır bu Quran,
Ən ülvi kitabdır bu Quran.
İdrakını bildirir cahanə,
Fazilliyinə odur nişanə,
Kamilliyinə odur nişanə,
Aqilliyinə odur nişanə,
Qabilliyinə odur nişanə,
Adilliyinə odur nişanə.
Hər bir dəmini edir tərənnüm,
Ürf aləmini edir tərənnüm.
Şəxsiyyətini edir tərənnüm,
Qüdsiyyətini edir tərənnüm,
Heysiyyətini edir tərənnüm,
Saf niyyətini edir tərənnüm,
Ey müslimə iftixarü hami,
Barəndə gözəl demiş Nizami:
"Sultani – səriri – kainatsan,

Şahənşəhi – kişvəri – həyatsan”.
Ey yer üzünün axır rəsuli,
Vəsfində nə xoş demiş Füzuli:
“Ey padşəhi – səriri – lövlak,
Məqsudi – vücudi – xakü əflak!...
...Ey raqimi – nüsxeyi – məani,
Məmureyi – elmi – dinə bani.
Şahənşahi – məsnədi – risalət,
Rəssami – qəvaidi – ədalət”.
Ey eşqə dayaq olan Muhəmməd,
Ey elmə çıraq olan Muhəmməd.
Ey zülmə hasar olan Muhəmməd,
Ey ədli şuar olan Muhəmməd,
Ey həqqə nəsim olan Muhəmməd,
Ey “Dürri – yetim” olan Muhəmməd.
Ey müslim üçün yanan rəsulim,
“Xeyrül – bəşər” adlana rəsulim.
Ey dinimi bərqərar edən kəs,
İslamı cahanda var edən kəs.
Ey Kəbəni təmir eyləyən kəs,
Xaliq sözünü bizə deyən kəs,
Bütxanəni ey uçurdan adəm,
Ey aləm içində tazə aləm,
Bir vədə “Əmin” adına laiq
Görmüş səni əksərən xəlaiq.

“Xeyrül – ənam”adlanan da Sənsən,
Xeyr işlə qanadlanan da Sənsən.
Ey ərşə qədəm basan rəsulim,
Allahə qulaq asan rəsulim,
Mümkünmü yenə qədəm qoyulsun?
Meracına afərinlər olsun!
Həzzin çoxalıb birə min oldu,
Merac sənin nəsibin oldu!
Allahı görən rəsul Sənsən,
Allahə ilahi qul Sənsən.
Ey ər rəsulun, ərən rəsulim,
Ey yeddi göyü görən rəsulim,
Var idi birinci göydə Adəm,
Görcək səni olmuş idi xürrəm,
Var idi ikinci göydə Yəhya,
İdrislə idi, deyildi tənha.
Var idi üçüncü göydə Yusif,
Yusif gözünə göründü arif.
Dördüncü göyə yetişdiyin dəm,
İsa Sənə olmuş idi həmdəm.
Var idi beşinci göydə Harun,
Altıncı göyə bəzəkdi Musa,
Altıncı göyə gərəkdi Musa.
Yeddinci göyə yetişdiyin an
İbrahimi görmüsən yaxından.

Cismin qəbul idi yeddi göydə,
Səkkiz rəsul idi yeddi göydə.
Sonra daha yüksəyə yönəldin,
Sən "Sidrətül – intəha"yə gəldin.
Sən "Sidrətül – intəha"də oldun,
Saf elçi idin, səfadə oldun.
Pak elçi idin, daha pak oldun,
Allahə yetib fərəhnak oldun.
Ey laiq olan ilahi lütfə,
Ey sadiq olan ilahi lütfə,
Meracına afərinlər olsun.
Zər tacına afərinlər olsun.
Meracdə yox zaman həddi,
Meracdə yox məkan həddi.
Meracını dərk edən tapılmaz,
Meracə daha gedən tapılmaz.
Meracı yığılsa aləm əqli
Dərk eyləyə bilməz adəm əqli.
Ey şerimə şan olan Muhəmməd,
Ey cismimə can olan Muhəmməd,
Ey qəlbimə nur olan Muhəmməd,
İslamə qürur olan Muhəmməd,
İslamın olan ey iftixarı,
Əfv eylə bu Şahini, bu zarı,
Zarəm ki, mən acizəm, sözüm az,
Az sözlə Nizami olmaq olmaz!

Çox sözlə Nəsimi qabil oldu,
Çox sözlə Füzuli fazil oldu.
Çox sözlə Seyid sərəfraz oldu,
Çox söz ilədimsə də az oldu.
Ver güc ki, olum şerdə qadir,
Çox sözlə Ələkbər oldu Sabir.
Ver güc ki, xəyalatım çox olsun,
Nətim və Minacatım çox olsun.
Çox Nət yazanlar oldu zahir,
Qismət mənə həm necə cəvahir.
Yəni ki, cəvahirimdi hər Nət,
İmanımı təsdiq eyləyər Nət.
Nət ilə gözüm tox olsa yaxşı,
Nətim nə qədər çox olsa yaxşı!
Ver güc ki, qəzəl bağım gül açsın,
Ver güc ki, bu dilsizin dil açsın.
Ver güc ki, desin bu şeri güclü,
Təqdim eləsin bu şeri güclü,

Dil vəsf edərsə ismin – dildarımız Muhəmməd,
Səlləllahu əleyhi və alihi və sələm.
Tutsaq həmişə rəsmin – qəmxarımızı Muhəmməd,
Səlləllahu əleyhi və alihi və səlləm.
Bütxanədən yan olduq, müştaqü heyran olduq,
Sadiq müsəlman olduq, sərdarımız Muhəmməd,
Səlləllahu əleyhi və alihi və səlləm.
Allahımız bir oldu, dilxahımız bir oldu,

On dörd əsrdir oldu meyarımız Muhəmməd,
Səlləllahu əleyhi və alihi və səlləm.
Biz bəndəyik, o – sultan, biz aşiqik, o – canan,
Eşq mülkü olsa viran memarımız Muhəmməd,
Səlləllahu əleyhi və alihi və səlləm.
Cahil sözü əzabdır, Şahin sözü gülabdır,
Peymanımız kitabdır, ilqarımız Muhəmməd
Səlləllahu əleyhi və alihi və səlləm,
Səlləllahu əleyhi və alihi və səlləm!

## NİZAMİ ZÖHRABİ
### *PEYĞƏMBƏRİN (S) XOSROV PƏRVİZƏ MƏKTUBU*

Dəvət etmək üçün hökmü – Qurana
Gəldi Mədinədən elçi İrana.
Elçinin gəlişi şah sarayına,
Təsadüf edirdi Səfər ayına.
Günəşli bir gündü, fəsli – bahardı,
Günorta çağıydı, dolu nahardı.
Qəsri bürümüşdü gülüş, çalçağır,
Küçədə yatmışdı neçə ac fağır.
Xosrov əylənirdi, yaman kefdəydi,
Müğənni müftəydi, kaman müftəydi.
Çəkdikcə şahənşah qızların nazın,
Içində duyurdu ruhunu yazın.
Cavanlıq eşqiylə qəlbi vururdu,
Bu anda yaşadan onu qürurdu.
Iki yarımçılpaq sərxoş rəqqasə
Birgə vermişdilər bərkdən səs – səsə.
Gəlib əyanlara yanaşıb təlxək,
Təlqin eyləyirdi onları tək – tək.
Girirdi qızlarala təlxək qol – qola,
Gülüb qəşş edirdi Xosrov az qala.
Elçinin buraya qəfil gəlişi
Kəsdi məzhəkəni, kəsdi gülüşü.
Dərhal bir ciddilik gəldi saraya,

Düzüldü əyanlar bir – bir sıraya.
Durub hüzurunda Xosrov Pərvizin,
Ona təqdim etdi Abdullah özün.
Fikrini ətraflı anladıb şaha,
Vaxtı yubatmadı Abdullah daha.
Keçib, şahənşaha verdi naməni,
Söylədi:-Peyğəmbər göndərib məni.
Çıxarıb şahənşah naməni zərfdən,
Üzünü turşutdu elə ilk hərfdən.
Görəndə lap başda Allah adını,
Yeritdi xudpəsənd şah inadını.
Boğa bilməyirdi hirsini Pərviz,
Başında tükləri qabardı biz – biz.
Ilk iki misranı güclə oxudu,
Dedi:-Bu aşkardır, yoxsa yuxudu?!
Sözü xahişi yox, hökmü andırır,
Od vurub içimdən məni yandırır.
Mən Xosrov Pərvizəm, şahlar şahıyam,
Qədim bir ölkənin tək pənahıyam.
Mənəm sevinci də, onun ahı da,
Mənəm qibləsi də, qibləgahı da.
Başımı əymərəm mən hər yetənə,-
Deyə Xosrov vurdu elçiyə tənə.
Kəsib o, sözünü xəyala daldı,
Susmuşdu əyanlar, hamısı laldı.

Otaqda hökm edən indi sükutdu,
Duruşlar saxtaydı, baxışlar kütdü.
Hamı gözləyirdi şahın əmrini,
Saray yaşayırdı bir qul ömrünü.
Yanına düşmüşdü Xosrovun qolu,
Əlində qalmışdı qədəhi dolu.
Durub yavaş – yavaş düşdü o, taxtdan,
Dayanıb bir qədər, çıxdı otaqdan.
Bir azdan qayıdıb əyləşdi taxta,
Oldu damarında qan laxta – laxta.
Hirsindən sifəti olmuşdu gömgöy,
Axıb qədəhindən tökülürdü mey.
Qəzəb güc gəlirdi, o, titrəyirdi,
Dodağı altında nəsə deyirdi.
Nəhayət, hikkəsi verdi büruzə,
Eylədi məktubu o, rizə - rizə.
Kağız parçasını səpib otağa,
Gəzdirdi gözünü o, sola, sağa.
Bağırdı:-Bir görün yazan nə yazıb,
Görünür dəlidir, yolunu azıb.
Yazıb ki, nəbiyəm, xətmi – rəsulam,
Haqqa səsləməyə sizi məsulam,-
Deyib, təkrar etdi o, ilk misranı,
Başına götürdü səsi Kisranı.
Sonra dörd yanını o, süzə - süzə,

Gəlib Abdullahla durdu üz – üzə.
Söylədi, boğaraq bir az hirsini:
-Elçisən, verərdim yoxsa dərsini.
Yaraşmaz adıma elçiyə qıymaq,
Qıysam, tənə edər mənə el – oymaq.
Get çatdır sözümü Peyğəmbərinə,
Qoymasın o, məni axmaq yerinə
Yaraşmaz heç zaman İran şahına
Baş əymək nə ona, nə Allahına.
Mənim inandığım alovdur, oddur,
Sizin Allahnız könlümə yaddır.
Mən qail olmaram heç görünməzə,
Allah varsa əgər, görünsün gözə.
Bu yerdə şah birdən sözünü kəsdi,
Otaqda o yana, bu yana gəzdi.
Düşünüb o, nəsə yadına saldı.
Birdən vahiməli səsi ucaldı:
-Yox, yox, görünsə də Allah gözümə,
Səcdəni bilmərəm caiz özümə.
Varlıq tanımıram özümdən uca,
Məni çıxartmayın dözümdən bica.
Zidd gedə bilmərəm öz amalıma,
Qatmaq istəmirəm zəhər balıma.
Üzünü çevirib sonra vəzirə:
-Yazdır bu məktuba layiq nəzirə.

Ver gələn elçiyə, burdan onu qov,-
Deyə sakitləşdi azacıq Xosrov.
Əyləşdi taxtına düşünüb bir az
Cavab göndərməkdən Xosrov keçdi vaz.
Dedi:-Tez xəbərdar eylə Bazanı,[1]
Yanıma gətirsin bunu yazanı.
Gətirsin onu bir qul timsalında,
Gətirsin, əlləri bağlı dalında.
Gedirdi Abdullah, ancaq pərt idi,
Xosrovun cavabı yaman sərt idi.
Bilmirdi Abdullah eyləsin necə,
Başına gələni söyləsin necə?
Gedirdi üç gündü tər tökə - tökə,
Ayağı altında yer çökə - çökə.
Hələ də elçiyə deyildi məlum
Ki, dünən Xosrovu haqlayıb ölüm.
Gəlmirdi, gəlməzdi nə də ağlına
Ki, şah qurban gedib doğma oğluna.[2]
Rəsuli Əkrəmə Rəbbi həyandı,
Hər şey Mədinədə ona əyandı.
Aşkar olmamış olay İranda,
O, xəbər almışdı yerdən duranda.
Sübh tezdən olmuşdu Cəbrail nazil,
Gecənin sirrindən agahdı fazil.

---

[1] İran şahının Həməndəki valisi
[2] Xosrovu oğlu Şiruyə öldürmüşdü.

Bilirdi Kisranın sınıbdır tağı,
Dönüb cəhənnəmə şahın otağı.
Dolub gecə onun qarnına sancı,
Ona kar verməyib saxta inancı.
Gəlməyib əməli Yaradana xoş,
Gedib axirətə bir şah əli boş.
Hələ qoyulmamış qəbrə o murdar,
Artıq çəkilmişdi Mədinədə car.

Gəlib yetişməmiş həftənin sonu,
Açıldı elə bil buzlağın donu.
Olacaq şahənşahın əmrindən hali,
Vurdu oda – közə özünü vali.
Bərkdən salmasa da o, səsə bunu,
Gizlində çəkirdi ipə sabunu.
Oldu iki yolçu səvar Yəməndə
Biri kəhər ata, biri səməndə.
Vali öz fikrini bildirib qəti,
Söylədi salanda yola heyəti:
-Dönməyin siz onsuz dala bu yolu,
Ya diri gətirin, ya da ki, ölü.
Tezdən yola düşdü bu kiçik heyət,
Məlumdu son mənzil, məlumdu niyyət.
Qaldı qumlu düzlər, vadilər dalda,

Tükəndi qabda su, bardaqda bal da.
Yandırdı yol boyu onları isti,
Çatdılar mənzilə bir axşamüstü.
Bilal qurtaranda axşam azanın,
Atdan elçiləri endi Bazanın.
Gördülər tələsir hamı məscidə,
Yoxdu bu birlikdən düşən kəs cüda.
Etdi elçiləri bu halət məftun,
Əlif qamətləri dönüb oldu nun.
Oldu ürəkləri elçilərin fəth,
Şükr edib Allaha, yetirdilər mədh.
Axıra çatanda sonuncu rükət
Elçilər etdilər birgə hərəkət.
Dedilər, Rəsula edərək təzim:
-Dəyişdi barəndə fikrimiz bizim.
Bir xəbis niyyətə gəlmişdik bura ,
Çıxıb dumanlıqdan, bələndik nura.
Azanla ram etdi bizi müəzzin,
Misilsiz anını yaşadıq həzzin.
Səcdəyə getməzdən tutduq iqamə,
Əyilib, ucaldıq ali məqama!
Elçilər azacıq verib fasilə,
Dedilər:-Biz gəldik belə hasilə
Ki, çirkin gizlənər gələndə gözəl,
Isti yel əsəndə tökülər xəzəl.

Gəlib səni gördük, qeyri – iradi
Dəyişdik mətləbi, fikri, muradı.
Haqqdır o Allah da, haqsan özün də,
Kimliyin əks olub nurlu üzündə.
Bir din tanımırıq bundan faydalı,
Bunun qədər düzgün qanun – qaydalı.
Bu andan islama qail kəslərik,
Gedib qövmümüzü Haqqa səslərik.
Rəsulun üzünə təbəssüm çökdü,
Sirli məqamları o, açıb – tökdü.
Dedi:-Yerə düşdü Xosrovun tacı,
Bələndi al qana uzun çal saçı.
Bu ölüm Allahdan gələn qəzadır,
O, küfrə müqabil haqlı cəzadır.
Zülmü rəva bilsə özünə zalim,
Islah edə bilməz onu yüz alim.
Biz ona göndərdik lölöyi – xuşab,1
O, özü olmadı bu sovqata bab.

Gəldilər elçilər ordan Yəmənə,
Gəldi bir rəvayət çölə - çəmənə.
Gəldi bir parlaqlıq Aya, Günəşə,
Gəldi üzlərə nur, ruhlara nəşə.
Verdilər elçilər valiyə müjdə,

[1] Ən qiymətli ləl

Sığışan deyildi bu sovqat müştə.[1]
Yox oldu qəlbindən qorxu, sıxıntı,
O, Haqqa qovuşub, Haqqa sığındı.
Qurtardı baş əymək İran şahına,
Əl açdı Allahın o, dərgahına.

## *PEYĞƏMBƏRİN (S) ELÇİSİNİN BİZANS QEYSƏRİ HERAKL İLƏ GÖRÜŞÜ*

Qüdsdən qayıdırıdı Bizans Qeysəri,
Şamda köç salmışdı, rahatdı yeri.
O gün Şama gəldi Dihyətul – Kəlbi,
Işdən hali oldu, böyüdü qəlbi.
Öyrəndi Heraklın elçi yerini,
Açaraq başını, sildi tərini
Yanına gələrək hündür bir daşın,
Qurdu daş dibində elçi bardaşın.
Oturub azacıq burda dincəldi,
Durub Qeysər qalan saraya gəldi.
Çöldə ayağının çırpdı tozunu,
Görüşə eylədi hazır özünü.
Əvvəl tarazladı o, əmmaməni,
Çıxarıb əlində tutdu naməni.

[1] Ovuc

Keçib salam verdi hamıya elçi,
Naməni Qeysərə uzatdı yolçu.
Oxudu məktubu Qeysər astadan,
Dedi:-Bu, naşıya dərsdir ustadan.
Baxıb qoca rahib dərin maraqla,
Dözməyib tez sual etdi Herakla:
-Kimdir onu yazan, nədir diləyi,
Hansı səmtdən əsir səhra küləyi?
Qeysər sərt baxışla süzüb rahibi,
Dedi:-Muhəmməddir onun sahibi.
Nə kin var sözündə, nə də ədavət,
Islama eyləyir bizi o, dəvət.
Pislikdən görmürəm burda bir əsər,-
Deyə tamamladı sözünü Qeysər.
Hər yandan nəzərlər ona tuşlandı,
Qızğın mübahisə dərhal başlandı.
Rahib mızıldandı edərək irad:
-Çox şey vəd eləyir dediyin bir ad.
Bəlli olmasa da tamam məzmunu,
Görürəm, bu məktub qırıb əzmini.
Dərindən bir düşün cavab verməmiş,
Nə o, bir naşıdır, nə biz görməmiş.
Indi cavbdehsən dövlət adından,
Hər şey asılıdır sərt inadından.
Düşün ki, məsulsan hər xaçpərəstə,

Yol verə bilməzsən burada qəsdə.
Sənin qabağında iki yol durur,
Birində itaət, birində qürur.
Düşün həm özünü, həm də Bizansı,
Demə çəp hansıdır, demə düz hansı.
"Hə" desən, üstünə qalxar Roma da,
Sənə saray nədir, qalmaz koma da.
O zaman əlvida söylə təxtinə,
Tüpür taleyinə, tüpür bəxtinə.
Özündə deyildi halı Qeysərin,
Yavaşca qaşıyıb ovdu peysərin.
Baxırdı qəzəblə yüzlərlə papaz,
Elə bil Qeysərə dəyirdi qapaz.
Qeysər necə desin, onun sələfi
Qəsdən dolaşdırıb öncə kələfi.
Iki yüz yetmiş dörd il bundan əqdəm
Olunub çox çirkin əmələ iqdam.
Birinci Konstantın çağırıb Sobor,
Qazdırıb "İncil"in əsli üçün gor.
Göstəriş verıb o,üç yüz nəfərə,
Çəkdirib üstünə Haqqın kəfərə.
Orda həqiqətin boğulub səsi,
Yazılıb "İncil"in saxta nüsxəsi.
Odur, pıçıldadı elçiyə Qeysər:
-Heyif, nəsibimiz olmadı Kövsər.

Etdik axirəti dünyaya fəda,
Satdıq imanı puç şərəfə, ada.
Tapa bilməyirəm ayrı yol, anla,
Məcburam barışam mövcud olanla,-
Deyə yola saldı Qeysər elçini,
Sonra köks ötürüb, çəkdi içini.

## *PEYĞƏMBƏRİN (S.) ELÇİSİ MİSİR KRALI MUKAVKISIN SARAYINDA*

Var idi sarayda ayrı ehtişam,
Verildi elçiyə Kral burda şam.
Edib əyanlarla Xətibi tanış,
Dedi:-Qarış bizə, elçi, gül, danış.
Bura nə İrandır, nə də ki, Şamdır,
Gəlişin bizimçün bir xoş məqamdır.
Sənin dediklərin gəlib xoşuma,
Qövmümü yığmışam odur başıma.
Bir halda bildiniz bizi feyzə bab,
Islamdan söhbət aç, olaq feyziyab.
Xətib yerə qoyub şərbət camını,
Məclisə bildirdi ehtiramını.
Anladıb islamın mahiyyətini,
Sonra təkrar etdi öz niyyətini.
Elçinin söhbəti, sözü çox çəkdi,

Dinləyən hesabsız, danışan təkdi.
Nəhayət, qurtardı sözünü Xətib,
Verildi məclisə bir başqa tərtib.
Nüfuzlu kəsləri qədim Misirin
Etdilər söhbətdə əvəz bir – birin.
Verildi xətm üçün söz Mukavkısa,
Danışdı o, kəskin, mənalı qısa.
Kral ölçüb – biçdi hər bir sözünü,
O, sözü bəzədi onda söz onu.
Çatdı o, dünyada arzuya, kama,
Söz onu ucaltdı yüksək məqama.
Söylədi:-Döğulub burda fironlar,
Ediblər dünyanı tərk bir – bir onlar.
Qalıb hərəsindən neçə nişanə,
Biri ehram tikib, biri kaşanə.
Biri çox sərt olub, birisi həlim,
Almışıq hərədən bir cürə təlim.
Misirdən başlayıb hər bir inkişaf,
Lil sular durulub olub burada saf.
Sənət də başlayıb burdan, yazı da.
Insan məskəninin ilkin izi də.
Olub qədim diyar elmin mərkəzi,
Bizə dikilibdir dünyanın gözü.
Keçməyib yenilik Misirdən qıraq,
Ona böyük olub həmişə maraq.

Olmuşuq hikmətin biz məhək daşı,
Qətiyyən deyilik seçimdə naşı.
Çox təklif alsaq da Bizansdan, Şamdan,
Ancaq etməmişik nuş hər təamdan.
Onların olsa da vədləri yağlı,
Bizim gözlərimiz olmayıb bağlı.
Dünyanın işini hey izləmişik,
Səbr edib bu günü çox gözləmişik.
Yüz illər çəkmişik intizarını,
Dərdik o həsrətin vüsal barını.
Zuhuru gözlənən sonuncu Rəsul
Olub nəhayət ki, Məkkədən hasil.
Ehkami – islamla artıq tanışıq,
Yersizdir, zənnimcə, artıq danışıq.
Zəkalar beşiyi sayılan Misir
Görməyir bu dində zərrəcə qüsur.
Olmayıb bu qədər bizlərə məhrəm
Heç bir daş kitabə, heç uca ehram.
Bir din tanımırıq biz ondan ali,
Səmavi, bəşəri, nöqsandan xali.
Muhəmməd Rəsuldur, yoxdur buna şəkk
Allahın nurundan olub o, münfəkk.1
Görün nə məqama ucalmışıq biz
Ki, tutub Peyğəmbər ordan bizə üz.
Allahdan olunub bizə lütf əta,
Layiq bilinmişik biz iltifata.
Açıb Allah bizə nicat qapısı,

[1] Qopmaq, ayrılmaq

Hidayət qapısı, hacət qapısı.
Kral tamamladı sözünü belə,
Gəlib o, Xətiblə tutdu əl - ələ.
Dedi:-Bildin, qardaş, niyyətimizi,
Çatdır Peyğəmbərə beyətimizi.
Gətirdik haqq olan Allaha iman,
Bir də fikrimizi bürüməz duman.
Hər zaman hər yerdə sizinlə varıq,
Allaha baş əyən müti qullarıq.
Sonra üz tutaraq Kral kabitə:
-Gətir, məktubu ver, -dedi – Xətibə.
Məclis belə bitdi gecə yarısı,
Yerə süzüləndə Ayın sarası.
Misir torpağına ələnən ziya
Tamam tənasübdü sözə, mövzuya.
Səhəri elçiyə qoşub Mukavkis
Göndərdi Həzərtə bir at, iki qız.
Misir torapağından çıxmamış hənuz,
Tutdu Haqq yolunu hər iki kəniz.
Gəldi Mədiniyə iki çariyə,
Birisi Şirindi, biri Mariyə.
Yoxdu belə gözəl heç bir ölkədə,
Günəşi qoyurdu qızlar kölgədə.
Peyğəmbər Hassana verdi Şirini,
Saçı gül qoxulu, dili şirini.
Saxladı yanında o, ikincini-
Halal nəslə mənsub bu saf incini.
Edib Mariyəyə fikrini agah,
Bağladı Peyğəmbər onunla nigah.

## NİZAMİ ZÖHRABİ
## *PEYĞƏMBƏRİN (S) MƏDİNƏDƏ QARŞILANMASI*

Vardı Mədinədə şənlik havası,
Müşk - ənbər saçırdı torpaq, hava, su.
Üzlərdən yağırdı sevinc, həyacan,
Xoş səda qalibdi Yerdən Göyəcən.
Çöl darlıq edirdi orda adamdan,
Çıxıb boylanırdı uşaqlar damdan.
Nəhayət, dəvələr gəldi yaxına,
Qoşuldu onlar da bu gur axına.
Hamı niyyət etdi tutsun ovsarı,
Çəksin qafiləni evinə sarı.
Bu yerdə qaldırdı Həzrət səsini,
Dedi: -Dəvəm bilir vəzifəsini.
Onun ovsarını siz boş buraxın,
Dəvənin yatdığı yerə bir baxın.
Görün baş verəcək vaqiə harda,
Kiçik bir nişangah basdırın orda.
Razı olsa yerin sahibi hərgah,
Biz orda tikərik dini qərargah.
Intizar içində qaldı camaat,
Hamı həsrət ilə baxırdı mat – mat.
Başını aşağı salaraq dəvə,
Gəlib yaxınlaşdı köhnə bir evə.

Allahdan dəvəyə verildi izin,
Əyilib söykədi yerə o, dizin.
Durub getdi bir az, diz üstə bir də
Çökdü nəccarlara məxsus bir yerdə.
Peyğəmbər dəvənin üstündən düşdü,
Camaat onunla gəlib görüşdü.
-Xoş gəldin Allahın Rəsulu, -deyə
Aldılar bir anda onu dövrəyə.
Tez Xalid ibni Zeyd qabağa çıxdı,
Öpdü Peyğəmbəri, əlini sıxdı.
Söylədi: -Var mənim səkkiz otağım,
Yeməyə çörəyim, yerim – yatağım.
Bu gündən sənindir mənim olanım,
Gərək qulluğunda özüm dolanım.
Xalid layiq bildi məni şərəfə,
Döndərdi dəvəni bizim tərəfə.
Allah rəhmətini saldı üstümə,
Qonşuluq lütf etdi əziz dostuma.
Allah yer qoymayıb heç bəhanəyə,
Gəl gedək, ya Rəsul, bizim xanəyə.
Olmadı Həzrətin ona iradı,
Dedi: -Düşdüyüm yer elə buradı.
Allahın adından gələn bu səfir
Xalidin evində oldu müsafir.

## *MƏDİNƏDƏ İSLAMIN YÜKSƏLİŞİ*

Həzrət Mədinəyə gəldiyi zaman
Sayca hələ azdı burda müsəlman.
Bu şəhər Məkkədən fərqli olaraq
Dinə göstərirdi çox böyük maraq.
O, sərhəd çəkirdi hər çirkin cəhdə,
Sadiqdi əvvəldən bağlanan əhdə.
Ola bilməz başqa birlikdə təməl
Dini qardaşlıqdan daha mükəmməl.
Allah elçisinin bura gəlişi
Xeyli canlandırdı müqəddəs işi.
Həm Xəzrəc, həm də ki, Ovs buna şaddı,
Daha kin – küdurət onlara yaddı.
O vaxt bölünsə də şəhər üç yerə,
Burda öz dininə qaildi hərə.
Müsəlman ərəb də, yəhudilər də,
Gəzib dolanırdı sakit bir yerdə.
Eyni məhəllədə, eyni dalanda
Vardı yəhudi də, müşrik olan da.
Düşməzdi burada bir nəfər də rast
Həzrəti İsaya qail xaçpərəst.
Kim ki, sinəsində xaç daşıyırdı,
Salaraq Nəcranda yurd, yaşayırdı.
Heç kəs başqasına olmurdu mane,

Bu hal Peyğəmbəri edirdi qane.
Dində zorakılıq yoxdur deyərək,
Gücünü vermişdi təbliğata tək.
Təbliğ olunurdu hər bir din azad,
Arada nə nifaq vardı, nə təzad.
Bir gün camaata Həzrət xitabən
Dedi: -Bir məsləhət eyləyirəm mən.
Ibadət etməkçün asudə hər kəs
Yaratmaq lazımdır bir dini mərkəz.
Sanki hamı bənddi bu göstərişə,
Etdilər Məscidi – Şərifi inşa.
Indi Mədinədə doğan Günəşi
Azanla səslərdi Bilal Həbəşi.
Çıxıb minarəyə hər gün müəzzin,
Kəlmeyi – şəhadət söylərdi həzin.
Məsciddən göylərə ucalan səda
Fəth edib qəlbləri salırdı oda.
Məscidə bitişik iki otaqlı
Bir ev də yapdılar qapısı tağlı.
Divarlar üstünə atıb şalbanı,
Çıxıb suvadılar bir gündə damı.
Salıb səliqəyə evin içini,
Yığdılar Həzrətin bura köçünü.
Düşdü Peyğəmbərin sahmana yurdu,
O, Ayişə ilə ailə qurdu.

Islam artırdıqca öz nüfuzunu,
Çoxları tuturdu ona üzünü.
Düşmüşdü müşriklər bundan qorxuya,
Gedə bilmirdilər gecə yuxuya.
Görəndə islamın yüksəlişini,
Qıcdı yəhudilər ona dişini.
Kurayza Fədəkdə, Kaynuka burda
Dedi: -Sahib çıxıb o, bizim yurda.
Çatıbdır Muhəmməd yüksək ad – sana,
Baxırıq kənardan biz yana – yana.
Əgər ki, bir il də keçsə bu sayaq,
Tapacaq özünə hər yanda dayaq.
Əgər Mədinədə qalmaq istəsək,
Gərək bu vüsətin qarşısın kəsək.
Ya gərək baş alıb buradan qaçaq,
Ya da başımızdan onu biz açaq.
Dəyişək biz gərək güc nisbətini,
Qoy didsin məsihlər onun ətini.
Getməsə ərəblər dini savaşa,
Məqsədi başqa cür çatdıraq başa.
Bir qədər dəyişsək işin qaydasın,
Tezliklə görərik bunun faydasın.
Nifaq salmaq üçün başqa zəmində
Göstərə bilərik işin cəmin də.
Dəysə Xəzrəc ilə Övsün arası,

Bizim gözümüzün getməz qarası.
Araya salmaqçün yenə davanı
Bəsdir qızışdirmaq iki cavanı.

O vaxt Mədinədə hərb qadağandı,
“Hər kəs cürət edib pozsa bu andı,
Edər öz başını bəlaya düçar”-
Deyə çəkilmişdi dörd bir yana car.
Çəkib məramının üstünə pərdə,
Saldı yəhudilər nifaq şəhərdə.
Onlar çıxmasa da özləri üzə,
Işləri verirdi hər an büruzə.
Ovsdən olan biri bazarda açıq
Xəzrəcli cavana verirdi acıq.
Verib çəkinmədən qabağa döşün,
Təhlil eyləyirdi Buas döyüşün.
Keçmişi o, şirin – şirin anırdı,
Danışdıqca coşub, lovğalanırdı.
Xəzrəcli hirsidən tir – tir əsirdi,
Dişi bağırsağın onun kəsirdi.
Nəhayət, xəzrəcli gətirmədi tab,
Verdi o cavna belə bir cavab:
-Gec deyil, vuruşmaq əgər istəsən,
Çək mənim üstümə yenə dəstə sən.
Kişisən gəl girək bir də döyüşə,-

Deyərək başladı o da söyüşə.
Bu vaxt gəldi Ovsün bir ağsaqqalı,
Yatırtdı o, dərhal bu qilü – qalı.
Dedi öz qövmünə: -Döymə döşünə.
Insan iş görməzdən gərək düşünə.
Bu xəbər bir azdan Həzrətə çatdı,
Durub əbasını çiyninə atdı.
-Dava – dalaş hara, müsəlman hara?-
Deyərək üz tutdu dərhal bazara.
Peyğəmbər bazara gəlib çatanda
Ordaydı söyən də, araqatan da.
Anlayıb fikrini yəhudilərin,
O, daldı xəyala dərindən – dərin.
Söylədi: -Gedirkən biz əmniyyətə,
Kim sizi sövq edib çirkin niyyətə?
Siz dava salsanız islam laxlayar,
Kim bunun qarşısın onda saxlayar?
Aldanıb İblisin yağlı dilinə,
Gəlin siz uymayın onun felinə.
Cövlan elədikcə İblisin atı,
Bürüyüb aparar qan bu elatı.
Salın, ey qardaşlar, onu siz atdan,
Gen durun qurduğu hiylə - fəsaddan.
Görün insan ömrü necə qısadır,
Yaxşılıq hər ömrü min il uzadır.

Yaxşı bir iş tutsa Adəm övladı,
Öləndən sonra da yaşayar adı.
Tez yaddan silinir yamanlıq, pislik,
Kimsəyə lazımdır məgər xəbislik?!
Yanaşı durubdur yaxşı da pis də,
Dünya qərar tutub yaxşılar üstdə.
Yaxşılıq etməkçün yaranıb insan,
O, gərək bu yolla qazana ad – san.
Çalışıb sədd çəkə fitnə - fəsada,
Saleh əməllərə o, əl uzada.
Nəticə çıxarın dediklərimdən,
Düşünün sözümü bir də dərindən.
Aralı durmayın, gəlib qarışın,
Təvəqqe edirəm sizdən, barışın.
Cavanlar oldular burda qol – boyun,
Barışla qurtardı qorxulu oyun.

## *QUREYİŞ İSLAM ƏLEYHİNƏ*

Islam olduğundan zidd nüfuzuna,
Qüreyş buraxmırdı yaxın özünə.
Illərlə göstərdi mənasız inad,
Üz – üzə dayandı atayla övlad.
Əsla inanmırdı Qüreyş məada,
Axirət gününü salmırdı yada.

Ayrıla bilmirdi öz adətindən,
Zövq alırdı bütə ibadətindən.
Qüreyş öyünürdü övladlarıyla,
Ucuz  şöhrətiylə, bir də varıyla.
-Necə ola bilər, axı nə təhər
Hamı bir ağacdan götürsün bəhər?
Hər kəs arvadına sahib olsa bəs
Təmin olunarmı kişidə həvəs?
Axı nə istəyir Muhəmməd bizdən,
Niyə dönməliyik əqidəmizdən?
Biz verə bilmərik bu işə rüxsət,
Üstündən tezliklə çəkməliyik xətt.
Olmaz ona vermək bunca ixtiyar, -
Deyə çıxartdılar başçılar qərar.
- Hamımız birlikdə Qüreyş nəsliyik,
Bizim Muhəmmədən nəyimiz əskik?
Var ikən Müğeyrə, bir də Ümeyyə,
Muhəmməd peyğəmbər sayılsın niyə?
Yığışıb eyləyək biz ona üsyan,-
Bağırdı yerindən tez Əbu Sufyan.
Bir yandan islamın təmiz havası,
Bir yandan vəzifə, tayfa davası
Seçim qarşısında qoydu Qureyşi,
Həll edə bilmirdi bu müşkül işi.
Yüksəkdə tutaraq öz qürurunu,

Zəif nəfəsiylə Allah nurunu
Söndürmək istəyən Qureyş tayfası,
Bilmirdi inadın yoxdur faydası.

Bir axşam oldular ağsaqqlar cəm,
Götür – qoy etdilər ta ki sübhəcən.
Əbu Talibgilə tezdən getdilər,
Onu məsələdən agah etdilər.
Keçdilər hücuma sağdan və soldan:
-Sən onu tez qaytar getdiyi yoldan.
Vacibdir öyrənək biz əvvəl – axır
Muhəmməd nə üçün bütə zidd çıxır?
Çağır, söhbət elə, bir onu dindir,
Dinimiz var ikən bu din nə dindir?
Soruş, niyə olub bütlərə asi,
Bəlkə vardır onun öz təmənnası?
Daha tükənibdir bizim səbrimiz,
Götürə bilmərik belə cəbri biz.
Çəkindir tez onu tutduğu işdən,
Yubatsan gec olar, keçər iş işdən.
Əgər yenə etsən ona himayə,
Verərsən hörməti büsbütün zayə.
Sən onu bu yoldan çəkindirməsən,
Bu gündən bizimçün nə o var, nə sən.
Qureyş tayfasının səbri daşırdı,

Vəziyyət günbəgün ağırlaşırdı.
Bu qarşıdurmaya çəkmək üçün sədd
Səhəri göstərdi Əbu Talib cəhd.
Durub Peyğəmbərin evinə getdi,
Qövmünün sözünü o, təkrar etdi.
Bildirdi fikrini ona aşikar:
-Mən ola bilmərəm nə lal, nə də kar,
Bil, çəkə bilmərəm bu boyda qəmi.
-Ey atam əvəzi, ay əziz əmi, -
Deyərək Peyğəmbər birdən dilləndi,
Iti baxışları ona zilləndi.
-Qureyşin dil vermə sən gəl ağzına,
Diqqət ver dediyin sözün məğzinə.
Gəl, qərar çıxartma belə tələsik,
Sən bax həqiqətin gözlərinə dik.
Sən mənə həm əmi, həm də atasan.
Muncuq deyiləm ki,qırıb atasan.
Himayə etmisən məni bu qədər,
Verməz zəhmətini İlahi hədər.
Bilirəm, boynumda haqqın böyükdür,
Ancaq bu sözlərin çox ağır yükdür,
Gəzdirmək dözümüm xaricindədir.
Ixtiyar nə səndə, nə də məndədir,
Allah tərəfindən mən seçilmişəm,
Onu təbliğ etmək olubdur peşəm.

Istəsə, çıxardar sözü yadımdan,
Tapılmaz yapışan qol – qanadımdan.
Rəbbimin vəhyinə olmuşam məzhər,
Məni düşündürmür nə ləl, nə gövhər.
Özümdən etmirəm mən heç bir işi,
Qoysalar əlimə Ayı, Günəşi,
Heç vaxt ayrılmaram risalətimdən,
Mən dönə bilmərəm öz adətimdən.
Əlini çəksən də üstümdən, əmi,
Mən üzə bilmərəm Haqdan əlimi.
Əmisi bu yerdə ucaldıb səsin
Söylədi: -Xətrinə sözüm dəyməsin.
Haqqın məgər başqa yox yardımçısı?
-Haqq sonsuz ümmandır, bizsə - damcısı.
Onun ehtiyacı yardıma yoxdur,
Özünün qüdrəti hamıdan çoxdur.
Etsəniz də zülmə, dərdə tuş məni,
Mən ola bilmərəm Haqqın düşməni.
Yox, yox, ayrılmaram Cənabi Haqdan,
Əziyyət çəkmə sən, əmi, nahaqdan.
Ya O, qüvvət verər bu işdə, ya da
Canımı yolunda eylərəm fəda.
Bircə narahatam mən sənə görə,
Qorxuram imansız gedəsən gora.
Əmi, ibrət götür övladi – Nuhdan,

Haqqa pənah apar, gəl düşmə ruhdan.
Girmə od içinə sən bilə - bilə,
Rəhməti bir olan Allahdan dilə.
Bil ki, hər əməlin Ona əyandır,
Allah tövbəkarı bağışlayandır.
Kimin ki, əlləri ona uzanıb,
Umduğu faydadan artıq qazanıb.
Bir sonsuz ümmandır lütfü, kərəmi,
Tövbə et, dayanma sən bekar, əmi.
Yaşama kafirtək qalan ömrünü,
Etmə bilə - bilə talan ömrünü.
Günahdan çəkinsən hətta yarıdan.
Mərhəmət görərsən Allah sarıdan, -
Söyləyib Muhəmməd durdu yerindən,
Dərdi nəfəsini bir az dərindən.
Əsirdi dodağı, dolmuşdu gözü,
Əmisinə təsir eylədi sözü.
Tərəddüd etsə də çox Əbu Talib,
Gəldi düşüncəsi dilinə qalib.
Qoca birdən – birə gələrək cuşa
Dedi: - Olacağam səninlə qoşa.
Nə qədər ki, axır damarımda qan,
Cismimi nə qədər tərk etməyib can,
Bir kimsə toxuna bilməz tükünə,
Şərikəm çəkdiyin bu haqq yükünə.

Mən düşmən önündə çəkərəm çəpər,
Sinəmi səninçün eylərəm sipər.
Bil ki, ya Muhəmməd, sən deyilsən tək,
Məndən görəcəksən həmişə kömək.
Çəkinmə cavandan, nə də qocadan,
Sözünü hər yerdə söylə ucadan.

## MƏKKƏNİN ALINMASI

Bütün Mədinədə islam yayıldı,
Dinsizlər Məkkədə hələ qalırdı.
Bağlayıb arada sülh müqavilə,
Pozmurdu şərtləri heç biri hələ.
Fürsəti vermədən gecəylə ələ,
Bir gün hücum etdi düşmən qəbilə.
Neçə keşikçini qətlə yetirdi,
Sonra da xəbərsiz geri çəkildi.
Peyğəmbər səhəri bunu eşitdi,
Döyüşə başlamaq əmrini etdi.
Bilib Əbu –Sufyan tez bu xəbəri,
Dedi: alacaqdır ordu şəhəri.
Yığaraq bir yerə şəhər əhlini,
Dedi: qəbul edin islam dinini.
Gəlib yaxınlaşıb islam ordusu,
Bacara bilmərik daha doğrusu.

Bu sözdən qorxaraq Məkkəlilər,
İslamı ürəkdən qəbul etdilər.
Gəlib Əbu –Sufyan onun yanına,
Dedi: bağışlayın, qardaş –oğluna .
İslama gəldiyin ona söylədi,
Pis əməllərindən tövbə eylədi.
Gəlib yaxınlaşdı şəhərə ordu,
Məkkədən bir qədər aralı durdu.
Şəhər peyğəmbərə yaman əzizdi,
O, burda nə qədər təhqirə dözdü.
Bəzən yuxularda onu görürdü,
Sevincdən gözündən yaş tökülürdü.
Elə ki, o gəldi öz şəhərinə,
Getdi ziyarətə Kəbə evinə.
Kəbə ətrafında çadır quruldu,
Çadırda peyğəmbər təmiz yuyundu.
Bir qara əbanı geydi əyninə,
Tutaraq üzünü Məkkə əhlinə,
Dedi: qardaşları Yusifi atdı.
Didərgin salaraq günaha batdı.
Yenə bağışladı Yusif onları,
Əfv etdim mən sizi, o günahları.
Onu alqışlayıb dedilər rəhbər,
Hamı qışqırırdı Allhu –Əkbər.

## *MƏKKƏ AĞSAQQALLARININ PEYĞƏMBƏRİN(S) QƏTLİNƏ FƏRMAN VERMƏSİ*

Allah  xəlq etsə də hamını azad,
Arada bəndələr yaradıb təzad.
Qureyş gəlməyirdi Muhəmmədlə düz,
Hər an gözlənirdi ona təcavüz.
Mədinə çıxandan ona tərəfdar
Məkkə düşünməyə olmuşdu vadar.
Belə hal Qureyşi yaman sıxırdı,
Gözü hədəqədən onun çıxırdı.
Mədinə verirdi islama rəvac,
O, özü qoyurdu öz başına tac.
Qureyşsə qazırdı özünə quyu,
Durulmaq bilmirdi Məkkənin suyu.
Mədinə islama açdıqca meydan,
Məkkədə kin tumu səpirdi Şeytan.
Bitirdi bu tumdan hiylə, vəsvəsə,
Hamı gözləyirdi olacaq nəsə.
Üzürdü Qureyşi paxıllıq, həsəd,
Itirib başını bu quru cəsəd
Dalğalı dənizdə hey atırdı qol,
Tapa bilməyirdi çıxmağa bir yol.

Bir gün cəm olanda hamı namaza,
Peyğəmbər hicrətə verdi icazə.
Dedi:-Müsəlmanlar bilsin aşikar,
Olarlar Məkkədə Qureyşə şikar.
Qureyş çəkilməsə bu işdən dala,
Gözləyir hamını böyük bir bəla.
Vəziyyət olurdu getdikcə gərgin,
Ağırlı keçirdi burada hər gün.
Əsirdi Məkkədə qorxunc bir külək,
Adamlar buradan köçürdü tək – tək.
Edib axirətə dünyanı fəda,
Haqq deyə salaraq aləmə səda,
Kimisi gizlincə, kimisi açıq
Qururdu özünə yanda alaçıq.
Hər gün köçənlərin artırdı sayı,
Axırdı Məkkədən bir qaçqın çayı.
Bəzən əlli - əlli, bəzən də yüz – yüz
Adamlar tuturdu Mədinəyə üz.
Həzrət aparırdı özü hesabı,
Məkkədə qalmışdı çox az əshabı.
Qorumaqdan ötrü öz imanını,
Atıb tıhlükəyə şirin canını,
Köçdü ən nəhayət burdan Əbu Zər,
Bir evin yükünü apardı bir nər.
Qövmünə bağlılıq, yurd məhəbbəti

Öldürə bilmədi amalı qəti.
Qoşulub Məkkəyə gələn qasidə
Köçdü Mədinəyə Salman Farsi də.
Məkkədə qalsa da dövləti, malı,
Çəkib aparırdı onu amalı.
Günlərin birində  sübh çağı Ömər
Götürüb belinə bağladı kəmər.
Kəbənin yanına sürdü dəvəni:
-Hər kəs bacarsa, saxlasın məni,-
Deyərək qışqırdı dəvənin üstdən,
Çıxmadı səs – səmir orda bir kəsdən.
Qureyşin əməyi gedirdi heçə,
Bilmirdi bu axın bitəcək necə.
Görəsən Muhəmməd qalacaq burda,
Əlvida deyəcək yoxsa bu yurda?
Qureyşçün sirr idi onun əməli,
Bilmirdi nə üçün köçməyib Əli.
Hələ də yanından getməyib Həmzə,
Verib Muhəmmədlə hər gün diz – dizə
Ona nə söyləyir bəs Əbu Bəkir?
Bir borcu ödəmir yüz belə fikir.
Qureyşin başını yorurdu sual,
Dərmək istəyirdi meyvəni kal – kal.
Edib fikirləri əldə dəstəvuz,
Hazırdı etməyə indi təcavuz.

Müvafiq olaraq verilən vədə
Görüş olmalıydı Darun – Nədvədə.
Elə ki, oldular ğasaqqəllar cəm.
Söylədi:-Muhəmməd doğulan gündən
Dəyişib ab – hava burda kökündən.
Nədənsə, olmuşuq biz hamımız kor,
Özümüz qazmışıq özümüzə gor.
Çıxardıb bu boyda Məkkəni yoldan,
-Eh, -deyib baxmışıq biz ona daldan.
Əlində Qureyşi edib oyuncaq,
Biz isə dayanıb susmuşuq ancaq.
Onu qane etmir daha bu vadi,
Sığmır yerə - göyə onun inadı.
Budur, bölgə - bölgə o, addımlayır,
Qureyşsə yerində dayanıb sayır.
Dalını çevirib əqidəsinə,
Hay verib Mədinə onun səsinə.
Mədinə bizimlə üz – üzə durub,
Məkkənin şöhrəti eyləyir qürub.
Bizlərə Muhəmməd verib çox əzab,
Çəkək biz onunla gərək haqq – hesab.
Yanaşsaq bu işə yenə də səthi,
Bütün ərəblərin gözlənir fəthi.
Onda qalacağıq biz ayaq altda,
Söyəcək Qureyşi doğma da, yad da.

Əhv edə bilmərik onu heç təhər,
Verib qətrə - qətrə o, bizə zəhər.
Içmişik iştahla hey şirin – şirin,
Yaramız daxildən bağlayıb irin.
Buraxa bilmərik əldən fürsəti,
Tədbir görməliyik biz bu gün qəti.
Utbənin qaçırdı hərdən dodağı,
Eşirdi çöp ilə qumlu torpağı.
Əlini saxlayıb Utbə bir qədər,
Dedi: -Öznüzü yormayın hədər.
Tənə edirdiniz mənə hamınız,
Qaldı içinizdə arzu kamınız.
Onu dayandırmaq olmadı mükün,
Yetişdi, nəhayət, söylədiyim gün.
Qayıdın bu yoldan, hələ deyil gec.
-Yenə nə söyləyir bu gic oğlu gic? –
Deyərək qəzəblə Əhnəs bağırdı,
Onun gözlərindən alov yağırdı.
Kəsildi qorxudan Utbənin səsi,
Hamı müdafiə etdi Əhnəsi.
Əbu Sufyan qısa dedi sözünü:
-Bilmək istəsəniz əgər düzünü,
Öldürməkdən başqa yoxdur əlacı.
Sonra gülümsəyib o, acı – acı
Söylədi: -Eyləsək biz onu sürgün,

Dönər o, Məkkəyə yenə də bir gün.
Salsaq Muyhəmmədi zindana əgər,
Başımız bu işdən çox ağrı çəkər.
Ağacın olarsa meyvəsi acı,
Kökündən kəsəsən gərək ağacı.
Qayıdıb Utbəyə baxaraq çəp – çəp
Dedi bir nəfəsə tez Əbu Ləhəb:
-Abdullah atamın qəddini əydi,
Kaş ki, evlənməmiş özü öləydi.
Ondan miras qaldı bizə bu yetim,
Adı çəkiləndə ürpəşir ətim.
Onu bir dərd verib Qureyşə fələk,
Boğaydıq biz onu qundağda gərək.
Qureyş sarılmasa indi silaha,
Imkan düşməyəcək əlinə daha.
Tutub adamlara üzünü tək – tək,
Bağırdı: -Öldürmək, ancaq öldürmək!
Hamı bir məxrəcə gəlsə də, amma
Ortada qalmışdı hələ müəmma.
Fərman verilsə də o gecə qətlə,
Işə yanaşırdı hamı diqqətlə.
Bir sual araya çıxırdı burda:
Onu kim öldürsün, necə və harda?
Gəlib yetişəndə söhbət icraya,
Dərhal yönəlirdi başqa məcraya.

Hər kəs yürütsə də bir mühakimə,
Yoxdu icra üçün qol qoyan hökmə.
Eyni söz barədə desələr də hey,
Yaxşı məlum idi hamıya bir şey:
Onu kim öldürsə, axar öz qanı,
Əbdi – Manaf diri qoymaz o canı.
Qoşuldu Əbu Cəhl bir də söhbətə,
Dedi: -Yol verməyin çox da zəhmətə.
Fikrimi demişəm mən sizə bayaq,
Gəlin bu söhbəti çox uzatmayaq.
Bu uzun söhbətin budur qısası:
Hamını qorxudur qanın qisası.
Söylədi məclisdə sözünü hamı,
Vuruldu qisasın burda eyhamı.
Vermək istəyirəm bir təklif mən də:
Qoy hər tayfa versin bir nümayəndə.
Qoy qılınc götürsün əlinə hərə,
Batırsın ucunu onun zəhərə.
Heç kimi salmayaq gəlin çətinə,
Çıxanda Mühəmməd öz həyətinə
Vursun hər silahlı ona bir zərbə,
Qalmasın ehtiyac bir daha hərbə.
Itər, belə ilsa, ortada bu iz,
Asudə alarıq nəfəs onda biz.
Tapmaz Əbdi – Manaf əsli qatili,

Qısalar o zaman onların dili.
Saxlayıb beş – on gün onun yasını,
Qureyşdən alar o qan bahasını.
Verilən təklifə hamı sevindi,
Keflər kökəldi nəhayət indi.
Qureyş buraxmadı əldən imkanı.
Qətlin təyim oldu vaxtı, məkanı.
Bir bayram sevinci vardı burada,
Utbəyə göz vurdu Əhnəs arada.
Muğeyrə söykənib gendə çəliyə,
Diqqət yetiridi hər incəliyə.
Qaçmadı bu məqam onun gözündən,
Söylədi: -Ya Əhnəs, çıxma özündən.
Sən vermə burada heç kimə acıq,
Nə sözün vardırsa gəl danış açıq.
Əhnəs köks ötürüb dedi: -Muğeyrə,
Gələn səhərimiz açılsın xeyrə.

## HÜSEYN CAVİD
### *HİCRƏT*

Eyni şəhərdə məzzarlıq. Kənarda bir evciyəz, iki-üç xurma ağacı.

İkindi çağı...

Ev sahibi Səid təlaş ilə gəlir, qapını şiddətlə çalır. Qapı açılır. Onun 30 yaşını keçməyən qarısı-Xəttab qızı qarşısına çıxır.

***Xəttab qızı***

Səid, üz-gözünü saran
Bu təlaş neçin, əcaba?

***Səid***

Əhd etdi qardaşın əlan
Dəhşətli bir qurultayda...

Sükut...

***Xəttab qızı***

Aman, nədir əhd etdiyi?
Bu təlaş, bu susmaq neçin?

**_Səid_**

Xəttab oğlu and içdi ki,
Peyğəmbəri məhv eyləsin!

**_Xəttab qızı_**
(*sarsılmaş və qorxulu*)

Ah, bu qorxunc xəbər məni
Bir yıldırım kimi vurdu.
Tanrı qurutsun əlini
Yox, o artıq çox qudurdu!

**_Səid_**

Bilsə hələ sən də, mən də
O dinə iman etmişiz;
Heç sağ buraxmaz, ilk öncə
Bizdən öc alar şübhəsiz.
(*Uzaqdan Xəttab oğlu gbrünür.*)

**_Xəttab qızı_**

İştə kəndisi! Şərrindən,
Ya rəb, sən saxla bizləri.

**Xəttab oğlu**
(*Kinli addımlarla yaxlaşır*)

Səid! Sizdən varmı görən
Heç o düzmə peyğəmbəri?

**Xəttab qızı**

Yox bir kimsənin xəbəri.
(*Səidi göstərir.*)
Nə zevcəm görmüş, nə də mən.
(*hər ikisi içəri girir*)

**Xəttab oğlu**
(*əli qılıncının qəbzəsində, qızğın*)

Xayır, əsla o sərsəri
Qurtulamaz bu pəncəmdən.
(*Bu sırada Əbu Talib oğlu sürətli addımlarla gəlib keçir.*)
Dur, ey Əbu Talib oğlu,
Bu sürətlə sən nerəyə?

***Əbu Talib oğlu***

Gediyoram tanrı qulu
Peyğəmbərlə görüşməyə.

***Xəttab oğlu***

Sizlərdəki həsəb-nəsəb
Bəlli, hər kəscə möhtərəm.

***Əbu Talib oğlu***
(*onunu sözünü kəsərək*)

Fəqət məncə elm, ədəb
Həsəb-nəsəbdən müqəddəm...

***Xəttab oğlu***

Sözlərimi kəsmə, dinlə!

***Əbu Təlib oğlu***

Dinləyirəm, əvət, söylə.

***Xəttab oğlu***

Məncə atıb yeni dini,
Əcdadınla öyünməli...

***Əbu Talib oğlu***

İnsan deyil əcdadını,
Yalnız haqqı düşünməli.

***Xəttab oğlu***

Nə istərsiniz əcaba
Gözə görünməz tanrıdan?

***Əbu Talib oğlu***

Görmədiyim bir tanrıya
Mən əyilməm heç bir zaman.

***Xəttab oğlu***

Nerdə gördün onu,nerdə?

***Əbu Talib oğlu***

Hər zaman iştə hər yerdə,

Əvət, göstərir hər səda,
Hər hərəkət onu daim.
Bir şey görmədim ki onda
Tanrını görmüş olmayım.

***Xəttab oğlu***
(*yarımistehza*)

Sən bu fövqəladə yolu
Lütf edib də öyrət mənə.

***Əbu Talib oğlu***
(*eyni ahənglə*)

Bir çocuq, ey Xəttab oğlu,
Öyrətəməz bunu sənə.

***Xəttab oğlu***
(*mənalı təbəssümlə*)

Fəqət deyirlər Peyğəmbər
Tapınırkən tanrısına;
Daim izhari-əcz edər,
Heyrətlə der «ma ərəfna»...

***Əbu Talib oğlu***

İzhar əcz edər arif
Ən böyük idrak əhlidir.

***Xəttab oğlu***
(*məğrur və istehzalı baxışlarla*)

Dursun! Xaliqini hərif
Bu gün məzarda öyrənir.

***Əbu Talib oğlu***
(*əli qılıncının qəbzəsində titrər*)

Sakit ol, onun məzarı
Deyil yerdə, göylərdədir.
Ona yalnız uca tanrı
Öz qucağında yer verir.
Həm də onu, inan mana,
Hər igid qılıncı kəsməz.
Dünya dağılsada ona
Əsla ölüm yeli əsməz.

***Xəttab oğlu***
(*istehzalı qəhqəhəylə*)

Fəqət rəngin çox dəyişdi,
Könlün qovğamı istəyir.

***Əbu Talib oğlu***

Xayır, çünki qan tökməyi,
Böyük tanrı mən eyləyir.

***Xəttab oğlu***

Bu bir yıldızlı hiylə ki,
Həp qorxudan nəşət eylər.

***Əbu Talib oğlu***

Saqın! O sevməz hiyləni,
Nə söylərsə doğru söylər.
Abdulla oğlunu əsla
Qorxudacaq bir qüvvət yox,
Heç öyünmə keçmiş ola;
(əlini köksünə qoyaraq)
Onun yardımçısı pək çox...

***Xəttab oğlu***

İştə qəhrəman bir çocuq!
Ərəbsən, eşq olsun sənə!
İnan, səndəki məğrurluq
Ciddən xoş göründü mənə!
Lakin tutuböz əhdimi
Mən məhv etməliyəm onu.
(İstehzalı təbəssümlə.)
Tanrıdan xəbərgəldimi,

Ararsan Xəttab oğlunu.
(Məğrur və əzəmətli addımlarla uzaqlaşır.)

**_Əbu Talib oğlu_**
(*sinirli*)

Ah, Peyğəmbərin be helmi
Həm düşmənləri güldürür.
Yox, bu dərd yaxar könlümü,
Çox sürməz, məni öldürür.
(Kəskin bir əzm ilə.)
Xayır, mən Xəttab oğluna
Üzvermən tüğyan eyləsin.
Buraxmam bu cəllad ona
Güldən ağır söz söyləsin.

(*Sürətli və kinli addımlarla eyni yolu izlər.*)

Bu sırada digər tərəfdən azğın üzlü, canavar gözlü bir ərəb hənüz beş-altı yaşına varmış qızının qolundan tutub qızğın addımlarla məzarlığa doğru yürür.

**_Ərəb_**

Artıq usandım, gəl, yetər!

***Qız***
(*acı fəryad ilə*)

Annəciyim!... Ah, nerəyə?

***Ərəb***

Sən də bacın kimi gəbər!
Qızlar məhkumdur heçliyə!

***Qız***
(*yalvarır*)

Aman, babacığım, aman!

***Ərəb***

Gəl, yetər!...
(*Hiddətlə sürüklər.*)

***Qız***
(*qorxaraq çağırır*)

Ah, annəciyim!

***Ərəb***

Gəl, ölümdür sənin cəzan,
Artıq yox fəzlə etməyim.

***Qız***

Ah, burax, anamı bir də
Görəyim, sonra vur öldür.

***Ərəb***

Haydı sən dəf ol, gəbər də,
O da həsrətindən ölür.
(*Boş məzarın içinə atar.*)

***Qız***

Ah!

***Ərəb***
(*məzarın üzərini iki-üç böyük daşla qapar*)

İştə... Sus, yetər, mana
Qız övladı lazım deyil.

***Qızın səsi***

Annəciyim...

***Ərəb***

(*mütəəssir*)

Bədbəxt ana...
İmdi yavrusundan qafil...
(Peşman və məhzunca bir tövrlə əli alnında düşünür.)
Ah, nə duyğusuzmuş tanrım,
Bir gün taleyim gülmədi.
Neçin, bilməm neçin qarım
Qız doğururkən ölmədi.

(*Qızğın və sinirli.*)

Xayır, mən oğuldan başqa
Övlad istəməm,istəməm.
Qız və qadın insanmı ya?
Yox, mən qıza övlad deməm.

(Kinli addımlarla çəkilib gedir. O getdiyi kimi, Səid ilə Xəttab qızı təlaş ilə qapını açıb çıxarlar.)

***Xəttab qızı***
(*Səidə*)

Aman, durma, nərdə olsa
Peyğəmbəri, get ara bul!
Ah, qardaşım onu bulsa,
Heç sağ buraxmaz, əmin ol!

***Səid***

Şaşırma, ey Xəttab qızı,
Qardaşın gərçi qəhrəman.
Peyğəmbər o imansızı
Bir sözlə susdurar, inan.

***Xəttab qızı***

Hər iştə ehtiyat eyi,
Get, xəbər ver evlərinə.
Həmən get bul Xədicəyi,
Zevcəsidir, bilsin yenə.
(*Peyğəmbər uzaqdan görünür*.)

***Səid***

(*baxar)*

Çox şükür, iştə kəndisi!
(Xəttabı qızına.)
Saqın, bir şey söyləmə, dur...

***Qeybdən bir səs***

Annəcəyim...

***Xəttab qızı***

Cocuq səsi.
Ah bu səs nərdən gəliyor?

***Səid***

(təlaş ilə Peyğəmbərə yaxlaşır, əyilib əlini öpdükdən sonra)

Aman ey tanrı elçisi!
Bir cəllad arayır səni.

***Qeybdən bir səs***

Annəciyim...

***Peyğəmbər***

Cocuq səsi.

***Qeybdən bir səs***

Annəciyim...

***Peyğəmbər***

Bu səs məni
Xərab etdi, ah nə həzin!..

***Ana***

(acı fəryad ilə qoşub gəlir)
Aman yavrum, mələk yavrum,

***Peyğəmbər***

(xarab olmuş bir məzara yaxınlaşır. Üzərində böyük daşı bir trəfə çəkib baxır)

İştə bir qız! Yardım edin,
Yardımı əmr etmiş tanrım.
Ah görünür- diri-diri
Məzara gömmüşlər bunu.

***Ana***

Əvət xain bir sərsəri
Məhv etmək istəyir onu.
Səid məzara enir, qızı yuxarı qaldırır, Peyğəmbər yardım edib çıxarır.
Of, yavrum...

***Qız***

Ah, annəciyim...
(Qucaqlaşırlar.)

***Peyğəmbər***
(anaya)

Dur, yüksəltmə fəryadını,
Söylə mən bilmək istərəm
Bu məsumun cəlladını.

***Ana***

Cəlladı iştə çox aydın,
Kəndi alçaq babasıdır.
(Yaralı bir ahəng ilə.)
Onca bir qız, ya bir qadın
Uğursuz baş bəlasıdır.

***Peyğəmbər***
(müztərib və həyəcanlı)

Qadın, qadın?! Onu duymaq, duyurmaq istərkən
Yaxar düşüncəmi bir şölə,bir zəhərli tikən.
Bütün həyatı çiçəkləndirən fəqət o... neçin,
Neçin əzilsin o, bilməm neçin sürüklənsin?!
Qadın-günəş, cocuq-ay ... nuru ay günəşdən alır.[1]

---

[1] Йахуд: О бир эцняш ки, бяшяр зювгц, рущу ондан алыр.

Qadınsız ölkə çapuq məhv olur, zavallı qalır.
Qadın əlilə fəqət bəxtiyar olur bu cahan.
O bir mələk... onu təqdis edər böyük yaradan.
O çox sevimli, gözəl, incə, nazlı bir xilqət,
Onun ayaqları altındadır fəqət cənnət.
Qadın gülərsə bu issız mühitimiz güləcək,
Sürüklənən bəşəriyyət qadınla yüksələcək...

***Ana***

Haydı gəl gedəlim quzum.

***Qız***

Ay, babamdan qorxuyorum.

***Peyğəmbər***

Allah əsirgəsin, aman!
Vəhşiləri keçdi insan.

***Ana***

Qorxma! O heç görməz səni!

***Qız***

Görsə öldürəcək məni.

***Ana***

Evdə yox, bizi tərk etdi,
İmdi yol kəsməyə getdi.
Qorxma, annən dilənər də,
Verməz səni o namərdə.

***Peyğəmbər***

Tanrı yardımçınız olur,
Azğın cəzasını bulur.
(Evi göstərir.)
Bax, bu evdə yaşayanlar
Çox mərhəmətli insanlar...
Bunlarda qan var, vicdan var,
Uca tanrıya iman var.
Burda qalın hər ikiniz,
O cəlladı görməyiniz.

***Ana***

(qızilə bərabər Peyğəmbərin ayaqlarına qapanır)
Allah sizdən razı olsun.
Peyğəmbər qollarından tutub qaldırır.

***Səid***

Gedin, bir az rahat bulun.

***Xəttab qızı***

Gəlin, heç maraq etməyin.

***Peyğəmbər***

(mənalı bir baxışdan sonra)
Məhəbbətdir ən böyük din.
İçəri girərlər.

***Xəttab qızı***

(Peyğəmbərə)

Aman, buyursanız siz də...

***Peyğəmbər***

Xayır, mən getmək istərim...

***Xəttab qızı***

Bir az saxlanınız bizdə,
Qəzəblənmiş bəradərim...

***Peyğəmbər***

(sözünü kəsərək)

Lakin tanrının qəzəbi
Onunkindən daha müdhiş...

***Xəttab qızı***

Ah, qorxuram, çox əsəbi,
Bəlkə doğar çirkin bir iş.

***Peyğəmbər***

Sən get, bu kimsəsizləri
Ovut, barındır, əkmək ver.
Böyük tanrı Peyğəmbəri
Hər an bəladan hifz edər.

Qadın onun əlini öpər, müztərib baxışlarla içəri girər və qapını qapar. Bu mənzərəni uzaqdan görünən Nəim ilə Topal seyr edərlər.

***Nəim***

Yazuq bu Xəttab oğluna,
Peyğəmbərə kin bəsləyir.
Həmşirəsi uymuş buna,
Din içində din bəsləyir.

Peyğəmbər dalğın addımlarla məzarlıqda bir daş üzərində oturub düşünür. Bu sırada qız, oğlan bir yığın çocuq aşağıdakı şərqini söyləyərək gəlir və hər parça bitdikdə əl çalar, oynarlar.

### Çocuqlar

Deyir göydə bağçalar var,
Orda çiçəklər nur saçar,
İnsan mələk kimi uçar...
İstəməm, masaldıı onlar,
Mən vuruldum yalnız sana
Vətən! Ah, sevgili ana!
Dün bir quş gördüm yaralı,
Düşmüş yurdundan aralı.
Dişlərdi köksünü çalı,
Söylərdi sanki hər halı:
Vəhşi qartal qıydı mana,
Vətən! Ah, sevgili ana!

Bir neçə çocuq islıq çalarlar yerdən daş parçaları alıb Peyğəmbərə atar, o çəkilib getmək istərkən Baş kahin yanında birinci, ikinci, üçüncü rəis və iki kahin olduğu halda qarşı tərəfdən çıxırlar.

### Baş Kahin

*(Peyğəmbəri göstərir, istehzalı bir tövrlə.)*

İştə əngin fəzaların
Qəhrəman nümayəndəsi!
İştə Latü Üzzaların
Böhtançı bir xanəndəsi!

***Birinci rəis***

Görünür bizdən bıqmış da ,
İmdi başqa yol gediyor.
Diriləri buraxmış da
Ölülərlə vəz ediyor.

***İkinci rəis***

Tuhaf!.. Mən Xəttab oğlunu
Sadiq bilirdim əhdinə.
Hənuz sağ buraxmış bunu,
Əski keyfindədir yenə.

***Üçüncü rəis***

Qüsur yox onda, hər kəscə
Bəllidir ki, o çox cəsur...
(Peyğəmbərə işarətlə.)
Bəlkə hərif sehr etmiş də,
Yalnız ona görünmüyor.

***Peyğəmbər***

Sus! Allahın Peyğəmbəri
Çox uzaqdır o işlərdən.
Onun sehridir sözləri
Varmı qarşılıq söyləyən.

***Baş Kahin***

(son dərəcə qızğın)

Bilməm nəçin sarsılıb da
Göylər yerə tökülmüyor?
Bilməm neçin sovrulub da
Bu dünya alt-üst olmuyor?
Ah, o məbudlar ki bizə
Altun verir, şöhrət verir,
O bütlər ki, ölkəmizə
Həyat verir, qüvvət verir;
Heç rəvamı dünkü yetim
Onları təhqir etsin də,
Biz kənardan seyr edəlim,
O sağ qalsın yer üzündə?!

Bu sırada ətrafdan qadın, erkək, çoluq-çocuq toplaşıb dinlər.

***Peyğəmbər***

Xayır, aldanma, ey zavallı bəşər,
Səncə qalibmi xeyrə fitnəvü şər?
Əlverir qəflət, istəməz tüğyan,
Səni er-gec həlak edər üsyan.
(Yerdən bir ovuc torpaq alıb havaya sovurur.)
Sən nəsən? İştə bir ovuc torpaq!
Bax, düşün! Kibri at, qüruru burax.

Əyri yoldan çəkil, fəsadı unut!
Əvət, ancaq düşün də haq yolu tut.
(Məzarları göstərir, qızğın və həyəcanlı.)
Var, səninçin də böylə bir gün var,
Bir gün əldən çıxar bu altunlar.
Həp susar tapdığın sənəmlər, əvət
Yardım etməz güvəndiyin şöhrət.
Həp sönər duyduğun şərəf, iqbal;
Tanrıdan başqa hər nə varsa, xəyal!..

***Üçüncü rəis***

Arxadaş, söylənmə artıq
Biz dinləməkdən usandıq.
Vaz keç də sən bu sözlərdən,
Qarşılıq, hər nə istəsən;
Altın, riyasət, gözəl qız,
Hər şey verməyə hazırız.

***Peyğəmbər***

Yoxsulluq ən böyük sərvət,
Qarşımda heçdir rəyasət.
Xayır, istəməm, gözəl qız,
Sevgilim tanrıdır yalnız.
Çünki ən son pənah odur,
Ona tapanlar qurtulur.

Hətta günəşi sağıma,
Ayı soluma qoysanız;
Fikrimdən dönməməm əsla,
Bir qul yaşarmı tanrısız?

(Gedəcək olur.)

***Baş Kahin***

Getmə, bir dur, ah, nerəyə?

***Peyğəmbər***

Haqq əmrini yetirməyə;
Kim eşitsə nicat bular.
Kim rədd etsə həlak olar,
Haq sevən arxamca gəlsin;
Korlar qəhr olub əzilsin.

(Saymazca və məğrur addımlarla uzaqlaşır.)

***Baş Kahin***

Ah, bu uğursuz sabei
Yaxar məni atəş kibi.
(Camaata heyrət və hiddətlə.)
Həp baxar, həp susarsınız,
Üsyan etməzmi qanınız?
Məxarlıqda yatanlarla
Yoz sizin fərqiniz əsla.

***Camaatdan***

- Ah, o xain məhv olmalı!
- İmdi cəzanı bulmalı!
- Haydı, yoldan çevirməli!
- Susdurmalı, öldürməli!

Qadınlar və çocuqlar yerdən daş parçaları alır, Nəim ilə Topaldan başqa hər kəs gurultu ilə Peyğəmbər getdiyi tərəfə doğru yürür. Eyni zamanda göy gurlar.

***Topal***

Haydı gəl, biz də bərabər gedəlim,
Gəl bu Peyğəmbəri bir seyr edəlim.

***Nəim***

Fəzlədir məncə bu yersiz hyəcan,
Nə imiş sanki o bədbəxt insan...

***Şəmsa***

(Nədimə ilə bərabər gəlir)
Bu nə, yahu, bu nə dəhşət əcəba?
Sarsılar həp təməlindən dünya.

***Nəim***

(müstəhzi)

Göylərin elçisi merac ediyor,
O böyük baş içimizdən gediyor.

***Şəmsa***

Nə demək? Anlamadım, söylə, nə var?

***Topal***

Verdi hər kəs onu edamə qərar.
Göy gurultusu kəsilir.

***Şəmsa***

(Nədiməyə)
Çox yazıq! Gəd baxalım bir bu nə hal,
Ah, o layiqmi ki, olsun pamal?
(Sürətli addımlarla camaat gntdiyi tərəfə gedirlər.)

***Nəim***

(istehzalı təbəssümlə Şəmsaya)

Heç maraq etmə, o artıq getdi,
Çünki göylərdəki tufan bitdi.

**_Topal_**
(qarşı tərəfə baxar)
Buna bax!...

**_Nəim_**
Kimdir o?

**_Topal_**
Xəttab oğlu.

**_Nəim_**
(baxır)
Nə də qızğın! Gözü al-qanla dolu...
(Kinli baxışlarla gələn Xəttab oğluna.)
Buna hiddət əcəba, söylə, nədən?

**_Xəttab oğlu_**
Onu öldürməyə əzm etdim mən.
Kimə sorsam, buradan keçdi deyir,
Araram, yox, görünür sehr eləyir.

**_Nəim_**
(istehzalı təbəssümlə qafasını oynadır)
Burda bir zevc ilə bir zevcə yaşar...

***Xəttab oğlu***

Bu qadın bəlli, mənim həmşirəm.

***Nəim***

İştə Peyğəmbərə onlar məhrəm,
Çıxmayır heç birinin gərçi səsi.
Yeni din aşiqidir hər ikisi;
Öncə onlardır, əvət, məhv olacaq...

***Xəttab oğlu***

(qılıncını yarıya qədər çəkir, son dərəcə sinirli)

Sus, Nəim! Ah, nə deyirsən, mənə bax!
Kəbə məbudlarına and olsun,
Doğru çıxmazsa sözün, məhv oldun!

***Nəim***

Xayır,əsla; mənə layiqmi yalan?
(İstehzalı qəhqəhəylə.)
Şanlı Peyğəmbəri əlan buradan.
Bax, bu evdən çıxıyorkən gördüm.
(Topal ilə bərabər uzaqlaşır.)

***Xəttab oğlu***

(çılğın)

Ah, ölüm! Onlara dəhşətli ölüm!...

(qapını çalmağa başlar. İçəridən gələn xoşahəng bir qadın səsi diqqətini cəlb edir, durub dinlər.)

***Eşidilən səs***

Ulu tanrı, o görünməz yaradan
Əmr edər yalnız ədalət, ehsan.
O fəna işləri, fəhşiyyatı
Nəhy edər, varlığının isbatı
Bu təbiət, bu məhabətli fəza...
Onca birdir; ulu,zəngin, füqəra.

Qapını bir daha şiddətlə çalır. Səid ilə rəfiqəsi çıxır. Xəttab qızı əlindəki bir parça dərini həmən qoltuğunda saxlar.

***Xəttab oğlu***
(Səidə)

Mənə bax,doğrumu, əcdadımızın
Buraxıb dinini oldun xain?
(Sükut)
Niyə susdun, niyə susdun böylə?
Şaşırıb durma, cavab ver, söylə!

***Xəttab qızı***

Fəzlə israr eləyirsən, yetişir.

***Xəttab oğlu***

(Səidə)

Səni zənn etməz idim bunca həqir.

(Qılınc parlar.)

İştə, al!

(Araya girən həmşirəsinin başı yaralanır,fışqıran qan alnını və köksünü boyayır.)

***Xəttab qızı***

Ah, yaralandım, eyvah!

***Xəttab oğlu***

Söylə, həmşirə! Bu söz doğrumu, ah?!

***Xəttab qızı***

Doğru, çox doğru, əvət, Peyğəmbər
Bizcə ən şanlı, böyük bir rəhbər!
Onun allahına, iman etdik,
Duyğusuz bütlərə üsyan etdik.
Qorxumuz yox, eyi bil, hər ikimiz
Haqq üçün can ilə başdan keçəriz.
(Köksünü açar)
İştə öldür! Acıdan qurtularız,
Qovuşub tanrıya məsud olarız.

***Xəttab oğlu***

(əvvəlki mətanəti söndüyü halda, həmşirəsinə)

Bir taqım ayət oxurdun da dəmin,
Onu göstər mənə!

***Xəttab qızı***

Olmaz!

***Xəttab oğlu***

Bu neçin?

***Xəttab qızı***

Etmədin bəlkə riayət, hörmət.

***Xəttab oğlu***

Edərəm.

***Xəttab qızı***

And iç!

***Xəttab oğlu***

İnan!

***Xəttab qızı***

İştə!

(Yazılı dəri parçasını çıxarıb verir.)

***Xəttab oğlu***

Əvət!

(Şaşqın və vurulmuşcasına oxur.)

«Ulu tanrı, o görünməz yaradan»
Əmr edir yalnız ədalət, ehsan.
O fəna işləri, fəhşiyyatı
Nəhy edir, varlığının isbatı
Bu təbiət, bu məhabətli fəza...
Öncəbirdir; ulu, zəngin, füqəra.»

(Sarsılmış bir halda.)

Nə ilahi, nə müqəddəs ilham!
Duyduğum yox bu fəsahətdə kəlam.
Məni əfv eylə, mələk həmşirəm.
Doğru din... qalmadı əsla şübhəm.

(Həmşirəsini qolları arasına alır və əlindəki məndil ilə yarasının qanını silər.)

Yaranı şimdi sarıb mən gedərəm,
O böyük dahiyə iman edərəm.

(İçəri girirlər.)

Azacıq sonra Peyğəmbər qana boyanmış və başı sarınmış olduğu halda Şəmsa ilə Nədimənin yardımı ilə gəlir.

***Şəmsa***

(Nədiməyə)

Daha dur, bir qədər etsin rahət.

***Peyğəmbər***

(əlini ağzına gətirir, acı bir fəryad ilə)
Dişlərim! Ah, qırılıb oldu səqət.
(Böyük bir daş üzərinə oturur.)

***Şəmsa***

(əlini onun omuzuna qoyaraq)
Ağrıdır, bəlkə bir az sonra keçər,
Ölmədin, iştə bu dünyayə dəyər.

***Peyğəmbər***

Səni çox başqa tanrıdım, lakin
Bir mələkdən daha munis qəlbin.
Duyğusuz bütlərə vurğun cühəla
Daha xoşdur sənə aciz qul ola.

***Şəmsa***

Latü Üzza səni qurtardı dəmin,
Yenə təhqir eləyirsən, bu neçin?

***Peyğəmbər***

(sinirli)
Latü Üzzamı? Çəkil, sus, dəf ol!

***Şəmsa***

Uçurum – izlədiyin qoxulu yol.

***Peyğəmbər***

Qorxu yox, izlədiyim haq yoludur,
Yaradan, öldürən ancaq bir odur.
Hər nə mövcud isə xilqətdə onun,
(Şəmsaya işarətlə)
Bu gözəllik, bu lətafət də onun.

***Şəmsa.***

Mənə bax!

***Peyğəmbər***

(əli ilə rədd edir)
Haydı, çəkil get, yetişir.

***Şəmsa***

(məğrur və istehzalı təbəssümlə)
Bir gözəl bunca edilməz təhqir.

***Peyğəmbər***

Mən gözəllərdə gözəl ruh araram,
Ruhu duşgunləri çirkin sayaram.
Bir gözəl lövhə ki, yapmış rəssam.

Daha xoşdur onu məftun olsam.
Tanrı eşqilə yanan haqq nuru
Səndə yox, durma, çəkil get, doğru,
Zahirin xoşsa da bədbatinsən.
Bu gözəlliklə, əvət, çirkinsən.

***Şəmsa***
(çox fəna sarsılır)

Yox, bu təhqirə dayanam əsla.
(Nədiməyə.)
Gedəlim.

***Peyğəmbər***

İştə açıq yol!

***Şəmsa***
(hiddət və nifrətlə ətrafa)

Budala!
(Peyğəmbərə)
İstədim mən səni məsud edəyim,
Duymadın qəlbimi, artıq nə deyim?

***Peyğəmbər***

Məni haqq düşməni məsud edəməz,
Tanrısız bir qızını eşqində nə həzz?

***Şəmsa***

Düşmən olsam da sənin tanrına mən,
Sənə hörmət duyaram, ah bilsən!

***Peyğəmbər***

(sözünü kəsərək əli ilə rədd edir)
İstəməm... öylə məhəbbət, hörmət
Doğurur məndə tükənməz nifrət.

***Şəmsa***

(acı təbəssümlə Peyğəmbərə)
Nə könül varmış, əvət səndə, nə hiss.
(Nədimə ilə bərabər uzaqlaşır.)

***Peyğəmbər***

Saçların çox uzun, əqlin naqis.

***Şəmsa***

(dönər, məğrur və sərt bir baxışla)
Naqis olsam da kamalın məndən,
Varlığın, həm də zavalın məndən.
(Gedirlər.)

Hava qaralmağa başlar, Mələk nurlar və təbəssümlər içində Peyğəmbərin qarşısına enir.

### *Mələk*

Ey ulu tanrı elçisi!
Göydən sənə müjdələr var.
Yüksək mələklərin səsi
Həp birdən səni alqışlar.
Mübarək alnında açan
Eşqin qanlı qönçələri;
Çiçəkləndirəcək, inan,
Ən parlaq səhifələri.
Böyük dahilərin payı
Həm olmuş mızraq, qılınc, ox.
Onlardakı fırtınayı
Susdurmaz daş, tikən, yumruq.
Qorxma, söylə! Şəfəq sökər.
Bir gün qaranlıq sıyrılar;
Hər kəs qarşında diz çökər,
Xain silahlar qırılar.
İzlədiyin pənbə yıldız
İssız bir heçlikdən gülər.
Sındın insanlara yalnız
Sevgili, dadlı busələr.

(Çəkilir.)

### *Skelet*

(boş məzardan çıxar, qorxunc və istehzalı qəhqəhələrlə)

Busə, həp busə! İştə şerü xəyal,
Busə, həp busə! Daima sual?!
Busə çox dadlıdır, mələklər için,
Sevgi xoşdur duyan ürəklər için.
Busədən həzz edərmi bir qaplan?
Sevgi anlarmı heç zəhərli ilan?
Qaniçən, kinli, möhtəris qartal
Kirli dırnaqlarilə bulsa məcal,
Qoparıb parçalar,didər, əsəbi
Bu məhəbbətlə çırpınan qəlbi.
Busədən xoşlınırmı heç canavar?
Vəhşi insan da öylə həp qəddar!
(Əlindəki sıyrılmış qılıncı oynadaraq.)
Boş xəyal... Əldə parlamazsa silah,
Tanımaz haqqı sayğısız gümrah.
İştə hər ölkə, iştə hər millət
Həp qılıncdan alır şərəf, qüvvət.
Patlar ancaq onunla izzəti-nəfs,
Qanlar onsuz həyatı hüznlə yəs,
Son sözüm: boş düşüncədən ayrıl,
Busə istəmirsən silaha sarıl.
(Sürəkli qəhqəhələrlə çəkilir.)

***Peyğəmbər***

(yalnız)

Ah, nə dəhşət, nədir bu sisli xəyal?
Yenə röyamı gördüyüm, bu nə hal?

***Mələk***

(dadlı təbəssümlərlə enir)

Heç maraq etmə, ey böyük rəhbər!
Oxu altun kitabı, etmə kədər;
Zəfər istəmirsən, bu şəhri burax.
Köç!... həmən başqa yurda köç!... ancaq
O zaman sözlərin qəbula keçər.
Yox çıxan yerdə bir mətaəə dəyər,
Hər dəha başqa bir cahan istər,
Kimsə olmaz evində Peyğəmbər.

(Çəkilir. Hava işıqlanır.)

***Əbu Talib oğlu***

(sürətli addımlarla gəlir. Peyğəmbəri qucaqlayır)

Bu nə? Ey fəxri-kainat, eyvah,
Gözlərim kaş ki kor olaydı da, ah!
Görməyəydim bu halı... Söylə sənin
Düşmənin hanki duyğusuz, xain...

***Peyğəmbər***

Düşmanım varsa tanrı düşmanıdır,
Bu axan qan da, iştə haq qanıdır.

***Əbu Talib oğlu***

(əli qılıncının qəbzəsində titrər)

Daha səbrim tükəndi, söylə, aman,
Hərb için hökm yoxmu allahdan?

***Peyğəmbər***

Bəklə, dur! Heç təlaşa yox hacət,
Xainin bir cəzası var əlbət.

Bu sırada Xəttab oğlu evdən çıxır, Peybəmbəri görüncə heyrətdən dona qalır.

***Əbu Talib oğlu***

(sarsılmış bir halda qılınc çəkmək istər)

Sağ buraxmam, xayır, bu azğını mən!

***Peyğəmbər***

(sərt və kəskin bir baxışla Əbu Talib oğluna)

Dur! Unutdunmu tanrı hökmünü sən?
(Xəttab oğluna.)
Gəl, yaxın gəl, durub şaşırma, əvət,
Bəllidir məncə etdiyin niyyət.

***Xəttab oğlu***
(yaxlaşır)
Nə imiş niyyətim?

***Peyğəmbər***
Mənim ölümüm!

***Xəttab oğlu***
Əcəba yoxmu səndə qorxu?

***Peyğəmbər***
Ölüm məncə bir cismin inqilabı demək
Həm də çox fəzlədir maraq etmək.

***Xəttab oğlu***
Titrəyirkən bütün cahan məndən,
Bu cəsarətlə çox böyüksən sən.
(Qılıncını çəkərək.)
Söylə, hər kimsə düşmənin gedəyim,
Öc alıb bir vuruşda məhv edəyim.
Bax bu almas qılınc bu gün ancaq
Sənin uğrunda parlayıb duracaq.

***Peyğəmbər***

İstəməm başqa dürlü yardım mən,
Etiqad eylə tək o tanrıya sən.

***Xəttab oğlu***

Haqdır, əlbət, inandığın yaradan,
Ona qəlbimlə eylədim iman.
(Təzim ilə Peyğəmbərin əlini öpər, o da qarşıqlıq olaraq onu öpüb qucaqlar.)

***Peyğəmbər***

(böyük bir sevinc ilə)
Cümlə dünya verildi sanki mənə,
Versin allahım əcri-xeyr sənə.

***Xəttab oğlu***

(Əbu Talib oğlu ilə qucaqlaşıb öpüşür)
Çox böyükmüş güvəndiyin qüdrət,
Məni, ey şanlı qəhrəman, əfv et.

***Peyğəmbər***

Öpüşüb birləşin ki, hər ikiniz
Haq yolun ən dəyərli rüknüsünüz.
Dini-islamə yox zaval, artıq,
Haqqı təbliğə başlayın apaçıq.

Səid ilə Xəttab qızı çıxır. Peyğəmbəri o halda görüncə
Təlaş ilə ona yaxlaşırlar.

***Xəttab qızı***

Nə qiyafət bu, ah, aman, ya rəbb!

***Peyğəmbər***

(göyə işarətlə)

Həp onun eşqidir bu halə səbəb.

***Əbu Talib oğlu***

(Peyğəmbərə çox həyəcanlı)

Hər nə zülm etdilər durub baxdıq,
İmdi yox səbrə ehtiyac... artıq
Çırpınır intiqam için könlüm,
Ya zəfər, haq və ya şərəfli ölüm!..

***Peyğəmbər***

Daha dur, öylə bir düşüncə əbəs...
Bugünün hökmü başqadır: hər kəs
Xəbər etsin də kəndi bildiyinə,
Başlayın cümlə yol tədarükünə.
Gecə erkən beşər-üçər həpimiz
Buradan ayrı-ayrı köçməliyiz.

***Xəttab oğlu***

Hazırız cəngə, gəlsə həp dünya,
Bu təlaş anlamam neçin əcəba?!

***Peyğəmbər***

Tanrıdan çünki böylədir fərman,
«Köç!» Əvət «köç» deyir böyük yaradan.
Göy gurlar, qaranlıq çökər.

***Skelet***

(acı qəhqəhələrlə Peyğəmbərin qarşısına fırlar)
«Köç!» Əvət «köç!» Fəqət unutma, saqın,
Ərəb övladı imdi çox çılğın...
Rəhbərin əldə həp kitab olsa,
Sənə olmaz zəfər nəsib əsla.
(Ridasının altından çıxardığı parlaq qılıncı
Peyğəmbərə uzadır.)
İnqilab istəyirmisən, mənə bax!
Bu qılıncdır o fikri parladacaq.
Xəstə bir üzvə bənzər amili-şər.
Kəs də, bulsun şəfa vücudi-bəşər.

***Peyğəmbər***

(qılıncı alır, mənalı və kəskin bir ahənglə)
Əvət, ən doğru, ən gözəl ayin:
Əhli-vicdanə – busə, xainə – kin!..

## NİZAMİ ZÖHRABİ
## *BƏDR DÖYÜŞÜ*

Gəlib yetişəndə dəstə Safraya
Sanki od yağırdı göydən səhraya.
Seçdilər bir sakit yer Zəfiranda,
Quruldu çadırlar orda bir anda.
Ömər bir nəfərlə gedib görüşdü,
Karvan barəsində ondan soruşdu.
Öyrəndi ki, karvan çoxdan sovuşub,
Bəlkə də Məkkəyə artıq qovuşub.
Həzrətə xəbəri Ömər söylədi,
Dedi:-Zənn etmə ki, bu bir hiylədi.
Peyğəmbər buyurdu:-İki gün öncə
Keçənə arxadan çatmarıq, məncə.
Elan et qoşuna, qayıdaq geri,
Deyil, düşünürəm, inadın yeri.
Ancaq getməmişdən topla hamını,
Qırma onların da heç inamını.
Artır, Xəttab oğlu, indi səyini,
Öyrən camaatın burda rəyini.
Məncə, bundan başqa yoxdur yaxşı yol,
Çox güman, qoyacaq hamı buna qol.
Söhbət et, dəstəni geriyə döndər,
Həm də Mədinəyə bir qasid göndər.

Mədinə əhlinə durumu çatdır,
Çünki ordakılar bərk narahatdır.
Ömər qoşunu tez bir yerə yığdı,
Özü bir dəvənin belinə çıxdı.
Onları durumdan agah elədi,
-Qayıdaq, - söylədi – qərar belədi.
Dəstə hazır oldu geri dönməyə,
Peyğəmbər yeridi atı minməyə.
Bir nəfər yetişdi bu vaxt təngnəfəs,
Qopdu dodağından həyəcanlı səs:
-Ya Rəsul, tələsmə, bir ayaq saxla,
Dönürük geriyə biz hansı haqla?
Gəlir üstümüzə Məkkə qoşunu, -
Söyləyib, itirdi kişi huşunu.
Bilib Mədinədə nə baş verdiyin,
Vurdu Əbu Sufyan ayrı bir düyün.
Eyləyib dərindən olayı təhlil,
Dedi:-Durulmayıb hələ ki, bu lil.
Kəsib müsəlmanlar yolu hər yandan,
Bu yük əziz deyil bizdəki candan.
Gedər, biz rastlaşsaq, bu can da, mal da,
Qövmümüz neyləyər belə bir halda?
Üzləşməmək üçün yolda onlarla
Sürün dəvələri gizli yollarla.
Olsaq da Məkkəyə biz gec çatası,

Yoxdur o yolların heç bir xatası.
Bir xeyli keçmişdi o gün axşamdan,
Karvan yol başladı Məkkəyə Şamdan.
Adi vaxtdakından iki qat uzun
O, bir cığır açdı köksündə düzün.
Getdi təhlükəli yol keçə - keçə,
Nə bir gündüz bildi, nə də bir gecə.
Adi axarıyla ötsə də zaman,
Əldən düşmüşdülər yolçular yaman.
Karvanın başçısı gəlirdi daldan,
Onu çıxartmışdı yorğunluq haldan.
Gedirdi altında at yorta – yorta,
Arxada qalmışdı çoxdan günorta.
Qafilə Məkkəyə gəlib çatırdı,
Günəş də qüruba gedib, batırdı.
Indi karvanbaşı düşüb arxayın,
Qəlbində hesaba vururdu payın.

Karvan mənzilinə çatmazdan əqdəm
Məkkədə Qureyşi çulğamışdı qəm.
Karvanın yolunu gözləyən şəhər
Almışdı çox ciddi soraq bu səhər.
Qasid Damdam ibni Əmr Qifari
Eylədi səyini həddən yuxarı.

Acığa salmaqçün Məkkə əhlini
Tərsinə dəvənin qoydu rəhlini.
Çıxaraq belinə o, bir ulağın,
Tutub dəvəsinin kəsdi qulağın.
Şəhərdən kənarda cırıb yaxasın,
Hay vurdu qasidi Əmr ibn Asın:
-Qalxın, ey qəflətdə şirin yatanlar,
Malı talan olan, yurdu batanlar!
Silin gözünüzü, yuxunu qovun,
Qırın qəlbinizdən qorxu buxovun.
Görün biz nə qədər olmuşuq əfəl,
Uzadır Muhəmməd biz tərəfə əl.
Daha o, hər şeyin çıxarıb ağın,
Kəsibdir karvanın yolda qabağın.
Durun, Məkkə əhli, tez tədbir tökün,
Yoxsa ələ gəlməz biri də yükün.
Gəldi hər tərəfdən adamlar səsə,
Əbu Cəhl yeriyib dedi çox kəsə:
-Bəsdir verdi Qureyş ona bunca boy,
Əl çəkməz, tutmasaq ona yaxşı toy.
Gözəl bəhanədir bu ki, davaya,
Olmaz bu fürsəti vermək havaya.
Çoxdan axtarırdıq hərbə bəhanə,
Deyin, gözləyirik indi daha nə?
Bir də fürsət düşməz yaxşısı bundan,-

Deyib qılıncını çəkdi o, qından.
Bir nəfər səsinə onun veridi səs:
-Qanana işarə, - dedi – edər bəs.
Dava Əbu Cəhlin tək işi deyil.
Ona qoşulmayan heç kişi deyil
Heç kəs qaçırmasın boyun savaşdan,
Məkkədə aşsa da işləri başdan.
Kişilər qabağa versin döşünü,
Ayırsın arvaddan hamı kişini.
Getməyən qoy çəksin gözünə sürmə,
Bağlasın arvadtək başına tirmə.
Gedib əllərinə qoy yaxsın həna
Kişi əli gərək bulana qana.
Qureyş silahlandı sözə bənd kimi,
Dedilər:-Fənd olmaz heç bu fənd kimi.
Bu yaxşı məqamdır intiqam üçün,
Qoy görsün Mədinə Məkkənin gücün.
Çox ciddi girişdi Məkkə yürüşə,
Mübaşir olmuşdu hərə bir işə.
Uzun yol üçün də, döyüş üçün də
Hazırlıq görüldü bir gün içində.
Düz bir min nəfərlik müsəlləh ordu
Keçib Əbu Cəhlin dalında durdu.
Qalmadı yürüşdən imkanı olan,
Sənəti, peşəsi, dükanı olan.

Qoca da gedirdi, indi cavan da,
Qalan olmamışdı bir kimsə yanda.
Təkcə Əbu Ləhəb xəstə yatırdı,
O, nə yemək yeyir, nə həb atırdı.
Tamam kəsilmişdi onun taqəti,
Heç at minməyə də yoxdu haləti.
Ondan olmasa da bir kömək uman,
Özü narahatdı həmin gün yaman.

* * * *

Çıxdı axşamüstü ordu Məkkədən,
Yoxdu qələbəyə daha şəkk edən.
Dedilər: -Belə bir güc qabağında
Laxlayar təməli hətta dağın da.
Görəndə bir belə güclü qoşunu,
Qaçacaq, götürüb düşmən başını.
Qoşun yol yeridi düz bir gün yarım,
Gərildi əsəblər kamantək tarım.
Dayandı karvanla qoşun üz – üzə,
Dedi Əbu Sufyan: -Bu nə möcüzə?!
Süzüb altdan – altdan o, bu qoşunu,
Bərkdən bir – birinə sıxdı dişini.
Yatırmaqdan ötrü bu ehtirası,
Çağırdı yanına tez ibni Ası.
Söylədi:- Yetişdik xətərsiz bura,

Varmıdır ehtiyac bu vurhavura?
Gör necə qorxuya salıbdır xəbər,
Olubdur Məkkədə hamı səfərbər.
Başa sal, camaat dönsün evinə,
Imkan verməyiniz düşmən sevinə.
Eşidib Əbu Cəhl onun sözünü,
Başını dik tutub, qıydı gözünü.
Sürüb dəvəsini qabağa, dedi:
-Bəsdir, qorxu bizi çeynəyib yedi.
Səfərbər olmadıq burdan dönməyə.
Bizi təhrik etmə yerə enməyə.
Gedirik inamla zəfər çalmağa,
Məcbur etmə bizi sən alçalmağa.
Qırma öz qövmünün gəl inamını,
Üfürüb söndürmə ümid şamını.
Indi ümidimiz yalnız hərbədir.
Bu sözlər arxadan bizə zərbədir.
Sən gəl, Əbu Sufyan, bizi düz anla.
Bitməyir işimiz bircə karvanla.
Deyil təhlükənin bu heç də sonu,
Yaxşı tanıyırsan axı sən onu.
Muhəmməd əl çəkən deyil inaddan,
Bizi keçirəcək hələ min oddan.
Qureyşin günbəgün əyilir qəddi,
Deyil təhlükənin bu gün son həddi.

Çəkilsək biz dala burdan azacıq,
Şöhrəti verərik biz əldən açıq.
Söhbətə qoşuldu Ütbə bu yerdə,
Dedi:- Çox demişəm, deyirəm bir də.
Yetər, ya Əbu Cəhl, az bizi danla,
Razıyam ürəkdən Əbu Sufyanla.
Təkcə mən deyiləm belə düşünən,
Savaş niyyətindən dönüb – daşınan.
Bəni – Zöhrə ilə - Bəni – Adiy də
Deyirlər, düşünək ətraflı bir də.
Gəl, düşün bir qədər sən soyuq başla,
Çıxart hərb fikrini, başından, boşla.
Əbu Cəhl tez onun sözünü kəsdi,
Söylədi:-Ya Ütbə, bu söz əbəsdi.
Sonra üz çevirib Əbu Sufyana,
Etdi gileyini, o, yana – yana:
-Unutdun sən nə tez verdiyin sözü,
Nə tez qaysaqladı yaranın gözü.
Sən özün salmısan bizi bu oda,
Ya biz ölməliyik hamımız, ya da
Gərək boynumuza alaq əfəlik,
Ona beyət edək biz birdəfəlik.
O zaman çıxmayaq gərək eşiyə,
Dönək evimizdə qorxaq pişiyə.
Sən qəbul etsən də, mən isə qəti

Götürə bilmərəm bu həqarəti.
Yetər, qulaq asdıq şirin nağıla,
Burdan qayıtmarıq, dünya dağıla.
Eyb etməz, sizsiz də keçər işimiz,
Batar Muhəmmədə daha dişimiz.
Bu vaxt Əbu Sufyan kükrədi, coşdu.
Dedi: - Dilin uzun, başınsa boşdu.
Elə qoparmısan haray – həşir sən,
Guya biz dovşanıq sən isə şirsən.
Daim iş görmüşəm mən siyasətlə,
Sən isə üstünlük vermisən qətlə.
Doğrudur, vermişdim bu qətlə qərar,
De, indi o qərar nə işə yarar?
Atıbdır Muhəmməd indi qol – budaq,
Daha o qərarı gərək unudaq.
Çalışıb bir yola ona gətirək,
Içindən məhv edib, izi itirək.
Əbu Cəhl söyləyib sürüb dəvəsin:
-Görürəm, yaranıb sülhə həvəsin.
Nə qədər vursan da sən nala – mıxa,
Sanma ki, bu fikir başından çıxa.
Çoxdur düşünənlər mənimlə eyni,
Dolub, arxayın ol, Qureyşin beyni.
Odur ki, bu yoldan biz qayıtmarıq,
Düşmən əzilincə bu yerdə varıq.

Gedirik döyüşə biz min nəfərlə,
Gözlə, gələcəyik sonda zəfərlə.
O vaxt olacaqsan sözünə peşman,
Onda deyəcəksən gedəydim kaş mən.
Sürünüb o zaman sən dizin – dizin,
Istərsən əlimdən öpməyə izin.
Deyib, o, mahmızla dəvəni vurudu,
Keçib lap ordunun önündə durdu.
Sonra da əlini atdı qılınca,
Tərpəndi min nəfər onun dalınca.
Ütbə öz yerində qalmışdı daştək,
Düşündü, burada olaydın kaş tək.
Baxırdı Əhnəs də göz döyə - döyə,
Istəyirdi bir söz Ütbəyə deyə.
Dedi Əbu Sufyn baxıb Əhnəsə:
-Demək isətəyirsən görürəm nəsə.
Gecdir, o bu donu çoxdan biçibdir,
Daha söz deməyin vaxtı keçibdir.
Ona qoşulmaqdır bir əlacımız,
Gedək, başımızdan düşməz tacımız.
Süzərək diqqətlə karvanın yükün,
Dedi:-Açıb onu tez yerə tökün.
Lazım olan qədər silah götürün,
Məkkəyə ərzağı ancaq ötürün.
Dilimiz Qureyşın ynında gödək

Olmasın deyə biz qoşunla gedək.
Vaxtı keçirməyək biz boş – boşuna,
Uzağa getməmiş çataq qoşuna.
Haydı yubanmayın, atları qovun, -
Söyləyib, buraxdı atın cilovun.

Qayıtdı başına huşu kişinin,
Dedi:-Tədbir tökün, dərin düşünün.
Gəlir üstümüzə silahlı yağı,
Çatacaq buraya sabah sübh çağı.
Çıxdı ibni Məaz bu vaxt qabağa,
Həzrətə xitabən söylədi:-Ağa,
Mən yaxşı bələdəm Əbu Hüseylə,
Yoxdur sözlərində saxtalıq, hiylə.
Dayan, götürməmiş bu yerdən ayaq,
Düşünüb işləri yerinə qoyaq.
Daşıb dağılmamış qabından sirkə,
Qurtuluş yolunu arayaq birgə.
Həzrət cavabında söylədi Sədə:
-Bilirəm, sadiqdir Mədinə vədə.
Ancaq gəlməmişdik biz hərb etməyə,
Odur, pis baxmıram çıxıb getməyə.
Bir daha arayaq sülh imkanını,
Qoymayaq axmağa insan qanını.

Dünyanın zinəti insandır ya Səd,
Ona mələklər də aparır həsəd.
Mən hərb barəsində vəhy də almışam,
Hərbə yox, meylimi sülhə salmışam.
Qureyş öz məkrindən əl götürə kaş,
Nə təndən qan çıxa, nə də gözdən yaş.
Sevməyir Rəbbimiz həddi aşanı,
Fitnəsi, fəsadı, zülmü daşanı.
Səd dedi:-Biz qana susamamışıq,
Lazımdır, əlbəttə, dinclik, barışıq.
Ya Rəsul, biz sülhə göstərsək də cəhd,
Bağlamır bizimlə qarşı tərəf əhd.
Daha əmniyyətin buzu çatlayır,
Bizim üstümüzə düşmən adlayır.
Rəva bilməyirsə zülmü İlahi,
Nə üçün biz yerə ataq silahı?
Dəyməz belə yerdə daha dözməyə,
Hazırıq düşməni indi əzməyə.
Verilsin düşmənin gərək cəzası,
Budur sözün, məğzi işin əsası.
Ölümdən pis olar qaçsaq bu anda,
Biabır olarıq bütün cahanda.
Sən rəva bilmə ki, Yəsrib alçala,
Basa Qureyş onu küyə, əl çala.
Yellədib yavaşdan Həzrət başını,

Dedi:-Qarşılayaq gələn qoşunu.
Gözləyək, gəlsinlər, söhbət eyləyək,
Sonra fikrimizi biz də söyləyək.
Sülhün imkanları hələ bitməyib,
Barışa ümidim tamam itməqib.
Səd dedi:-Ya Rəsul, səninlə biz də
Razıyıq hər işdə, hər adi sözdə.
Bütün bu cəhdlərin sonu, hasili
Qureyşin sözündən qalıb asılı.
Sülhün ehtimalı çox az görünür,
Yaralı ilantək Qureyş sürünür.
Oynarıq çaldığı bütün havanı,
Təki o, sülh desin, kəssin davanı.
Qalmayaq bu yerdə düşməndən dala,
Ta ki, qadir olaq hər iki hala.
Qureyiş gəlib bizə indi gor qazır,
Gərək dəf etməyə biz olaq hazır.
Döyüşdə mövqe də çox ciddi şərtdir,
Bu yer əlverişsiz, havası sərtdir.
Burda uduzarıq girsək döyüşə,
Dəstəmiz yerini gərək dəyişə.

Alver yeri idi əzəldən Bədir,
Burda bilməzdilər hərb nə, qan nədir.

Dəstəni burada Məaz saxladı,
Bir azdan onları qoşun haqladı.
Üzbəüz durdular burda ordular,
Qərargah yarandı, çadır qurdular.
Əbu Cəhl qoşunu sıraya düzdü,
Ütbə də onları gözaltı süzdü.
Sonra üz tutaraq dayanan səfə,
Belə xitab etdi sonuncu dəfə:
-Ey Qureyiş, düşünün, edirik biz nə,
Kimdir düçar edən bizi bu hüznə?
Neyçün qənim olub ata oğula,
Niyə Qureyş gərək qanda boğula?
Baxın, Əbu Bəkr durub o səfdə,
Oğlu Əbdürrəhman bizim tərəfdə.
Durub qaynataya əks kürəkəni,
Yumaz Nil çayı da heç bu ləkəni.
Burda Muhəmməddir orda Əbul – As
Ölsə, yazıq Zeynəb kimə tutsun yas?!
Nələr baş verəcək bilmirik hələ
Qatsa öz əlini Əli Nofələ.
Mənimlə üzbəüz oğlum dayanıb,
Baxıram, ürəyim qana boyanıb,
Əlimdə yetişsə qətlə Hüzeyfə,
Dəyməz bu çılğınlıq sonra yüz heyfə.
Qureyş, eşit məni, başa düş məni.

Olmaq istəmirəm övlad düşməni.
Dözmədi Əbu Cəhl, dedi:-Kiri sən,
Döndərə bilməzsən bizi geri sən.
Səhv edib seçmişik səni sərkərdə,
Yaxşı ki, belə tez yırtıldı pərdə.
Göründü axır ki, həqiqi üzün,
Qiymət ver özünə indi sən özün.
Dovşansan, qıcsan da şirtək dişini,
Yeriyə bilməzsən şir yerişini.
Ütbə Əbu Cəhlin kəsib sözünü,
Dedi:-Gəl bu qədər öymə özünü.
Pis olmaz dilini bir az saxlasan,
Belə söylənirsən hansı haqla sən?
Verir kimliyini xəbər öz adın,
Bilirik, qırıqdır əzəldən zatın.
Nəslən olmuşsunuz aləmi qatan,
Biçmisən, nə əkib gorbagor atan.
Hər sözün, söhbətin bir ağ yalandır,
Qəlbin fitnə kanı, dilin ilandır.
Mənim qılınsımla ölsə Hüzeyfə,
Baxıb batacaqsan qəlbində keyfə.
Sən insan deyilsən, cinsən, iblissən,
Amalı, niyyəti. arzusu pissən.
Boynunda qalacaq tökülən qanlar,
Vaxt gələr, nəsillər məni düz anlar.

Bu vaxt Əbu Sufyan dilləndi:-Coşma,
Ya Utbə, heç kəsi söhbətə qoşma.
Danışıb bu qədər vaxtı uzatma,
Burdan gələcəyə sən ağız atma.
Ittiham eyləmə dörd tərəfini,
Qoru, bacarırsan öz şərəfini.
Bu sözlər Utbəni haldan çıxartdı,
Tələsik əl atıb xəncəri dartdı.
Qaldırıb, başının üstdə saxladı,
Atın yüyənini bir də yoxladı.
Cilovu əlindən bir az buraxdı,
Gəzdirib gözünü, ətrafa baxdı.
Üzünü çevirib Əbu Sufyana
Dedi:-Susamısan, göürəm, qana.
Neynək, Əbu Sufyan, olsun sən deyən,
Qoşulsun qoy mənə özünü öyən.
Qureyş Əbu Cəhlin olub girinci,
Göstərsin nümunə özü birinci.
Çatsa kişiliyi qoy addım atsın,
Zərbənin ilkini gərək o, dadsın.
Aldanıb bu iblis atan ilməyə,
Gəlib Məkkə əhli bura ölməyə.
Inanmıram kimsə nicat qazana,
Sonra lağ eləyə, dili uzana.
Allah varsa gərək bizi öldürə,

Qureyşin üstünə eli güldürə.
Əmr ibn Hərdəmi hirsindən əsdi,
Söylədi qəzəblə:-Ya Utbə, bəsdi.
Şığıyıb quş kimi qabağa çıxdı,
Bərk-bərk dişlərini qıcıdı,sıxdı.
Əvvəl ağı dedi öz qardaşına,
Sonra daş götürüb çırpdı başına.
Üst – başı büsbütün qana bulandı,
Səyirdi dodağı, gözü sulandı.
-Bu gün almalıyam qanın əvəzin,-
Deyib, mahmızladı o, öz dəvəsin.
Meydanda bir dövrə vurub dayandı,
Məramı hamıya onun əyandı.
Intiqam hissiylə yanırdı gözü,
Bu oldu meydanda onun ilk sözü:
-Deyim son fikrimi sizə bu başdan,
Olmaz islanmışın qorxusu yaşdan.
Qalmaz bu dünyaya gözüm tamarzı,
Bu gün öz yerinə yetsə bu arzu.
Niyyətim qətidir, sözüm qətidir,
Qisas qardaşımın vəsiyyətidir.
Çıxsın qoy düşmənin varsa hünəri,
Öldürüb, üstündən sürüm bu nəri.
Yaxılsın al qanı quma, daşlara,
Cəsədi yem olsun vəhşi quşlara.

Olmasa, Tanrımız göylərdən enə,
Mən sizə bir nicat verməərəm yenə,-
Deyə ox götürüb qoydu kamana,
Atıb o, Mihcanı bələdi qana.
Bir dəfə “vay” deyib Mihca qışqırdı,
Qan onun köksündən çölə fışqırdı.
Bərk – bərk iki əllə yapışdı oxdan,
Yıxıldı, ölmüşdü sanki o, çoxdan.
Qatil heyran – heyran baxdı hədəfə,
Düşdü bir çaxnaşma öndəki səfə.
Şəhid verilmişdi Bədirdə artıq,
Daha yaranmışdı pərdədə yırtıq.
Ola bilməz idi heç bir barışıq,
Səslər ucalırdı qarmaqarışıq.
Ömər gəlib qucdu keçmiş köləsin,
Qureyşə xitabən qaldırdı səsin:
-Demək, siz verdiniz hərb işarəsi,
Hərbin hərbdən başqa yoxdur çarəsi.
Biz yerdə qoymarıq bu axan qanı,
Çəkin başınıza indi qalxanı.
Ümid bağlamayın siz burda əfvə,
Məhkumdur ordunuz Bədirdə məhvə.
Əbu Cəhl Ömərin sözünə güldü,
Söylədi:-Gör kimin  işi müşküldü?!
Belə dil – dil ötüb girmə gözə sən,

Bir bax öz dəstənə, bir də bizə sən.
Düşün, gör tutmsan kimi kimə tay,
Buyur, həm dəsəni, həm də bizi say.
Biz vahid orduyuq indi min canda,
Bizi qorxutmayır qada da, qan da.
Bu söz silkələdi Həmzəni yaman,
Dedi:-Kişi deyil diləyən aman.
Kimin hünəri var indi dəbərsin,
Onsuz da əlimdə coşub təbərzin,-
Söyləyib, meydana dərhal atıldı,
Qeyzindən qaşları dərhal çatıldı.
Qışqırdı Həmzənin üstünə Əsvəd:
-Səni öldürməyi mən etmişəm vəd.
Gərək özüm kəsəm sənin başını,
Görəm gözlərinin qanlı yaşını.
Kəsilmiş başnı nizəyə taxam,
Qanından mən içəm, üzümə yaxam.
Olmasa, qəzəbim əsla soyumaz,
Sizə nifrətimi heç bir su yumaz,-
Deyə o, meydana çıxıb bağırdı,
Əl edib Həmzəni cəngə çağırdı.
Sonra Əsvəd cumdu hovuza sarı,
Dedi:-Gözüm bunu görməsin barı.
Əvvəlcə dağıdım bu su hovuzun,
Qoy susuz qalsınlar qoynunda düzün.

Həmzə görüb onu irəli cumdu,
Islam tarixində bu ilk hucumdu.
Şirtək nərə çəkdi o, qaça – qaça,
Əsvədə vermədi imkan göz aça.
Bir dəfə qolunu arxaya gərdi,
Vurub rəqibini torpağa sərdi.
Gəlib ona tərəf Həmzə əyidi,
Sanki bu bayaqki Əsvəd deyildi.
Yoxdu vücudunda əlamət candan,
Ruh tərk eyləmişdi onu haçandan.
Salsa da araya özü ixtilaf,
Çıxmışdı verdiyi vədinə xilaf.
Çəkib Əsvəd ibni Əbdül – Əsədin
Həmzə bir kənara atdı cəsədin.
Sonra yeiryərək bir qədər dala,
Dedi:-Dilin açdı başına bəla.
Ağlın güc gəlmədi bir tikə ətə,
Səni sürüklədi dil fəlakətə.

Qurban verilmişdi hər iki yandan,
Daha çəkinmirdi tərəflər qandan.
Üz – üzə durmuşdu tövhid şirk ilə,
Qarışa bilməzdi saf su çirk ilə.
Qaçılmaz olmuşdu indi qan, xata,

Qureyşdi buraxan qığılcım ota.
Kimisi silaha, kimisi əngə
Güc verib, hazırlıq görürdü cəngə.
Qulaq tutulurdu səsdən burada,
Söyürdü Əbu Cəhl qəsdən arada.
Birdən səsi gəldi Əmr ibni Asın:
-Döyüşə sərkərdə, -dedi – başlasın.
-Ya Utbə, özünü dalda gizləmə,
Növbə səninkidir daha gözləmə.
Tez ol, bir nərə çək, gücünü cəmlə,
Sən eylə düşmənə birinci həmlə.
Keç, göstər Qureyşə öz qeyrətini,
Bil ki, başlamaqdır işin çətini.
Qızmışdı Utbənin başı bu sözdən,
Salmaq istəmirdi özünü gözdən.
O, qoydu başına tez dəbilqəni,
Geyindi əyninə dəmir həlqəni.
Çıxıb o, meydana, bir az gözlədi,
Içindəki hissi boğdu, gizlədi.
Sonra xəncərini söykəyib yerə,
Çəkdi dəli kimi qəzəblə nərə.
Götürüb tələsik qılınc – qalxanın,
Şeybə də kəsdirdi tez onun yanın.
Qeyrəti güc gəldi həm də Vəlidə,
Keçib o, dayandı lap irəlidə.

-Başla, Utbə, - deyə səslər ucaldı,
Coşdu, bu səslərdən Utbə güc aldı.
Üz tutub ucadan dedi Ömərə:
-Verməz heç bir təklif daha səmərə.
Günəş göydən qopub yerə qarışa,
Yenə Qureyş burda getməz barışa.
Ömər, yaram mənim yaman yaradır,
Hər iki tərəfdə üzüm qaradır.
Cəngə girməliyəm Ömər naçaram,
Öldürüb – ölməyə qalıbdır çaram.
Çıxsın cəsarəti olan, döyüşək,
Biz şair deyilik sözlə deyişək.
Söylədi Ömərə ibni Revaha:
-Gözləyə bilmərik biz burda daha.
Hünər sahibidir hər kəs burada,
Yoxdur hünərsizə yer bu arada.
Kəsim qoy mən onun ittihamını,
Qureyşin gözündə qoyum kamını,-
Deyə o,Utbəyə tərəf atıldı,
Çəkib qılıncını cəngə qatıldı.
Utbə tez əlini saldı yanına,
Dedi:-Cəngdə gərək kişi tanına.
Hələ bilməmişdən zərbə dadını,
Tanıt öz soyunu, söylə adını.
Abdullah:-Ya Utbə qurtar oyunu,-

Deyərək söylədi öz ad – soyunu.
Utbə qılıncını atdı kənara,
Söylədi:-Sən hara, canım, mən hara?!
Yoxdur mən fəqirin başqa mümkünü,
Cəngə çağıriram özmünkünü,
Olsun öldürən də bizdən ölən də,
Olsun ağlayan da bizdən, gülən də.
Qureyş al qanına gərək bələnə,
Qoy görsün bu işdən gəlir ələ nə?
Utbə qutararkən Əbu Ubeydə
Verdi işi ilə cavab bu qeydə.
Şeybə də hazırdı döyüşə indi,
Gözlədi bir qədər, dözmədi, dindi:
-Çıxmışıq savaşa Hübel xətrinə,
Gəlsin arzu çəkən ölüm ətrinə.
Qırıb qollarını salıb yanına,
Döndərim köksünü arı şanına.
Gəlin, yubatmayın bir belə vaxtı,-
Deyib, nizəsini torpağa taxdı.
Gözünü  çəkmədən bir an nizədən,
Cəngə hazırlaşdı Həmzə təzədən.
Bağlayıb bəndini dəmir qolçağın,
Dedi:-Qoy dərsini verim alçağın.
Bürüdü İlahi bir nur sifətin,
Yeridi meydana şir kimi mətin.

Allaha edibən canını nəzir,
Durmuşdu savaşa Həmzə müntəzir.
O, bir nərə çəkdi dərindən – dərin,
Səsindən titrədi Yer cəngavərin.
Dedi:- İstəyirsən, kafir, başqa nə?
Döyüşə hazıram Allah eşqinə.
Cəngə girməmişdən gəl, düşün dərin,
Çayı keçməmişdən demə afərin.
Olsan da nə qədər mahir üzgüçü,
Bil ki, dağ selinin vardır öz güçü.
Aldanıb basarsan ayaq yarğana,
Səni sürükləyər sel burulğana.
Cəngə girişmisən Hübel adına,
Bacarsa, hay versin qoy fəryadına.
Mən Allah adına gəldim savaşa,
Mən Ona bağlayım ümid, sən daşa.
Sən hələ bilmirsən kim qazanacaq,
Kim dik dayanacaq, kim uzanacaq.
Bilirəm verəcək Haqq mənə fürsət,
Sənin qabağında çəkəcək bir sədd.
Hələ vaxtın vardır, düşün yenə sən,
Haqqın düz yoluna bəlkə dönəsən.
Onu qandırmağa Həmzə çox dedi,
Şeybə hər sözünə onun “yox” dedi.
Əbu Cəhl uzaqdan haray çəkərək.

Söylədi:-Getməyin üstünə tək – tək.
Gözləməyin Əli meydana girsin,
Verin bəri başdan Həmzənin dərsin .
Sanki yuxudaydı Utbə, oyandı.
Çəkib qılıncını hazır dayandı.
Vurmaq istəsə də zərbəni siftə,
Qorxurdu imkanı verə o, fovtə.
Qoyub rəqibinə göz gizli – gizli,
Məqam axtarırdı o, yüz faizli.
Tutub başı üstdə hazır şəmşiri,
Utbə çəkilirdi anbaan geri.
Şeybə də nizədən yapışıb dartdı,
Bir qulac torpağı peykan qopartdı.
Çəkdi qılıncını qından Vəlid də,
Hazırlıq yetişdi artıq son həddə.
Həmzənin gərildi simtək əsəbi,
Sel kimi daşırdı kini, qəzəbi.
Dönmüşdü hirsindən qızmış pələngə,
Sifəti düşürdü hey rəngdən rəngə.
Gedirdi qabağa baxmadan dala,
Olurdu dalınca yer çala – çala.
Dəniztək çağlayan çoşqun qəzəbin
Önündə qalmışdı rəqiblər zəbun.
Odur ki, verərək onlar əl - ələ,
Çox səy edirdilər qurmağa tələ.

Vəlid çalışırdı onu aldatsın,
Şeybə zərbə vursun, məqsədə çatsın.
Ancaq ki, düşmürdü Həmzə tələyə,
Qılıncı qalxmışdı sanki fələyə.
Qıy çəkib, alıcı quştək səkirdi,
Ölümün gözündən o, tük çəkirdi.
Müsəlman dəstəsi narahat tərzdə
Döyüşə baxırdı, dayanıb mərzdə.
Irad eyləyərək indi Vəlidə,
Cəngə hazırlaşdı Həzrət Əli də.
Qəzəb iliyinə onun işlədi,
Onu elə bil ki, ilan dişlədi.
Gəlib Peyğəmbərlə durdu yanaşı,
Dedi:-Qureyş özü çürütdü aşı.
Heç vaxt bulunmayıb o, heç düz işdə,
Biz isə getmişik daim güzəştə.
Pozdular burda da qanun – qaydanı,
Üçü keçiribdir ələ meydanı.
Bu cəhd də olundu onlar sarıdan,
Çıxmaz hoylamaqla donuz darıdan.
Zənn etməm vuruşan bir kordur korla,
Verim cavabını bu zorun zorla.
Sən ver xeyir – dua mənə, Öndərim,
Qoy gedim onları muma döndərim.
Olmaz güzəşt ilə nəticə hasil,

Edim cəhənnəmə onları vasil.
Alıb Peyğəmbərin xeyir – duasın,
Getdi o, sökməyə hiylə yuvasın.
Titrədi səsinə yerlər, fələklər,
Oldu cürətinə heyran mələklər.
Yetişib meydanın lap ortasına,
Dedi:-Anan gəlsin, Vəlid yasına.
Geniş aç gözünü, bax qənimimə,
Qadirəm tək verəm cavab bu minə.
Tanı rəqibini, Vəlid, Əliyəm,
Ilahi eşqiylə çoşan dəliyəm.
Mən Haqq baxçasından əsən küləyəm,
Allaha vurulmuş müti köləyəm.
Allah aşiqiyəm, Şiri – Xudayam,
O Rəbbin nurundan tutulub mayam.
Mənəm bu eşq ilə qəlbi döyünən,
Onu fəxarətlə öyüb öyünən.
Vəlid qorxusundan əsdi, titrədi,
Bir addım geriyə atıb, büdrədi.
Söylədi dizləri bərk əsə - əsə:
-Görürəm, qoymursan heç dil qəfəsə.
Bilirsən baş kəsmək peşəmdir mənim,
Səbr et, kim olacaq gör kimə qənim.
Qara gözlərini oyacağam mən,
Çıxarıb ovcuna qoyacağam mən.

Ətini doğrayıb mən xırda – xırda,
Sinənə basaram ayaq axırda.
Söyləyib, Əliyə tərəf yüyürdü,
Əli məqsədini onun duyurdu.
Çoşdu qəzəbindən, seltək çağladı,
Vəlidin yolunu kəsib bağladı.
Dedi dişlərini bərk sıxa – sıxa:
-Saldı sözün məni, Vəlid, acığa.
Qurumuş bir ələf su içməz şehdən,
Cahillər götürməz ibrət nasehdən.1
Qureyş sözlərini eyləsin sırğa,
Tablaşmaz önümdə bilsin qasırğa,-
Söylıyib qalxanı atdı kənara,
Dedi:-qaçacaqsan əlimdən hara?
Ey Vəlid, özündən oldu təşəbbüs,
Çək indi cəzanı, taleyindən küs,-
Deyərək şığıdı Əli ley kimi,
Quruyub qalmışdı Vəlid key kimi.
Olmadı imkanı onun qaçmağa,
Ya kəlmə kəsməyə, ya qol açmağa.
Əli bir həmlədə Vəlidi yıxdı,
Qoydu ayağını köksünə sıxdı.
Şirtək şikarının üstünə çökdü,
Əl atıb qınından qılıncı çəkdi.

---

[1] Nəsihət edən.

Tiyə parlayırdı havada par – par,
Uzanıb qalmışdı Vəlid yerdə xar.
Köksünə qılıncın qoyub ucunu,
Əli:-Etiraf et, –dedi- suçunu.
Hübelə qalmaqla bunca vəfa sən,
Görməzsən Rəbbimdən əsla şəfa sən.
Nə də kömək olar atan Utbədən,
Bu dünya malından, addan, rütbədən.
Gec deyil, bağışlar Allah, biləsən,
Sən Haqqa tapınıb kömək diləsən.
Vəlidin qaraldı dünya gözündə,
Deyildi qətiyyən halı özündə.
Qılıncı görəndə qorxdu diksindi,
Əridi qüruru, büküldü, sındı.
Örtdü bir əliylə Vəlid üzünü,
Aldı o, bir təhər ələ özünü.
Dedi:-Ürəyimdə qaldı hər arzum,
Indi söz deməyə yoxdu heç luzum.
Nə mən əyilərəm sənin Rəbbinə,
Nə sən bağışlarsan, ğəlməsəm dinə.
Ancaq yerdə qalmaz, inan, bu qanım,
Viranə qalsa da lap xanimanım.
Tapılar nəslimdən axır bir nəfər,
Çalar üstünüzdə sizlərin zəfər.
Ayağa dursaydım, olmazdı dərdim,

Iti dişlərimlə səni didərdim.
Sənə də kinim var, Allahına da,
Salıb burda məni Allahın oda,-
Söylədi, gözləri onun qaraldı,
Gen dünya başına birdən daraldı.
Keçmişdi yaxası aslan cənginə,
Sarılıq çökmüşdü onun rənginə.
Əli: -Sən düşmüsən, -dedi – qarmağa,
Rəbbim fürsət verməz bir də durmağa.
O, verər üstünlük ancaq dostuna,
Ömründə son kərə şahid ol buna.
O, dosta yer verər düşmən qucunda,
Bir behişt yaradar alov içində.
Zavallı, gor kimi düşmən seçmisən,
Qureyş içən sudan sən də içmisən!
Gəl çıxart başından bu fikri qəti,
Bil, Onun hamıya var məhəbbəti.
Vardır nicat üçün hələ imkanın,
Daşın niyyətindən axmamış qanın.
Əli çox söylədi, Vəlid yenə də.
Etiraf etmədi heç bir dəfə də.
Əli xitab etdi ona son kərə:
-Əl çək inadından, onu qoy yerə.
Hələ ki, var sənin dərdinə dərman,
Tövbə et, qətlinə sən vermə fərman.

Başını yenə də Vəlid buladı,
Küfr edib, it kimi kafir uladı.
Əli rəqibini son kərə süzdü,
Kəsib sərçə kimi başını üzdü.

Meydanda hələ də döyüş gedirdi,
Utbə rəqibinə hücum edirdi.
Əbu Ubeydəni axır ki, çəmlə
O, yorub, eylədi uğurlu həmlə.
Rəqibi aldığı ağır yaradan,
Bilmirdi əl atıb tutsun haradan.
Üstündə durmurdu başı, əsirdi,
Ağrı doğrayırdı onu, kəsirdi.
Yanıb sızlayırdı Əbu Ubeydə,
Belə sızlamazdı heç dilsiz ney də.
Utbə sevincindən çəkib qəh – qəhə,
Tutmuşdu özünü özü bəh – bəhə.
Axdıqca yaradan qan sızğın – sızğın,
Baxıb, zövq alırdı işindən quzğun.
Şığıdı o, birdən, cəld hərəkətlə
Istədi ovunu yetirsin qətlə.
Çıxdı son zərbəsi boşa davada,
Qolundan yapışdı bir əl havada.
Görəndə Əlini Utbə sıxıldı,

Kəsilmiş ağactək yerə yıxıldı.
Baxışı Vəlidə onun sataşdı,
Qıvrıldl ilantək, o, bir də aşdı.
Sürünüb, oğlunu o, qucaqladı,
Sel tək göz yaşını töküb ağladı.
Kəsilmiş başına sürtüb əlini,
Oxşadı oğlunun qıvrım telini.
Vəlidi yaladı Utbə buz kimi.
Onu sinəsinə sıxıb saxladı.
Qeyzindən ağzında dişi laxladı.
Utbə bir atəşə, oda qalandı,
Gözləri böyüdü, alcalandı.
Baxırdı Əliyə ölgün baxışla,
Sanki yay durmuşdu üzbəüz qışla.
Yana çevirərək Əli üzünü,
Silirdi əlindən qanın izini.
Onu baxışlara  Utbə ötürdü,
Əl atıb qılıncı yerdən  götürdü.
Qolunu qaldırıb, belini gərdi,
Ona güc vermişdi oğlunun dərdi.
Olmadı macalı onun vurmağa,
Bilsəydi etməzdi heç cəhd durmağa.
Göz açıb – yumunca o, Şiri – Xuda
Saldı bədənindən başını cüda.
Sonra Ubeydəyə Əli əl atdı,

Savaş meydanından onu çıxartdı.
Bundan ehtizaza gələn Həmzə də,
Vurdu rəqibinə bir neçə zədə.
Şeybə xar olmuşdu, qalmışdı aciz,
Indi sinəsinə dirənmişdi diz.
Aldığı yaradan itirirdi qan,
Təslimə hazırdı Əzrayıla can.
Yaralı quş kimi o, vurnuxurdu,
Altındakı torpaq qanlı çuxurdu.
Eşib dırnağıyla yeri didirdi,
Onu yaraları çox incidirdi.
Ancaq o, qoymurdu heç dil qəfəsə,
Deyirdi yavaşca Həmzəyə nəsə.
Əlini köksünə tez – tez döyürdü,
Həmzəyə biçirdi hədə, söyürdü.
Hələ təhqirlərə dözürdü Həmzə,
Yaralı ovunu süzürdü Həmzə.
Birdən cuşa gəldi başsız yel kimi,
Sürüdü Şeybəni yerdə vəl kimi.
Eyləyib kafirin tamam işini,
Atdı bir kənara murdar leşini.

Dəydi bir – birinə aləm burada,
Heç bir yer yox idi daha irada.
Qureyşin keçirdi məkri həyata,

Onda qalmamışdı ar da, həya da.
Görüb əməlinin belə səmərin,
Əbu Cəhl düşündü bir az da dərin.
Tələsik silaha o, da sarıldı,
Gəldi gözlərinə bir şövq, parıltı.
Olur, gördü artıq arzuları çin,
Insan qiyafəli bu iblis, bu cin.
Dedi: -Ürəyimə dolub bir inam,
Məni bu gün üçün doğubdur anam.
Atıldı Əbu Cəhl cəng meydanına,
Gəldi döyüşçülər onun yanına.
Yeriyib meydana girdi ordular,
Cəngdə bir – birini yaman yordular.
Qılınc səslərindən qulaq batırdı,
Səs – küy mahallara gedib çatırdı.
Kimsə vurmayırdı qılınc havayı.
Kəsilən başların itmişdi sayı.
Göyə ucalırdı başlardan təpə,
Yanında qan gölü vururdu ləpə.
Bir xeyli keçsə də gecə yarını,
Kimsə tərk etmirdi hələ yerini.
Neçə qılınc vuran, ox atan vardı,
Burda nə dincələn, nə yatan vardı.
Qan dizə çıxmışdı Bədr çölündə,
Üzürdü cəsədlər bu qan gölündə.

Görüb belə müdhiş, qanlı səhnəni,
Atlar gəmirirdi dəmir dəhnəni.
Islam ordusunu sıxıb dörd yandan.
Keçirdi müşriklər döyüşdə candan.
Gedirdi müslman ordusu dala,
Məğlub olurdular onlar az qala.
Nə qədər etsə də cəm öz kinini,
Çətindi üç yüzə qırmaq minini.
Qüvvələr nisbəti birin üçəydi,
Bu çox ağır, müdhiş, məşum gecəydi.
Hələ uzanırdı qanlı vaqiə,
Həzrət əl götürdü Yerdən Baqiyə:
-Nəfsi güc gəlsə də bəni – Adəmə,
Ya Rəbb, zidd getmərəm mən iradəmə.
Nələr keçirtdiyim Sənə bəllidir.
Səbrin mənim üçün bir təsəllidir!
Çalsa bu döyüşdə müşriklər zəfər,
Sənə ibadətçün qalmaz bir nəfər.
Lütf et vəd etdiyin mənə yardımı,
Düşmən qarşısında yıxma ordumu,-
Deyə o, qapıldı həmdü – sənayə,
Gəldi bu vaxt ona Rəbbindən ayə.
Səsləndi Cəbrail:-Gəldim deməyə,
Mələklər yetişir sizə köməyə.
Olub qəzəbinə Allahın düçar,

Düşmən önünüzdə tablaşmaz, qaçar.
Həzrət bu xəbərdən xeyli sevindi,
Yoxdu sevincinin hüdudu indi.
Dərindən bir nəfəs aldı asudə,
Titrədi fərəhdən ümid səsi də.
O, Əbu Bəkrə verərək müjdə,
-Qalib gələcəyik,- dedi – döyüşdə.

Açıldı Bədirin səhəri qara,
Olmuşdu dərindən yer para – para.
Gəlirdi torpağın ahı dərindən,
Sanki çıxacaqdı Yer məhvərindən.
Torpaq götürmürdü belə sınağı,
Yanıb qovrulurdu qanlı qasnağı.
Al rəngə büründü bir azdan dan da,
Elə bil çimmişdi Günəş də qanda.
Bürünüb buludlar qan laxtasına,
Gəlmişdi Bədirə şəhid yasına.
Günəş boylananda üfüqdən təzə,
Durudlar qoşunlar yenə göz – gözə.
Olum qarşılaşdı yenə ölümlə,
Edirdi rəqiblər aramsız həmlə.
Çəkildi qılınclar qından yenə də.
Daşlar həna qoydu qandan yenə də.

Hər iki tərəfdən atıldı nizə,
Fəryad sədaları yayıldı düzə.
Yenə də başlara oxlar töküldü,
Verildi sinələr tiğə, söküldü.
Başlar bədənlərdən olduqca cüda,
Büləndi göylərə ah dolu nida.
Get gedə artırdı bu ah, bu nəva,
Mövqelər uğrunda gedirdi dava.
Üstünlük keçirdi müsəlmanlara,
Işi müşriklərin  düşmüşdü dara.
Kim – kimə çatırdı, vurub yıxırdı
Bacaran aradan haman çıxırdı.
Nə sursat verirdi fayda, nə də say,
Nə də Əbu Cəhlin çəkdiyi haray.
Zema ibni Əsvəd, Hişam oğlu As
Öldülər, meydanda düşcək basabas.
Əsirdi üstündə başı Əhnəsin,
Dözməyib tərk etdi döyüş səhnəsin.
Qureyşin başına ələnirdi kül,
Indi nicat tapmaq olmuşdu müşkül.
Daha heç təbliğat etmirdi kömək,
Qaçırdı müşriklər meydandan tək – tək.
Ancaq hər müsəlman indi, əksinə,
Qadirdi orduya gərsin tək sinə.
Üç yüz beş nəfərlik bu dəstə indi,

Meydanda elə bil bir neçə mindi.
Hər biri canını tutub dişinə,
Səbəbdi ölənin on – on beşinə.

Görəndə Üməyyə ibni Xələfi,
Sancdı elə bil ki, Bilalı əfi.
Düşündü verdiyi zülmü, əzabı,
Dedi:-Fürsət varkən çəkim hesabı.
Alıb Umeyyəni nişan, oxladı,
Sonra da nəbzini gedib yoxladı.
Əlini çəkərək onun əlindən,
"Ya Allah" nidası qopdu dilindən.
Dedi:-Dərk elədim bir şeyi, ya Rəbb,
Hər bir nəticəyə varmış bir səbəb.
Sonra təkbir deyib o, dönə - dönə,
Döyüş meydanına atıldı yenə.
Kəsilmək bilmirdi həzin nidası,
Göylərə qalxırdı təkbir sədası.
Seçərək hər sözü Bilal zövq ilə,
Allaha deyirdi tərif şövq ilə.

Əli verməyirdi düşmənə aman,
Onu qaldırırdı zirvəyə zaman.

Düşmənin tuturdu göydə oxunu,
Lərzəyə salmışdı bu hal çoxunu.
Kimsə gətirmirdi zərbəsinə tab,
Yoxdu bu meydanda ona olan bab.
Özü də bilmədən orda Hənzələ
Başını tuş etdi birdən cəncələ.
Əlidən arxaya keçib, çəmlədi,
Gücünü bir yerə yığıb, cəmlədi.
Gəlib yetişəndə zərbə məqamı,
Qaldı Hənzələnin qəlbində kamı.
Həmzə haray çəkdi, dönərək Əli,
Baxdı düşməninə çox iddialı.
Düşdü Hənzələnin canına bir xof,
Zərbəni dadmamış o, bağırdı: -Of!
Əsnədi, titrədi, əsdi dizləri,
Aldığı zərbədən çıxdı gözləri.
Töküldü gözləri açıq ovcuna,
Bədən kəsik başı aldı qucuna.
Dəydi cəsədinə qəfil bir ox da,
Baxıb Əli dedi:-Hənzələ, toxta.

Çəkib Əbu Cəhli xəlvət bir yerə,
Vurmuşdu öz qövmi yanında dövrə.
Üz tutub o, dedi Bəni – Məhzuma:-

-Öllmədim, axır ki, çatdım arzuma.
Əgər Muhəmmədi öldürsəm özüm,
Olmaz heç bir dərdim, ey Bəni – Məhzum.
Gətirər əməlim nəslimizə şan,
Öyünər bizimlə, hərbdən danışan.
Mən bu gün yetişsəm öz muradıma,
Min dastan qoşarlar mənim adıma.
Onu Muəvvəzələ qardaşı Muaz
Görüb, söylədilər: -Ey ağıl dayaz!
Sənin arzuların boş bir xəyaldır,
Əgər bacarırsan yerində lal dur.
Susmasan, çəkərik ətini şişə.
Qoymarıq niyyətin başa yetişə.-
-Deyə eylədilər kafirə hucum,
Əbu Cəhl söylədi:-Bitməyib gücüm.
Çox da sevinməyin bu üstünlüyə,
Nədənsə düşmüşük bir az tünlüyə.
Qələbə olacaq bizimlə axır,
Aslan qoşununa neyləyər naxır?!
- Kafir, -Muaz dedi- danışma uzun,
Dər indi barını dediyin sözün.
Edib canlarını Haqqa sadağa,
Yeridi qardaşlar birdən qabağa.
Onlar Əbu Cəhlə lap çathaçatda
Atdı öz belindən kafiri at da.

Çaşmışdı, bilmirdi indi neyləsin,
Nə sayaq dil töksün, necə söyləsin.
Dəyişdi bir anda büsbütün halı,
Qaldı nə dəymişi, nə də ki, kalı.
Deşik axtarırdı, sanki siçandı,
Işinə deyildi uyğun heç andı.
Bilmirdi özünü o, soxsun hara,
Aləm görünürdü ona qap – qara.
Görüb belə halda onu Muəvvəz,
Yetişdi, qoymadı heç ala nəfəs.
Əbu Cəhl çəksə də qalxan başına,
Çalmadı Muəvvəz qılınc boşuna.
Şəmşir olduğundan həddindən iti,
Kəsirdi qalxanı, altından əti.
Zərbə Əbu Cəhli ikiyə böldü,
Qaldı ürəyində muradı, öldü.

Artıq qaralırdı Bədirdə hava,
Lap axşama yaxın səngidi dava.
Qureyş tərəfdən Aqillə Nofəl
Təslim olmaq üçün qaldırdılar əl.
Düşdü bu döyüşdə əsir Əbul As,
Həm də Peyğəmbərin əmisi Abbas.
Oldu neçə ölən, neçə keçilən,

O vaxtlar Məkkədə sayıb – seçilən
Əsvəd ibni Amir, Abd ibni Zema,
Gəldilər Həzrətə bir – bir təzimə.
Qaldı hər yeddidən meydanda biri,
Yarısı meyiddi, yarısı diri.
Qovaraq meydanda yetmiş ölünü,
Qureyş tərk elədi Bədr çölünü.
Vardı bir o qədər əsir düşən də,
Yarası olan da, bağrı şişən də.
Çaldı müsəlmanlar şərəfli zəfər,
Şəhadət dağına qalxdı on dörd ər.
Bir – bir eylədilər bu şərbəti nuş
On əshab, dörd ənsar, bitincə döyüş.

Qaçanlar qoymuşdu neçə dəvə, at,
Qalmışdı həm ərzaq, həm də ki, sursat.
Həzrət elan etdi ucada qəti:
-Bölün halal kimi bu qəniməti.
Bölün hər bir şeyi burda bərabər,
Çünki axıtdınız dəryalarca tər.
Hər nə götürsəniz sizə halaldır,
Qureyşin deyildir, bu bizim maldır.
Sonra üz tutaraq ibni Muaza
Dedi: -Əsirlərə verməyin cəza.
Götür Öməri də, gedib yoxlayın,

Hər kəsin yarası varsa, bağlayın.
Olsa onlar ilə rəftarınız bəd,
Allah qəzəb eylər bizlərə, ya Səd.
Əsgər cəngdə düşmən, indi qonaqdır,
Xidmət etməliyik nə qədər sağdır.
Əməliniz halal, diliniz şirin
Olsun, siz hamını eyni dindirin.
Bəlkə niyyətindən daşınan ola,
Islam cərgəsinə qoşulan ola.
Hər kəs öz fikrində eyləsə israr,
Belə kəslər üçün başqa qərar var:
Azad etmək üçün hər əsir kəsi,
Alın mümkün qədər siz qan fidyəsi.
Ancaq haqq aşmasın dörd min dirhəmi
Ki, ödəyə bilsin fidyəni hamı.
Kim ki, istəməsə fidyə ödəmək,
Onda çəksin zəhmət, sərf etsin əmək.
Onda can sahibi öyrətsin azı
Bizdən on nəfərə oxumaq, yazı.

Peyğəmbər göndərib iki nəfəri,
Demişdi car edin siz bu zəfəri.
Xəbərdar eyləyin bir – bir hamını,
Yandırsın Mədinə zəfər şamını.
Qoymayın heç kəsi qala yalavac,

Gərək nə lüt olsun şəhərdə, nə ac.
Hər evə baş çəkin, bir – bir haylayın,
Lütə don, aca da ərzaq paylayın.
Açın hər tərəfdə ehsan süfrəsi,
Hamıya doyunca verin yemək, su.
Küsülü olanlar varsa, barışsın,
Qəmli ovqatlara sevinc qarışsın.
Qoymayın kimsənin gözünü yaşlı,
Bayramı qeyd edin əməlli başlı.
Qılsın müsəlmanlar bayram namazı,
Qalsın Pərvərdigar bu işdən razı.

Dəfn edib Bədirdə çəhidlərini,
Dəstə tərk elədi dərhal yerini.
Hamı yeriyirdi şad bir ovqatla.
Yara incidirdi Ubeydəni bərk,
Saralıb qalmışdı saman çöpütək.
Möhkəm sarınsa da onun yarası,
Sarğının dolmuşdu qanla arası.
Nə yemək yeyirdi, nə su içirdi,
Nə də ki, qaradan ağı seçirdi.
Keçdi dəqiqələr anlar ötüşdü,
Nəhayət, Rəhvaya dəstə yetişdi.
Yoxdu Ubeydədə əvvəlki əhval,
Gözləri açıqdı, baxışları lal.

Bir azdan əhvalı tamam pisləşdi,
Vurnuxdu bir qədər, sonra süstləşdi.
Vardı söz deməyə onda bir həvəs,
Ancaq qalmamışdı o güc, o nəfəs.
Gəlirdi ağzından acı qara su,
Ölümə qalmışdı bircə çarası.
Ondan çəkməyirdi Əzrayıl heç əl,
Göz – gözə durmuşdu onunla əcəl.
Son dəfə qaldırıb qolunu çırpdı,
Son dəfə ah çəkdi, gözünü qırpdı.
Son dəfə sinəsi qabardı, qalxdı,
Aşağı enəndə qolları salxdı.
Alnında tər hələ puçur – puçurdu,
Cismi yerdə idi, ruhu uçurdu.
Elə ki, başladı ruhu pərvaza,
Açıldı behişdə dərhal dərvaza.
Ruh uçub quş kimi behiştə qondu,
Bu nə xoş başlanğıc, nə gözəl sondu!

## *UHUD DÖYÜŞÜ*

Yetişdi, nəhayət, on beşi Şəvval,
Çalındı təbillər döyüşdən əvvəl.
Təbil sədaları dağları aşdı,
Dəydi bir – birinə hamı çaxnaşdı.

Gəldi hərəkətə hər iki qoşun,
Toz qalxıb bürüdü dağların döşün.
Xəfif meh əsirdi arana dağdan,
Uhuda baxırdı Günəş uzaqdan.
Günəş boylandıqca al şəfəqləri
Tədricən boyadı nura hər yeri.
Yatırdı ağappaq çən zirvələrdə,
Çəkilmək bilmirdi hələ bu pərdə.
Yeriyib hər qoşun tutdu öz yerin,
Rəqiblər seyr etdi gendən bir – birin.
Yerbəyer oldular rəqiblər dağda,
Qalxdı cəngdən əvvəl iki bayraq da.
Süzüb at belindən şəst ilə dağı,
Dedi Əbu Sufyan döyüş qabağı:
-Ümdə arzusudur hər bir nəfərin,
Dadmaq ləzzətini bu gün zəfərin.
Gərək Bədir dərdi bizə dərs ola,
Bu gün həmin günə gərək tərs ola.

Diskindi səs – küydən yuxulu dağlar,
Ölü rəngli, ölüm qoxulxu dağlar.
Artıq verilmişdi cəngə işarə,
Dağda pəhləvanlar çəkirdi nərə.
Gurladı sel kimi Həmzənin səsi,

Yırtıldı dağların bəyaz pərdəsi.
Elə ki, o, girdi cəng meydanına,
Düşmənin vəlvələ düşdü canına.
Pənah gətirərək iman gücünə,
Əli də qoşunun girdi içinə.
Talha dayanmışdı əlində bayraq,
Rəngi zirvələrə çökən çəndən ağ.
Meydanda görəndə Əli Talhanı,
Atdı sol əlindən yerə qalxanı.
Söylədi, yapışıb qılıncdan bərk – bərk:
-Birinci Talhanı öldürəm gərək.
Qoymaram o bayraq burda ucala,
Baxıb fərəhlənə, Qureyş güc ala.

Yeridi, Talhanı hədəf seçərək,
Səfləri dağıdıb, qırıb keçərək,
Yanında görəndə Talha Əlini,
Ilantək çıxartdı ona dilini.
Dəyməzdi bu yerdə ağız açmağa,
Odur ki, üz qoydu Talha qaçmağa.
Düşüb caynağına alıcı quşun,
Az qala bayraqdar itirsin huşun.
Onun qalmamışdı ayağında güc,
Olmuşdu qəlbində xəyalları puç.
Əlidən aldığı ağır zərbədən

Oldu iki şaqqa bir ağır bədən.
Əli xalça kimi sərdi Talhanı,
Bayrağın üstünə töküldü qanı.
Bu ölən birinci bayraqdar idi.
Düşsə də belə tez yerə bayrağı,
Yenə can atırdı döyüşə yağı.
Çıxırdı təzədən dalından dağın
Biri əvəzinə enən bayrağın.
Çatdı ölənlərin sayı altıya,
Oldu qəbzə də al, oldu al tiyə.
Əyilib olmuşdu qılınc ikiqat,
Əmələ gəlmişdi qəbzəsində çat.
Əli almayırdı bir an dincini,
Cəngə səsləyirdi o, yeddincini.
Nə Əli yorğundu, nə Qureyş yorğun,
Davam eyləyirdi Uhudda qırğın.
Dönmək istəmirdi düşmən geriyə,
Ibrət olmayırdı ölən diriyə.
Qureyş bu qanlara məhəl qoymurdu,
Bir – bir bayraqdarlar olsa da peyda,
Hələ verməyirdi cəhdləri fayda.
Birbəbir onları eyləyirdi xar
Yorulmaq bilməyən Heydəri – Kərrar.
Salaraq içinə qorxudan səsin,
Durub gözləyirdi hər kəs növbəsin.

Bu növbə yeddinci bayraqdarındı,
Üstünə yağırdı sanki qar indi.
Rəngi olmuşdu ağ, buz kimi əti,
İndidən duyurdu o, məşəqqəti.
Aləm dolanırdı onun başına,
Axı, tüpürdüyün necə yalasın?!
Göz yumub qanlara Bəni – Əbdüddar,
Göndərdi meydana yeni bayraqdar.
Eyləyib bayraqdar cəm cürətini,
Artırdı bir xeyli öz sürətini.
O, gəlib meydana girmişdi təzə,
Qeyizdən dəniz tək çoşdu Murtəza.1
Lərzəyə gəlmişdi aləm səsindən,
Ətrafa yağırdı od nəfəsindən.
Şığıyıb laçıntək Heydəri – Kərrar,2
Çəkdi bir ləhzədə cəbhələrə car:
-Siz saya güvənin, mənsə imana,
Ümid bəsləməyin bu gün amana, -
Deyə o, qəzəblə bir zərbə çaldı,
Qılıncdan əlində tək qəbzə qaldı.
Qopub ayrılaraq qəbzədən tiyə,
Kəsərək daşları, batdı gədiyə.
Edib parça – parça bağrını yerin,
Tiyə işləmişdi torpağa dərin.

---

[1] Həzrət Əli
[2] Əlinin ləğəbi

Oldu bu vaqiə çox gözlənilməz,
Verdi bu təsadüf düşmənlərə həzz.
Görəndə Əlinin əlini yalın,
Ikrimə əmr etdi:-Tez təbil çalın!
Hay vursun carçılar Şama, Hələbə
Ki, Qureyş Uhudda çalıb qələbə.
O, nəfəs dərməyə tapmamış macal,
Səs düşdü dağlara:-Ya Hübel, ucal.
Gəldi bayraqdara təkəbbürü güc,
Baxıb o, Əliyə, gülürdü bic – bic.
Artıq özünü o, qalib sanırdı,
Bayraq başı üstə dalğalanırdı.
Inam yaranmışdı özünə indi,
Parıltı gəlmişdi gözünə indi.
Söz sancdı Əlini bir neştər kimi,
Baxdı düşməninə qızmış nər kimi.
Üz – üzə qalmışdı iki fərqli gənc,
Iki fərqli amal, iki zidd güvənc.
Düşməni gözaltı süzürdü Əli,
Xəyal dəryasında üzürdü Əli.
Vurmağa hazırdı kafir əmudla,
Əli boylanırdı göyə ümidlə.
Peyğəmbər o yanda qılınc vururdu,
Düşmən ona qarşı tələ qururdu.

Möhkəm qarışmışdı başı döyüşə,
Istəmirdi dönə, səmti dəyişə.
Gah sola çalırdı qılınc, gah sağa,
Vaxtı yoxdu geri dönüb baxmağa.
Deyildi Əlidən nədi xəbərdar,
Bilmirdi o yanda nə təhlükə var.

Əli qalxanını kənara atdı,
Qaldırıb əlini göyə uzatdı.
Çox uzun sürmədi çəkdiyi həsrət,
Verildi Allahdan Əliyə nüsrət.
Dilindən qopmaqla "Allah" kəlməsi,
Bir oldu mələyin yerə gəlməsi.
Tanrı aslanının çətin anında,
Cəbrail Rəsulun oldu yanında.
Çatdırıb Allahdan salam Quluna,
Dedi:- Qoyma Əli qəmdə buluna.
Geri dön, bax onun sən bir halına,
Yubanma, kömək et əliyalına.
Tez ol, qılıncını sən ona çatdır,
Onu darda qoymaq Allaha yaddır.
Görməz bundan belə övladi bəşər
Zülfüqartək qılınc, Əli kimi ər.
Əziz bəndəsidir Əli Allahın,
Sevir mələklər də mərdlərin şahın.

Təqdirə layiqdir onun hər işi,
Ağlı, düşüncəsi, elmi, rəvişi.
Yoxdur başqa varlıq belə xislətdə,
Ona qibtə edir mələklər hətta.
Oldu bu sözlərdən peyğəmbər məmnun,
Qondu bir təbəssüm üzünə onun.
Dedi:-Mən Əlidən, Əli məndəndir,
Bizim cücərməmiz eyni dəndəndir.
O, həm əmim oğlu, həm qardaşımdır,
Kişilər içində ilk dindaşımdır.
Bu sözlər mələkçün necə də xoşdu,
O da öz səsini bu səsə qoşdu.
Söylədi:-Ya Rəsul məndə sizdənəm,
Siz məndən, mən sizin ikinizdənəm.
Həzrətin sığmadı fərəh köksünə,
Diksindi Günəş də onun səsinə.
Çəkdi o:-La seyfə illa Zülfüqar1
Və la fəta illa Əli, - deyə car.
Gedib ulduzlara sədası çatdı,
Yeriyib qılıncı Əliyçün atdı.
Bərq vurdu qılıncın almaz tiyəsi,
Xəyaldan ayrıldı onun yiyəsi.
Nəzəri qılıncla birdən tapışdı,
Əl atıb qəbzədən göydə yapışdı.

---

[1] Zülfüqar kimi qılınc, Əli kimi igid yoxdur.

Baxıb Zülfüqara Əli feyz ilə,
Ucadan bir nərə çəkdi qeyz ilə.
Bu səs bayraqdarın yardı bqğrını,
Hiss etdi içində qopan ağrını.
Əlindən çıxmışdı onun girəvə,
Indi o, dönmüşdü özü bir ova.
Əli qəzəb dolu bir zərbə çaldı,
Kafirin dilindən fəryad ucaldı.
Zülfüqar sıyırıb atdı başı da,
O başın düşdüyü bir sal daşı da.

Oxucum, təsvirim çəkdi çox uzun,
Çünki fərqi vardır iş ilə sözün.
Burda vacib olan o kiçik andı,
Səbəb Allahdandı, hökmü – zamandı.
Ayrıdır söz ilə vaxtın imkanı,
Mən geniş şərh etdim o kiçik anı.
Nə isə, düşməyək mətləbdən iraq,
Burda haşiyəni gəl başa vuraq.
Yenə də Əliyə nəzər yetirək,
Onun qeyrətindən ibrət götürək.
O, cəng meydanına çıxan hər kəsin
Edirdi qulağı boyda tikəsin.
Səngimək bilmirdi döyüş hələ də,

Düşmən vurnuxurdu bu dar tələdə.
Alırdı uyaraq şeytan felinə,
Əbdüddar övladı bayraq əlinə.
O qədər onları şeytan tovladı,
Öldü Uhudda düz doqquz övladı.

Daha pozulmuşdu burda intizam,
Səflər arasında yoxdu bir nizam.
Dəymişdi qoşunlar biri – birinə,
Bilmirdi ölənçün etsin diri nə.
Savaş meydanında ağlı – qaralı
Neçə ölən vardı, neçə yaralı.
Qalmışdı canının hər kəs hayına,
Şərik çıxan yoxdu özgə vayına.
Təşnəydi su üçün neçə zariyan,
Bilmirdi neyləsin yara sarıyan.
Xanım Nəsibəylə1 xanım Ayişə,
Hərəsi məşğuldu burda bir işə.
Nə pambıq çatırdı ancaq, nə cuna,
Bilmirdi neyləsin xanımlar buna.
Uhud boyanmışdı qızılı qanla,
Hopub islanmışdı özülü qanla.
Qum da əhmər rəngdə, daş da qırmızı.

[1] Şəfqət bacısı idi.

Qan laxta vurmuşdu solğun üzlərdə,
Paltar geyinmişdi qandan düzlər də.

Qoyaraq meydanda silahdaşını,
Qaçırdı, götürüb düşmən başını.
Qureyşin süqutu artıq labüddü,
Uhud onun üçün qara tabutdu.
Görəndə ki, qaçır meydandan rəqib,
Etdi ox atanlar onları təqib.
Qoyub mövqeyləri başlı başına,
Gəlib qoşuldular onlar qoşuna.
Qarətə məşğuldu başı dəstənin,
Nəfsinə qul olmuş naşı dəstənin.
Qənimi dəstənin oldu öz andı,
Bu yerdə dəstə yox, Qureyş qazandı.
Qureyşin əlinə keçmişdi dərə,
Artəq Mədinəyə açıqdı bərə.
Dəstə Mədinənin açıb ovcunu,
Qureyşə vermişdi ipin ucunu.
Haqqa olunmuşdu burda təcavüz,
Odur, Haqq qoymuşdu onları aciz.
Hasili bu idi olunan qəsdin,
Ədalət olmuşdu dostluqdan üstün.

Get – gedə qızırdı meydanda vuruş,
Gətirə bilmirdi Mədinə duruş.
Əlindən getmişdi üstün mövqeyi,
Itirmək qorxusu vardı hər şeyi.
Vəhşi də döyüşün qızğın çağında,
Pusquda durmuşdu Uhud dağında.
Çox cəhd eyləyirdi o, əlahiddə
Alsın istəyini elə Uhudda.
Rahat buraxmırdı qəlbini maraq,
Gözündən qpymurdu Həmzəni iraq.
Bir əlində nizə, yıxıla – dura,
Vururdu özünü qul ora – bura.
Etməkçün canını bu gün azadə,
Hazırdı girməyə oda, közə də.
Həmzə də tapmırdı bir yerdə qərar,
Qırırdı düçşməni o, birər – birər.
Qulaq tutulurdu onun səsinə,
Yoxdu tab gətirən bir zərbəsinə.
Meyadanda şimşəktək Həmzə çaxırdı,
Vurub bu tərəfdən, ordan çıxırdı.
Coşub çağlayırdı sanki borandı,
Güvənci bir Allah, bir də Qurandı.
Dilindən qopmurdu hey təkbir səsi,
Yeri titrədirdi onun nərəsi.
Gözdən qoymayırdı qul hədəfini,

Vermək istəmirdi əldən nəfini.
Batıra bilməzdi öz ad – sanını,
Aramaq lazımdı zərbə anını.
Məqam düşmürdü ki, nizəni atsın,
Məcburdu zərbəni hələ yubatsın.
Sağlayıb sağ çiyni üstdə nizəni,
Süzürdü dörd gözlə dağı, düzəni.
Həmzə qoymamışdı yer heç gümana,
Batışa bilməzdi tək heç kim ona.
Ümidi yox idi özünə qulun,
Əyildi, söykəyib dizinə qolun.
Nizəni tərsinə yerə batırdı,
Hündür daş dibində keçib oturdu.
Sonra pıçıldadı qul məlul – müşkül:
-O gecə yağaydı başıma kaş kül.
Açıbdır başıma dilim bəlanı,
Geriyə qaytarmaq olmaz olanı.
Bu mənim istəyim, mənim yolumdur,
Sözdən daşınmağın əcri ölümdür.
Nəfəs almaq üçün bir gün azadə,
Razıyam yanmağa indi yüz oda.
Azadlıq dünyada ən şirin şeydir,
Köləlik zəhərdir, o isə meydir.
Almaq üçün onun bir saatını.
Xoşdur versəm bütün qul həyatını

İndi keçə bilər həyata arzum,
Geri çəkilməyə yoxdur heç lüzum.
Bu yerdə yolumu kəssə öz atam,
Onun da ömrünə verərəm xitam, -
Deyib, bir ah çəkdi sinə dolusu,
Keçdi xəyalından eli, ulusu.
Döndü ah səsinə Həmzə o səmtə,
Vəhşi bulunurdu hələ də qəmdə.
Dikildi  Həmzənin ona baxışı,
Yağdı qulun üstə nifrət yağışı.
Bilmirdi gizlətsin özünü harda,
Asılıb qalmışdı elə bir darda.
Bu odlu baxışdan o, tökürdü tük,
Qalmışdı, tutaraq boynunu bükük.
Həmzə ona tərəf addım atırdı,
Ayağı dizəcən yerə batırdı.
Sanki yeriyirdi ov üstünə şir,
Görüb, qoparmışdı qul haray – həşir.
Hay verdi on nəfər ünə, haraya,
Həmzəni aldılar birdən araya.
Sağda da düşməndi, indi solda da.
Qoymurdu yaxına yağını Həmzə,
Biçirdi solunu, sağını Həmzə.
Gendən seyr edirdi kölə qırğını,
Özü sancmış idi gölə qarğını.

Gözünü Həmzədən çəkmədən kölə,
Yavaşca götürdü nizəni ələ.
Acıldı boynunun birdən büküyü,
Görmüşdü zirehdə kiçik söküyü.
Tüpürüb,ovcunu bir az yaşladı,
Nizəni Həmzəyə tərəf tuşladı.
Baxıb qıyğacı, sol gözünü yümdu,
Turşutdu bir qədər üzünü, cumdu.
Bir oldu nizəni qulun atmağı,
Həmzənin əyilib yerə yatmağı.
Nizə göbəyinə onun batmışdı.
Ağrıdan qaşını Həmzə çatmışdı.
Nizə boyasa da qana bağrını,
Susurdu, içində boğub ağrını.
Axırdı yaradan hələ isti qan,
Olmuşdu büsbütün onun üstü qan.
Görəndə torpaqda qanın izini,
Dikəldi, söykəyib yerə dizini.
Qalxıb o, düzəltdi tamam qəddini,
Dedi: - Ölüm, hələ gözlə həddini.
Var mənim pak adım, şərəfli nəslim,
Asan eyləmərəm bu canı təslim.
Tutdu ikiəlli nizədən möhkəm,
Eylədi bir yerə qüvvəsini cəm.
Nizəni qarnından kənara dartdı,

Çəkib yarasından onu qopartdı.
Peykana ilişib düşdü göbəyi,
Qeyzdən gözlərinin şişdi bəbəyi
Son dəfə o, çəkdi bir dəli nərə,
Qaldı cinni – bəşər mat bu hünərə.
O, şahid çağırıb kürreyi - ərzi ,
Verirdi Uhuda şəhadət dərsi.
Səsinə quşlar da qanad saxladı,
Düzlər silkələndi, dağlar laxladı.
Görəndə bir belə gücü, qeyrəti,
Basdı kafirləri onun heybəti.
Hamı öz yerində donub qalmışdı,
Cəmləyib son dəfə Həmzə gücünü,
Keçirtdi nizəyə birdən üçünü.
Yıxıldi onlarla özü də bahəm,
Qalmadı qəlbində onun daha qəm.
Ömrün zay etmədi qalan anını,
Həmzə qanı ilə aldı qanını.
Kafirlər düşdülər üstünə onun,
Hamısı hazırdı qəsdinə onun.
Tutdular dörd yandan ox yağışına,
Ox batdı köksünə, batdı başına.
Indi yas tutmuşdu Həmzəyə cahan,
Dərd qala bilməzdi bu yerdə nihan.
Ildırım çaxırdı, bulud dolmuşdu,

Qəmdən Günəşin də rəngi solmuşdu.
Bükmüşdü dağları bu dərd, bu ağrı,
Qana boyanmışdı güllərin bağrı.
Verirdi çiçəklər yelə saçını,
Səpirdi o gedən yola saçını.
Yer ağı deyirdi, Göy ağlayırdı,
Mələklər Həmzəni soraqlayırdı.
Nə aha baxırdı, nə saç yolmağa,
Gəlmişdi Əzrayil bir can almağa.
Mələk ayırdıqca ruhunu təndən,
Oldu tər Həmzənin alnında dən – dən.
Mələklər şəhidin verdi qüslünü,
Haqdan o, eşqinin aldı mislini.
Ruhən bulunurdu Göydə bu varlıq,
Edirdi ənginlik bu ruha darlıq.
O, qışdan uçurdu bahar fəslinə,
Behişt müntəzirdir onun vəslinə.
Ölmədi, ölümdən bac aldı Həmzə,
Ölümün fövqünə ucaldı Həmzə.
Açdı qanı ilə içi nur dolu
Şəhadət məktəbi, ölməzdik yolu

Qəlbə sığmayırdı sevinci Hindin,
Açmışdı bu ölüm dilinin bəndin.

Bərkdən deyib – gülür, dil – dil ötürdü,
Fərəhini nə Yer, nə Göy tuturdu.
Baş alıb meydana özü gedirdi,
Keçib dağ – dərəni, düzü gedirdi,
Yetişib, meyitdən durdu aralı,
Hələ can verirdi neçə yaralı.
Görüb qumun üsdə qanlı qasnağı,
Bulandı ürəyi, gəldi qusmağı.
Ağzına basaraq o, bir əlini,
Nifrətli baxışla süzdü ölünü.
Qoyub bir əlini qaşının üstə,
Dayandı Həmzənin başının üstdə.
Dedi: - Gör üstünə, Həmzə, kim gəlib,
Kim yerə sərilib, gör kim dikəlib?!
Misli görünməmiş bu şad günümdə
Sərili düşmüsən mənim önümdə.
Əli ayağına bağlı qul kimi,
Deşik – deşik olmuş köhnə çul kimi,
Havayı gəlməyib başa şənliyim,
Satılıb bu gecə işə mənliyim.
Bil, diri düşsəydin əgər əlimə,
Sən arzu çəkərdin belə ölümə.
Bilirsən, bilirsən, Həmzə, neynərdim,
Səni diri – diri tutub çeynərdim.
Sinəni dişimlə didib cırardım,

Çəkib ciyərini kökdən qırardım.
Ehtiyac qalmazdı xəncər – bıçağa,
Tonqal yandırmağa, oda, ocağa.
Qoymazdım ki, yerə bir tikən düşə,
Çəkərdim ətini çiy – çiy mən dişə.
Kəsib damarını,susamış leylək,
Qanını doyunca içərdim meytək.
Sən üç düşmənimdən birisən, Həmzə,
Fərq etməz, ölüsən, dirisən, Həmzə.
Mənim qəbulumsan bir düşmən kimi,
Tapılar anlayan məni mən kimi.
Qalıb əlinizlə ocağım viran,
Dönüb torpaq olub dörd qılınc vuran.
Dağılıb tifaqım, yurdum kor qalıb,
Mənə evim boyda qara gor qalıb.
Neyləsən soyumaz yanan ürəyim,
Dikəlməz bir daha sınan dirəyim.
İntiqam yolunu seçərək hüda,
Qureyş hücum çəkib, Həmzə, Uhuda.
Məkkədən bu qədər yol basa – basa
Dözməyib, gəlmişəm özüm qisasa.
İnadla mən qıldım əhdimə vəfa,
Sənə kar vermədi etdiyin difa.
Nələr ki, baş verib bu gün Uhudda,
Bu dünya durduqca qalacaq yadda.

Həm mənim adıma, həm sənə xatir
Hər yerdə olacaq qətlin təvatür.
Həmzə, qaçılmazdır burda rəzalət,
Yoxdur qisas üçün bundan düz alət.
Səni çox intizar qoymaram əcrə,
İndi dediyimi eylərəm icra.
Dəyməz, - dedi – vaxtı çox yubatmağa,
Başladı meyitə o, əl qatmağa.
Çəkdi onu əvvəl hündür təpəyə,
Döndü Hind ac – susuz quduz köpəyə.
Eylədi meyitlə goreşən kaftar
Misli görünməmiş qisaslı rəftar.
Yaxıb sifətinə qanın laxtasın,
Dedi: - Qoy ürəyim bir az toxtasın.
Qan gördü, dişləri onun qıcıdı,
Əsirdi fərəhdən bütün vücudu.
Onun əllərini ovcuna aldı,
Bir – bir barmağını ağzına saldı.
Qırdı dişi ilə on barmağını,
Çıxarıb gözünün yedi yağını.
Atıb gözlərinin yerə qarasın,
Dedi: - Qoy Rəbbini gözün arasın.
Tapsa qoy çağırsın onu köməyə,
Verməsin o, səni Hində yeməyə.
Görüb göz yerində bir cüt boş çala,

Baxdı heyran – heyran, çəkilib dala.
Qəhqəhə çəkərək ucadan güldü,
Yanar gözlərindən yaşlar süzüldü.
Cəsədin üstünə getdi təzədən,
Əl atıb yapışdı bərk – bərk nizədən.
Duruxdu bir qədər, nizəni atdı,
Köməksiz meyitə əlini qatdı.
Yapışıb qarnından dərini cırdı,
Onun ciyərini kökündən qırdı.
Üstündəki qanı tamam yaladı,
Elə bil gicitkən onu daladı.
Tər basdı üzünü, onu buz aldı,
Dişləri keyidi, əli susaldı.
İstədi Hind onu didə, gəmirə,
Ciyərsə ağzında döndü dəmirə
Əlini saxladı, Hind bir az durdu
Ancaq ölməmişdi gözünün qurdu,
Söylədi: - Tapmıram bir söz deməyə,
Gümanım qalıbdır ancaq qəməyə.
Dişlərim batmadı, Həmzə, ətinə,
Saldı cəsədin də məni çətinə, -
Deyərək əlinə qəməni aldı,
Onu tez – tələsik Hind işə saldı.
Eylədi ciyəri o, tikə - tikə,
Hər biri dırnaqdan bir azca yekə.

Onu muncuq kimi bir sapa düzdü.
Tutub qarşısında maraqla süzdü,
Xoşuna gəldi bu qanlı həmayil,
Hind oldu bir iyrənc niyyətə mail:
Bu bir yük olsa da, - dedi – dözərəm,
Ölüncə boynumdan asıb gəzərəm.
Sinəmə vurulmuş bir soyun dağı
Olaraq qalacaq bu boyunbağı.
O, mənə Həmzədən yadigar olsun,
Baxıb qövmü ona, saçını yolsun.
Əgəb bütün aləm söysə də məni,
Hökmən vurmalıydım bu sədəməni.
Uhud davasından qalan xatirə
Qəlbimə rahatlıq bəlkə gətirə, -
Söyləyib, Hind onu boynuna saldı,
Dərindən asudə bir nəfəs aldı.
Olmadım axır ki, mən dili gödək, -
Deyib çıxıb getdi qara kölgətək.

## PEYĞƏMBƏRİN (S) YARALANMASI

On nəfər çəkirdi Həzrətə keşik,
Tapmırdı cərgədə düşmən bir deşik.
Durmuşdu ərənlər kürək – kürəyə,

Yarı üzü dağa, yarı dərəyə.
Utlə ibni Vakkas əl boyda bir daş
Ataraq, yaratdı səflərdə təlaş.
Daş dəyib Rəsulun qırdı dişini,
Bitmiş hesab etdi kafir işini.
Bu qəfil zərbədən Həzrət yıxıldı,
Ağrıdan ürəyi möhkəm sıxıldı.
Utbə qürrələnib özünü öydü,
Əlini fərəhlə döşünə döydü.
Bu zaman Abdullah ibni Kamiyə
İstədi nümunə olsun hamıya.
Soxuldu, heç kəsə vermədən aman,
Həzrətə özünü yetirdi haman.
Onun qarşısına atıldı Musab,
Fani dünya ilə bitdi haqq – hesab.
Getmədi Musabın həyatı bada,
Etdi Haqqa xatir canını fəda.
Başını xəncərə tuş etdi Musab,
Şəhadət meyini nuş etdi Musab.
Düşdü bərk çaxnaşma, qarışdı ara,
Aldı Peyğəmbərdə də üzündən yara.
Ağrı şiddət etdi, Həzrət bayıldı,
Dərhal bir şaiyə dağa yayıldı.
"Mühəmməd Uhudda öldü" dedilər,
"Başını Kamiyə böldü" dedilər.

Çatdı qulaqlara necə bu yalan,
Oldu əllərini yanına salan.
Oldu silahını yerə qoyan da,
Oldu tez – tələsik meyit soyan da.
Oldu yas saxlayıb ağı söyləyən,
Oldu çəpik çalıb şadlıq eyləyən.
Verdi Kamiyəyə neçəsi xələt,
Etdi neçəsini varlı bu qələt.
Parladı gözləri Əbu Sufyanın,
Düşündü: qövmünün alıbdır qanın.
Açıb kəmərinin qızıl toqqasın,
Belinə bağladı ibni Vakkasın.

Yoxdu heç bəd xəbər bu yalan kimi,
Sancmışdı Əlini o, ilan kimi.
Ağrı eyləyirdi içində şiddət,
Büruzə verirdi özünü hiddət.
Qoymadı qılıncı qınına Əli,
Tələsdi Həzrətin yanına Əli.
Car çəkdi: - Qalsam da meydanda tək mən,
Baxacam ölümün gözünə dik mən.
Əyilən deyiləm mən heç zalıma,
Əsla götürmərəm zülmü dalıma.
Mənim bir amalım, bir haqq yolum var,

Düşünən başım var, vuran qolum var.
Dəyişən deyiləm yolumu əsla,
Vermərəm zalıma əlimi əsla.
Qoy düşmən yerisin üstümə mənim,
Yansın alovuma, istimə mənim.
Deyildir kafirlər bunu bilməmiş,
Minini öldürrəm özüm ölməmiş.
Bütü "Allah" deyə etmərəm qəbul,
Olmadım, olmaram heykəllərə qul.
Var mənim bir yolum, üç inandığım,
İman gətirdiyim, uca sandığım.
Allahdır başımın üstündə duran,
Bələdçim – Peyğəmbər, çırağım – Quran.
Onlarla olmuşam hər zaman mənən,
O uca zirvədən deyiləm enən.
Çəkilən deyiləm Haqq nidasından,
Qorxmuram bu yolun qan – qadasından.
Qəbul eyləyirəm ölümü, qanı,
Şəhidlik adından uca ad hanı!!! –
Deyib, nərə çəkdi dərindən – dərin,
Səsindən titrədi təməli yerin.
Coşqun səsindəki ehtiraz, lərzə
Sığışan deyildi bu bölük Ərzə.
Düşmüşdü kainat bərk təlatümə,
Səsə Mədinədən qalxdı Fatimə.

Bu səs ürəyini qırdı bəndini,
Tez saldı üzünə o, rübəndini.
Atanın vayına gedirdi qızı,
Gözləri olmuşdur qandan qırmızı.
Ağrı ürəyini söküb didirdi,
Xanım göz yaşını töküb, gedirdi.
Saçını üzünə dağıtmışdı yel,
Tərləyib olmuşdu tükləri tel – tel.
Zərif ürəyinə çökən bu ağrı
Onu aparırdı Uhuda doğru.
İçində gəlmişdi dərdi cövlana,
Dərd onu qoymurdu dönə, tövlana.
Əymişdi dərd yükü onun belini,
Açmışdı bəd xəbər birdən dilini.
Ün çəkib Fatimə ağı deyirdi,
-Sındı asimanın tağı, - deyirdi.
Dözmürdü bu aha dağlar, düzənlər.
Qaralıb dönürdü külə süsənlər.
Yanıb əriyirdi səsə daşlar da,
Hüznə qərq olmuşdu göydə quşlar da.
Qıy çəkən qartallar susmuşdu, laldı,
Allah, bu nə ağır, dözülməz haldı?!
Bu, necə fəryaddı, bu necə ündü,
Bu, nə qorxunc zaman, nə müdhiş gündü?!
Matəm içindəydi aləm bu dəmdə,

Bu səs batırmışdı hamını qəmdə.
Gedirdi o, sağa, sola baxmadan,
Gedirdi o, yola, kola baxmadan.
Gedirdi Fatimə eninə yolu,
Gedirdi, yanına düşərək qolu.
Sürünüb gedirdi o, dizin – dizin,
Gedirdi, torpağa sürtərək üzün.
O, çatdı Uhuda, dörd yanı gəzdi,
Daşlar ayağını doğradı, əzdi.
Dolandı gözləri yaşlar içində,
Kəsilmiş bədənlər, başlar içində.
Peyğəmbər balası ün çəkə - çəkə
Endi gah dərəyə, qalxdı gah dikə.
Yoxdu Peyğəmbərdən bir xəbər verən,
Ölüb – qaldığını gözüylə görən.
Çıxdı bir qədər də xanım hündürə,
Gördü atasını o, birdən – birə.
Ah çəkib Fatimə səbir gətirdi,
Özünü birtəhər ona yetirdi.
Gördü ki, atası huşsuz uzanıb,
Olub cadar – cadar dodağı, yanıb.
Düşmüşdü meyitlər burda yan – yana,
Axıb qarışmışdı yerdə qan – qana.
Dəhşətə gətirdi onu bu lövhə,
Ün çəkib deyirdi Fatimə növhə.

Əks – səda verirdi ahı – fəğanı,
Gözündən axırdı qəlbinin qanı.
“Atam vay” deyərək o çəkdi nalə,
Mərhəmət dilədi Haqdan bu halə.
Peyğəmbər yavaşca gözünü açdı,

Sanki doğdu Günəş, şəfəqlər saçdı.
Susdu o, görəndə atasını sağ,
Əsdi sevincindən vücudu zağ – zağ.
Salavat deyərək zikr elədi o,
Diz çöküb, Allaha şükr elədi o,
Peyğəmbər qızının əlindən tutdu,
Başını köksünə sıxıb, ovutdu.
Üzünü söykədi onun üzünə,
Qız baxdı ataya, ata qızına.
Dedi:-Göz yaşını sil, əziz balam,
Sən ey qeyrət qalam, sən ey qız qalam!
Bu da bir sınaqdır, qəzov – qədərdir,
Belə çətinliklər gəldi – gedərdir.
Getməyir dünyanın heç işi həmvar,
Bir sevinc yolunda neçə min qəm var.
Bu çətin zamanda çəkilən cəfa
Verəcək bəşərə misilsiz səfa.
Səni bürüməsin əsla qəm – kədər,

Bil ki, getməyəcək qanımız hədər.
Dünya islam ilə olacaq abad,
Ədavət olacaq insanlığa yad.
Bu dinlə tapacaq dünya asayiş,
Dostluq, bərabərlik, birgəyaşayiş.
Açılır bu dinlə Haqqa doğru yol.
Bəşərin nicatı yalnız ondadır,
Ona da aparan yol Qurandadır.
Onu əvvəl – axır seçəcək hamı.
Gəlib bu körpüdən keçəcək hamı
Islam var olacaq dünya durduqca,
Beyin düşündükcə, ürək vurduqca.
Olsun bəşəriyyət sözümə əmin,
Birləşsin altında yaşıl ələmin!
O, kəsib sözünü göylərə baxdı,
Qızına buyurdu:-Yubatma vaxtı.
Bir az su tap gətir, tez ol yu qanı,
Təmizə çıxarar ancaq su qanı, -
Deyərək qolunu daşa dayadı,
Axan qan al rəngə daşı boyadı.

Özünü meydana vurmuşdu Əli,
Cəsəddən bir təpə qurmuşdu Əli.
Gəlirdi düşməni o, biçə - biçə,

Qureyşin arzusu dönürdü heçə.
Qılıncla özünə o, yol açırdı,
Dözməyib meydandan düşmən qaçırdı.
Valehdi Əliyə yer də, fələk də,
Övladi – bəşər də, cin də, mələk də.
Düşmən də çəkmirdi əl inadından,
Çıxmırdı Bədirin dərdi yadından.
Yumub gözlərini girmişdi oda,
Edirdi meydanda canını fəda.
Durum dəyişirdi burda anbaan,
Durmuşdu ölümlə olum yanbayan.
Gah bu, gah o tərəf qalib çıxırdı,
Məkkə gah basılır, gah da yıxırdı.
Qalib görünənlər bir qədər əvvəl,
Bir azdan qalırdı özü məəttəl.
Savaş meydanında qızdıqca vuruş,
Gətirə bilmirdi Mədinə duruş.
Əlindən gedirdi üstün mövqei,
Itirmək qorxusu vardı hər şeyi.
Qələbə düşmüşdü onlardan iraq,
Qureyşin əlində yanırdı çıraq.
Odur ki, asudə nəfəs dərirdi,
Qarşı tərəf isə itki verirdi.
Ötdü şəhidinin yaşı yetmişi,
Artıq olunurdu onun xətm işi.

Müsəlman ordusu gedirdi dala,
Qureyş batırırdı əlini bala.
Sözsüz Mədinəyə qalibdi Məkkə,
Yox idi zərrəcə yer burda şəkkə.
Bu vaxt Əbu Sufyan bərkdən çəkib car,
Dedi:-Əlimizə keçibdir açar
Öldürüb nəhayət biz Muhəmmədi,
Yerinə yetirdik verilən vədi.
Qalxdıq biz əlçatmaz zirvədən uca,
Davam etdiririk döyüşü bica.
Həzarat, dəyişin tez işin yönün,
Məsləhət edirəm Məkkəyə dönün.
Ikrimə eylədi ona etiraz:
-Sus, ey ağıl gödək, qaməti dıraz!1
Bəyan etmək ilə öz məramını
Heyrətə gətirdin sözlə hamını.
Qalib Mədinəyə bir qarış yolun.
Nə üçün seçirsən bu barış yolun?
Keçib Mədinənin boynuna ilgək.
Ip deyir, boş tutma, tez ol, məni çək.
Sənsə ağzımızdan alıb tikəni,
Sancdın yolumuza qara tikanı.
Axır qorxaqlığın verdi büruzə,
Bizi yük elədin sən bir xoruza.

[1] Uzun

Tənə etməsəydi elə mənə burda.
Tikəni edərdim dilindən xırda.
Əbu Sufyan onun kəsdi sözünü.
Söylədi:-Öyməyin bəsdi özünü.
Dilin çox uzanıb, başın qızıbdır.
Bu yolu səninçün atan cızıbdır.
Atan da felinin oldu qurbanı,
Vadar etmə açam qara torbanı.
Seçmisən yolunu sən Əbu Cəhlin.
Məgər tanımırsan Mədinə əhlin?
Bu başdan deyirəm: heç cür, heç vədə
Zəfər qazanmarıq biz Mədinədə.
Sınmayın Mədinə özün itirib,
Savaşı zəfərlə Məkkə bitirib.
Övs ilə Xəzrəcin coşsa hikkəsi.
Salamat qoymazlar bizdən heç kəsi
Qayıtsaq Məkkəyə məğlub qismində,
Qureyş qoymaz qala bir can cismində.
Bizim ətimizi qövmümüz didər.
Bu qədər əziyyət havayı gedər.
Sözümü düz yozun, düzgün anlayın.
Məni az məzəmmət edib danlayın.
Bizə hörmət – izzət bu halda nağddır,
Qayıdaq, hələ ki, üzümüz ağdır.
Geriyə dönməkdə məqsədim burdur,

Savaşın sonluğu məni qorxudur.
Olsa da qərarım çox gözlənilməz,
Mədinə məhv olar, bilin, yenilməz.
Qısa görünsə də Mədinəyə yol,
Qurbanlar istəyir bizdən o, bol – bol.
Bu yolun var neçə dağı, dərəsi,
Bizimçün bir səddir onun hərəsi.
Əngəldir bu yolun hər kolu, daşı,
Gəlin ağrıtmayaq ağrımaz başı,-
Deyə o, yəhərə sıxıb qıçını.
Ata var gücüylə vurdu qamçını.
Qureyş cəsədlərdən qurub bir taya,
Uhuddan qoşunu çəkdi Rəvhaya.

## *XƏNDƏK HƏRBİ*

Çoxdan gözləyirdi Mədinə bunu,
Salmadı bu xəbər heyrətə onu.
Töküb ayaq altda varidatını,
Buraxdı meydana o da atını.
Olsa da bu döyüş Uhudun ardı,
Üslublarda kəskin fərqləri vardı.
Şəhərdən çıxmağın tərəfdarı az
Oıduğundan, keçdi bundan hamı vaz.
Dinləyib diqqətlə Salman Farsini.

Seçdilər hücumun onlar tərsini.
Təklifə müqabil tədbir tökdülər,
Köhnə hasarları tamam sökdülər.
Şəhər qapıları olundu təmir,
Taxtanın yerinə asıldı dəmir.
Ciddi müdafiə səddi cızıldı,
Bu sərhəd boyunca xəndək qazıldı.
Hamı olunmuşdu hərbə səfərbər,
Bir səfdə durmuşdu arvad, uşaq, ər.
Ciddi bir intizam vardı daxildə,
Bir ələ baxırdı su da, taxıl da.

Bu xəndək qoymuşdu Qureyşi çaşbaş,
Ancaq peşmanlığın eyləmirdi faş.
Əzm ilə gəlmişdi bu gün savaşa,
Oxu toxunmuşdu ilk andan daşa.
Qureyşçün keçilməz səddi bu xəndək,
Sonuncu mənzildi, həddi bu xəndək.
Vermirdi qətiyyən cəhdləri fayda,
Baxırdı şəhərə durub o tayda.
Müttəfiq qoşunu göz döyə - döyə
Gendən boylanırdı dərin xəndəyə.
Şəhərin belinə dolanan kəmər
Müsəlman əhlinə verirdi səmər.

Ötdü dəqiqələr, ötdü saatlar,
Yorulub taqətdən düşdülər atlar.
Keçdi bu minvalla bir gün, iki gün,
Əsla tərpətmədi Mədinə tükün.
Öznü daha da o, tox saxladı,
Nə qorxub əsdi o, nə də laxladı.
Düşmən gözləmkdən daha bezirdi,
Qaçmağa bəhanə indi gəzirdi.
Səngimək bilməyən payız yağışı
Daha da çətinə salmışdı işi.
Qəzəblə gəlmişdi həmin il payız,
Gəlib gətirmişdi soyuq, sızhasız.
Onda Mədinədə il başqa ildi,
Sanki bura qızmar ölkə deyildi.
Yatırdı gecələr düşmən soyuqda,
Kimi daş dibində, kimi oyuqda.
Qırırdı hər gecə neçəsin sazaq,
Ancaq çatışmırdı yenə də ərzaq.
Qoşulub Qureyşə tamah ucundan
Gələnlər ölürdü burda acından.
Səbri adamların tükəndi, daşdı,
Dəydi bir – birinə hamı çaxnaşdı.
Etdi narazılıq əhli – Qatafan,
Qoşunun içində qalxdı bir tufan.
Dedilər: -Sizlərdən heç nə ummuruq,

Ancaq əzablara göz də yummuruq.
Bizlər öyrənmişik basıb – kəsməyə,
Dəyməz burda durub tir – tir əsməyə.
Qoşulub Qureyşə gəldik talana,
Sən demə uymuşuq biz ağ yalana.
Bizi nə düşünən, nə bir anan var,
Bu pis halımıza nə bir yanan var.
Bizə rəqib kəslər öz evindədir,
Hərə öz işində, öz keyfindədir.
Qalmışıq yağışda, daş dibində ac,
Ordasa düşməyir ocaq üstən sac.
Dayanıb gözləsək belə bir il də,
Eyləyə bilmərik nəticə əldə.
Həzarat, pozuruq sizinlə şərti,
Bizə qalmayıbdır Qureyşin dərdi.
Gedirik, Mədinə qoy qalsın sizə,
Qalın gendən onu siz süzə - süzə.
Atıldı irəli tez ibni Əhtab,
Qatafan əhlinə elədi xitab:
-Bura gəlmişsiniz mənim sözümlə,
Hər işi həll edin yenə özümlə.
Söyləyin, həzarat, Qureyş neyləsin,
Məgər o, görürdü bunun hiyləsin?
Buraya gəlməzdən axı heç mən də
Bilmirdim bizi nə gözləyir öndə.

Mən də sizin kimi çox narahatdım,
Axır ki, bu gecə asudə yatdım.
Deyim, qəlbinizi daha sıxmayın,
Verdiyniz vədə xilaf çıxmayın.
Mən dünən görüşüb ibni Əsədlə,
Gəldim yanınıza bir şirin vədlə.
Yalvarıb döndərdim Kəbi inaddan,
Etdim Mədinəni məhrum qanaddan.
Etsə də Kəb buna xeyli təəssüf,
Anddan üstün oldu milli təəssüb.
Bizim yolumuzu seçdi Kurayza,
Bizim cərgəmizə keçdi Kurayza.

Işdən hali oldu ibni Məsudi,
Onu coşdurmağa bir söz bəs idi.
Təzəcə qoşulub islam səfinə,
Tapmışdı o, ruhən zəngin dəfinə.
Hələ ki, bu sirri bilən yox idi,
Onun sevincini bölən yox idi.
Bilən də ki, ozub andı Kurzaya,
Gəldi Qatafanlı içində qeyzə.
Cavab vermək üçün hiyləyə, məkrə,
Çox yollar aradı gəlməzdən fikrə.
Gəlib Peyğəmbərə açdı ürəyin,

Rəsuli Əkrəmin aldı o, rəyin.
Qayıdıb o, dərhal işə girişdi,
Əvvəl Kuruzayla gedib görüşdü.
Dedi:-Bəd gətirir ilimiz ildən,
Salıb müharibə hamını dildən.
Burda gözləməkdən daha bezmişik,
Zəfər qazanmaqdan biz əl üzmüşük.
Mən sizə deyirəm sözün düzünü,
Düşünün durumun siz tərs üzünü.
Qureyş başınızı salıb bəlaya,
Qatıb sizləri çox qəliz olaya.
Etibar etməyin siz ona çox da,
Saxtadır andı da, işi də saxta.
Heç də xoşa gələn deyil halımız,
Ilan zəhərinə dönüb balımız.
Yaxşı keçməyəcək getsək, işiniz,
Həzarat, bu haqda dərin düşünüz.
Daşınmasın deyə sonra sözündən,
Deyin, girov versin Qureyş özündən.
Gəlib sizlə birgə nəfəs alsınlar,
Savaş qurtarınca burda qalsınlar.
Təklif Kurayzanın ağlına batdı,
Dərin yatmışları Nuaym oyatdı.
Salıb Kurayzanın qorxu canına,
O, Əbu Sufyanın gəldi yanına.

Dedi: -Sil gözünü, yurdu dağılmış,
Aşkar sandıqların, demə, nağılmış.
Gör gedib kimlərə əl uzatmısan,
Kimin laylasına uyub yatmısan?!
Tərsinə dolanıb indi çərxi pir,
Bu gün zuhur edir dünən olan sirr.
Inamım olmasa sözə yüz faiz,
Deməyi bilməzdim özümə caiz.
Bu sirri bir nəfər mənə açıbdır,
Qorxudan bu gecə yuxum qaçıbdır.
Didib içəridən qəlbimi şübhə,
Necə sağ çıxmışam bilmirəm, sübhə.
Özünü ələ al dinləməmişdən,
Qorxuram ki, çıxar ayrı iş işdən.
Bil ki, bulandırır Kurayza suyu,
Qazır ayağının altında quyu.
Verdiyi vədə o, dönük çıxıbdır,
Gedib Muhəmmədin əlin sıxıbdır.
Səni salmaq üçün bir tor toxuyub,
Dünən bu qərarı aşkar oxuyub.
Istəyir Qureyşdən girov götürə,
Verib Mədinəyə, rahat otura.
Məqsədə yetməkçün gəzir girəvə,
Məbadə olasan razı girova.
Söz Əbu Sufyanı əvvəl çaşdırdı,

Bir qədər keçməmiş onu çoşdurdu.
Söylədi xitabən müsahibinə:
-Baha başa gələr söz sahibinə.
Ancaq belə yerdə olmaz tələsmək,
Bütün əlaqəni biryolluq kəsmək.
Duruxub azacıq, gözünü döydü,
Sonra Kurayzanı bir ağız söydü.
Azca sakitləşdi, səsi yumşaldı,
Bir qədər süstləşdi, əli boşaldı.
Çəkib saqqalına yavaşca sığal,
-Cəzaya məhkumdur, - söylədi – cığal.
Tapşırdı təzədən bərk – bərk Nuayma,
-Bunu burda dedin, heç yerdə yayma.
Bu sözü sirr kimi gərək saxlayaq,
Bəni – Kurayzanı bir də yoxlayaq.
Bütün dediklərin gərək çözülə,
Lap üstdən başlayıb, çataq özülə.
Mən vacib bilərəm hələ susmağı,
Bəni – Kurayzanı gendən pusmağı.
Olsun hər şey onun təşəbbüsüylə,
Məkrinə müqabil quraq biz hiylə.
Cüzi bir işarə olsa girova,
Salarıq balıqtək onu tilova.
Xain gərək belə islah oluna, -
Deyib, o, boylandı Qoba yoluna.

Durmuşdu Mədinə hələ dağ kimi,
Burda qaynayırdı iş bulaq kimi,
Müntəzir durmuşdu əmrə ərənlər,
Gendən duyurdular bunu görənlər.
Igidlər çəkmişdi qılınca ovxar,
Yanırdı tiyələr havada par – par.
Burda hakim idi inam, coşğunluq,
O biri tərəfdə süstlük, çaşqınlıq.
Həzrət yer qazırdı dinclik bilmədən,
Alnından süzülən təri silmədən.
Son dəfə yoxlayıb səfləri tək – tək,
Verdi camaata o, ürək – dirək.
Söylədi, edərək əshabı təskin:
-Tezliklə olaraq Məkkədə məskun.
Bu səfər Qureyşin son yürüşüdür,
Odur gah qızdırır, gah da üşüdür.
Qalmayıb inamı daha özünə,
Titrətmə gəlibdir onun dizinə.
Bu hərb dəyişəcək aləmi fövri,
Çatacaq islamın tərəqqi dövrü.
Uğurlu görürəm işin son anın,
Şübhə eyləməyin, mənə inanın.
Kisranın ağ qəsri, Şamda saraylar,

Açıb qapısını bizi haraylar.
Islam dost edəcək bizi farsa da,
Önündə keçilməz dağlar dursa da.
Elçimiz gedəcək burdan Hində də,
Bərqərar olacaq islam Çində də.
Yetəcək səsimiz Nil çayına da,
Sonsuz dəryaların o tayına da.
Durar, uzaq çəkməz, hər bir turanlı
Bir bayraq altında əli Quranlı.
Təşəkkül tapsa da din burda gərçi,
Türklər olacaqlar islama carçı.
Islam məntiqinə qüdrəti türkün
Söykənib, fəth edər dünyanı bir gün.
Onların dövranı sürər çox uzun,
Səadət bürüyər bütün Yer üzün.

Qureyş olmuş idi Kurayzaya yad,
Arada yox idi hörmət, etimad.
Kurayza özünə xas olan dəblə
Iddia qaldırdı ciddi tələblə.
Aldı əvəzində belə bəyənat:
-Etməklə bu yerdə anda xəyanət,
Bizə gor qazıbdır Bəni – Kurayza,
Alar təqsirinə müqabil cəza.

Hiyləyə, məkrədir meyliniz zatən,
Olmayıb işiniz heç vaxt sözə tən.
Qol qoya bilmərik əsla girova,
Çıxmaz tülkü ilə heç də şir ova.
Yaxşı ki, bu birlik uzun sürmədi,
Qurd bizə lağ edib, çaqqal hürmədi.
Qureyş Kurayzaya bel bağlayaraq,
Bu gün göstəribdir hucuma maraq.
Vermək istəmirdik biz buna qərar,
Ancaq israr etdi savaşa Dirar.
Gətirdi yenə də hucumumuz bəd,
Bu gün öldürüldü ibni Əbdivəd.
Əlinin əliylə o, yetdi qətlə,
Daim anılacaq o, məhəbbətlə.
Getdi o, dönərək bir əsatirə,
Qaldı ondan bizə şirin xatirə.
Savaş gətirmədi bizə heç uğur,
Baxanda düşmənə bizi hirs boğur.
Qırılır acından gündə neçəmiz,
Ildən uzun çəkir burda gecəmiz.
Fələk tərsə sayır Qureyş sayını,
Qazancsız yemişik bütün mayanı.
Illərlə dursaq da belə döş – döşə,
Ehtimal görmürük burda uduşa.
Qərara almışıq, daha gedirik,

Sabah bu yerləri biz tərk edirik.
Ancaq biz qoymarıq sizdə qisası,
Qureyşin var buna haqqı, əsası.
Bütün işinizi eyləyərik faş,
Qalmaz yurdunuzda daşın üstdə daş.
Olsa da bizimçün eyib, gedərik,
Kurayza satqındır deyib, gedərik.
Yağlı dilinizə qatsanız bal da,
Qala bilməzsiniz burda bu halda.
Qalmaz, bilirik ki, yerdə xəyanət,
Qonşuya xəyanət, yurda xəyanət!

Yoxdu Mədinədə o gecə yatan,
Sayıq dayanmışdı əli ox tutan.
Qureyş qoşununu çəkib gedirdi,
Düşərək taqətdən çöküb gedirdi.
Talana gəlmişdi ağır köç ilə,
Dönürdü Məkkəyə indi heç ilə.
Qureyşdən fələk də qisas çıxırdı,
Külək qayaları vurub yıxırdı.
Gövdəli ağaclar qopurdu kökdən,
Lil sular axırdı dərədən, dikdən.
Dağlardan əsdikcə külək düzlərə,
Çırpırdı tikantək qumu üzlərə.

Soyuq sifətləri qum dalayırdı,
Sazaq qorsalayır, yel yalayırdı.
Bu halət Allahdan gələn iş idi,
Bu gediş Qureyşçün son gediş idi.
Beləcə Qureyşin burnu ovuldu,
Dalınca Kurayza burdan qovuldu.
Etdi niyyətini alt – üst son şuluq,
Sərhəddən kənarda qaldı qonşuluq.
Qərar olduğundan haqla həmahəng,
Verən tapılmırdı ona ayrı rəng.
Bu nə soyqırımı, nə də soyğundu,
Cəza cinayətə tamam uyğundu.
Sonluq söykənirdi "Əhdi Qədimə"
Bunu vəd edirdi o müqəddimə.

## *XEYBƏR QALASININ FƏTHİ*

Yox idi cənubdan daha təhlükə,
Burda qalmamışdı daha bir ləkə.
Vurub Mədinəni birbəbir dişə,
Girmişdi onunla hamı sazişə.
Şimalda böyükdü hərbə ehmal,
Buna yəhudilər vururdular xal.
Çəksə də fikrinin üstünə pərdə,
Hazırlıq gedirdi hər gün Xeybərdə.

Coşurdu içində Xeybər qalası,
Bu hiylə yuvası, bu qan çalası.
Yəsir bu icmaya başçı olandan,
Hər gün söz düşürdü hərbdən, talandan.
Səllam eyləsə də bir az ehtiyat,
Xələfi bu işdə çıxartmışdı ad.
Vurub dağa – daşa özünü Yəsir,
Qoymaq istəmirdi işdə kəm – kəsir.
Xeybərdə qatdıqdan sonra aranı,
Qaldırdı ayağa Vadil Kuranı.
Belini bağlayıb Vadil Kuraya,
Qoymadı sakitlik çökə araya.
Gəldi Yəsir ordan dərhal Teymana,
Burda nail oldu əhdi – peymana
Fikir də köhnəydi, əməl də köhnə,
Qobadan köçmüşdü Xeybərə səhnə.
Ibni Əhtab kimi cəhd edib Yəsir,
Hamını etmişdi fikrinə əsir.
Qobadan irs qalan iş də, amal da,
Cərəyan edirdi indi şimalda.

Artıq Mədinədə labüddü cihad,
Tələb eyləyirdi bu sayaq nihad.[1]

---

[1] Yaranış, zat, təbiət

Gözləmək olmazdı günlər ötüşə,
Düşmən bu yerlərə gəlib yetişə.
Kəsmək lazım idi önünü selin,
Əzmi, cəsarəti, gücüylə elin.
Edib imanını işinə şahid,
Çıxdı öz evindən neçə mücahid.
Bir gündə cəm oldu qoşun bir yerə
Yerimək qət oldu burdan Xeybərə.
Atların nalına sarıyıb keçə,
Qoşun Mədinədən çıxdı bir gecə.
Yeridi durmadan yolda bir kərə,
Üç gün tamamında çatdı Xeybərə.
Zülmət gecə idi, hamı yatmışdı,
Bir bürcdə keşikçi tonqal çatmışdı.
Peyğəmbər:-Nallardan açın keçəni,
Bir təhər ötürün burda gecəni.
Vurmayın Xeybərə zərbəni qəfil,
Yağılar içində var neçə tifil.
Allah hifz eyləyir hər bir yatanı,
Sevməyir o, bala zəhər qatanı.
Qıysaq, aralıqda itəcək hesab,
Çəkməli olarıq özümüz əzab,-
Deyərək tez düşdü dəvədən yerə,
Hamını mat qoydu həmən mənzərə.
Sonra əl götürdü o, Yerdən Göyə,

-Sənsən pənahımız, ya Allah, - deyə.
-Sağlam düşüncəyə ram eylə zoru,
Keçsin öz başına düşmənin toru.
Bizi bu qalanın hifz et şərindən,-
Deyib, köks ötürdü Həzrət dərindən.

Var idi Xeybərdə düz yeddi qala,
Yeddi şər yuvası, yeddi dərd – bala.
Hazır dayanırdı savaşa daim
Iki güclü qala – Kamusla Naim.[1]
Qaladan çıxanda tezdən camaat
Gördü ki, dayanıb xeyli dəvə, at.
Müntəzir durublar cəngə ərənlər.
Geriyə döndülər bunu görənlər.
Həyəcan təbili dərhal çalındı,
Bütün vasitələr işə salındı.
Elə bil bənd idi hamı bir himə,
Hər yandan başlandı yol Sülalimə.[2]
Adamlar sel kimi bura axışdı,
Sanki qüvvələrə bu bir baxışdı.
Xeyli danışdılar ardan, namusdan,
Dedilər:-Qadınlar çıxsın Kamusdan.
Şiqdə yer verilsin qıza, gəlinə,

[1] Qala adı
[2] Qala adı

Kişilər götürsün silah əlinə.
Durum bu yerlərdə olsa qarışıq,
Qalsın təhlükədən uzaq barışıq.

Naim qalasından başlandı dava,
Çıxmışdı qonşular sübh tezdən ova.
Düşmən qoruyurdu qalanı yaxşı,
Hələ gətirirdi onun naxışı.
Oldu növbə ilə qoşuna rəhbər
Bir gün Əbu Bəkr, bir gün də Ömər.
Keçsə də o əldən bayraq bu ələ,
Hasil olmayırdı nəticə hələ.
Üzürdü hamını yorğun baxışlar,
Keçilməz divarlar, ensiz yoxuşlar.
Axşam Həzrət dedi:-Eyləməyin qəm,
Naimdə qalxacaq sabah bu ələm.
Onu götürəcək sabah digəri,
Mənim sadiq dostum Allah nökəri.
O, gedib hər işə əncam çəkəcək,
Uçuq evcik kimi Naim çökəcək.
Peyğəmbərin sözü xofu götürdü,
Qəlblərə ruh verdi, inam gətirdi.
Baxışlar nikbindi, dillər dualı,
Özünə verirdi hamı sualı:

-Kimdir Peyğəmbərin dediyi görən,
Kimdir o bəxtəvər, o xoşbəxt ərən?
Qoyub şübhələrə Peyğəmbər nöqtə,
Dedi:-Zaman bunu eyləyir diqtə.
Tez olun, Əlini bura çağırın,
Tapşıraq biz ona işin ağırın.

Qızdırma içində Əli bişirdi,
Gözünü aramsız ağrı deşirdi.
Başının altına qoyub bir qolun,
Uzanıb qalmışdı dibində kolun.
Sərmişdi üzünə ipək dəsmalı,
Özündə deyildi qətiyyən halı.
Yetirdi xəbəri Əliyə Bilal,
Dedi:-Şahid olsun sözümə hilal.
Bu söz mənim deyil, Peyğəmbərindir,
Iman zamanıdır, yer – hünərindir.
Gəlib Peyğəmbərin çağırışına,
Qoydu əllərini Əli döşünə.
Dedi:-Hər əmrinə mən müntəzirəm,
Doğulduğum gündən Haqqa nəzirəm.
Buyur, ya Peyğəmbər, qulluğun nədir,
Ibni Əbu Talib qulluğundadır.
Peyğəmbər Əlini basıb bağrına,

Söylədi:-Ya Əli, sən nə, ağrı nə?!
Qoy o gözlərinə toxunsun əlim,
Yox olsun ağrısı qoy ilim – ilim,-
Deyə sığalladı onun gözünü,
Götürdü ocağın sanki közünü.
Ömrü qurtarınca Əli, doğrudan,
Şikayət etmədi gözdə ağrıdan.

Səhəri götürüb Əli ox – kaman,
Kəhərin belinə sıçradı haman.
Oturdu "bismillah" deyərək Əli,
Belini azacıq əyərək Əli.
Oturdu vüqarla atın belində,
Açdı zirehinin qatın belində.
Gərnəşdi, elə bil o, qızmış nərdi,
Allaha həmd edib, köksünü dərdi.
Dəmir qolçaqları qoluna taxdı,
Dedi:-Yetişibdir döyüşün vaxtı.
Yeridi Peyğəmbər tez irəliyə,
Uzatdı bayrağı yerdən Əliyə.
-Get, - dedi – bir Allah sənə yar olsun,
Onun sayəsində düşmən xar olsun.
Getdiyin yol bəlli, məqsəd bəllidir,
Vacibi bu işin düzgün həllidir.

Çalış, əmi oğlu, sən elə et ki,
Olsun mümkün qədər burda az itki.
Cəhd etmə qalaya girməyə sən tək,
Bil, qapı ağzında qazıblar xəndək.
Olmaz kömək edən oraya düşsən,
Açarsan əlinlə başına iş sən.

Əli at belində, ələm əlində,
Gedirdi, Allahın adı dilində.
Gediridi savaşa Allah naminə,
Əcəl buraxmışdı onu zaminə.
Onun nəfinəydi iş də, zaman da,
Allah saxlayırdı onu amanda.
Süzüb qalaları o bircə - bircə,
Saldı nəzərini sağdakı bürcə.
Dedi:-Qoy sınayım burda gücümü,
Başlayım qalaya burdan hucumu.
Ayırım gövdədən sağ budağını,
Axırda köksünün vurum dağını.
Sonra bir qıy çəkdi bərkdən ələmdar,
Yandı başı üstdə qılıncı par – par.
Atın cilovunu əlindən atdı,
Əyilib köhlənin belinə yatdı.
Bir əlində ələm, birində xəncər,

Gedirdi döyüşə bu ər oğlu ər.
Düşmən tez özünü qalaya soxdu,
Çoldə bir nəfər də yəhudi yoxdu.
Hündür divarların girib dalına.
Düşmən düşünməzdi Xeybər alına.
Yox idi başını çıxaran çölə,
Göydən daş düşmüşdü elə bil gölə.
Hərdən ox ataraq qala bürcündən,
Çıxırdı bu sayaq düşmən borcundan.
Müsəlman ordusu çatıb divara,
Içəri girməyə gəzirdi çara.
Nə qılınc yarardı daşı, nə əmud,
Yerdə bir Əliyə qalmışdı ümid.
Əli dörd tərəfi gəzib yoxladı,
Qayıdıb meydana, atı saxladı.
Gördü bir qapı var qalaya küncdən,
Dirəyi poladdan, layları tuncdan.
Oldu ələmdara gün kimi aşkar,
Bihudə dayanıb burda bu leşgər.
Qalaya yol tapmaq olmasa mümkün,
Qoşun qayıdacaq geriyə qəmgin.
Həmdü – səna edib Əli Allaha,
Qaldırdı atını meydanda şahə.
Əl atdı qapının gəldi bir layı,
Xəndəyin üstünə düşdü bir tayı.

Salındı qalaya qapıdan bərə,
Müsəlman qoşunu girdi Xeybərə.

Etmişdi əlində qapını qalxan,
Heyrandı Əliyə kənardan baxan.
Vardı görkəmində əzəmət, vüqar,
Duruşu etmişdi düşmənləri xar.
Işə düşməmişdi hələ ki, qılınc,
Dadına yetirdi əlindəki tunc.
Atmayıb əlindən yerə qalxanı,
Vurub yatırırdı yerə, qalxanı.
Qoymurdu düşməni o qol açmağa,
Düşmən tapmayırdı bir yol qaçmağa.
Əli kimliyini sübut edirdi,
Qalalar birbəbir süqut edirdi.
Artıq çökmüş idi dizə beş qala,
Ancaq vuruşurdu hələ baş qala.
Axıb qüvvələrin bura hamısı,
Güclə qoruyurdu hələ Kamusu.

Çıxdı at belində qaladan biri,
Qolları giv kimi, gövdəsi iri.
Dili zəhər kimi, üzü turşməcaz,

Çıxdı söyləyərək ucadan rəcəz:
-Tanı, ey pəhlivan, məni, Mərhabam,
Mənə təlim verib hünərvər babam.
Dəyərəm döyüşdə min cəngavərə,
Hələ toxunmayıb kürəyim yerə.
Acizdir qarşımda şir də, pələng də,
Əmin olacaqsan sözümə cəngdə.
Yoxdur, hamı bilir, dünyada mislim
Kimsəyə etmərəm Kamusu təslim,-
Deyə sinəsinə döyüb, öskürdü,
Ağzından od yağdı, alov püskürdü.
Əli tənə etdi belə Mərhaba:
-Səni zənn etmirdim belə, mərhəba.
Görürəm, özündən yaman razısan,
Özün iddiaçı, özün qazısan.
Vacib olmasaydı tanınmaq sənə,
Qətiyyən vurmazdım səninlə çənə.
Bəni – Haşimiyəm, tanı, Heydərəm,
Allah aslanıyam, ər oğlu ərəm.
Aləmə bəllidir hər hekayətim,
Haqqa vurğunluqum, Haqqa taətim,-
Deyərək şığıdı, sanki qartaldı,
Qaldırıb qolunu bir dəfə çaldı.
Gətirə bilməyib bu zərbəyə tab,
Aşıb qucaqladı torpağı Mərhab.

Savaş növbəsində indi Yəsirdi,
Dili söz tutmurdu, dizi əsirdi.
Meydana girməyə tapmadı imkan,
Etdi Əli onun köksünü şan – şan.
Bir qədər keçməmiş Xeybər Fatehi
Gedib təkbaşına aldı Vatihi.[1]

Xeybər peşman idi, Xeybər çökmüşdü,
Bu külü başına özü tökmüşdü.
Indi Mədinədən sülh diləyirdi,
Elçisi gəlmişdi, boyun əyirdi.
Sürərək irəli elçi ciddi şərt,
Söylədi:-Olsa da nəticəsi sərt,
Olun əmlakına Xeybərin şərik,
Bizi yurdumuzdan salmayın perik.
Dil töküb, yalvarıb, çox ciddi səylə
Etdi Mədinəni qane bu rəylə.
Hərbsiz imza etdi sülhə Fədək də,
Bu durum saxladı Qureyşi şəkdə.

[1] Qala adı

## *HÜDEYBİYYƏ SÜLHÜ*

Səfər tədarükü dərhal başlandı.
Nəzərlər Məkkəyə burdan tuşlandı.
Qurbanlıq ən yaxşı mallar seçildi.
Hamının əyninə ehram biçildi.
O gecə sübhəcən yatmadı Əsma.
Yuyunub, saçına qoydu o, basma.
Karvan hazır oldu, gəlib son anda
Qarışdı onlara qoca çoban da.
Qoşulub, nəhayət, zümrə zümrəyə,
Məkkəyə gedirdi dəstə ümrəyə.
Səfə düzülmüşdü at, dəvə, qatır,
Karvanın başında gedirdi şatır.
Sayı zəvvarların minə yaxındı,
Bu səfər Kəbəyə dinc bir axındı.
Tayfası müxtəlif, yaşı müxtəlif,
Neçəsi nun qədli, neçəsi əlif
Gedirdi Kəbəyi – Müəzzəməyə,
Allahın şəninə təqdis deməyə.
Karvan tərpənəndə Ümmü Sələmə
Çoşğun bir fərəhlə baxdı aləmə.
Öpüb bayrağı o, bağrına basdı,
Sonra kəcavənin üstündən asdı.

Zəvvarlər Ridvanda saldı düşərgə,
Dikəldi çadırlar cərgəbəcərgə.
Nə ki, varlı vardı Şamda Hicazda,
Məkkəyə gəlmişdi o ilki yazda.
Xəbəri gətirdi Osman buraya,
Elə bil duz səpdi açıq yaraya.
Bu xələr Qureyşin keyfini pozdu,
O, min fikrə düşdü, min yerə yozdu.
Karvanın olsa da məqsədi bəlli,
Qureyşə vermirdi bu heç təsəlli.
Düzdür, bitərəflər olsa da içdə,
Çoxluq verməyirdi razılıq heç də.
Odur ki, cəm oldu yenə başçılar,
Gəldilər sonda bir yönə başçılar.
Dedilər: Mühəmməd qoy olsun əmin,
Taparıq yenə də biz onun çəmin.
Hazırıq hamımız burda ölməyə,
Qoymarıq Kəbəni iki bölməyə.
Baxmarıq biz indi ay hansı aydır,
Girərik, bilmərik çay hansı çaydır.
Azdırmaz bu yoldan bizi Zilqədə, -
Deyə birləşdilər vahid həlqədə.

Bezikdi zəvvarlar qarşıdurmadan,
Üç gün gözlədilər mürgü vurmadan.

Hələ ki, elçidən xəbər yox idi,
Hələ şux durmuşdu Qureyş, tox idi.
Məkkə başçıları düşünüb xeyli,
Elçi göndərdilər bir gün Süheyli.
Qureyşin adından gələn bu vəkil
Verdi bu duruma ayrı bir şəkil.
Dedi: - Mövqeyindən Qureyş büdrəsə,
El ona lağ edər verib səs – səsə.
Bilmək istəsəniz sözün düzünü,
O da hifz eyləyir öz nüfuzunu.
Olsada Qureyşə fikriniz bəlli,
Vaxt tələb eləyir durumun həlli.
Bir deyil, bu işin iki üzü var,
Qureyşin bu haqda fərqli sözü var.
Durum çözülməsə burda dəxi tam,
Verməz öz sözünə Qureyş də xitam.
Güzəştə getməsək biz əlli - əlli,
Qansız keçməyəcək bu işin həlli.
Gəlmişəm sizinlə bir dil tapmağa,
Sülh əldə eləyib, saziş yapmağa.
Arada anlaşma olmasa, gərək
Sizinlə biz burda savaşa girək.

Iki gün uzandı müzakirələr,
Çözüldü hər adi söz birər – birər.

Mədinə tutaraq durumun dəmin,
Bir az ehtiyatla atdı qədəmin.
Nəhayət, çevrildi bir gün söz işə,
Döndü Peyğəmbərin  meyli sazişə.
Tərəflər bu sülhə tamam hazırdı,
Şərtləri kağıza Əli yazırdı.
Olsa da Ömərin mövqeyi kəskin,
Dedi Əbu Bəkir:-Etmə əbəs kin.
Peyğəmbər hər işi yaxşı biləndir.
O, qan tökən deyil, qanı siləndir.
Saziş toxunsa da sənin təbinə,
Zidd iş tutmaq olmaz elin dəbinə.
Dərs oldu bu mərdin sözü o mərdə,
Düşünüb, razılıq verdi Ömər də.
Bir sülh imzalandı Hüdeybiyyədə,
Zəka qalib gəldi qanlı niyyətə.
Mədinə dərk etdi bir şeyi qəti,
Baş tutan deyildir bu ziyarəti.
Ümrədən çıxsa da bu il tam əli,
Qoyuldu növbəti həccin təməli.
Siyasi baxımdan bu ilk uğurdu,
Ondan xoş sabaha ümid doğurdu.
Bu sülh Mədinənin qələbəsiydi,
Aldı təşəbbüsü ələ, bəsiydi.

Səsləyib xalqları sülhə, barışa,
Islam hər tərəfə atırdı rişə.
Hər yanda hörmətlə o, sayılırdı,
Ev – ev, bölgə - bölgə o, yayılırdı.
Seçilib səmavi dinlər içində,
Bərqərar olurdu minlər içində.
Tablaşıb zamanın hər sınağına,
Nurlu yol açırdı behişt bağına.
O, nə bir qövm üçün, nə şər üçündü,
O, hidayət üçün, bəşər üçündü.
Etmişdi islamı daha da kamil
O biri dinlərdən fərqli bu amil.
Hələ heç ölkədə yoxdu bu dindən,
Hələ xəbərsizlər çoxdu bu dindən.
Məcburən sığmışdı dar bir məkana,
Ehtiyac var idi cüzi təkana.
Hələ ki, Mədinə bu yolda təkdi,
Dünyanı xəbərdar etmək gərəkdi.
Artıq bunun üçün zaman çatmışdı,
Özünü bu işə Həzrət qatmışdı.
Gətirdi elçisi təklif Yəmənə,
Dedi:-Gəlin haqqa, dinə, imana.
Islam sülh üçündür, barış üçündür,
Hidayət yolunda yarış üçündür.

Dalınca xəbərdar eylədi Şamı,
Dedi:-Qəbul edin dini – islamı.
Silin küdurəti, kini biryolluq,
Gəlsin evinizə əmniyyət, bolluq.
Hələ yetişməmiş bir ay tamama,
Aldı Peyğəmbərdən dəvət Yəmamə.
Aldı Bəhreyn də, aldı Oman da,
Rəsuli Əkrəmdən təklif o anda.
Aşıb zaman – zaman islam dağları,
Sözlə fəth edirdi çox uzaqları.
O, hansı məkana ayaq açırdı,
Orda iman nuru şəfəq saçırdı.
Yerini verirdi haram halala,
Haram çəkilirdi süfrədən dala.

## *MUTƏ VƏ ZATUS – SƏLASİL HƏRBLƏRİ*

Səkkiz il keçirdi hicrətdən bəri,
Çox möhkəm sıxırdı vaxt Peyğəmbəri.
Gəlib yetişəndə Cümədəl – ula1
Düşdü Mədinədən on elçi yola.
Hələ heç çatmamış onlar Busraya,
Məsihlər saldılar nifaq araya.

[1] Cümədəl-üla-hicri-qəməri aylarının 5-cisidir.

Dedilər, dəstəni qırıb Mutədə:
-Sizə də deyilik mail, bütə də.
Nə bu din lazımdır bizə, nə bu dəb,
Nə belə ibadət, nə belə ədəb.
Belimiz bağlıdır böyük Bizansa,
Kəsərik, hansı əl bura uzansa.

Xəbər Mədinəni möhkəm laxlatdı.
Hamı əlini tez silaha atdı.
Durumu Mədinə çözdü bir həftə,
Durdu üç min nəfər bir gündə səfdə.
Çıxdı Mədinədən üç minlik ordu,
-Zorun, -söyləyərək, cavabı zordu.
Yeritdi Bizans da yüz minlik qoşun,
Romadan verildi əmri vuruşun.
Qüvvələr olsa da tərs mütənasib,
Olmadı qələbə heç kimə nəsib.
Qoyaraq düşməni itkiyə məruz,
Mədinə göstərdi gücünü bariz.
Olsa da Cəfərin qolları qələm,
Düşmədi torpağa o yaşıl ələm.
Onu öz dişində gəzdirdi Cəfər,
Qoymadı toxuna ona bir nəfər.

Mutədə olmamış nəticə hasil,
Gəlmişdi gündəmə Zatus – Səlasil.
Indi Mədinəni sayırdı zəif,
Bir yandan Qatafan, bir yandan Taif.
Görəndə bi təhər Məkkə durumu,
Dəyişdi onun da fikri, qırımı.
Çəkib sülh şərtinə gizlində bir cız,
Tutdu bir əlində o, iki qarpız.
Özünə xas olan fəndlə, fikirlə
Ittifaq yaratdı Bəni – Bəkirlə.
Hazırlıq görürdü çox açıq – saçıq,
Qəsdən Mədinəyə verirdi acıq.
Düşmüşdü fikrindən əks tərəf duyuq,
Ilığın yerinə gəlmişdi soyuq.
Mədinə çox dedi, Məkkə az qandı,
Qoydu müsəlmanlar bir yerə andı.
Qoymayıb durumu onlar bu halda,
Çaldılar sazişin kökünə balta.
Yaratdı bu halət Məkkədə bir xof,
Elə bil çaxmaqdan od almışdı qov.
Vəziyyət dərindən burda cözüldü,
Qureyşin hər işdən əli üzüldü.
Ikrimə söylədi: -İşimiz yaşdır,
Sən get, Əbu Sufyan, onları çaşdır.

Iş Əbu Sufyana gəldi çox çətin,
Bir az da turşutdu o, turş sifətin.
Söylədi: -Mən bunu edə bilmərəm,
Heç vaxt Mədinəyə gedə bilmərəm.
Mən verə bilmərəm ələ yaxamı,
Cırıb çıxararlar orda çuxamı.
Bəsdir qoydun məni sən it yerinə,
Barı sən də yara işin birinə.
Çatlasın, İkrimə, atanın goru,
Qətiyyən qalmırsan atandan geri.
Verər öz nəslini büruzə tülkü,
Tamam dəyişsə də rütbəsi, silki.
Yüz il bir qəfəsdə şirlə qalası
Olsa da, şir olmaz tülkü balası!
Batdı İkrimiyə bu söz nizətək,
Batdı o, durduğu yerdə dizədək.
Hirsindən gözləri onun bərəldi,
Dünya gözlərində tamam qaraldı.
-Baha başa gələr sənə cəhəlin,-
Deyərək apardı qılınca əlin.
Çıxartdı qınından dərhal qılıncı,
Doldu rəqibinin qarnına sancı.
Ikrimə bir addım atıb duruxdu,
Çünki bundan başqa bir yolu yoxdu.
Qaldıra bilməzdi üstünə eli,

Qayıtdı təzədən üstünə əli.
Qorxdu yanaşmağa ota köz ilə,
Verdi cavabını sözün söz ilə.
Dedi: -Bəsdir, yaman sarsaqlayırsan,
Özünü nə vaxtdan aslan sayırsan?
Seçməyə nə var ki, şirdən çaqqalı,
Ona şir görkəmi verməz saqqalı!
Çaqqal şir yerişi yeriyə bilməz,
Şir kürkü geysə də, sürüyə bilməz.
Yaman uzadırsan hər yetənə dil,
Tanı öz haqqını, öz yerini bil.
Danışma mənimlə bu qədər qaba,
Azı iki dişli olur, bil, yaba.
Olsaydı əgər ki, ayrı bir zaman,
O murdar dərinə təpərəm saman.
Qalsın hesabımız bir özgə vaxta,
Onda dik başına vuraram noxta.
Bu çətin zamanda sən gəl olma kəc,
Versən bu fürsəti, olar sonda gec.
Orda soysalar da dərini sərpa,
Mütləq etməliyik sazişi bərpa.
Biz vaxt qazanmağa gərək çalışaq,
Olmaz ki, hər oda dərhal alışaq.
Tez get, Mədinəyə bir yağlı dil tök,
Əyil iş xətrinə, lap diz üstə çök.

Inandır bu işə sən Mədinəni,
De ki, andı kəssin anddan dönəni.
Çalış vaxt qazanaq nəfəs dərməyə,
Bükməsin Mədinə bizi dürməyə.
Onların Məkkəyə son gəlişləri
Tərsinə döndərib bütün işləri.
Bugünkü vəziyyət əyandır sana,
Çalışıb xatanı dayandırsana.
Çoxdur rəğbət edən onlara, əvət,
Hamısı gözləyir quruca dəvət.
Indi Məkkə əhli bənddir bir oda,
Gərək görünməsin onlar burada.

Ikrimə tapşırıq verib qasidə,
Oturdu Məkkədə özü asudə.
Elçi Mədinəni gəzib dolandı,
Yandı öz içində, oda qalandı.
Ancaq baş tutmadı bu hiylə, bu fənd,
Bağlandı üzünə Mədinədə bənd.
Elçi yol göstərdi, Mədinə təmkin,
Sazişin bərpası olmadı mümkün.
Əvvəldən məlumdu elçiyə sonluq,
Bilirdi iş deyil indi tək onluq.
Xilaf çıxdığından Məkkə vədinə,
“Yox” deyib durmuşdu bu gün Mədinə.

Əhli – Mədinənin bu sərt mövqeyi
Alt – üst eyləmişdi indi hər şeyi.
Elçi bir kimsədən görmədi ülfət,
Etmədi bu səfər heç yaxşılıq vəd.
Ona üz vermədi qızı Həbibə,
Bilmirdi üz tutsun hansı təbibə.
Uğursuz səfəri indi elçinin
Küləyə Məkkənin verdi əlçimin.
Ona biçməsə də Mədinə hədə,
Əminlik yox idi möhkəm sülhə də.

## *MƏKKƏNİN FƏTHİNDƏN SONRAKI DURUM*

Məkkə fəth olundu, hər işdən əvvəl
Kəbənin içində gəzdirdilər əl.
Çıxıb Peyğəmbərin çiyninə Əli,
Ayaqlar altına atdı Hübəli.
-Yoxdur Haqq yanında yeri batilin, -
Deyərək üstünə çıxdı kətilin.
Saldı şəkilləri yerə divardan,
Dedi: - Yoxluqları yaxşıdır vardan.
Süzüb heykəlləri iti baxışla,
Söylədi: - Qövmümü, Allah, bağışla.
Sənə asi olub, gör bilə - bilə
Nəyə səcdə edib cahil qəbilə?!

Düz on beş gündü ki, Qureyş şad idi,
Əvvəlki əməllər ona yad idi.
Hamı qovuşmuşdu hər səadətə,
Yoxdu ürəklərdə yer pis adətə.
Azanla oyanıb – yatırdı Məkkə,
Səadət içində batırdı Məkkə.
Tapdı hər ailə, hər ev əmniyyət,
Həm əməl gözəldi burda, həm niyyət.
Dünyadan böyükdü qəlblərdə fərəh,
Çəkmirdi heç işçün heç bir nəfər ah.
Qurdla dolanırdı quzu mehriban,
Heç lazım deyildi sürüyə çoban.
On beş gün dinc keçən vaxtın əvəzin,
Hərb ilə Məkkədən çıxdı Həvazin.1
Tayfanın başçısı Malik ibni Övf
Yaratdı qövmünün içində bir xof.
Yeridi ordusu dərhal Hüneynə,
Dedilər: - Qoymarıq bar verə meynə.
Kəsərik kökünü bizə çatmamış,
Aşıb bu dağları düzə çatmamış.
Bu iyirmi minlik qoşuna nisbət
On minlə getməyi Məkkə etdi qət.

[1] Məkkə yaxınlığında yaşayan tayfadır.

Əvvəlcə Həvazin gəlsə də üstün,
Səbr ilə alındı qabağı qəsdin.
Məkkə düşmənini batırıb yasa,
Qovdu yetişincə ta ki, Evtasa[1]
Apardı kükrəyən sel Həvazini,
Sürtərək torpağa, daşa dizini.
Məkkə düşmənindən aldı təzminat,
Aldı qırx min qoyun, aldı düz min at.
İyirmi min dəvə, altı min əsir
Verərək xar oldu orda müqəssir.
Saxlaya bilməyib öz başını dik,
Bir müddət Taifdə gizləndi Malik.
Sakif qəbiləsi çəkib sağına,
Verdi sığınacaq öz ortağına.
Tezliklə diz üstə çökdü Taif də,
Getdi sakiflərin əməyi müftə.
Ayaqlar altında tapdalandı Lat,
Şirikdən azad oldu bu el, bu elat.

Bu durum ənsarı çox çaşdırırdı.
Beynində fikrini dolaşdırırdı.
Qüreyşdən görsə də burda xoş qılıq,
Onu tərk etmirdi nigarançılıq.

[1] Yer adıdır.

Bilmirdi, Peyğəmbər necə edəcək,
Məkkədə qalacaq, yoxsa gedəcək?
Onun doğmaları çoxdu burada.
İndi heç təhlükə yoxdu burada.
Özünə seçməyə yeri, məkanı
Həm həqq var idi, həm də imkanı.
Bir gün son qoyaraq bu üzüntüyə,
Peyğəmbər buyurdu: - Ey ənsar, - deyə.
İnsan dar günündə tanıyar dostun,
Tutdunuz qövmümdən siz məni üstün.
Qureyş burda məni sahir sayanda,
Siz mənə oldunuz dost da, həyan da.
Oldunuz sözümü birinci alan,
Sizi çaşdırmadı iftira, yalan.
Hicrət eyləməklə sizin diyara,
Mən sahib olmuşam çox ixtiyara.
Hicrətsiz də belə etməzdim heç dərd,
Sizin içinizdə olsaydım bir fərd.
Sizinlə olmağı istərdim müdam,
Sizinlə olmaqdan necə də şadam!
Mənim qərarımı bilməmiş hənuz,
Yersizdir,ey ənsar,bütün şübhəniz.
Bilin, qalan ömrüm sizlə keçəcək,
Bu can axirətə ordan köçəcək.

Artıq labüd idi onun köçməyi,
Qət etdi köçməzdən vəli seçməyi.
-Hələlik – söylədi doğma şəhərə,
Güc gəldi sevinci onun qəhərə.
Getdi Mədinəyə, ibni Cəbəli1
Qoydu müvəqqəti Məkkədə vəli.
Zülmət qaranlığa çiləyərək nur,
Yollandı Məkkədən on min bahadur.
Getdi Haqq naminə döyüşən ordu,
Məkkə qoşunuyla əyişən ordu.
Gəlmişidi düşməntək dağ – daş aşaraq,
Qayıtdı Qureyşlə qardaşlaşaraq.

Tutdu Mədinəyə üzünü ellər,
Gəldi söyləməyə sözünü ellər.
Şirkin köklərinə çəkərək mişar,
Hər yanda edirdi islam intişar.
Hər gün yüzü gedib, mini gəlirdi,
Bəyənib hamı bu dini, gəlirdi.
Islam rövnəqlənir, kamilləşirdi,
Şirkin bulağında su lilləşirdi.
Yer tapa bilmirdi ürəkdə qəlplər,

[1] Müaz ibn Cəbəli.

Allah eşqi ilə vururdu qəlblər.
Çapırdı atını zaman dörd nala,
Qalmırdı Peyğəmbər zamandan dala.
Açıb namaz üstə əlini Göyə,
Elçilər salmışdı neçə ölkəyə.
Məkkənin fəthindən ötməmiş üç ay,
Islam cərgəsinə qoşulmuşdu Tayy.[1]
Həzrətin hər günü keçirdi gərgin,
Gəlirdi yanına heyətlər hər gün.
Ancaq ki, çox idi hələ rəqibi,
Davam etdirirdi düşmən təqibi.
Son vaxtlar qaldırıb başını Təbuk,[2]
Gendən Mədinəyə atırdı təpik.
Düzüldü yenə də sıraya qoşun,
Yetirdi özünü oraya qoşun.
Eşidib, meydandan düşmən əkildi,
Qalanın içinə dərhal çəkildi.
Qorxub, Mədinədən dilədi aman,
Istəyi yerində ödəndi haman.
Bu oldu Həzrətin sonuncu cəngi,
Vergiylə düzəldi sülhün pərsəngi.

Həzrətin sevinci sonsuz dəryaydı,
Nə gözəl dövrandı, nə gözəl aydı.

[1] Tayfa adı
[2] Yer adı

Ancaq bu fərəhi sürmədi uzun,
Dəfn etdi torpağa o, Zeynəb qızın.
Qüssəli çağları gəldi yenə də,
Gəzdirdi bu dərdi ata sinədə.
Könlü ayrılmamış fəqət əzadan,
Allah sevindirdi onu təzədən.
Ona Mariyədən verdi bir oğul,
Acı ovqatına qatdı qənd – noğul.
Aylar ötüb keçdi, il başa çatdı,
Peyğəmbər yenə də kədərə batdı.
Dünyaya göz yumdu əziz balası,
Qanla gözlərinin doldu çalası.
Buyurdu:- Neyləyim Allah əmrinə,
Calaya bilmərəm bir gün ömrünə.
Mən ala bilmərəm səni ölümdən,
Gəlməz Allah işi mənim əlimdən.
Məhkumuq hamımız ölümə, onsuz,
Keçəcək bu yoldan hər yönlü, yönsüz,-
Deyib, İbrahimi qoydurdu qəbrə,
Sonra dəvət etdi qövmünü səbrə.
Söylədi: - Allahı tanıyıb – sevən,
Cənazə üstündə qoparmaz şivən.
Dərd əhli söndürər ürək yanğısın
Gözdən axıtmaqla yaş xısın – xısın.
Üzünü çevirib sonda Əliyə,

-Ehtiram olaraq, - dedi – ölüyə,
Qəbrinin üstünə baş daşı sancın,
Yerinə yetirin elin inancın.
Edər nişan üçün bir daş kifayət,
Bər – bəzək ölüyə verməz şəfaət.
Ölünün dəfnidir vacib olanı,
Dünya şöhrətidir yerdə qalanı.
Eylə ümmətimə, ya Əli, təbir.
Varlını, kasıbı udan bir qəbir
Olmasın bir barmaq hündür qarışdan,
Çəkinsin ümmətim vecsiz yarışdan.

## ASİF
## *XƏNDƏK QƏSİDƏSİ*

Eşit bu qissəni, şiə, Əliyyi-əladən,
Ki, zikr edim sizə mədhi cənabi-Mövladən.
Beşinci hicrət ilində olubdu bu əhval,
Yəhudiyani-Qureyşi o sinfi-ədadən.
Bəni-nəzir qovuldu Mədinə şəhərindən,
Hamı ədavət ediblər rəsuli-Tahadən.
Rəisiyani-Qureyş ittifaq eylədilər,
Qoşun tədarük ediblər o əhli-Bəthadən.
Mədinəyə gedələr harisü-Əbusüfyan,
Ki, intiqam alalar ol rəsuli-valadən.
Xəbər verildi rəsuli-xudayə bu məqsəd,
Münafiqin ola məhrum bu təmənnadən.
Yığıbdı məşvətərə ta təmami əshabi,
Mədinə şəhəri ola hifz şərri-ədadən.
Edibdü xəndəyi təklif həzrəti-Səlman,
Səhabə oldula məmun bu fikri-üzmadən.
Mədinə əhli edib ittifaqi xəndəkdə,
Hamıya qismət olubdur o ərz kübradən.
Rəsuli-Əkrəm ilə ol əmiri-xeybərgir,
Mübarək əllərilə işlədi o qəbradən.
Tamam eylədilər xəndəyi büsatilə,
Hamısı şad olubdur o gün bu mənadən.

Qoyuldu şəhr kənarində ləşgəri-islam,
Mühacirü-həmi ənsarü həm əhibbadən.
Yetəndə düşməni-din xəndəyin kənarinə,
Təhəyyür aləminə getdi bu müəmmadən.
Dedi bu hiylə deyil leyk məkr kar ərəb,
Yəqin ki, Həzrəti Səlman verib bu fitvadən.
Olan zamanda bu əhli Mədinəyə qalib,
Açanda dəsti-qitali görər cəfahadən.
Ki çox rəşadətilə göstərib ata məhmiz,
Düşübdü xofa cəmaət o gəbrü tərsadən.
O dəmdə xəndəyi keçdi dolandı meydani,
Mübariz istədi dəvasinə əcəlladən.
Xitab qıldı mənəm əmr Əbdəvid oğlu,
Ki,düşdü üstümə min atlı əhli ədnadən.
Müharib olmağa çünki yox idi qəlxanim,
Dəvə balasını etdim sipər o əsnadən.
Hücum edib o məlaini elədim pamal,
Ticarət əhli tapıblar nicat yəğmadən.
Əgərçi varsa mübariz mənə, tələb edirəm,
Şücaiyani-ərəblər hani bu qovqadən.
Hani Mühəmməd onu məhv xar zar eliyim,
Görə şücaəti-zurim bu qanlı dəvadən.
Mühəmməd adını xar eyliyəndə ol kafər,
Gəlibdü cuşa Əli zülfüqari-baladən.
Gəlib rəsuli-xuda məhzərinə ərz etdi,

Mənəm sənin köməyin Qüdrəti-təaladan.
Mürəxxəs eylə gedim cəng edim diliranə,
Qurtara aləmi-islam bu vəhşət-əfzadən.
Buyurdu şiri-xudayə rəsuli-aləmyan,
Bu Əmrdür sayılır pəhləvani-danədan.
Bu Əmridə vardur zur xariqüladə,
Bu qədri olginən agah bu sirri ixfadən.
Cavab verdi rəsuli-xudayə ol mövla,
Varımdu zur qolumda xudayi-yektadən.
O Əmridürsə, vədi mən də Qüdrətullahəm,
Ver iznü rüsxəti-cəng cənabi-reytəmbər,
Libasi-cəng geyibdir olub mühəyyadən.
Nə gördü Əmr gəlir bu cavan rəşadətilən,
Ki, bak eyləməz əsla o şiri-qərradən.
Cəsarəti-əsədullahə qaldı çün heyran,
Xitab qıldı heyifsən qayıt bu sədadən.
Cavani rəşədisən leyk mən nəhəngi mühit,
Mübariz olmağa əl çək həyatü dünyadən.
Xitab eylədi Əmrə Əmir-Müttəqiyan,
Ki, Kəbə örtüyünü tutmusan bu mənadən.
Maqam cəngində üç şey rica ola səndən,
Sədaqətilə verirsən birini dəvadən.
Cavab verdi o mövlayə həqqidür bu söz,
O üç şeyin birisini xahiş eylə ədadən.
Xitab eylədi, ya əmir,gəl müsəlman ol,

Cavab verdi mən əl çəkmişəm o üqbadən.
İkinci təklif odur gəl cidal etməgilən,
Götür qoşunlaruvi getginən bu səhradən.
Cava verdi o mövlayə farisi –yel-yel,
Qəbul eyləmərəm mən bu hərfi bicadən.
Edərlər tən mənə bunu bil zənən Qureyş,
Bu qədər xof edirəm mən bu nami-rüsvadən.
Üçüncü təklif odur ki gəl piyadə ol sən də,
Edək müharibəni qorxmuram bu dəvadən.
Aşağə düşdü atından o zalimi-bi din,
Ki, peylədi atını zülmi-kibri-qərradən.
O zalim ərz elədi mən qılınc vurum ya sən,
Buyurdu sərvəri-din zərb qıl təadadən.
Həmişə rəzmidə verrəm ədülərə möhlət,
Ümid etməgilən sən olursan əhyadən.
Gəlibdü qeyzə o zalim vurubdu bir zərbət,
Kəsib dəbəlqəni keçdi o rəsi-əthadan.
Yer ilə göy arasında o dəm ucaldı səda,
Edibdü rehlət o həzrət bu dar əfnadən.
Gəlib rəsuli-xuda məhzərinə çün həsəneyn,
Ucaldı naleyi-əfqan cənab Zəhradən.
Verib təsəlli o həzrət cənabi-Fatiməyə,
Əli tapıbdı cərahət ki, tiqi-bürradən.
O dəmdə şahi-vilayət dolandı meydanı,
Yaralı başını tez bağlayıbdı tənhadən.

Gəlibdü Əmrə mübariz durub müqabilədə,
Götürdü qüdrət ələ zülfüqari-baladən.
Ki, endirib ona zərbət vəliyyi ləm yəzəli,
Kəsib onun süpərin böldi kitaf əzadən.
Çəkibdü nərə o dəmdə sərildi yer üzünə,
Fərar etdi qoşun Firqeyi-nəsradən.
Bu zərb şəstə dedi afərin hami aləm,
Sədayi-ehsan ucaldı ərz ilə sürəyyadən.
O hərb xəndəgidə zərbən-Əliyyi vəli,
İbadəti səqəleyni keçibdü-mənadən.
Gəlib rəsuli-xuda məhzərinə verdi səlam,
Tapa ədavvülərin zilləti təbərradən.
Buyurdu şiri-xudayə cənab peyğəmbər,
Nə müjdə xahiş edirsən ola bu əsnadən.
Dedi qiyamət olanda elə şəfaətüvi,
Hami mühibbilərim olsun əhl əncadən.
Ərəbdə rəsmii orət gəlirdi dəvayə,
Fərar etmiyələr rəzmigəhdə büryadən.
Təvəqqi eylədi əmrin bacısı Mövladən,
Görə o qardaşın əlvidai-cuyadən.
Verildi izn ona gəldi o qanlı meydanə,
Görəndə qardaşını əl götürdü əbkadən.
Dedi edibdü səni qətl bir kəsi əfzəl,
Ki, Səndən artıqdır qüdrəti-təcəlladən.
Bu halda yadə düşür, şiə, ruzi-aşura,

Gələndə qətligah içrə aman üsəradən.
Var idi bir bacıda axtarırdı qardaşini,
Yox idi bircə əlamət o başü simadən.
Soyulub yaralı bədən başi kəsilmişdi,
Çəkibdü nalə o dəm ah va hüseynadən.
Bəs et bu qissəni sən, «Asif»a, təmam eylə,
Müdam zikr elə mədhi-cənabi-Mövladən.

## MÜCRÜM
## *XEYBƏR QƏSİDƏSİ*

Sal yadə, ey könül, yenə mövlayi-Qənbəri,
Ta nurilə münəvvər ola şiə gözləri.
Yaran gəlibdi dövrə yenə təbimin cuşi,
Bilməm necə bəyanə çəkim rəzmi-Heydəri.
Qurban olum məhəbbətuvə guşi-huşi qıl,
Gör Mürtəza Əli necə fəth etdi Xeybəri.
Çün şəhri-Xeybərə yetişib şiri-kirdigar,
Çün qəmli halidə görüb ol dəm peyğəmbəri.
Pirnuş edib o həzrətə çox ehtiram ilə,
Verdi səlam sahibi-din ərşi-ləngəri.
Durdi alıb qucağına vəliyyi-Xudani.
Çox eylədi nəvaziş o lövlaki-sərvəri.
Fərmayiş edib əmr edib ol Xaliqi-cəlil,
İmdaduvə cağırginən ol şiri-davəri.
Oldur ki, səslədim səni yet dadə, ya Əli,
Sənsən xəlayiq üçün olan həqqi rəhbəri.
Ey nuri-həqq, zireh geyib, ol azimi-cidal,
Görsünlər zərbi-şəsti-yədullahi-heydəri.
Fərmayişi-Rəsuli eşitcək vəliyyi-həqq,
Səmən və taətən deyib ol həqqi məzhəri.
Oldu səvar Düldülə aldı ələm ələ,
Gördü yəhudi qovmu şəhan-şahi sərvəri.
Görcək o şiri davəri ol Harisi-ləin,

Ol dəm çıxıb minib atın olmuşdu çox cəri.
Gördü bu şah qabaqda gələnlər kimi deyil,
Möhkəm yerində durdu çü səddi-İskəndəri.
Haris edəndə həmlə o şah vermədi aman,
Vurdu qılınc dü parə edib nəhsi peykəri.
Qaçdı yəhudilər bu sözi Mərhəbə dedi,
Bir nərə çəkdi başa qoyub xud məxfəri.
Alati-rəzmə qut oldi əyninə geyim geyib,
Qoydi o məxfər üstünə bir məxfəri zəri.
Əsbabi-rəzmini qurtarıb getdi nizəsin,
Qoydu qədəm rükabə səvar oldu əşqəri.
Sürdi atın gəlirdi o mərdudi-bihəya,
Öz dayəsi çıxıb qabağa qaçdı sözləri.
Ey pəhləvan olaydı gözüm kor bu gecə,
Gördüm bir özgə hal ilən sən itək dilavəri.
Gördüm yuxumda bu gecə bir şiri qeyzilən,
Etdi hücum üstüvə çün badi-sər-səri.
Cənk etmə olsa Əsəd adi əgər bu sərvərin,
Bil dayənin sözün özüvə pəndi-madəri.
Gəldi yetişdi gördü durub şəhləbən Nəcəf,
Bildi cahanda yoxdi o şahın bərabəri.
Səsləndi ey cəvan nədu adın de doğrusun,
Meydanə getdün axırı mən tək dilavəri.
Qıldı xitabi solət ilə şiri-lafəta,
Adım Əlidü müşkül açan şiə sərvəri.

Birdə adım Əsəddü mənim şiri-ləmyəzəl,
Qıl bir nəzarə gör bu cilali-qəzənfəri.
Mərhəb eşitdi çün qayıdıb bir neçə qədəm,
İblisi nəfs qoymadı getsün o kafəri.
Əl atdı tiqinə o ləin çox qürur ilən,
Həmlə edib həlak edə şiri-dilavəri.
Çün Mərhəbin o zərbətini rədd edib Əli,
Məyus edib o dəmdə o mərdudi-kafəri.
Əl atdı zülfiqarə o həllali müşkülat,
Zahir edib o ərseyi-Xeybərdə məhşəri.
Qeyzə gəlib o şiri-Xudavəndi-kirdigar,
Ərşə yetirdi nəreyi-Əllahu Əkbəri.
Hökm oldu dörd mələklərə ta əllərin tutun,
İndi Əli fənayə verər yeddi yerləri.
Əzrailü, Mikailü bir də ki İsrafil,
Həm Cəbrail fərş edib yer üzrə şəhpəri.
Tiqi-düsər əlində dönüb Mərhəb üstünə,
Əllahu Əkbər sovti basıb cümlə göyləri.
Bir noilən gərdişə götürüb Zülfüqarini,
Məhbut edib şücaəti göydə mələkləri.
Vurdu qılınc dü parə edib keçdi sinədən,
Ləngər salanda tiğə o dəm ərşi ləngəri.
Böldi xiyari-tər kimi ol Məhrəbi-duni,
Vasil olub cəhənnəmə duzəx olub yeri.
Xəllaqi-zülcəlal buyurub mərhəba Əli,

Sən eylədin rəvac bu dini-peyəmbəri.
Ya rəb, xəyalimə seyd etdi bir cəvan,
Qandan həna yerinə xizab oldu əlləri.
Ya Mürtəza Əli, neyçün imdadə gəlmədin,
Tirə nişan edəndə o dəm hülqi-Əsqəri.
Hardaydın ol zaman ki, Hüseyn üstə qomi kin,
Tökdi süpahi nizəvü tiğilə xəncəri.
Etdilər cümlə yarivü ənsarivi şəhid,
Ovnilə Fəzlü Cəfərü Əbbasü, Əkbəri.
Qıldıla nazənin bədənin cümlə çak-çak,
Saldıla qumlar üstə o cismi mütəhhəri.
Başın kəsdi cidayə vurub Şümri-bihəya,
Etdi əsir Zeynəbü Gülsümi-müstəri.
«Mücrüm» yazar həmişə Hüseynin müsibətin,
Bi şəkk şübhə görməyəcək holi-məhşəri.

## NAZİM SALAMİ

### *1) BƏDR DÖYÜŞÜ*

Çatdı Əbu – Cəhlə belə bir xəbər,
Edib Mədinəyə Məhəmməd səfər.
Ilan tək qıvrılıb narahat yatdı,
Qışqırıq salaraq aləmi qatdı.
O vaxt Əbu – Süfyan yox idi burda,
Karvanla qalırdı hələ Suriyada.
Əbu – Cəhl əmr etdi hazır olsunlar,
Yollarda dayanıb pusqu qursunlar.
Gözləyə bilmərəm, Əbu – Süfyanı,
Gözləsək biz artıq gec olar onu.
Gərək biz qəfildən zərbə endirək,
Əzib birdəfəlik, tamam məhv edək.
Oxucum tələsmə bir qədər yavaş,
“Bədr döyüşüdür, altıncı savaş.
Hamını yaxşıca silahlandırıb,
Min nəfər müşriki yola saldırıb,
Çıxdı qarşılasın, Əbu – Cəhl onu,
Peğəmbər bilirdi onsuzda bunu.
Peğəmbər dedi ki, gəl tökməyək qan,
Qılınc qaldırmasın insana – insan.
Bizə inanmırsız yerinizdə qalın,
Ancaq cəhənnəmi yadınıza salın

Vəhy gəldi allahdan, eşitdi yavaş:
Səninlə savaşan vadırsa savaş,
Qələbə sizindir az olsanız da.
Allah dayanıbdır bil arxanızda.
Cəbrayıl qələbə sizlədir dedi:
Peyğəmbər sonradan döyüşə girdi,
Müşriklər gələndə xeyli güldülər,
Başqa döyüşçünüz yoxmu dedilər?
Çıxıb təkbə - təkdə vuruşa bizlə,
Eyibdir bu bizə döyüsək sizlə.
Əli bu sözlərdən çox qəzəbləndi,
Həmzə də, Zübeyr də irəli gəldi,
Elə ki, öldürdü Əli Asını,
Anası saxladı onun yasını.
Zülfüqar qılıncı Asıdan aldı,
Bu qılınc "İslama" qələbə çaldı.
Düçmən məğlub olub qayıtdı geri,
Etdilər Məkkəyə matəm hər biri.

### *2) UHUD DÖYÜŞÜ*

Altı yüz iyirmi dördüncü ildə,
Keçdi Məkkəlilər hücuma bir də.
Yığıb Əbu –Sufyan üç min nəfəri,
Qələbə qazandı o, bu səfəri.

Bütün yəhudilər ona qoşuldu,
Bədəvi ərəblər hamı bir oldu.
Vardı Abbas adlı orda birisi,
Özü peyğəmbərin doğma əmisi.
Tamam fərqlənirdi qardaşlarından,
Elə bil ayrıydı qanı –qanınan .
Abbas eşitdi ki, qureyşilərdən,
Hücum olacaqdır sabah ertədən.
Bu işi qoymadı qala səhərə,
Oğlunu göndərdi o gün şəhərə.
Üstəlik tapşırdı oğluna desin
Xəbər eyləyəni qoy bildirməsin.
Yaxşı ki, əhvalat vaxtında çatdı,
Peyğəmbər o gecə şura yaratdı.
Dilindən ilk çıxan bu oldu sözü,
Gərək biz qoruyaq şərəfimizi.
Eşidin, qələbə görəcəyik biz,
Ölsək də cənnətə köçəcəyik biz.
Söhbəti bitirib yenidən qalxdı,
Zirehi geyindi, qılıncı taxdı ,
Nizəni, qalxanı alıb əlinə,
Hamı yola düşdü "Uhud" çölünə.
Peyğəmbər qılıncla atın belində,
O da vuruşurdu "Uhud" çölündə.
Min nəfər müşrikdən onu bu zaman,

On beş döyüşçüydü cəmi qoruyan.
Düşmən ilk vaxtlarda özün itirdi,
Çünki qəfil hücum heç gözləmirdi.
Burda Əbu –Sufyan hiylə işlətdi,
Hər şeyi ataraq qaçmaq əmr etdi.
Hər nəyi vardısa tullayıb düşmən,
Atlarla döndülər geriyə birdən.
İslam ordusunu tamah aldatdı,
Görüb qəniməti silahı atdı.
Atlardan düşdülər qənimət üçün,
Düşməni unutdu onlar büstbütün.
Düşmən atlı idi, onlar piyada,
Hə qədər kəsildi başlar arada.
Əlinin başçılıq etdiyi dəstə,
Olmayıb qənimət yığmaq həvəsdə.
Sinəsin qabağa verib hər biri,
Dövrəyə aldılar bil peyğəmbəri.
Ətabə adında büstpərəst vardı,
Özünü dəstənin içinə saldı.
Yarıb peyğəmbərin daşla başını,
Üstəlik sındırdı o, bir dişini.
Qılıncla zərbəni endirdi alçaq,
Qılıncı dizinə batmadı ancaq.
İkinci zərbəni vurmaq istədi,
Dolqa öz qolunu qabağa verdi.

Qılınc döyüşçünün kəsdi qolunu,
Məsləhət bilmişdi rəbbimiz bunu.
Atdan yıxılanda yerə peyğəmbər,
Onun öldüyünü güman etdilər.
Əli peyğəmbəri tərkinə aldı,
Onu təhlükəsiz yerə apardı.
Ətabə kəməndlə tutub atını,
Dedi: başa vurdu öz həyatını.
Öldürdüm, ucadan deyə qışqırdı,
İslam ordusunun ümidin qırdı.
Yarandı qoşunda ruh düşkünlüyü
Hamı da görürdü bu müşküllüyü.
Qırılan –qırıldı qaçan da qaçdı,
Bir təhər özünə hərə yol açdı.
Edib min vəhşilik qureyş ordusu,
Heç kim inanmazdı buna doğrusu,
Kəsib meyitlərin qulaqlarını,
Həmzənin yırtaraq, Hində qarnını,
Bu qadın Həmzəyə nifrət edirdi,
Ciyərin çıxarıb çiy –çiy yeyirdi.
Peyğəmbər düşmədi yenə də ruhdan,
Vəhy gəldi ona bir olan Allahdan.
Dedi: ya Məhəmməd, ruhdan düşmə sən,
Tezliklə qələbə sən görəcəksən.

### *3)XƏNDƏK DAVASI*

Gəldi Əbu – Süfyan təzə səfərdən,
Xəbəri yox idi yeni xəbərdən.
Tutub hal –əhval dost –tanışları,
Yorğun, qanıqara gördü onları.
Bildi ki, arada nə isə olub,
Hamının qüssədən bənizi solub.
Əbu –Cəhl dəymədi onun gözünə,
Axırda açdılar sirri özünə.
Qardaşın ölməyi onu yandırdı,
Intiqam hissini alovlandırdı.
Yığıb o, döyüşə dörd minlik ordu,
Özü bu ordunun başında durdu.
Məkkədə nə qədər yəhudi vardı,
Gəlib ordusuna onun qoşuldu.
Çatdı peyğəmbərə belə bir xəbər,
Edir Əbu –Sufyan üstünə səfər,
Ayıq ol, müşriklər düşüblər yola
Əbrəh ordusu tək gərək məhv ola.
Peyğəmbər hamını yığıb bir yerə,
İstədi bu işə bir tədbir görə.
Fars Salman adında birisi vardı,
Ona peyğəmbərimiz çox inanırdı.
Sevirdi peyğəmbər ailəsi onu,
Bütün şəhər əhli bilirdi bunu.

Salman təklif etdi, gəl çəkək zəhmət,
Məkkə ətrafında qazıyaq xəndək.
Düşmən hücum etsə düşər tələyə,
Hamı əhsən dedi belə kələyə.
Peyğəmbər alaraq əlinə beli,
Birinci başladı qazmağa yeri.
Hamı ona baxıb beli alaraq,
Məkkə ətrafında xəndək qazaraq,
Səhər gün çıxandan, batana kimi,
Quşlar yuvasında yatana kimi,
Bir ay işlədilər zəhmət çəkdilər,
Nə bir rahatlanıb dinclik etdilər.
Keçdi bir neçə gün aradan belə,
Qureyş qoşunları səpildi çölə,
Şəhər mühasirə olundu tamam,
Vəziyyət ağırdı, olduqca yaman.
Düşmən tərəfdən bir pəhləvan vardı,
Atı yumruq ilə vurub yıxardı.
"Bədr" döyüşündə yaralanmışdı,
Köksündə qılıncın yeri qalmışdı.
Fürsət axtarırdı əvəz çıxmağa,
"İslam" ordusunu tamam yıxmağa.
Adı Əmir idi məşhuri –cahan,
Hələlik yox idi onu bir yıxan.
Əmir öz atıyla irəli gəldi,

Dedi: birinizin yoxdur hünəri,
Qorxaq tülkü kimi nə gizləndiniz,
Xəndəyin içinə qaçıb girdiniz
Hamıya söz atıb yamsılayırdı,
Hətta peyğəmbəri ələ salırdı.
Əli dözməyərək ayağa durdu,
Peyğəmbər islama belə buyurdu:
Onunla izn ver çıxım döyüşə,
Necə dözmək olar belə söyüşə.
Əgər ölərəmsə mən bu döyüşdə,
Bilərəm ölmüşəm mən haq bir işdə.
Dua et, ya Rəsul, indi gəl məni,
Qoy əzim döyüşdə kafir düşməni.
Peyğəmbər öpərək onu bir kərə,
Allaha yalvardı o, xeyir görə.
Gəlib Həzrət Əli Əmrə yanaşdı,
Onunla sakitcə belə danışdı:
Deyirlər döyüşdən hər vaxt qabaq sən,
Rəqibin üç şərtin qəbul edirsən.
Əmir cavab verdi söylə şərtini,
Indidən qoy bilim nədir "dərdini".
Əli buyurdu ki, əvvəl gərək sən,
İslamı ürəkdən qəbul edəsən.
Onun bu şərtini Əmir rəəd etdi,
İkinci şərtini o təklif etdi.

Dedi ki, sonrakı şərtimiz budur,
Qayıdıb evində rahatca otur.
Əmir bununla da razılaşmadı,
Dedi qisasını o, almalıdı.
Sonuncu şərtini Əli söylədi,
Sən atlı mən isə, piyadə dedi:
Əmir razılaşdı, həmin şərt ilə
Tullandı o, atdan quş kimi yerə.
Atın ayaqların qılıncla vurdu,
Sonra Əmir ona belə söylədi:
Sən ey Əbu –Talib övladı dedi,
Dostam atanla mən, bunu eşit sən,
Başqa pəhləvanla qoy vuruşum mən.
Sən hələ cavansan yaraşmaz mənə,
Bu yaşda mən qılınc qaldırım sənə.
Əli belə dedi: əcəl ki, gəldi,
Baxmaz o, cavandı, qocadı nədi.
Çəkib qalxanını Əli başına ,
Hörmət eləyirəm dedi, yaşına.
Sən endir zərbəni birinci mənə,
Ey Əmir, növbəni vermişəm sənə.
Əmir qəzəbləndi, yaman bozardı,
Qılıncı Əlinin başına çaldı,
Böldü iki yerə qılınc qalxanı,
Az qala axmışdı əlinin qanı.

Zərbəni endirmək Əliyə çatdı,
Əmirin qıçını o, kəsib atdı.
Əmir yıxıldısa o, dözdü buna,
Kəsilmiş qıçını tulladı ona.
Çökdü sinəsinə Allahın şiri,
Getdi cəhənnəmə murdarın biri.
Üzüb qılınc ilə başını atdı,
İslamın ordusu murada çatdı.
Üç dəfə qışqırdı Allahu –əkbər,
Eşitdi bu səsi əziz peyğəmbər.
Gəlib qucaqladı, öpdü Əlini,
Dedi: sevindirdi ürəkdən məni.
Əmir tək düşməni öldürməklə sən,
İslam dinimizi xilas etmisən.

### *4)BƏNİ QOREYZA SAVAŞI*

"Bədr" çölündəki məğlubiyyətdən,
Ölən çox olmuşdu qureyşilərdən.
Bir gün qureyşilərdən gələrək hamı.
Tapıb ordugahda Əbu –Sufyanı
Ona qəzəb ilə belə dedilər,
Yəhudi, müsəlman saziş edirlər .
Keçməsək tezliklə əgər hücuma,
Müsəlman çoxalsa güc çatmaz ona.
Bir yandan səhrada külək qalxmışdı,

Bu payız aləmi yaman qatmışdı.
Elə bir tufan da gəldi bu zaman,
Bütün düşərgəni eylədi viran.
Çadırlar dağıldı, qazanlar aşdı,
Bütün qureyşilər tələsik qaçdı.
Qorxub yəhudilər evinə getdi,
Onlar güşərgəni tamam tərk etdi.
Peyğəmbər bunların hamısın bildi,
Rəbbim özü cəza veribdir dedi.
Xəbər də elədi yəhudilərə,
Onların qaldığı məhəllələrə.
Gedərək oraya Bilal bildirdi,
Peyğəmbər namaza gələcək dedi.
Əgər istəməzlər köçüb getsinlər,
Və yaxud islamı qəbul etsinlər.
Qoşunu çəkərək sonradan Əli,
Etdi mühasirə qureyşiləri.
Möhkəm müdafiə olsa da düşmən,
Ancaq bacarmadı Həzrət –Əliynən.
Hamısı nəhayət təslim oldular,
İslama gəlməyib, çox qırıldılar.
Əli silah tutan qılıncdan keçdi,
Qadını, uşağı tamam qul etdi.
Vardı əsir bir qız Reyhan adında,
Peyğəmbər evləndi, sonra onunla.

## HACI YUSİF QULAMMİRZƏ OĞLU
### *1) İSLAMDA İLK HƏRB – BƏDR DÖYÜŞÜ*

Bədr Mədinədən səksən mil uzaq,
Məsafədə olan bir kənddir, ancaq
Şama gedib – gələn bütün karvanlar,
Bu kənddən yolunu salırdı onlar.
Hicrətin ikinci ili bura da,
Ramazan ayında oldu ilk dava.
Dinləri uğrunda cihad edənlər,
Cəmisi oldular üç yüzə qədər.
Məkkədə yeriyən bir böyük ordu,
Ertəsi onlarla üz – üzə durdu.
Min nəfərdən artıq müşriklər bu an,
Müsəlmanlara hərb eyləyir elan.
Əbu Cəhl deyir: -Biz sizi artıq,
Əsirtək Məkkəyə aparacağıq.
Məni bu gün üçün doğmuşdur anam,
Sizi diri – diri yandıracağam.
Sayca üstün olub o, güvənirdi,
Mənəvi qüvvəti düşünməyirdi.
Üzbəüz dayandı haqq ilə batil,
Biri ədalətli, o biri qatil.
Biri üzü qara, birninki ağdır,
Tovhid ilə şirk vuruşacaqdır.

Oğlu Valid sağda, ortada Ütbə,
Sol tərəfindəsə qardaşı Şeybə.
Hər üçü meydana oldular süvar,
Müsəlmanlar ilə qarşı durdular.
Mədinə tərəfdən ortada Həmzə,
Sağda Həzrət Əli, solda Übeydə.
Yaxına gəldikcə bu əhli hünər,
Kafirlər qorxudan çəkinirdilər.
Vuruşma başladı əvvəl təkbətək,
Əli ilə Həmzə meydana gircək,
Birinci həmlədə çəkdilər nərə,
Rəqiblərin dərhal sərdilər yerə.
Əli rəqibinə vermədi aman,
Başını bədəndən üzdü çox asan.
Həmzə rəqibini yıxsada yerə,
Zərbəsi getmişdi onun boş yerə.
Əlbəyaxa olub güləşən zaman,
Kimsə qışqırırdı müsəlmanlardan:
-Ya Əli, Həmzəni yordu bu kafər.
Həmzə rəqibinin başın bir qədər,
Alıb sinəsinə sıxdığı üçün,
Ona zərbə vurmaq deyildi mümkün.
Başını kənara dedi: -Çək Həmzə,
Əli o kafərə yetirdi zərbə.
Sonra Übeydəni yaralı görcək,

Ütbənin üstünə şığıdı quştək.
Ütbənin o saat həyatı söndü,
Übeydəni alıb geriyə döndü.
Sonra da ümumi həmlələr oldu,
Günəşin üzünü toz – duman aldı.
Ətarafa yayıldı "Allahu əkbər",
Müsəlmanlar şirtək döyüşürdülər.
Müşriklər qaçırdı hərə bir yerə,
Öndəki kəllələr düşürdü yerə.
Əbu Cəhlin özün salaraq atdan,
Iki cəsur etdi qanına qəltan.
Başsız qalan şirkin ordusu qorxar,
Az müddət ərzində məğlub oldular.
Müsəlmanlar on dörd şəhid verdilər,
Kafirlərdən öldü düz yetmiş nəfər.
Bir o qədərin də aldılar əsir,
Sağ qalanları da qaçdı birbəbir.
Məkkəyə çatanda bu qara xəbər,
Heç cürə inana bilməyirdilər.
Əbu Ləhəb isə öz hikkəsindən,
Bağrı çatlayaraq keçindi həmən.
Mədinəyə gələn zəfər müjdəsi,
Müsəlmanların bu qələbə səsi
Ətrafa yayıldı hamı sevindi.
Yəhudilər o gün qara geyindi.

Bədir döyüşündə düşən əsirlər,
Mədinəyə bir gün sonra gəlirlər.
Onlarla Həzrətin əmisi Abbas,
Kürəkəni olan müşrik Əbül As,
Arvadı Sevdanın əmisi oğlu,
Bütün əsirlərin qolları bağlı,
Əksəri möhtərəm nüfuzlu adam,
Yetmişdən ikisin etdilər edam.
Kasıb olanları söz verdi daha,
Asi olmayacaq Rəsulüllaha.
Hansı bir əsirlər imkanlı idi,
Fidyə alınaraq azad edildi.
Peyğəmbərin qızı Zeynəbin əri,
Məkkəyə çatdırdı tez bu xəbəri.
Əlində heç bir şey olmadığından,
Zeynəb gərdənbəndin göndərir bu an.
Bu boyunbağını anası ona,
Toy günü hədiyyə salmış boynuna.
Həzrəti Peyğəmbər bunu görərkən,
Qədim xatirələr canlandı birdən.
Alıb gərdənbəndi baxarkən ona,
Həzrəti Xədicə düşdü yadına.
Əbul Ası azad edir Peyğəmbər,
Məkkəyə çatdıqdan sonra bu kafər,
Günahsız Zeynəbin talağın verir,

Bir baş Mədinəyə onu göndərir.
Mədinə şəhəri qədim zamandan,
Yəhudi xalqına olmuş bir məkan.
Burada nə qədər yəhudilər var,
Bir neçə tayfaya bölünür onlar.
Onların adları Qureyzə, Nəzir,
Üçüncü tayfası hiylədə mahir.
Kaynuka adını daşıyırdılar.
Mökəm qalalarda yaşayırdılar.
Onlar özlərinə çox güvənirllər.
Hər şeyin üstündə dava edirlər.
Bədr zəfərindən keçdi bir ara,
Düşmən kəsildilər müsəlmanlara.
Dava üçün fürsət axtaran onlar,
Namusa, qeyrətə sataşır onlar.
Əhdindən, sözündən birdən döndülər,
Rəsuli - əkrəmə çatdı bu xəbər.
Onlarla danışıq apardı Həzrət,
Dedi: -əhdinaməyə uyğun hərəkət
Əgər etməsəniz, onda bilin siz,
Qureyşin halına düşəcəksiniz.
Həzrətin sözünü qoydular lağa,
Dedilər: - Hazrıq biz vuruşmağa.
Odur ki, Peyğəmbər hərb elan edir,
Bir baş müsəlmanlar hücuma keçir.

Onları saldılar mühasirəyə,
Sonra başladılar sürgün etməyə.
Hicrətin ikinci ili müxtəsər,
Tarixə yazıldı bu hadisələr.
Vəhy ilə Həzrətə verdilər xəbər,
Qəilbini səmtini dəyişdirdilər.
Bu il də cihada izin verildi,
Odur ki, Bədrdə hərb edildi.
Otuz gün orucluq fərz qılındı,
Qurban, zəkat, fitrə əmr olundu.
Bayram namazları sayıldı əfzəl,
Müsəlmanlar içrə olundu əməl.
Peyğəmbər Bədrdən döndüyü zaman,
Qızı Ruqiyyə köç edir dünyadan.
Həzrətə bu itgi gətirsə də qəm,
Zilhəccə ayında Rəsuli - əkrəm,
Qızı Fatiməni Əliyə verir,
Nigahın kəsdirib, toyunu edir.
Mədinədə hamı şadlıq edirdi,
Islam günü – gündən qüvvətlənirdi.
Bəni Kaynukalar qovulmuş artıq,
Müsəlmanlar tapdı bir an rahatlıq.
Bədr döyüşündə çox ziyan çəkən,
Yaxın qohumların oğlun itirən
Əbu Süfyan yanıb alışır bu dəm,

Başına iki yüz atlı edir cəm.
Hər atlı yol üçün gördü tədarük,
Bir kisə qovrulmuş buğda aldı yük,
Mədinəyə yaxın gələn atlılar,
Xurma bağlarına girib at qovar.
Əkin yerlərini edər tar – mar,
Bir neçə evləri yandırmışdılar.
Iki müsəlmanı şəhid edirlər,
Peyğəmbərə bunu verdilər xəbər.
Onun qarşısına qoşun çıxanda,
Əbu Süfyan qorxub qaçır bu anda,
Ağırlıq etməsin deyə, atlılar
Buğda kisələrini atıb qaçdılar.

## *2) ÜHÜD DÖYÜŞÜ*

Peyğəmbər Bədrdə çalmışdı zəfər,
Yanıb tökülürdü Qureyşililər.
Intiqamlarını alsınlar deyə,
Onalar əl atdılar hər bəhanəyə.
Car çəkib Məkkədən kənar çıxdılar,
Üç min nəfərlik bir qoşun yığdılar.
Ətrafdan bədəvi ərəbləri də,
Cəm etdi ordunun tabeliyində.
Əbu Süfyan buna edir başçılıq,

Çünki o, Məkkədə rəisdi artıq.
Onun arvadı Hind olmaqla başda,
Cəlb etdi orduya qadınları da,
Orduya qoşulan on beş qadınlar,
Dedilər: -Bizdə də aslan gücü var,
Qisas almaq üçün qovruluruq biz,
Bədrdə ölübdür əzizlərimiz,
Qüdrətli sayseçmə igidlərimiz.
Odur ki, “qana – qan” and içmişik biz.
Hindin atasına Həmzə Bədrdə,
Ordu başçısıtək yetirdi zərbə.
“Vəhş” ləqəbində bir zənci vardı,
Həbəş üsulilə nizə atardı.
Bibisi oğluna köləlik edir,
Söhbət əsasında Hind ona deyir:
-Həmzədən Ütbənin qanını alsan,
Olarsan ən varlı bir adam inan.
Mükafat istəsən, qat – qat verərəm,
Səni köləlikdən azad edərəm.
Vəhş də bu işə çox məmnun oldu,
Nizəsin götürüb hərbə qoşuldu.
Məkkədə hazırlıq görülən zaman,
Həzrətin əmisi Abbas durmadan,
Dərhal Mədinəyə göndərdi çapar,
Həzrəti bu işdən etdi xəbərdar.

Bu xəbər sarsıtdı müsəlmanları,
Əsəbdən çoxunu coşdu qanları.
Bəzisi eşidib düşdü təşvişə.
Peyğəmbər hazırlıq görür bu işə.
Mühüm hadisələr olanda Həzrət,
Əshabın yığaraq edər məşvərət.
Münafiq, mühacir, həm ənsarları,
Ağsaqqalları da o, gecə yarı
Hərbi yığıncağa eylədi dəvət,
Onların fikrini bilsin nəhayət.
Fikir ayrılığı oldu bu zaman,
Münafiq tərəfin rəisi olan,
Əbdullah dedi ki: -Şəhərdə qalaq,
Yüksəkdən onları edək daş – qalaq.
Nə zaman şəhəri tərk etmişik biz,
Mümkün olmayıb ki, ötək itkisiz.
Bədr döyüşündə qürrələnənlər,
Həmişə savaşa öndə gedənlər,
Bayırda vuruşmaq istəyirdilər,
Onların adından dedi bir nəfər:
-Allahdan bu günü gözləmişik biz,
Üz – üzə gəlməyə vardır qüvvəmiz.
Şəhərin içindən çıxmasaq əgər,
O zaman da bizə qorxaq deyərlər.
Həzrət də bu fikrə çıxdı tərəfdar,

Şəhərdən çıxmağa verildi qərar.
O gün cümə günü olduğu üçün,
Tamam eylədilər namazın hökmün.
Həzrəti Peyğəmbər evinə girdi,
Zirehli paltarın geyib bitridi.
Qılınca qurşanıb çıxdığı zaman,
Bir qismi sözündən dönərək bu an,
Belə söylədilər Rəsulüllaha:
-Şəhərdən kənara çıxmayaq daha.
-"Qılıncın qınından çıxartsa əgər
Döyüşsüz qınına salmaz, Peyğəmbər!"
Qoşuna əmr etdi: -Döyüşə gedək,
Kimin haqq olduğun Allah deyəcək.
Müsəlmanlar əvvəl oldu min nəfər,
Üç yüz münafiqlər geri döndülər.
Yerdə qalanları yeddi yüz nəfər,
"Ühüd dağ" deyilən yerə gəldilər.
Qoşun arxasını söykədi dağa,
Düzüldü döyüşə hazır durmağa.
Dağın sol əlində bir keçid vardı,
Əlli oxatanı Həzrət apardı,
Onlara tapşırdı: -Bu keçidi siz
Əmrimi almadan tərk etməzsiniz.
Döyüş başlanarkən hər iki tərəf,
Əsgərlərin düzdü meydana səf – səf.

Qureyş tərəfindən gələn qadınlar,
Nəğmələr oxuyub çalıb oynayır.
Təkbətək döyüşə başlanan zaman,
Təlha irəliyə çıxdı durmadan,
Özünə layiq bir igid istədi,
Həzrəti Əli: -Mən hazıram, dedi.
"Allahın şiri" tez çıxdı irəli,
Təlhanı  bir anda öldürdü Əli.
Ona vuran kimi zülfüqarını,
Bir zərbə ilə aldı ixtiyarını.
Gördü çapalayır, çıxmayıb canı,
Iki yerə böldü o pəhlivanı.
Qureyşin bayrğın götürdü Osman,
Qarşısına çıxdı Həmzə durmadan,
Onu qardaşının gününə saldı,
Sonra qızğın döyüş bir vüsət aldı.
Əli, Həmzə bir də Əbu Düc cana,
Hər üçü şir kimi girdi meydana.
Düşmənlərin başə düşdükcə yerə,
Burada görünür qorxunc mənzərə.
Dəvə nəriltisi at kişnəməsi,
Yayılır səhraya ah – aman səsi.
Yerdən qalxır göyə qalın tozanaq,
Qılınclar qalxanlar şaqqıldayaraq.
Bir qnlı çarpışma gedirdi belə,

Tarix buna bənzər görməmiş hələ.
Qoşun güc gəlirdi bütpərəstlərə,
Doqquz bayraqdarın salmışdı yerə.
Döyüşün şiddətli qızğın çağında,
Həmzəni izləyən Vəhş sağında,
Nizəni tuşlayıb hədəfə atdı,
Qarnına sancılıb yerə uzatdı.
Şiddətli vuruşma çox davam edir,
Müsəlmanların bu xeyrinə gedir.
Əsgərlərinə ruh verən qadınlar,
Üz – gözü cıraraq ağlayır zar – zar.
Pərən – pərən düşən ordu qaçarkən,
Müsəlmanlar düşdü qəflətə həmən.
Qənimət yığmağa onlar girişdi,
Oxatanlar görüb tamaha düşdü.
Peyğəmbərin sözün tez unutdular,
Bu dünya malını üstün tutdular.
Düşmən əsgərləri görərkən bunu,
Üz qoydu tutsunlar keçid yolunu.
Arxadan hucuma dərhal keçirlər,
Döyüşün mövqeyin dəyişdirirlər.
Qarma – qarışıqlıq başlanan zaman,
Hücum elədilər öndən, arxadan.
Birdən bir şayiyə yayılır bu dəm,
Dedilər: -“ölübdür” Rəsuli - əkrəm!

Müsəlmanlar çaş – baş düşdü bir qədər,
Nə edəcəklərin bilməyirdilər.
Bir qismi meydanı tərk eyləyərkən,
Hətta, öldürürlər özünkilərdən.
Həzrəti Əliyə çatdı bu səda,
Zülfüqar əlində döndü bir oda.
Düşməni şimşək tək doğrayır, kəsir,
Gözləri Rəsuli - əkrəmi gəzir.
Müsəlmanlar içrə qışqırır biri:
-“Peyğəmbər ölməyib diridir, diri!”
Əli şad xəbəri eşidən zaman,
Sevincək o yana qaçır durmadan.
Həzrəti dövrəyə almış on nəfər,
Onu qoruyaraq döyüşürdülər.
Əli öz sinəsin edərək sipər,
Yaxın gələnlərə gücün göstərər.
Igidlər tərəfdən o, qorunanda,
Bir fürsət tapıb qarışıq anda,
Qəflətən hücuma keçdiyi zaman,
Qılıncla Həzrətin vurur başından.
Zərbədən dəbilqə bölünür iki,
Kafirlər giriblər yarışa sanki.
Hücumlar yönəlib ona birbaşa,
Başqa bir allahsız əl atıb daşa,
Uzaqdan Rəsuli - əkrəmə atmış,

Mübarək dodağın yarıb qanatmış.
Iki dişi sınır daş zərbəsindən,
Yanağında zireh kəsir dərindən.
Yaralanmış Həzrət yıxılır atdan,
Özünə gələndə deyir bu zaman:
-“Ya Rəbbim, xalqımı əfv et, bu anlar
Nələr etdiyin bilməyir onlar!”
Deyərək, Allaha dua edirdi,
Mətanətini o, itirməyirdi.
Yanındakılarla Həzrət bərabər,
Bir təpəyə doğru çıxıb getdilər.
Əbu Süfyan çıxır bir yüksək yerə,
Sevinci sığmayır onun göylərə.
“Muhəmməd hardadır?” – Deyib çığırdı.
“Yüksəl şanlı Hübel!” – bərkdən bağırdı.
Ucadan söyləyir Həzrətə doğru:
- Bədr döyüşünün əvəzidir bu!
Bəşər tarixinə kim salsa nəzər,
Müharibələri öyrənsə əgər,
Dünyanı gəzələr əllərdə çıraq,
Belə qəddarlığı görməzlər ancaq.
Qureyş qadınları vəhşilik etdi,
Insanlıq siması onlardan itdi.
Şəhid düşən bəzi müsəlmanların,
Burun – qulaqların, kəsib onların,

Iplərə keçirib düzdülər qatar,
Boyunbağı kimi bağlamışdılar.
Hind sakit olmadı işgəncələrdən,
Həmzənin bədənini bir neçə yerdən,
Didib parçalamış quduz vəhşitək,
Ciyərin qopartdı istəmiş yemək.
Ağzında çeynəyib uda bilməmiş,
Tarix bu ləkəni ondan silməmiş.
Qureyşilər getdi Məkkəyə tərəf,
Onlara kifayər etdi bu şərəf.
Müsəlmanlar hüzn içindəydilər,
Şəhid vermişdilər yetmiş dörd nəfər.
Peyğəmbər yenidən döndü meydana,
Gördü meyidləri bulanmış qana.
Mübarək siması qəmə büründü,
Gözündə mirvari damcı göründü.
Burnu, dodaqları kəsildiyiçün,
Həmzəni tanımaq deyildi mümkün.
Əbasın çəkərək üzün bağladı,
Bütün şəhidlərə qəlbən ağladı.
Həzrətin əmriylə qazıldı məzar,
Şəhidlər burada dəfn olundular.
Mədinəyə Həzrət döndüyü zaman,
Üzü yaralıydı, qəlbi pərişan.
Yəhudilər ilə ikiüzlülər,

Buna "məğlub" deyib yaydılar xəbər.
Hicrətin üçüncü ilində bunlar,
Tarixə düşərək yazıldı nə var.
Ühüddə başlamış gərgin bir döyüş,
Şəhidlər verilmiş, qanlar tökülmüş.
Ölülərə hucum edən qadınlar,
"Qana – qan!" andını içən qadınlar,
Həmzəni tanınmaz hala saldılar,
Intiqamlarından razı qaldılar.
Həzrətin də üzü bu ildə güldü,
Birinci nəvəsi dünyaya gəldi.
Fatimənin oğlu Həzrəti Həsən,
Oldu Peyğəmbərə təsəlli verən.
Həzrət ilə qohum olmaqçün Ömər,
Dul qalmış qızını – Həfsəni verər.
Həmin izdivacdan keçdi bir zaman,
Ümm Külsüm ilə evləndi Osman.
Peyğəmbər çox həssas, dərin düşünən,
Gələcəkdə olan dörd xəlifədən,
Ikisindən aldı özünə övrət,
Iki xəlifəyə qız verdi Həzrət.
Müsəlman kişilər bu ana qədər,
Müşrik qadınlarla evlənirdilər.
Bu ildən onlara edildi yasaq,
Müşrik qadınlarla kəbin bağlamaq.

## *3) XƏNDƏK DAVASI*

Hicrətin beşinci ilində artıq,
Müsəlmanlar tapdı azca rahatlıq.
Bəzi qəbilələr baş qaldıran tək,
Onlara qəfildən hücum edərək.
Yerlərində sakit otuzdururlar,
Mədinədə rahat həyat qururlar.
İslamın ən qəddar düşməni olan,
Nəzir oğulları qovulan zaman,
Bir qismi birbaşa getmiş Xeybərə,
Bəziləri köçmüş başqa bir yerə.
Odur Mədinədə qaynayır həyat,
Həzir oğulları oldu narahat.
Yanıb qovrularkən paxıllığından,
Sakit yaşamağa vermədi imkan.
Qureyşlə görüşüb bir neçə nəfər,
“Su yatar, düşmənsə yatmaz demişlər.”
Qureyş başçıların tutaraq dilə,
Deyir birləşsəniz əgər bizimlə,
Birlikdə qırarıq müsəlmanları.
İnandırmaq üçün hətta onları,
Cürbəcür dəlillər gətirmişdilər,
Yalan iftiralar şişirtmişdilər.
Əbu Süfyan əvvəl tərəddüd etdi,

O, öz aləmində xəyala getdi,
Mühəmməd hər yerdə yayır dinini,
İslamın gün – gündən yüksəldiyini
Apaşkar görüb, bu qərara gəlir,
Mühəmmədin tale üzünə gülür.
Əvvəllər ağlına gəlməyən bu iş,
İndi ona möhkəm təsir eyləmiş.
Yəhudilər “əhli – kitab” idilər,
Tovhid nə olduğun bilirlər əzbər.
Əbu Süfyan sordu, sual edərək:
-Hansı din yaxşıdır, deyiniz görək?
Mühəmmədin dini, yoxsa bizimki?
Cavabı bu oldu: - əlbət sizinki,
Onların dinindən sizin dininiz,
Daha xeyirlidir, bilməlisiniz.
Deyərək, Allaha qarşı çıxırlar,
Qureyşililəri qızışdırırlar.
Bunu eşidən tək tez Əbu Süfyan,
Yəhudilərə o aldandığından,
Qəbilə - qəbilə gəzdi hər yeri,
Ayağa qaldırdı bütpərəstləri.
Tezliklə yaratdı böyük bir ordu,
Özüdə ordunun başında durdu.
Mədinəyə doğru hərəkət etdi,
Necə ki, Peyğəmbər bunu eşitdi,

O, üç minə qıdər qoşun edir cəm,
Sonra hərbi şura çağırır bu dəm.
Şurada iştirak edən adamlar,
Durub məsləhətin söylədi aşkar.
Ühüd döyüşünü xatırlayaraq,
Səlman Farsi fikrin dedi bu sayaq:
-Bu orduya qarşı bizdə qüvvə az,
Onlarla üz – üzə vuruşmaq olmaz.
Şəhər içəridən qorunsun gərək,
Bir az da fikrini açıq deyərək,
Dedi:-Başqa yola əl atmasaq biz,
Bir nəticə verməz müdafiəmiz.
Şəhərin girəcək giriş yolunda,
Düzənlik sahənin bütün qolunda,
Dərin enli xəndək qazılsa əgər,
Atlılar girməyə eyləməz hünər.
Təklif Peyğəmbərin xoşuna gəldi,
Səlmanın bu fikiri qəbul edildi.
Hamısı əlinə külüng – bel aldı,
Gecəni – gündüzü çalışdı, qaldı.
Peyğəmbər özü də kömək edərək,
Altı gün ərzində qazıldı xəndək.
Evlərin damına daş – kəsək yığar,
Lazım olan zaman atacaqdılar.
Qureyşin ordusu gəlirdi seltək,

Heyrətə gəldilər xəndəyi görcək.
Hələ döyüşlərdə indiyə qədər,
Belə müdafiə görməmişdilər.
Bir az aralıda xəndəkdən kənar,
Döyüşə gələnlər qurdu çadırlar.
Mədinə saxlandı mühasirədə,
Müsəlmanlar oldu mühafizədə.
Qureyş əsgərləri bezdilər artıq,
İçlərinə düşdü bir narahatlıq.
Müharibə vaxtı çünki ərəblər,
Tez çapıb, talayıb qaçmağı güdər.
Onlar görürdülər uzanır dava,
Digər bir tərəfdən soyuyur hava.
Nəzir başçıları qorxuya düşdü,
Qüreyzə başçısı Kəblə görüşdü.
Bu iki tayfalar baş – başa verdi,
Nəzir oğlu Əxtab, Kəbə deyirdi:
-Dəniztək bir ordu gətirmişəm mən,
Bu yaxşı fürsəti vermə əlindən.
Bizimlə birləşib kömək eyləsən,
Islamı silərik biz yer üzündən.
Qureyş Qətəfanla birləşib demək,
Müsəlmanları da yox eyləyəcək.
Qureyzə başçısı oyuna girdi,
Vəziyyət doğurdan çətinləşirdi.

Qureyş, yəhudilər birləşir belə,
Məqəsdi şəhəri alsınlar ələ.
Gözləyirlər kömək gəlsin bir qədər,
Mədinəyə hücum edəcəkdilər.
Mühasirə davam edirdi hələ,
Iyirmi günədək dözdülər belə.
Zəfər ümidini görmürdü onlar,
Laqeydlik göstərdi qətəfanlılar.
Yəhudilərdən də gəlmədi kömək,
Əsgərlər də bundan artıq bezərək,
Çox böyük cəngavər olan Əbdivəd,
Əbu Cəhlin oğlu İkramə namərd,
Nofələ qoşulub bir neçə nəfər,
Xəndəyi alanıb keçə bildilər.
Əbdivəd qüvvətdə yırtıcı bir şir,
Özüylə döyüşən adam istəyir.
Əli hazırlaşır meydana girsin,
Həzrəti Peyğəmbər verməyir izin.
Qarşısın alaraq ona söyləyir:
-Sən otur ya Əli, gələn Əmrdir.
Əbdivəd təkrarən yenə bağırdı,
Döyüşmək istəyən igid çağırdı.
Bir göz qırpımında sıçradı yerdən
Əli, o məluna cavab verdi: - Mən
Onlar üzləşəndə, sanki bu zaman,

Küfrün qabağını kəsmişdi iman.
Əli bir şahintək döyüşə girdi,
Əvvəlcə fürsəti düşmənə verdi.
O kafir elə bir zərbə vurdu ki,
Əlinin qalxanı bölündü iki.
Başı yaralanıb axanda qanı.
Əbdivəd üstünə aldı qalxanı.
Əli qaldıraraq Zülfüqarını,
Bir yerə cəm edib öz vüqarını,
Bir zərbə endirdi “Allahu əkbər”,
Onu iki yerə bölmüş gördülər.
Nofəl bu döyüşdən qoyub qaçarkən,
Xəndəyin içinə düşür qəflətən.
Həzrəti Əli tez görərək bunu,
Xəndəyin içində öldürür onu.
Öz içindən gəldi adın mənası,
Tarixdə ad aldı “Xəndək davası”.
Yerdə qalanalrı qaçır bu zaman,
Ikramə nizəsin salır qorxudan.
Xəndək davasında Həzrəti Əli,
Ağır zərbəsilə kəsdi batili.
Həm iman, həm inam qüvvəsi ilə
Küfrün təməlini dağıtdı belə.
Əlinin zərbəsin Peyğəmbər o gün,
Bütün ibadətdən tutmuşdu üstün,

-Ya Əli, Əmri öldürməklə sən,
Küfürdən islamı xilas etmisən.
Ertəsi gün hücum edilir yenə,
Atlanmaq heç kimin gəlmir fikrinə.
Bir neçə gün belə eylədi davam,
Hamının dözümü tükəndi tamam.
Xəndəyi atlanmaq mümkün deyildi,
Qureyş başçıları səhvini bildi.
Bir çarə axtarmaq istərkən buna,
O gecə bayırda qopdu fırtına.
Gözləri kor edən qasırğa artdı,
Ağacları yerdən alıb qopartdı.
Zil qaranlıqları yardıqca şimşək,
Çadırları söküb yıxırdı külək.
Öz vaxtından əvvəl sanki, gəlib qış,
Göydən fasiləsiz tökülür yağış.
Allahın nə qədər "ordusu" vardı,
Bir anda hamısın yuyub apardı.
O gecə düşmənlər qərara gəldi,
Təlaşlı bir halda yola düzəldi.
Əbu Süfyan qorxub tapmamış imkan,
Dəvəsinə minmiş dizin açmadan.
Səhər fırtınadan qalmadı əsər,
Müsəlmanlar da həmd – səna etdilər.
Peyğəmbər: - Bizimdir növbə buyurdu,

Görə bilməz artıq Qureyş bu yurdu.
Allahın yardımı bizə bəs edər,
Bu o deməк idi çalındı zəfər.
Qureyzə tayfası çətin bir anda,
Fəlakət qapını kəsən zamanda,
Əvvəl bağladığı əhdi pozaraq,
Dar gündə düşmənə oldular dayaq.
Onların haqqında hökm kəsildi,
Hərbə qoşulanalar edam edildi.
Qadınlar, uşaqlar əsir oldular,
Malların qənimət kimi aldılar.
Tövrata da bunu uyğun bilirlər,
Yəhudilər sözsüz qəbul edirlər.
Bu ildən təyəmmüm qanun qılındı,
Qorxu namazı da əmr olundu.
Mühüm hökümlərdən biri qadınlar,
Üzlərinə örtük salmalı onlar.

### *4) HÜDEYBİYYƏ SÜLHÜ*

Mühacirlər hicrət edəndən bəri,
Məkkədə qalmışdı ev – eşikləri.
Vətən həsrətilə qovrulurdular,
Ata – baba yurdun unutmurdular.
Vətənin sevirdi hər bir müsəlman,

Onlara hər şeydən müqəddəs olan,
Kəbəyi – müəzzəm Məkkədə idi,
Ziyarət etməksə mümkün deyildi.
Hicrətin altıncı ili Peyğəmbər,
Əshabi – Kiramə eylədi xəbər.
Müqəddəs Məkkəyə gedəcəklərin,
Kəbəni ziyarət edəcəklərin.
Sonra da onları etdi xəbərdar:
-Allahın evinə gedən zəvvarlar,
Silah götürməyə etməsin hünər,
Çünki döyüşə yox, Həccə gedirlər.
Müsəlmanlar buna çox sevindilər,
Hazırlıq gördülər min dörd yüz nəfər,
Zilqədə ayında onlar qalxdılar,
Qurbanlıq götürüb yola çıxdılar.
Hamısı ehrama bürünmüş bu dəm,
Qabaqda gedirdi Rəsuli - əkrəm.
Xəbəri eşidən qureyşililər,
Xalid ibni Valid iki yüz nəfər,
Atlı götürərək yola üz qoyar.
Onları uzaqdan görən zəvvarlar,
Razı deyildilər qan tökülməyə.
Düşmənlə üz – üzə gəlməsin deyə,
Yolları daha da uzaq etdilər,
Dağlar araslndan çıxıb getdilər.

Hüdeybiyyə adlı bir yerdə karvan,
Məkkəyə az qalmış durdu, bu zaman
Məkkədən axışıb gələn elçilər,
Rəsuli - əkrəmə qəti dedilər;
-Məkkəyə girməyə etməyin hünər,
Ziyarətə izin verməyəcəklər.
Peyğəmbər fikrini bildirdi fəqət:
-Gəlmişik dava yox edək ziyarət.
Bütpərəstlər yenə inad etdilər,
Danışıq aparmaq üçün Peyğəmbər,
Osmana on nəfər qoşur mühacir,
Məkkəyə onları elçi göndərir.
Elçilər orada ləngidiyindən,
Belə bir şayiə yayılır, həmən.
Onları həbs edib, ya öldürüblər.
Bunu eşidərkən durub Peyğəmbər,
Əshabın bir ağac altına yığır,
Beyətə onları bu an çağırır.
Qəmə qəbzəsindən tutaraq bir – bir
Bütün müsəlmnlar ona and içir.
Peyman bağladılar son damlayadək,
Canların bu yolda qurban verəcək.
Orada gördülər əsil ülfəti,
Görüşə dedilər “Rizvan beyəti”.
Bu görüşdən keçir, bir gün sonradan

Məkkədən elçiylə qayıdır Osman.
Razılığın verir Rəsuli - əkrəm,
Sülh müqaviləsi bağlanır bu dəm.
Yazılış zamanı müqaviləni,
Peyğəmbər deyirdi, yazırdı Əli.
Yazdı "Bismillahir – Rəhmanir – Rəhim".
Elçi: -"Ər Rəhmanir – Ər Rəhim" bu kim?
Peyğəmbər elçiyə eylədi izah:
-Bu işdə Allaha apardıq pənah.
Elçi dedi: -Dayan, dur elə yazma,
"Allah adıyla" yaz, çox yerə yozma.
Elçi narazılıq edəndə fəqət,
Sadəcə "Bismillah" yazdırdı Həzrət.
"Allahın Rəsulu" yazılan zaman,
Təkidlə imtina eylədi ondan:
-Səni Rəsul kimi bilsəydik əgər,
Niyə vuruşurduq indiyə qədər?
Peyğəmbər Əliyə verdi tapşırıq,
"Rəsul" kəlməsini poz getsin artıq.
Həzrəti Əlinin əli gəlməyir,
"Rəsul" kəlməsini poza bilməyir.
Həzrət öz əliylə bu sözü pozar,
Muhəmməd Əbdullah oğlu yazdırar.
Qərarın şərtləri yazılan zaman,
On il müharibə oldu qadağan.

Bu il ziyarəti etdilər yasaq,
Lakin bu gələn il mümkün olacaq.
Həcc mərasimin keçirmək üçün,
Zəvvarlar qalacaq cəmisi üç gün.
Ziyarətə gələn hər bir müsəlman,
Məkkəyə girəcək silah almadan".
Bir neçə əlavə şərtlər yazıldı,
Hər iki tərəfdən möhür basıldı.
Bu şərtlər çox ağır olsa da ancaq,
Peyğəmbər bunlarla razılaşaraq.
Buna "fəthi mübin" adını verir,
Uzaqgörənliyin aşkar göstərir.
Sonralar burada yazılanların,
Xeyrinə olacaq müsəlmanların.
Başların qırxdırıb kəsdilər qurban.
Həzrət Mədinəyə getdiyi zaman,
Yolda nazil oldu "Fəth" surəsi,
Onlara vəd etdi zəfər müjdəsi.
Gedib Mədinəyə çatdılar artıq,
Müsəlmanlar içrə yox narahatlıq.
Sülh müqaviləsi olmuş bərqərar,
Islam ordusunu tanıyırdılar.
Qərar qəbul etdi Peyğəmbər qəti,
Hər yerə yaymalı islamiyyəti.
Elçilər göndərdi dərhal İrana,

Bizansa, Misirə, Həbəşistana.
Böyük dövlətlərə namə göndərir,
Onları islama o, dəvət edir.
Gümüşdən düzəlmiş möhürü vardı,
"Muhəmmədən Rəsulüllah" yazardı.
Iran hökmüdarı məktubu almış,
Allahın adıyla görür yazılmış.
Sonra da öz adın Rəsuli - əkrəm,
Xosrovun adından yazdırmış əqdəm.
Bunu təhqir sayıb Xosrov bağırmış,
Elçini qovaraq məktubu cırmış.
Bəzi hökümdarlar oldular xoşhal,
Məktubuna cavab yazdılar dərhal.
Bir qismi islama eylədi səcdə,
Misirin hakimi gələrək vəcdə,
Həzrətə göndərdi iki cariyə,
Bunlardan birini adı Mariyə.
Bu qızlar haqqında bir az sonradan,
Söhbət açılacaq bir yaxşı zaman.

## *5) XEYBƏRİN FƏTHİ*

Xeybər Mədinədən bir qədər kənar,
Şimal yol üstündə tutmuşdur qərar.
Ərazisi münbit səfalı yerdir,

Əsas əhalisi yəhudilərdir.
Əksəri burada sakin olanlar,
Bir vaxt Mədinədən qovulmuş onlar.
Hicrətin altıncı ilinin sonu,
Həzrəti Peyğəmbər eşidir bunu.
Xeybərdə yaşayan yəhudilərlə,
Islam düşmənləri vermiş əl - ələ.
Qətəfanlılarla bağlayır saziş,
Islamı boğmağa ayağa qalxmış.
Yerli ərəbləri qaldırıb yığar,
Mədinəyə hücum hazırlayırlar.
Rəsuli - əkrəmin əsas məqsədi,
Sülh yoluyla bunu yatırmaq idi.
Odur ki, Xeybərə elçilər gedir,
Görür yəhudilər lovğalıq edir.
Mədinədən sürgün olanlar hamı,
Din kimi tanımır əsla islamı.
Heç bir müqavilə bağlamayaraq,
Elçilərə deyir, gəlmisiz nahaq.
Müsəlmanlar ilə edir ədavət,
Elçilərdən bunu eşidir Həzrət.
Mədinədən yürüş etdiyi zaman,
Həzrəti Peyğəmbər eyləyir elan:
-"Qarşıdakı hərbin əsas əmalı,
Qənimətdən qəti söz olmamalı,

Düşmən hərəkətə keçməzdən qabaq,
Onların Xeybərdə qarşısın alaq.”
Min altı yüz nəfər üç günə qədər,
Xeybərə yetişdi cihad edənlər.
Həzrəti Peyğəmbər sülh təklif edir,
Yəhüdilər bunun əksinə gedir.
Təcrübələrinə əsaslanaraq,
Hazır vəziyyətdə əllərdə yaraq,
Pəhləvanlarına güvənirdilər.
Çəkinmədən hərbə qərar verdilər.
Peyğənbər əmr etdi başlandı savaş,
Müsəlmanlar keçdi hücuma birbaş.
Xeybərdə yerləşən yeddi qaladan,
İkisini təslim etdilər asan.
Naim qalasında çətinləşdi iş,
Əvvəl Əbu Bəkr hücuma keçmiş.
Qaladan atılan ox atəşləri,
Onu məcbur etdi qayıtsın geri.
İkinci gün Ömər döyüşə girdi,
Nə qədər ardıcıl hücum edirdi,
Onunda üzünə tale gülmədi,
Heç cəhdilə qalanı ala bilmədi.
Peyğəmbər bu zaman: - Sabah ələmi,
Elə bir kişiyə verəcəyəm ki,
Mütləq qələbəylə geri dönəcək,

Çünki o, Allahın dostudu gerçək.
Səhər tez ələmi Əliyə verir,
Xeyir – dua ilə onu göndərir.
Hücuma başlayır Həzrəti Əli,
İldırımtək kəsir doğrayır Əli.
Bir ara Əlinin döyüş zamanı,
Əlindən çıxaraq düşür qalxanı.
Daha da qızışır Allahın şiri,
Əlinə keçən tək qapının biri,
Yerindən qopardıb qaldırır bunu,
Qalxan əvəzinə işlədir onu.
Naim qalasını tez alıb Əli,
Kamus qalasına gedir irəli.
Onun qarşısına çıxır bu zaman,
Qalanı qoruyan güclü pəhləvan.
Adı Mərhab, özü əslən yəhudi,
Yetmiş cəngavərə bərabər idi.
Meydana girdilər onlar təkbətək,
Mərhəb özün bir an tərifləyərək,
Şəninə yazılmış şerlər dedi,
O ki var, özünə tərif eylədi:
-Mən sınaqdan çıxmış bir pəhləvanam,
Vurub öldürməyə doğmuşdur anam!
-Mənim də adlarım Murtəza, Heydər,
Qarşıma çıxanlar iki bölünər!

Bir əlində qılınc, birində qalxan,
Üz – üzə gəldilər iki pəhləvan.
Çox gedən şiddətli mübarizədə,
Mərhab ancaq oldu müdafiədə.
Əli son zərbəni endirdi ona,
İkiyə bölünüb düşdü bir yana.
Allahın sevimli qüvvət sahibi,
Xeybərdə ad aldı “Xeybər Fatehi”.
Başqa qalalarda alındı bir – bir,
Müsəlmanlar nə var ələ keçirdir.
Düşmənlərdə artıq qalmamışdı hal,
Yəhudilər təslim oldular dərhal.
Onların haqqında görüldü tədbir,
Gəlirləri “Beytülmal-a” verilir.
Xeybərin sülhündən sonra Peyğəmbər,
Orada istəyir qalsın bir qədər.
Yəhudilər verir ona ziyafət,
Süfrəyə qoyarlar zəhərlənmiş ət,
Bir tikə götürüb ağzına salmış,
Xörəyin tamından şübhəli qalmış,
Tikəni az müddət çeynəyən zaman,
Ağzından çıxarıb atır udmadan.
Yanındakılardan Bəşir udantək,
Oradaca ölür zəhərlənərək.
Xörəyi bişirən Zeynəb bu zaman,

Təqsirin boynuna alır qorxmadan:
-Sınamaqdan ötrü etmişəm dedi,
Əgər hökmdarsa, ölməli idi,
Bunu bilirdim ki, əsil Peyğəmbər,
Hiss edib yeməkdən imtina edər.
Onun günahından keçsə də Həzrət,
Qız canın qurtara bilməyir fəqət,
Ölən döyüşçünün qohumlarından,
Onu öldürürlər artıq bu zaman.
Ordu Mədinəyə zəfərlə döndü,
Fərəh hissi ilə qəlblər döyündü,
Sonuncu dəstəylə Cəfəri – Təyyar,
Həbəş ölkəsindən qayıtmışdılar.
Peyğəmbər Cəfərin üzün öpərkən:
- Hansına daha çox sevinim görən,
Bilmirəm Xeybərin fəth işinə,
Ya da ki, Cəfərin bu gəlişinə.
Xeybərin fəthindən sonra bu ara,
Qadağan edilir müsəlmanlara.
Vəhşi heyvanların ya qatır, eşşək,
Caynaqlı quşların ətini yemək.
Hamiləlik dövrü qutaranadək,
Əsir qadınlarla yaxınlıq etmək.
Qızılı, gümüşü alıb satanlar,
Qiymətinə uyğun satmalı onlar.

## *6) MUTƏ HƏRBİ*

Səkkizinci ili hicrətin oldu,
Peyğəmbər göndərdi şimala ordu.
Tarixçilər bunu belə şərh edir,
Bu hücuma iki səbəb göstərir.
Hicrətin altıncı ilində Həzrət,
Ətrafı islama edəndə dəvət.
Busra hakiminə o zaman hələ,
Məktub göndərmişdi bir elçi ilə.
Məktub alantək Harisi Həssan,
Elçini etmişdi qanına qəltan.
İkinci səbəbin belə deyirlər,
Bir neçə elçini yenə Peyğəmbər,
Göndərir islama dəvət eyləsin,
Mutə şəhərində olan canişin,
Məktubu cıraraq vəhşilik edir,
Gələn elçiləri qətlə yetirir.
Odur ki, Həzrəti Rəsuli – Xuda,
Vəzifə bölgüsü edir orduda.
Üç min əsgər olan orduya, Zeydi
Başçı təyin edib bayrağı verdi.
Sonra əsgərlərə etdi nəsihət,
Ehtiyatlı olun tapşırdı Həzrət:
-Qadın, uşaqları öldürmək olmaz,

Evləri yandırmaq hünər sayılmaz,
Ağacları kəsib tələf etməyin,
Təxribat yolnu tutub getməyin.
İslamın ordusu hərəkət edir,
Qeysərin valisi bunu eşidir,
Bütün qüvvəsini bir yerə yığır,
Rum əsğərlərin də Qeysər toplayır.
Yüz min nəfərlik bir qüvvətli ordu,
Üç min nəfr ilə üz – üzə durdu.
Sayca üstün olan xiristianlar,
Müsəlmanlar ilə hərbə başlayar,
Islamın ordusu gəldi heyrətə,
Rast gəlməmişdilər belə qüvvətə.
Geriyə dönmək də deyildi mümkün,
Döyüşə girməyi tutdular üstün.
Dillərində böyük Tanrının adı,
Mutədə bir gərgin döyüş başladı.
Hərbi təchizatda mükəmməl olan,
Düşmənlər hücuma keçir qorxmadan.
Ələmdar Zeydi ilk şəhid edirlər,
Bayrağı tez ondan alaraq Cəfər,
Düşmən üzərinə hücuma keçir,
Qılıncı şimşək tək doğrayır, biçir.
Onun dörd tərəfdən yolun kəsdilər,
Kafirlər hər iki qolun kəsdilər.

Ələmə sarılıb yerə düşərkən,
Bayrağı Əbdullah qaldırdı yerdən.
Onu da tezliklə etdilər həlak,
Faciə baş verdi daha hövlinak.
Hərə bir tərəfə qaçır bu zaman,
Xalid ibni Valid dərhal durmadan,
Dağılan ordunu qaytardı geri,
Bir yerə topladı tez əsgərləri,
Onlara ruh verib qaydaya saldı,
Özü də bayrağı əlinə aldı.
Əsgərlik dühasın göstərdi bu an,
Vuruşur düşməni saya almadan.
Öndəki qüvvəni arxaya çəkir,
Arxa qüvvələri önə keçirir.
Düşmənlər özlərin itirdi birdən,
Yeni qüvvə gəlib elə bilərkən,
Xalid hücum əmrin verdi bu zaman,
Geri çəkildilər qorxularından.
Xalid bu məqamda taparaq fürsət,
Əskərlərin geri çəkir nəhayət.
İslamın ordusun o xilas edir,
Düşmənlər də qorxub təqib etməyir.
Nə qalib, nə də ki, məğlub olmadan
Onlar Mədinəyə gəlir bu zaman.
Vuruş məharətin Həzrət eşitdi,

Xalidin adını "Seyfullah"etdi.
Döyüşdə qolların itirmiş Cəfər,
Bunu belə izah etdi Peyğəmbər:
-İki qollarına əvəz olaraq,
Cənnətə girməyə verildi qanad.
O, mələklər ilə uçur barabər,
Cəfərə, Cəfəri-Təyyar dedilər.
Mutə döyüşündən qalib olmadan,
Uzun sürən doyüş aparılmadan,
Bizanslılar bundan razı düşdülər,
Tez qurtarmasına sevinmişdilər.
Xalidin ağıllı hərb dühası,
Bir növ yaratmışdı zəfər havası.
Mütə döyüşündən sonra Qətəfan,
Nəçit, Süleym, Eşcə, Fəzarə, Zübyan,
Sair qəbilələr oldu müsəlman,
Onların sayları artır durmadan.

## *7) HÜNEYN DÖYÜŞÜ VƏ TAİFİN MÜHASİRƏSİ*

Müsəlmanlar əldə etmişdi zəfər,
Allaha həmd – səna eləyirdilər.
Fəht etmiş Məkkəyi – mükərrəməni,
Hamısı ziyarət etmiş Kəbəni.
Bir sevinc içində onlar bəxtiyar,
Böyük bir arzuya qovuşmuşdular.

On beş gün keçmişdi Məkkə fəhtindən,
Acı xəbər çatdı bir neçəsindən,
Məkkəyə yaxın bir yerdə yaşayan,
Bütlərə qəlbləri bağlanmış olan,
Havazin adında bir tayfa yaşar,
Bütlərin haqqında eşidib coşar:
-Müməmməd Məkkəyə gələndən bəri,
Müsəlmanlar qırıb, çatır bütləri.
Özlərinə növbə çatana qədər,
Iyirmi minədək toplamış əsgər.
Kömək etmək üçün öz şirk dostuna,
Səqif qəbiləsi qoşuldu ona.
Üç – dörd qəbilədən yığılan ordu,
Əlverişli yerdə pusquda durdu.
Həzrəti Peygəmbər bunu eşidər,
On iki minədək yığıldı əsgər.
Onlardan iki min məkkəli oldu,
Bütpərəstlərdən də ona qoşuldu.
Hüneynə çatdılar başda Peyğəmbər,
Düşmən hiyləsindən xəbərsizdilər,
Sabahın dan yeri sökülən zaman,
Keçərkən keçidin dar boğazından,
Hər iki tərəfə düzülən düşmən,
Onları dövriyə aldılar birdən.
Islam ordusna göydən ox yağır,

Əsgərlər bir anlıq çaşıb qaldılar.
Mühasirə yeri dar olduğundan,
Sərbəst döyüşməyə yox idi imkan.
Yanlış hədəfə də atanlar oldu,
Geriyə qaçmağa səbəb oldu bu.
Əsas səbəblərdən biri budur ki,
Ordunun tərkibi yekcins deyildi.
Yenicə islamı qəbul edənlər,
Ürəksiz döyüşür onlar bir təhər.
Hətta müşrik vardı yetmişə qədər.
Sanki bunlar bir növ cəsus idilər.
Odur ki, pozğunluq baş verdi bu an,
Geriyə qaçırlar qorxularından.
Necə ki, əsgərlər geriyə döndü,
Əbu Süfyan bunu görüb öyündü:
-Bu qaçışın önü dənizə qədər,
Bunun qarşısını kim ala bilər?
Mənalı gülüşlə şadyana deyir,
Təlha oğlu Osman dərhal sevinir:
-Bu gün Mühəmməddən aldım intiqam.
Əlava eləyir bir başqa adam:
-Bax bu gün necə də sehr pozuldu,
İslam əsgərləri didərgin oldu.
Qarışıq bir səhnə təcəssüm edir,
Vəziyyət doğurdan çox çətinləşir.

Əsgərlər qaçırdı hərə bir yana,
Həzrəti Peyğəmbər çıxdı meydana.
İstəyir dəvəsin irəli sürsün,
Düşmənin qabağin saxlamaq üçün.
Bunu görən kimi əmisi Abbas:
-Bu ki, təhlükədir belə yaramaz,
Deyərək  gur səslə qışqırdı bar-bar:
-Əqəbədə beyət edən ənsarlar,
And içib söz verən ey mühacirlər,
Qayıdın geriyə görmürsüz məgər.
Mühəmməd burdadır, hey səsləyirdi.
Abbasın gur səsi cingildəyirdi.
Çağırış onlara verdi cəsarət,
Hamısı geriyə etdi hərəkət.
Dərin bir qəflətdən ayılan zaman,
Hücuma keçdilər hərə bir yandan.
Ənsar, mühacirlər qılınc çəkdilər,
Dinsizlər qorxudan oldu dərbədər.
Qarşılarındakı yalın qılınclar,
Havanı yararaq, parladı par – par.
Düşmən bu hücuma tab gətirmədən,
Geri çəkildilər vaxt itirmədən.
Onlar bu dönüşü anlamadılar,
İslam əsgərləri qızışıb coşar:
-Haydı Xəzrəclilər, haydı ey ənsar,

Haydı mühacirlər! deyib qışqırar.
Həzrət görən kimi bu mənzərəni,
İslamın ordusu qovur düşməni:
-Bax indi gör necə isindi ocaq,
Düşmənlər içinə düşüb qaça – qaç.
Bir ovuc çınqıl daş alaraq yerdən,
Düşmən arxasınca tulladı birdən.
Havazinlər qaçır, geri baxmadan,
Müsəlmanlar hücum edir arxadan.
Arvad – uşaqların buraxıb qaçar,
“Şirin canlarını” aparırdılar.
Müsəlmanlar yenə qazanır zəfər,
Heç bir döyüşlərdə indiyə qədər,
Qiymətli qənimət ələ keçməmiş,
Dəvə, qoyun vardı, bir xeyli gümüş.
Necə ki, düşməni təslim etdilər,
Havazin rəisi Malik hiyləgər,
Taifə qaçmağa tapmışdı imkan.
Onula birləşən Səqif bu zaman,
Öz qalalarına qorxaraq girir,
Möhkəm qapılara qıfıl keçirir.
Şirkin son yuvası burdadır, indi,
Onu da dağıtmaq lazım bilindi.
Müşrükləri təslim etsinlər deyə,
Taifi aldılar mühasirəyə,

Müsəlmanlar hər növ tədbir gördülər,
Ərəblər görməmiş o dövrə qədər,
Qalanı deşməyə getdi mancanaq,
Bundan da bir fayda olmadı ancaq.
Aramsız hücumlar oldu dalbadal,
Onlar müqavimət göstərir dərhal,
Oxların ucunda alovlar atır,
Taxta mancanaqı vurub yandırır.
İçəriyə girmək olmadı mümkün,
Haram aylara da qalmışdı az gün.
Bu aylar hamıya verir bir əsas,
Mühasirəni çox saxlamaq olmaz.
Çünki taiflilər görüb ehtiyat,
İçəriyə yığıb hər ləvazimat.
Onlar bu qalada yatdı tülkütək.
Çıxmaları üçün gözləmək gərək.
Çox uzun müddətə ərzaqları var,
Çətin bu tezliklə təslim olsunlar.
Mühasirə çəkdi bir aya qədər,
Bu işdən əl çəkib geri döndülər.
Ciranəyə tərəf onlar gedərkən,
Havazın tayfası onu görərkən,
Ağsaqqallar gəlir bir necə nəfər,
Rəsuli - əkrəmdən xahiş edirlər,
Onları islama qəbul eyləsin,

Geriyə qaytarsın həm əhli – beytin.
Peyğəmbər onların qəlbin etdi şad,
Bütün əsirləri eylədi azad,
Əsirlər içində bir qadın bu dəm,
Soruşur: - Hardandır Rəsuli – əkrəm?
Peyğəmbər tanıdı onu görəntək.
Süd bacısı Şeyma yaxın gələrək,
Həzrət hörmət edib tutdu  hal - əhval,
Əbası üstündə oturtdu dərhal.
Uşaqlıq illərin xatırladılar,
Yamaclarda necə qaçıb, oynayar.
Həzrəti bir anlıq qəmləndirdi bu,
Həliməni, əri Harisi sordu,
Şeyma doluxsunub gözlərin silir:
-Rəhmətə gediblər, söyləyə bilir,
Peyğəmbər məhəbbət göstərdi ona.
Bir neçə baş qoyun pay verdi ona.
Əsirlikdən  azad edəntək onu,
Obasına tərəf tutdu yolunu.
Peyğəmbər Malkə göndərdi xəbər,
Gəlib o, müslman olarsa əgər,
Əmlakı özünə veriləcəkdir,
Ailəsi azad ediləcəkdir.
Malik bu xəbəri eşidən zaman.
Səqifilərdən o, xəlvət, durmadan

Atına minərək yola düzəldi,
Rəsuli - əkrəmin yanına gəldi.
Təslim olduğunu eylədi elan,
Şəhadət verərək oldu müsəlman.
Özünə verdilər malın – dövlətin,
Əhli - əyalını, bütün sərvətin.
Sonrada göstəriş verdi Peyğəmbər,
Üstəlik yüz dəvə bəxşiş verdilər.
Belə bir ürəyə sahib hünərdir,
Şirinliklə dinə dəvət edərdi.
İnsanlara qəti zor işlətmədən,
Heç bir qəbiləyə minnət etmədən,
Müsəlmançılğa edərdi dəvət,
Bir haqq tanıyırdı, o da ədalət.
Alınan qənimət bölünən zaman,
“Beytülmala” xums ayrıldı ondan.
Bərabər böləndü yerdə qalanlar,
Hərəyə dörd dəvə düşdü, qırx davar.
Həzrət tərəfindən quriyeşililər,
Qənimət alanda fərqlənmişdilər.
Xumsun hesabına Əbu Süfyana,
On nəfər ağsaqqal əşrəf olana,
Yüz dəvə hədiyyə verdi Peyğəmbər.
Odur ki, ənsarlar gileyləndilər:
-Hünər göstərməyən bu insanlara,

Bizdən çox qənimət verdi onlara.
Ənsarın fikrini hiss etmiş Həzrət:
-Qureyşə sizdən çox verdim qənimət.
Onlara verdiyim maldan ötrü siz,
Məndən nahaq yerə gileylənirsiz.
Baxmadım dövlətə, baxmadım mala,
Bu dünya malını verdim onlara.
Baxın, dəvələrin sürürlər çölə,
Mən isə qalmışam ənsarlar ilə.
Deyərək onların könlünü alır,
Müqəssir olub hamı ağlayır:
-Biz buna razıyıq, ya Rəsulüllah!
Sənə hər şey bəlli, könüllər agah.
Biz öz payımızdan razıyıq artıq,
Heç bir gileyimiz yoxdur azacığ.
Razıyıq sən ilə bir yerdə olmaq,
Xeyirdə, şərdə də birlikdə qalmaq.
Səxavət sahibi olmuş Peyğəmbər,
Hər nəyin bu yolda verib sərf edər.
Yeganə arzusu islamı yaymaq,
Bu dünya malından qaçardı uzaq.
Ən qəddar düşmənin o edərdi əfv,
Qəlblərin çəkərdi islama tərəf.
Bütün qənimətlər bölündü tamam.
Rəsulüllah ilə əshabı – Kiram,

Yenidən Məkkəyə geri döndülər.
Bir neçə gün keçdi, sonra Peyğəmbər
Qurani – kərimi təlim etməyə,
Müsəlmanlara düz yol öyrətməyə,
Layiq bildi Muaz ibni – Cəbəli,
Məkkə şəhərinə qoydurdu vali.
Gəlib Mədinəyə yetişən zaman,
Razılıq etdilər böyük tanrıdan.
Bütün döyüşlərdə indiyə qədər,
Qazanılmamışdı belə bir zəfər.
Artıq islamiyyət vüsət alırdı,
Bütün cilvəsiylə parıldayırdı
Əmin – amanlıq bir həyat quruldu,
Mədinə islamın mərkəzi oldu.
Kəb adında məşhur bir şair vardı,
Rəsuli - əkrəmə həcv yazardı.
Odur, onun qanı halal edildi,
Ölümü haqqında fərman verildi.
Islam sürət ilə yayılan zaman,
Qaçıb gizlənmişdi o, qorxusundan.
Kəbin bir qardaşı müsəlman idi,
Gəlib Peyğəmbərdən o əfv isdədi.
Həzrət keçir onun günahlarından,
Sonra da Kəb gəlib oldu müsəlman.
Həzrəti mədh edən qəsidə dedi,

Həzrət qəsidəni bəyənmiş idi,
Yanında başqa şey olmadığından,
Əbasın hədiyyə verir bu zaman.
Həmin qəsidəni tərif edirlər,
"Qəsidəyi – bürdə" adın verirlər.
Həzrət heç bir kimə kin bəsləmirdi,
Müsəlman olanlar əfv edilirdi.
Tayy qəbilsindən xiristianlar,
Müsəlmançılığa qarşı vuruşar.
Məşhur səxavətli Hatəmin oğlu
Adiy də başçıtək tutar bu yolu.
Qəddar düşmən idi müsəlmanlara,
Peyğəmbər Əlini göndərir ora.
Əli vuruşmağa başlayan zaman,
Adiy Şam tərəfə qaçır qorxudan.
Əli qəbilənin bütlərin qırar,
Ələ keçənləri əsir aparar.
Mədinəyə gələn əsirlər ilə,
Hatəmin qızı da keçmişdi ələ.
Rəsuli - əkrəmi gördüyü zaman,
Dedi: - Atam ölüb, yaxınım olan
Qardaşımda qaçdı, yoxdur heç nəyim,
Azadlığım üçün fidyə ödəyim.
Bir nicatım sənə sığınmaq ancaq,
Mərhəmətin ilə azad olunmaq.

Səxavətli comərd olubdur atam,
Kasıblara yardım edərdi müdam,
Heç bir tələbləri o rədd etmədən,
Malını, pulunu verərdi həmən.
Fağır – füqəraya daim əl tutar,
Əsir düşənləri gedib qurtarar,
Belə bir adamın qızıyam, baxın.
Peyğəmbər hörmətlə gələrək yaxın:
-Atan insanpərvər bir adam idi,
Azaddır Hatəmin qızı! – söylədi.
Allah mərhəmətli şəxsləri sevər.
Əvəzində qat – qat mükafat verər.
Yol xərci verdilər, həm də pal – paltar,
Qardaşı yanına yola saldılar.
Bu qız Peyğəmbərin mərhəmətini,
Rəhimkarlığını, fəzilətini,
Qardaşına bir – bir söyləyir nə var.
Adiy dinlədikcə tez verir qərar,
Gedib Mədinəyə gətirsin iman.
Həzrəti məsciddə gördüyü zaman,
Evinə aparır onu Peyğəmbər.
Yerdə əyləşərək söhbət edirlər.
Adiy sadə evə baxır maraqla,
Heç bir şey görməyir o, təmtəraqla.
Bu evin yox aşıb – daşan sərvəti,

Şahların evinə bənzəmir qəti.
Onun rəftarından apaydın görür,
O, adi adamlar tək həyat sürür.
Bu həyat tərzinə o olub heyran,
Dini qəbul edib oldu müsəlman.
Həzrətin yanına adamlar gəlir,
Ya heyətlər ilə ya da ki, bir – bir.
Gələnlərlə söhbət edir Peyğəmbər,
İslamı könüllü qəbul edirlər.
İslamın günəşi Ərəbistana,
Bütün cilvəsilə düşür hər yana.
O nura can atan bütün ərəblər,
İrəli sürmədən heç bir tələblər,
Uzaq ölkələrdən axışıb gəlir.
İslamın şöhrəti artır, yüksəlir.
İslamın qüdrətin eşidən, bilən,
Heyətlər gəlirdi hər bir tərəfdən.
O biri tərəfdən Rəsuli - əkrəm.
Mürşidlər göndərir ətrafa bu dəm,
Məktub yazır ərəb rəyislərinə,
Dəvət edir hamını müqəddəs dinə.
Yəməndə, Ommanda xiristianlar,
Yəhudilər ilə qarışıq yaşar.
Zərdüşt dinindən də olan var idi,
Bu xalqlar haqqında Peyğəmbər dedi:

-Onları vergiyə bağlamaq gərək,
İslama girməyə məcbur etməmək.
Bu icazə şirkə məxsus deyildir,
Əhli – kitablara aid edilir.
Başqa adətlərə toxunulmadan,
Bu ildən sələm də oldu qadağan.
Zəkat toplanırdı imkanlılardan,
Ondan kasıblara edilir ehsan.
Bu işi görməyə məmurlar gedir,
İslam sürət ilə inkişaf edir.
Qaranlıq ruhları aydınladırdı,
Sərhədləri aşıb kamal tapırdı.

### *8) TƏBUK HƏRBİ*

İslamiyyət bütün Ərəbistana,
Yayıldığı zaman o hər bir yana,
Şam tərəfdən gələn müsəlmanlardan,
Mədinəyə çatır xəbər bu zaman,
Bizans zəfər əldə etmiş İranda,
Fatehlik eşqinə düşmüş bu anda.
Məhv etməkçin onlar islamiyyəti,
Bir yerə toplayıb gücü – qüvvəti.
Ona tabe olan xiristiyanlar,
Bizans ordusuna qoşulmuş nə var.
Müsəlmanlar gəldi hiddətə bundan,
Hicazda bərk qıtlıq vardı o zaman.

Istidən od tutub yanır hər tərəf,
Heyvanlar qırılıb olmuşdu tələf:
Bəzisi istidən gileylənərək,
Orduya qoşulmaq istəməyərək,
Əssasız bəhanə uydurub deyər,
Onlara qoşulub tez münafiqlər:
-İran üzərində qələbə çalmış,
Ətraf ölkələri qorxuya salmış,
Mühəmməd Bizansı nə hesab edir?
Deyərək, orduda qorxu törədir.
Belə şaiyələr yayıb durdular,
Xalqın əl – ayağın soyudurdular.
İslamın düşməni ikiüzlülər,
Hərbə qoşulmaqdan imtina edər.
Hər cür maneçilik edir, odur ki,
Səfərə hazırlıq ağır gedirdi.
Ancaq qəlblərində iman olanlar,
Bu bəhanələrə məhəl qoymayar.
Orduya qoşulur belində şəmşir,
Maddi fədakarlıq, hünər göstərir.
Əshabi – Kiramdan zəngin olanlar,
Əlində - ovcunda verdi hər nə var.
Bəziləri minik heyvanlarını,
Qadınlar dar günçün qalanlarını,
Orduya könüllü gətirib verər,

Vətənə məhəbbət hiss etdirirlər.
Doğurdan havalar keçirdi isti,
Gedən yerləri də çox uzaq idi.
Münafiqlər bunu bəhanə edir.
-"Cəhənnəm atəşi daha istidir".
Onların yadına salaraq Həzrət,
"Tövbə" surəsindən dedi bir ayət.
Peyğəmbər görmüşdü geniş hazırlıq,
Otuz min silahlı toplamış artıq.
Ordu Mədinədən çıxmazdan qabaq,
Həzrəti Əliyə: -Bu yol çox uzaq.
Səfərə mən gedib gələnə qədər,
Sənin himayəndə qalacaq şəhər.
Qoşun hərəkətə gəldiyi zaman,
Goy üzün almışdı qatı bir duman.
Görkəmli tədbirdə gedirdi ordu,
Iman sevgisində qəlblər coşurdu.
Münafiqlər o gün çıxanda yola,
Əksəri orduya qoşuldu zorla.
Iki gün çıxmışdı qoşun şəhərdən,
Əbdullah fikrini dəyişdi birdən.
Tərəfdarlarıyla geri çəkildi,
Ordunu tərk edib şəhərə gəldi.
Məqsədi bu idi, müsəlmanların
Arasında nifaq salsın onların.

Çox az bir zamanda həmin fitnəkar,
Əlinin haqqında şayiə yayar.
Həzrəti Əliyə belə dedilər:
-Əmisi oğlunu guya Peyğəmbər,
Arvad – uşaq üstə qoyub pasiban.
Əli bu səbəbdən qalıb ordudan.
Ya da ki, istidən qorxduğu üçün
Cihaddan imtina edib büsbütün.
Muhəmməd də onu istər – istəməz,
Yerində canişin qoyubdur əvəz.
Əli eşidəntək hər işin atdı,
Iki gün at qovub orduya çatdı.
Gəlişin mənasın biləndə Həzrət,
Bir xeyli sükuta dalır, nəhayət:
-İkiüzlüdürlər həmin adamlar,
Hər fitnə - fəsada desən əl atar.
Düşməni gözündən qaçırsan əgər,
Hər cürə iğtişaş, nifaq törədər.
Mən səni şəhərdə saxladım ki, sən
Məni bir vəzirtək əvəz edəsən.
Harunun Musaya yaxınlığıtək,
Sən də mənə elə nisbətsən, bişəkk.
Peyğəmbər deyilsən, bircə fərq budur.
Mən bir yerə getsəm, yerimdə otur.
Sonra da işarə etdi bir ehkam,

Peyğəmbərlərin mən sonuncusuyam.
Bunula onların söhbəti bitdi,
Əli Peyğəmbərdən razılıq etdi.
Ata suvar oldu uçurmuş kimi,
Mədinə tərəfə uçdu quş kimi.
Təbukə çatanda İslam ordusu,
Bizanslar bundan qorxdu doğrusu.
Onlar bu gəlişdən tutmuşdu xəbər,
Girib qalalarda gizlənmişdilər.
Görəndə ki, gəlir qüvvətli ordu,
Düşmən qüvvələri geriyə durdu.
Bizansın qorxduğun gördüyü zaman,
Ətrafdakı bəylər tez tapıb imkan,
Həzrətin yanına elçitək girir,
Vergi ödəməyə razılıq verir.
Xaçpərəstlərdən də elçilər gələr,
Onlarla bağlanır müqavilələr.
Öz məzhəblərində qalsınlar deyə,
Razılıq verirlər vergi verməyə.
Peyğəmbər döyüşsüz qazandı zəfər,
Müsəlmanlar geri dönmək istəyir.
Bir çoxları dedi: -Gəldik buradək,
Bəlkə Şam tərəfə bir hucum edək.
Peyğəmbərsə bunu qəbul etmədi,
Vəba xəstəliyi Şamda var idi:
-"Vəba olan yerə girməyin, xeyir"!

Geriyə qayıtmaq əmrini verir.
Ordu vuruşmadan döndüyü zaman
Nə şəhid verdilər, nə töküldü qan.
Təbuk döyüşündən bir qədər qabaq,
Münafiq tərəflər əlbir olaraq,
Quba məscidinin ziddinə çıxar,
Mədinəyə yaxın bir yerdə onlar,
Özlərinə ayrı məscid tikdilər,
Altında zirzəmi düzəltmişdilər.
Əslində bu məscid came deyildi,
Sui – qəsd cinayət yuvası idi
"Onlar dildə iman gətirdi aşkar,
Ürəklərindəsə kafir oldular".
Peyğəmbər Təbukə edərkən səfər,
Münafiqlər ondan rica etdilər.
Peyğəmbər məscidə yolun salaraq,
Bir dəfə orada namaz qılaraq,
Istifadəsinə versin icazə,
Gözəl xütbələrdən söyləsin bizə.
Həzrət bu xahişi qəbul etmədi,
Onlara qəti rədd cavabı dedi.
Bu səbəbdən onlar bağırdı bar – bar,
Hərbə gedənlərə qoşulmadılar.
Təbuk döyüşündən dönəndə ordu,
Peyğəmbər uçurtdu həmin o yurdu.
Münafiqlər bunu gördüyü zaman,
Sakit oturdular qorxularından.[1]

---

[1] "ALLAHIN ELÇİSİ"

## NİZAMİ ZÖHRABİ
### *PEYĞƏMBƏRİN (S) VİDA HƏCCİ*

Məkkə qovuşmuşdu indi dincliyə,
Nöqtə qoyulmuşdu hər iyrəncliyə.
Qalxırdı Kəbədən sədayi – Quran,
Yoxdu təvaf edən burda lüt – üryan.
Ərəb torpağında qalmamışdı büt,
Etmişdi o sata məbudlar süqut.
Yoxdu səcdə edən burda oda da,
Tək islam hakimdi yarımadada.
Bir il öncə Əli gəlmişdi bura,
Gəlib, gətirmişdi Qurandan surə.
Oxuyub surəni o, dönə - dönə,
Hamını çağırdı haqq olan dinə.
Qatıb müşrüklərin kefinə soğan,
Onlara etmişdi həcci qadağan.

Qarşıdan gəlirdi yenə Zilhiccə,
Hazırlıq edirdi növbəti həccə.
Elan olunmuşdu səfərin vaxtı,
Xəbərdar olmayan bir kimsə yoxdu.
Çatdı Zilqədənin iyirmi beşi,
Həzrət öz yoluna qoydu hər işi.
Olaraq bir səhər dəvəyə səvar,
Çıxdı Mədinədən minlərlə zəvvar.
Getdi Peyğəmbərin zövcələri də,
Yoxdu Mədinədə qalan biri də,

Getdi Meymunə də, getdi Hafza da,
Dilləri dualı, ruhən azadə.
Həccə gedənlərin sayı yüz mindi,
Allah bu səfərə Özü zamindi.
Yoxdu ürəklərdə bir qorxu – hürkü.
Sərinə vermişdi yerini bürkü.
Yoxdu qafiləyə basqın edən də,
Şaddı yola salan, şaddı gedən də.
“Ləbbeyk” söyləyirdi indi ağızlar.
Pənah apardı Haqqa ağ üzlər.
Peyğəmbər düşərgə saldı Əbtəhdə,
Gözlədi bitincə birinci həftə.
Zilhiccə ayının gəldi səkkizi,
Əvvəlcə ehramı bağladı özü.
Yollandı Peyğəmbər ordan Minaya,
Qapıldı burada həmdü – sənaya.
O gecə sübhədək Minada qaldı,
Vacib namazları Minada qıldı.
Səhər tərk elədi Peyğəmbər dağı,
Ərəfat çölünə gəldi sübh çağı.
Qarşıda dururdu Məşərul – həram,
Allaha xoş gələn çox iş, çox məram.
Rəmyi – Cəməratda mövcud qaydanı
Gözləyib, başladı o da şeytanı.
Həcc başa çatırdı, bu ərəfədə
Qayıtdı təzədən o, Ərəfata.
Həmd etdi Peyğəmbər Allaha birdə,
Durdu Namirədə hündür bir yerdə.
Başladı ucadan həcc xütbəsinə,

Qanad saxladılar quşlar səsinə.
Dikib nəzərini burdan Məşərə,
Buyurdu xitabən bütün bəşərə:
-İnsanlar! – söylədi – məni eşidin,
Çaxdı ildırımtək səsi mürşidin.
-Duyuruq biz bu gün sonsuz iftixar,
Gördük Haqq nə təhər şirki etdi xar!
Nəsib olmayıbdır heç bir faniyə,
Durmaq bu məqamda heç bir saniyə.
Mənfur qanunları qırıb, tapdadıq,
O iyrənc keçmişə daha biz yadıq.
Etdik cəhaləti biz əzik – əzik,
Qiyamətə qədər biz yenilməzik!
Bir baxın dünyamız necə dəyişdi,
Çünkü döyüşümüz haqlı döyüşdü.
Bir vaxtlar qan içən cahil nəsildik,
Sonda cəhalətə düşmən kəsildik.
Gəldik bir araya Allah naminə,
Mömin qardaş olsun, dedik, möminə.
Yerdə təməlini qoyduq barışın,
Dedik, yaxşılıqda ancaq yarışın.
Qatdı səsimizə ellər səsini,
Qoyduq yenə dövrün bünövrəsini.
İttiham eylədik biz sələmçini,
Bütlərin üzünə çəkdik qamçını.
Götürdük aradan şirki, zinanı,
Dağıtdıq təməldən qanlı binanı.
Yoxdur qan səvaşı, qalmayıb riba,
Cahillik büsbütün gedib qüruba.

Adəmdən yaranmış zürriyyət üçün
Açdıq işıqlı yol hürriyyət üçün.
Buyurdu xütbənin o, davamını:
-Rəbbimiz yaradıb, - dedi – hamını.
Fərqsiz yaranıbdır insanın ilki,
Bəndələr özləri uydurub silki.
Üstünlük vermeyib Allah heç irqə,
Təqvalı kəslərdir ən ali firqə.
Allah hər bir kəsin verib haqqını.
Bəyənməz O, zülmü, heç nahaq qanı.
Zülmə, zəlalətə baş əyən kəsin
Zəhərə döndərər hər bir tikəsin.
O, rəhbər yetirər hər bir xalqa bab,
Verər naşükürə nanəcib ərbab.
Yaxşını yamandan seçməyən millət,
Layiqdir ölüncə çəkməyə zillət.
Əzilmək ölümdən daha betərdir, -
Söyləyib, köksünü o, bir də dərdi.
Buyurdu: - Allaha qul olan bəndə,
Qiyamət günündə qalmaz daməndə.
Çünkü Ondan savay yoxdur Haqq olan,
Haqq Odur, qalanlar hamısı yalan.
Quldur Ona qul da, quldur varlı da,
Ən aciz bəndə də,ixtiyarli da.
Düşünün,quluqsa hamimiz madam,
Təkəbbür neyçündür, ey bəni – Adəm?!
Uymayın şöhrətə,bihudə vara,
Vurmayın kimsənin qəlbinə yara.
Bilin,verdiyini alar bu dünya,

Boş salar hamını yola bu dünya.
Allah qiyamətdə qurar tərəzi,
Birinin birində qalmaz çərəzi.
Qoymayın borcunuz o çağa qalsın,
Sahibi haqqını dünyada alsın.
İşinin dəyərin verin muzdurun,
Önündə üzüağ, başı düz durun.
Geydirin köləyə, geydiyinizdən,
Yedirin, özünüz yediyinizdən.
Əfv edin siz ona mümkün olanı,
Qoymayın ağlaya qəmgin olanı,
Bilin, müqəddəsdir mömindəki can,
Zinətdir, ümmana bir gilə mərcan.
Hər kəs həddi aşıb varsa ifrata,
Allah layiq bilər onu nifrətə.
Çalışın, olmayın belələrindən, -
Deyə köks ötürdü bir də dərindən.
Düşündü bəlkə də bu son görüşdü,
-Təbliğ elədimmi? – deyə soruşdu.
Hamı bir ağızdan söylədi: - Bəli!
Göylərə uzandı Həzrətin əli:
-Şahid ol, ya Rəbbim – dedi – bu günə.
Çatdırdı xütbəni həmdlə yekuna.

## HACI YUSİF QULAM MİRZƏ OĞLU
## *VİDA HƏCCİ*

Hicrətin onuncu ili peyğəmbər,
Həccə gedəcəyin eylədi xəbər.
Bütün müsəlmanlar agah oldular,
Getmək istəyənlər hamı intizar.
Peyğəmbər yuyunub, ehrama girdi,
Günorta namazın qılıb, bitirdi.
Zilqədə ayının iyirmi beşi,
Əhli - əyaliylə cümə ertəsi,
Böyük  qafilənin başında Həzrət,
Etdilər Məkkəyə doğru hərəkət.
Yüz on dörd minədək gedirdi zəvvar,
Məkkənin evlərin görəndə onlar,
"Ləbbeyk" sədaları göyə yüksəlir,
Dağlar da, daşlar da lərzəyə gəlir.
Kəbəyə girəndə Rəsuli - əkrəm,
Allaha həmd edib, söylədi bu dəm:
-"Allahdan başqa heç bir tanrı yoxdur!
Yeganədir, Onun şəriki yoxdur!
Hər şeyə qadirdir, mülk Onunkudur,
Yaşadan, öldürən bilin ki odur!
Vədini yerinə yetirən zaman,
Islam düşmənlərin etdi pərişan".

Cəhalət dövründən fərqli olaraq,
Ziyarət etdilər başqa bir sayaq.
Kəbəni dolanıb təvaf edənlər,
Yeddi dəfə bunu edir sərasər.
Sonra da Səfadan Mərvəyə qədər,
Qaçış mərasimin icra etdilər.
Ərəfat çölündə Rəsuli – Xuda.
"Vida" xütbəsindən dedi bunu da:
-Ey insanlar, mənə qulaq asın siz,
Dediklərimə də əməl ediniz.
Sizinlə bu ildən sonra bəlkə də,
Görüşə bilmədim daha bu yerdə.
Islamdan öncəki adətləri tam,
Ayağım altında tapdalayıram.
Siz də qəlbinizdən keçmişi silin.
Bütün müsəlmanlar qardaşdır bilin.
Möminlər qardaşdır bir – birlərilə,
Mal alın, mal verin halallıq ilə.
Könül rizasına verməsə əgər,
Qardaşın malına haram deyilər.
Kölələrnizi yaxşı yedirmək,
Geydiklərnizdən geydirmək gərək.
Onlarla etməyin bəd, qaba rəftar,
Bizimtək Allahın qullarıdırlar.
Cahiliyyət dövrün adətlərindən,

Qan güdmə davasın ləğv edirəm mən.
Kimin arasında qan davası var,
Bilsin ki, uydurma şeylərdir bunlar.
Intiqam həvəsi keçmişdəkitək,
Sizin aranızda olmasın gərək.
Sələm də ortadan yox olur bu gün,
Nə zülmkar olun, nə zülm görün.
Allah "sələm yoxdur" bizə əmr edir,
Sərmayələrniz sizindir deyir.
Alacaqlılara kimin borcu var,
Aldığı məbləği qaytaracaqlar.
Qadınlarnızın üstündə sizin,
Haqlarınız vardır hər birinizin.
Qadınlarnız da bilsələr əgər,
Haqqınıza əməl etməlidirlər.
Sizdə də haqları var qadınların,
Həmişə qeydinə qalın onların,
Yaxşı rəftar edib olun mehriban,
Tanrı əmanəti almısız ondan.
Sizin övrətiniz qadınlar ki var,
Allahın əhdilə halal oldular.
Ey insanlar, sizin qanlarınız da,
Bütün dövlətiniz, canlarınız da,
Allaha qovuşan zamana qədər,
Bu yertək müqəddəs sayıla bilər.

Hər bir – birinizin canı və malı,
Başqa birisinə haram olmalı.
Qiyamət günündə yalnız və yalnız,
Tanrı hüzuruna çıxacaqsınız.
Sizdən soruşacaq O da təkbətək,
Ya mükafat, ya da cəza verəcək.
Ehtiyatlı olun, məndən sonra siz
Kafirlərin yolun getməyəsiniz.
Kim də saxlanmalı varsa əmanət,
Onu sahibinə verməli fəqət.
Bir qadının əri izin verməsə,
Malından o bir şey versə bir kəsə,
Demək sahibinin əksinə gedir,
O, qadın ərinə xəyanət edir.
Biri kirayəyə götürsə bir mal,
Sonra sahibinə verməli dərhal.
Başqasına zamin olan bir adam,
Məsuliyyətini daşıyır müdam.
Günahına görə hər qatil düzü,
Cavabdehliyini daşıyır özü.
Hansı bir cinayət törətsə hər kəs,
Övladlara şamil edilə bilməz.
Oğul, ya qız qatil olarsa, ata
Cavabdeh deyildir o buna hətta.
Sizə elə bir şey verirəm ondan,

Yapışan səhv yola düşməz heç zaman,
Allahın kitabı – birincidir bu!
Bir də Rəsulunun qayda – qanunu!
O: Təbliğ etdimi? –“Bəli”! Dedilər:
-“Şahid ol ya Rəbbim!” –dedi Peyğəmbər.
Həzrət xütbəsinə yekun vuraraq,
Bir daha onlara xatırlayaraq:
-“Alimləri sevib hörmət göstərin,
Onlara heç zaman bəsləməyin kin.
Mənim ölmümdən sonra əsla siz,
Bu islam dinindən dönməyəsiniz!
Deyərək dəvəsin sürüb Peyğəmbər,
Öz əshabələri ilə bərabər,
Qurban kəsmək üçün Minaya gəldi,
Həccin əməlləri tamam edildi.[1]

[1] “ALLAHIN ELÇİSİ”

## MİNAYƏ ƏLİYEVA
## *PEYĞƏMBƏRİN MƏKKƏNİ SON ZİYARƏTİ*

Mədinəylə Məkkə arasında yol...
Bu yolda böyük bir izdiham vardı,
Məkkəyə üz tutan insan axını
Bir nurun dalınca addımlayırdı.
Bu nur peyğəmbərdi – səlavətullah.
Ona elçiliyi buyuran Allah
Nuru vermişdi ki, öz əməliylə
Bəndənin yolunu işıqlandırsın.
Tanrı Muhəmmədə buyurmuşdu ki,
Qaranlıq qəlbdə də işıq yandırsın.
Buyurun! Seyr edin! Budur o işıq!
Izdiham yığılıb həmin işığa.
Min dörd yüz il keçib, lakin insanlar
Yenə də sığınıb həmin işığa.

Məkkə şəhərində doğuldu bu nur
Daha da gurlaşdı Mədinədə o.
Sonra da yayılıb bütün dünyaya
Artdı hər əsrdə, qərinədə o.
Indisə Məkkəni, doğma yurdunu
Ziyarət etməyə gedir Peyğəmbər,
Heç kəs bilməyir ki, bu doğma yurda

Sonuncu səfərdir edir Peyğəmbər.
Peyğəmbər müqəddəs torpağa çatıb
Kəbəni dolandı düz yeddi dəfə.
Səfayla Mərvaya üz tutdu sonra
Bunların hər iksi müqəddəs təpə.
Burda icra etdi səy ayinini,
Ərafət düzünə getdilər ordan.
Bu düzdə hamısı namaz qıldılar.
Dedilər, şükür olsun böyük yaradan,
Şükür! Gələ bildik bu ziyarətə.
Şükür! Verdin bizə belə qisməti .
Başa çatan kimi həcc mərasimi
Son sözünü dedi o, insanlara:
-Nə pislik edibsə mənə insanlar,
Hamsını keçirəm, bağışlayıram.
Qoy pislik etməsin bir daha onlar.
Heç vaxt haqq yolundan sarpmasın insan,
Quranın yolundan çıxmasın insan.
Çox sözlər söylədi, çox öyüd etdi,
Onun sözlərindən sevindi hamı,
Min dörd yüz ildir ki, qızıldan artıq
Qiymətə malikdir hər bir kəlamı.

Peyğəmbər qurtarıb nəsihətini,
Üz tutdu başqa bir müqqədəs yerə,

Ardınca axırdı insan karvanı,
Özünü bəxtəvər sayırdı hərə.
Bu o yer idi ki, Adəm Peyğəmbər
Allahdan diləyib xeyir – duanı.
Tanrıdır insanın ilk ümüd yeri.
Tanrıdır insanın ən son gümanı.

Peyğəmbər müqəddəs yerə çatanda
Dəvədən düşərək oturdu yerə.
Qərq oldu fikirə, düşüncələrə.
Xəyalən Adəmlə görüşdü bir dəm.
Artıq gün batırdı, axşam düşürdü.
Peyğəmbər yıxıldı düz üzü üstə.
Dostları bildi ki, vəhy gəlib ona,
Gəldilər yaxına dəstəbədəstə.
Elə ki, özünə gəldi Peyğəmbər,
Söylədi yenədə qızıl kəlamlar,
Onun sözlərinə qulaq asaraq,
Heyrətə gəldilər yenə adamlar.
Peyğəmbər oradan gəldi Məkkəyə,
Zəmzəmin suyundan içdi son dəfə.
Son dəfə əlvida dedi Məkkəyə.
Baxdı bu şəhərə ah çəkə – çəkə.
Buranın hər daşı, hər bir divarı
Ona əziz idi, ona doğmaydı,

Burda axan sular, ötən yellər də
Ona məlhəm idi,ona loğmandı.
Hamını, hamsını bağışlamışdı,
Burda nə çəkmişdi, nə görmüşdü o.
Ancaq ki, burada qala bilməzdi.
Mədinə əhlinə söz vermişdi o.
Çətin günlərində, ağır günündə
Ona dayaq olub Mədinə əhli,
Islamı fitnədən qorumaq üçün,
Ayıq – sayıq olub Mədinə əhli.
Vida səfəridir! Ağla, ey Məkkə!
Mühacir balanı qucaqla yenə!
Qara qüvvələrin əməllərini
Tarix kitabında sən saxla yenə!
Gələcək nəslə qoy ibrət olsun
Tarixin bu qara səhifələri!
Islam dünyasının gözündə nifrət,
Ürəyində yara səhifələri!

## S.Ə ŞİRVANİ
## *"QƏDİRİ – XUM" QƏSİDƏSİ*

Badeyi – Mustəfəvi Xümdə edər cüşu xuruş,
Ki, səfasından onun qarət olur taqətü huş,
Badədir ruhi – Xuda, saqiyi – gülçöhrə Süruş,
Aləmə nəşri – maarif eləyir badəfüruş,
Açılıb rəhmət ilə xaneyi – xəmmar bu gün.

Piri – meyxanə meyi – nabə işarət eylər,
Dürrnuşani – vilayətə bəşarət eylər,
Dini təkmil qılıb kəşfi – kəramət eylər,
Müxtəsər, aləmə təbliği – risalət eylər,
Faş olur mərtəbeyi – Heydəri – Kərrar bu gün.

Axırı – Həccini çün Xətmi – Rəsul etdi tamam,
Azimu – Yəsrib olub Əhmədi – Məhmud məqam,
Ol şahə Xümmi – Qədir üzrə olundu ilham,
Gəldi Cibril ki, ey sərvəri – səyyarə məqam,
Sənə göndərdi salam izzəti – Qəhhar bu gün.

Sən gərəkdir edəsən Xummi – Qədir üzrə nüzul,
Goftgu eyləməsin zümreyi – əshab füzul,
Bəs gərək, zahir ola mərtəbeyi – zövci – Bətul,
Olacaqdır o şəhin ziddi "zəlumən və cəhul"
Açılır aləmə məxfi olan əsrar bu gün.

Yetir afaqə o şahənşəhin övlalığını,
Sabit et cümlə bu mövlalərə mövlalığını,
Əlivü ali – Əli gövhəri – əlalığını,
Zatının dürri – giranmayeyi – valalığını,
Minbər üstə çıxıban eyləgilən car bu gün.

Etdi çün hökm nüzul ol şəhi – səyyarəxudəm,
Oldu əshabələrin surəti – hali dərhəm,
Etdilər ərz ki, ey zübdeyi – əhli – aləm,
Su tapılmaz bu qədir içrə hərarətdən həm,
Küreyi – xak olubdur küreyi – nar bu gün.

Nazil olmağə deyil hiç münasib bu məqam,
Hökm hökmündü, vəli biz sənə etdik elam,
Açıban dərci – dəhən sərvəri – ecaz kəlam,
Dedi: Bu hökmi – Xudavənddir, ey qövmi – giram,
Eyləyib hökm mənə qadiri – Cəbbar bu gün.

Etdi əshabə bu hökmü çu şəhi - ərşsərir,
Dedilər sövt ilə “ləbbeyk”, ucaldı təkbir,
Oldular cümlə piyadə çi səqirü, çi kəbir,
Müntəzir kim nədi fərmani – Xudavəndi – qədir,
Nə büruz eyləyəcək izzəti – dadar bu gün.

Ol şahənşahə hicazi – şitur oldu mənbər,
Bəd təmhidi – xudavəndi – qədimu davər,
Dedi: Aya, deyiləm mən sizə candan behtər,
Dedilər cümlə, bəli, ey şəhi – balagövhər,
Sənsən övlalığa mövlayi – səzavər bu gün.

Dedi:Hər şəxsə ki, aləmdə mən olsam mövla,
Ona mövladü Əli, ol şəhi – mülki – məna,
Ona nasir olana nasir ola bari – xuda,
Hasidü düşməninə düşmən ola rəbbi – səma,
Bu duanı elədi Əhmədi – Muxtar bu gün.

Tutdu bir xeymədə bəs Heydəri – Kərrar qərar,
Təhniyyət etdilər ol şirdilə xürdü kibar,
Ibn – Xəttab xitab eylədi, ey şiri şikar,
“Bəxxun, bəxxun ləkə Mövla” səni qıldı Cəbbar,
Oldun ey sərvəri din Aləmə sərdar bu gün.

O qədər keçmədi kim, xətmi – Rəsul etdi vəfat,
Zülməti – xakdə məstur olub abi – həyat,
Tutdular Xızr təriqindən o qövmi – zülmat,
Qıldılar özlərinə həqq ziyafət isbat,
Dedilər rehlət edib Seyyidi – Əbrar bu gün.

Uydular Əhrimənə, hökmi – Süleyman qaldı,
Birdə həqqin bizə göndərdiyi fərman qaldı,
Bənd olub zahirinə, batini – Quran qaldı,
Kəsdilər suyunu, əfsürdə gülüstan qaldı,
Necə kim, indi də zahirdu o asar bu gün.

Hiç şəkk yoxdu ki, əlan “kəma kan” saqi,
Oldu hər əsrdə bu nüktə nümayan saqi,
Bizə həq nayibidir Fazili – Şirvan, saqi,
Əlivü ali o sibti – Şəhi – Mərdan, saqi,
Ki, onun həqqini qövmü edər inkar bu gün.

Elmdə tay deyildir o cənaba bir əhəd,
Bu Əli mənqəbətin vəsfinə yoxdur sərhəd,
Nə qəmi etsə əgər hasidi – iqbalı həsəd,
Hasidin boynuna zəncir olacaq həbli – məsəd,
Münkəri – rütbəsinin mənzilidir dar bu gün.

Saqiya, badi – xəzan etsə gülüstanı xərab,
Yenə gül nəkhətini zahir elər buyi – gülab,
Tutmağa ali – Əli damənini eylə şitab,
Bamdə kəlmə, dəri – elmə elə dəqqül – bab,
Ki, Əli elmi Əlidən olur izhar bu gün.

Seyyida, kim ki, hürər Şiri - Xuda naibinə,
Sən onun lənət oxu ruhuna, həm qalibinə,
Qəzəbi – izzəd onun hazirinə, qaibinə,
Baxma dəhrin bu sifət xasirənə, xaininə.
Al qələm, yaz oların həcvinə əşar bu gün.

## M.Ə.DİLSUZ
## *"QƏDİRİ – XUM" QƏSİDƏSİ*

Axırı həccidə peyğəmbər Qədri – Xummidə,
Aləmə can verdi o sərvər Qədiri Xummidə,

Hökm edib naqə cəhazından səhabə ol zaman,
Verdilər tərtib bir minbər Qədiri Xummidə.

Çıxdı ol şah minbər üstə qıldı bir xütbə bəyan,
Eylədi həmdi –şəri– davər Qədiri Xummidə.

Bədi həmdi – Xaliqi – davər buyurdu Müstəfa,
Nuş edin yaran mənə yeksər Qədiri Xummidə.

Həqqidən yetmiş mənə bu hökm çox təkid ilə,
Cəbrəil açmışdı indi pər Qədiri Xummidə.

Nazil eylib həqq mənə bu dəmdə "Bəllig" ayəsin,
Hökm edibdir xaliqi – Əkbər  Qədiri Xummidə.

Bu Əlini hamısı həqqə Vəli bilsin gərək,
Canişinimdir mənim Heydər Qədiri Xummidə.

Gətdi minbərdə əli üstə Əlini Müstəfa,
Xəlq gördü hamu sərtasər Qədiri Xummidə.

Söylədi mən hər kimin mövlasıyam mövlasıdır.
Həqq edib bu sərvəri Sərvər Qədiri Xummidə.

Eyləyib həqq bu Əlinin taətin vacib sizə,
Eyyuhənnas, olmuyun kafər Qədiri – Xummidə.

Bu Əlinin düşməni napakidir, görməz behişt,
Həqq edibdir dostunu əzhər Qədiri Xummidə.

Oldu razi həqq bu gün islam deyilsin sizlərə,
Siz vəli bilsəz Əlini gər Qədiri Xummidə.

Etdi saqi Xaliqi – aləm bunu ruzi - ələst,
Ayeye "Qul innəma" əfsər Qədiri Xummidə.

Hər iki dünya Əlini qəlbidən sevsin gərək,
Qəlbidən hər kim səni istər Qədiri Xummidə.

Bu Əlini lütf ilə Xəllaqi – aləm eyliyib,
Zatinə mirati həm məzhər Qədiri Xummidə.

Gər bunu vəsfni edim ta həşr olunca dəmbə-dəm
Olmur on mində biri əzhər Qədiri-Xummidə.

Bu Əlini lütf ilə Xəllaqi-aləm eyliyib
Aləmi imkan üçün rəhbər Qədiri-Xummidə.

Gər bunun vəsfin edim ta həşr olunca dəmbədəm
Olmur on mində biri əzhər Qədiri-Xummidə,

Bu Əlini eyləyübdür Xaliqi – cinni bilər,
Ərşü fərşü aləmə ləngər Qədiri Xummidə.

Bu Əlidir Qasimi Xüldü cəhənnəm hakimi,
Insi cinnü Əkbəri Əsğər Qədiri Xummidə.

Bu Əlini eyləyübdür Xalqi – aləm sizə,
Sahibi mövlavu həm rəhbər Qədiri Xummidə.

Bu Əlidür baisi – icadi – mövcudatıdır,
Bu Əlidür saqiyi – kövsər  Qədiri Xummidə.

Bu Əlinin nuri – pakindən firuzandır müdam,
Mehri mahu cümleyi – əxtər Qədiri Xummidə.

Bu Əlinin daməni – pakin tutan tapmış müdam,
Tutmuyan tapmış həlakətlər Qədiri Xummidə.

Bu Əlinin vardur hübbündə behişti – qəsri – hur.
Həqq qoyub buğzunda həm əxkər Qədiri Xummidə.

Bu Əlinin beyətin etməz qəbul üç kimsənə,
Xayini, tərsavü həm münkər Qədiri-Xummidə.

Buğz ilə etmib vəlinin beyyətin ol gün qəbul.
Qoydu inkarı o üç əbtər Qədiri Xummidə.

Beyət etdi zahirən ol gün əgər Xürdü kübar.
Leyk batində necə əbtər Qədiri Xummidə.

Bir – birilə məşvərət etdilər ol mürtədlər,
Qoymun tutsun bu əmri sizlər Qədiri Xummidə.

Əvvəl ol kəs kim dedi “bəxxun ləkə” ey Mövlayi din,
Etdi inkari – vilayət həm Qədiri Xummidə.

Gərçi zahirdə xilafət etdilər bir neçə gün,
Leyki həqqi etdilər müzmər Qədiri Xummidə.

Həddi yox bir kimsənin həqqin nurun paymal edə,
Həqq edib öz nurunu ənvər Qədiri Xummidə.

Çün Süleymanə gətirdi Mur bir payi – mələx,
Töhvəmi mövla qəbul eylər Qədiri Xummidə.

Yetməz itmamə bu mövla vəsfi ta ruzi – cəza,
Bağlıya Dilsuz min dəftər Qədiri Xummidə.

## HACI SOLTAN HÜSEYNQULU OĞLU
## *"QƏİDRİ – XUM" QƏSİDƏSİ*

Fərmayiş etdi həzrəti Sübhan Xummidə,
Verdi şəhadət ayeyi – Quran Xummidə.

"Ya eyyuhərrəsul" yetişib Əhmədə o dəm,
Şövqilə verdi ümmətə fərman Xummidə.

Cibrildə açdı şəhpərini ərşü fərşüdə
Söylər dübarə ayeyi – bürhan Xummidə.

Xatəm Qədiri –Xummidə ərz etdi vəhyini,
Vermişdi əmri Rahimü rəhman Xummidə.

Əl üstə qaldırıb Əlini xəlqə söylədi,
Mövladi ümmətə Şəhi – Mərdan Xummidə.

Ağ olsa kim bu şahə vurar yarə qəlbimə,
Ahimlə yandırar onu nuran Xummidə.

Hər kim edərsə cani fəda şiri – Xeybərə,
Gözlər o şəxsi huriyi qılman Xummidə.

Inkar edərsə kim onu, inkar edir məni,
Vaxtdır bilinsin əsli müsəlman Xummidə .

Min – min kəlam nazil olub şəni – Heydərə,
Bu yolla kamil oldu hər iman Xummidə.

Səfdər, Müzəffər adına layiq görüldü o,
Həq zahir etdi, oldu nümayan Xummidə.

Şahiddi cümlə ərzü səma divü – insi – cin,
Ol dəm quruldu xilqətə mizan Xummidə.

Əmma ədavət eylədi bir iddə nabekar,
Min hiylə qurdu mətləbi pünhan Xummidə.

Zahirdə beyət eylədi bir neçə əhli – kin,
Batində tutub çeşmələri qan Xummidə.

Bağrına basdı Heydəri – Kərrari şahi – din,
Təbrikə gəldi Nuhi Süleyman Xummidə.

Ilyasu Xızrı İdrisi İsa da oldu şad,
Şad oldu həmdə Buzəri Səlman Xummidə.

Hər kəs ki, beyət eyləmədi yandı atəşə,
Möminlər oldu sakini – rizvan Xummidə!

Soltan Əli, Əli deyibən tutdu  rahi – eşq,
Ey kaş, olaydı şahinə qurban xummidə.

## MÜSTƏZAD
## *“QƏDİRİ – XUM” HAQQINDA*

Təbrik bu günə çünki bu gün Əhmədi Muxtar,
aləmlərə sərvər.
Bəlli eliyibdir ki, bilün Heydəri – Kərrar,
oldu sizə rəhbər.
Xummi – Qədirə yetdi edib hamıya izhar,
hər ayəni əzbər.
“Ma ünzilə” ayatini o söylədi təkrar,
tökdi düri şəkkər.
“Əlyövm” ədə İslamı açıb sahibi - əsrar,
şahid ola səflər.
“Əkməltü” də kamil Əlinin adıdı aşkar,
matdır buna kafər.
“Mən küntü” də “Mövla” sözünü qadiri – qəffar,
dinə dedi məhvər.
Bayram qəbul etdi o günü cümleyi zəvvar,
birlikdə sərasər.
Kim eyləsə bu hadisəni dəhridə inkar,
duzəx onu gözlər.
Soltan, Əli haqqın tanıt, ol həqqə tərəfdar,
et xalqı münəvvər.
Açmış bizə bu barədə hər mübhəmi əxbar,
Şahdır bizə Heydər.

## HACI YUSİF QULAM MİRZƏ OĞLU
## *"QƏİDİR XUM" HADİSƏSİ*

Mədinədən gələn böyük izdiham,
Həcc mərasimin bitirib tamam.
Vətənə dönmməyə hazırlaşərkən,
Zilhiccə ayının on dördü erkən,
Kəbə həyətində, başda Peyğəmbər,
Sübh vida namazı əda etdilər.
Dan yeri sökülüb ağaran zaman,
Mədinə yolunu gedirdi karvan.
Kimisi miniklə, kimi piyada
Sayları bəlkə yüz mindən ziyadə,
Zəvvarlar yol gedir mehriban, gülər,
Bir – birinə hörmət göstərirdilər.
Həzrəti Peyğəmbər öz dəvəsində,
Yaxın adamların əhatəsində,
Ətrafı gülərüz seyr eləyərkən,
Xoşlanır gördüyü bu mənzərədən.
Islam - əhlin belə, mehriban görür,
Iftixar hissilə qəlbi döyünür.
Sevinir islamın vəhdətinə o.
O böyük Allahın qüdrətinə o.
Islam bayrağının altında, fəqət,

Tayfalar içində yaratdı ülfət.
Sevinci bu idi, bədəvi ərəb
Allahı tanıyıb öyrəndi ədəb.
Iyirmi üç ildir o, yorulmadan
Onlara tilavət eylədi Quran.
O, öz Allahından razılıq edir,
Risalıtin uca zirvəsindədir.
Narahatlığı da var idi onun,
Bilirdi ömrünün yaşayır sonun.
Çünki Ərafatda olduğu zaman,
Ölüm dəvətini almışdı Haqdan.
Özündən sonra da yerində, o nur,
Adil bir rəhbərə ehtiyac duyur.
Odur ki, qəm tozu üzünə, bəzən
Qonaraq sevincin yuyur üzündən.
Qorxduğu o idi, ölərsə əgər,
Çəkdiyi zəhmətlər gedəcək hədər.
Düşünürdü etsin necə hərəkət,
Doğrusu, ehtiyat edirdi Həzrət.
Yerinə canişin qoymadan ölər,
Bu birlik dağılıb pozula bilər.
Allahın elçisi bu fikirdəkən,
Cənabı Cəbrail göründü birdən.
“Təbliğ” ayəsini gətirdi ona,
Allahın sevimli son Rəsuluna.

Zilhiccə ayının on səkkizində,
Hicaz çöllərinin qum dənizində,
Susuz səhralarda üzürdü karvan,
“Qədir xum” çölünə çatdığı zaman,
Dayanmaq əmrini verdi Peyğəmbər.
Buyurdu: - Gəlibdir mühüm bir xəbər.
Carçılar car çəkib çağırırdılar:
-Camaat dayanın, durun, xəbər var.
Hamısı dayanır üzlərdə heyrət,
Geridə qalanlar gəlir nəhayət.
Qabaqda gedənlər dönənə qədər,
Dəvələr yükündən yığıldı minbər.
Camaat namaza düzülən zaman
Istidən od tutub yanırdı hər yan.
Iki ağac vardı cəmi bu yerdə,
Onların üstünə salındı pərdə.
Kölgəlik yarandı Peyğəmbər üçün,
Ən böyük ibadət oldu həmin gün.
Namazın bitirib Rəsuli - əkrəm,
Minbərin üstünə qalxaraq bu dəm,
Səmavi görkəmdə çox cazibədar,
Həmd – səna edərək xütbə oxuyar:
“-Bunu bilməlidir hər mömin adam,
Onlara özündən mən çox yaxınam.
Həzrətin dediyi hər kəlmələri,

Carçılar təkirarən çatdırır geri:
Ey camaat! – dedi, Rəsuli - əkrəm:
Azqalıb dünyanı mən də tərk edəm.
Cənabi Cəbrail Pərvərdigardan,
“Təbliğ” ayəsini eylədi bəyan.”
Bu zaman araya sakitlik çökür.
Bəzisi ağlayıb göz yaşı tökür.
Peyğəmbər sözünə edərək davam:
-“Mənə qulaq asan ey əhli – islam!
Sizin içinizdə iki möhtəşəm
Qiymətli, ağır şey qoyub gedirəm.
Birinci – mübarək Qurani – kərim!
Ikinci – müqqədəs itrətim mənim!
Onlara ehtiram edilsin gərək,
Kovsər kənarında görüşənədək.
Allahın “ipindən” kim tutsa əgər,
Onu düzgün yola hidayət edər.
Mənim itrətimə eləyin hörmət,
Verirəm onları sizə əmanət.
Əbu Talib oğlu Əlini də siz,
Ən yaxın dost kimi bilməlsiniz”!
Əlinin əlindən tutub Peyğəmbər,
Çiynindən yuxarı çəkdi bir qədər:
-“Kimlərin mövlası olmuşamsa mən,
Mövladır onlara Əli, bu gündən!

Ya Rəbbim! Əlini sevəni sev sən,
Düşmənin uzaq et mərhəmətindən".
Peyğəmbər sözünə vuraraq yekun:
-"Dininizi kamil eylədim bu gün.
Burada olanlar olmayanlara,
Sözlərimi təbliğ etsin onlara,
Bəlkə olanlardan o, olmayanlar,
Eşidib bunları çox xatırlayar".
Sonrada göylərə uzadaraq əl:
-"Ya Rəbbim, əhdinə eylədim əməl!"
Deyərək minbərdən düşdü Peyğəmbər.
Təbriklər uzandı səhər qədər.
Gəlib dəstə - dəstə ziyarətçilər,
Həzrəti Əliyə beyət etdilər.
Əbu Bəkir, Ömər təbrik edərkən:
-Ya Əli, hamının mövlası sənsən!
Onlarda görüşüb tutdu əl - ələ,
"Qədir Xum" tarixə yazıldı belə.[1]

[1] "ALLAHIN ELÇİSİ"

## NİZAMİ ZÖHRABİ
## *"QƏDİR XUM" QƏSİDƏSİ*

Həcc başa çatmışdı Məkkədə bu il,
Durum saflaşmışdı, durulmuşdu lil.
Zəvvar olmamışdı heç vaxt bu sayda,
Heyrətə gəlmişdi Günəş də, Ay da,
Kəsilmiş qurbandan yedi hacılar,
Kəbəyə "hələlik" dedi hacılar.
Zəvvarlar dönürdü Məkkədən evə,
Yola düzülmüşdü yüz on min dəvə.
Arxada qoyarıq yalı, yamacı,
Gedirdi şad – xürrəm yüz on min hacı.
Bir ana dayanmadan yolçular yolda,
Qoydular bir neçə mənzili dalda.
Karvan Qədir – Xuma artıq yetirdi,
Bu vaxt vəhy mələyi ayə gətirdi.
Dedi ki, ya Rəsul, tapdı din kamal,
Yetişdi axıra müqəddəs amal.
Oldu peyğəmbərlik vəzifən tamam,
Elan et, tanınsın qoy burda imam.
Səslədi yavaşdan Həzrət sarvanı,
Buyurdu: - Dayandır burda karvanı.
Sözümdən agah et karvan əhlini,
Açdır dəvələrin burda rəhlini.
De ki, rəhillərdən minbər qursunlar,

Məni dinləməyə hazır dursunlar.
İzhar etməliyəm mən bir ayəni, -
Deyə izah etdi ona qayəni.
Belə nəql edir əl – Bərra bin Azib,
Nə məkan uyğundu, nə vaxt münasib.
Nə bir daldanacaq vardı bu yolda,
Nə su işartısı yamacda, yalda.
Karvanı saxlayıb, sarvan çəkdi car,
Bir dəvə belində qalmadı zəvvar.
Elə bil yağmışdı köz Qədir – Xuma,
Ayaq basmaq belə olmurdu quma.
Get – gedə daha da qızırdı bu sac,
Yanıb qovrulurdu odda yol – yamac.
Yoxdu bir əlamət burada yeldən,
İsti hacıları salmışdı əldən.
Çox adam yanmasın deyə ayağı,
Fərş etdi əbanə xalı sayağı.
Nəhayət, münasib bir yer tapıldı.
Burda rəhillərdən təpə yapıldı.
Bir azdan göründü Həzrət minbərdə,
Zikr etdi, yayıldı səs pərdə - pərdə.
Dedi: - Eşit məni, sən ey ümmətim,
Vəhy ilə bağlıdır belə bir qətim.
Aləmlərin Rəbbi Allah – təala
İslamı çatdırdı bu gün kamala.

Vəhy gəlib, söyləyim, eşitsin hamı,
Bəyəndi Rəbbimiz bilin, islamı.
İstinad edərək din təkamülə,
Bəsitdən başlayıb, yetdi kamilə.
Ancaq düşünməyin bu hədd son həddir,
Bu, bizə Allahdan olunan vəddir.
Açdığımız bu yol əbədi yaşar,
Qiyamətə kimi eylər intişar.
Gözləyir qarşıda hələ çox işlər,
Həqiqət naminə sözlər, çıxışlar
Bəlkə mən görməyəm o günləri heç,
Edəm bu dünyadan o vaxtacan köç.
Mən mələk deyiləm, canlı bəşərəm,
Gəlmişəm, bir insan ömrü yaşaram.
Siz kimi mənim də saylı günüm var,
Sevincli günüm var, vaylı günüm var.
Gün gələr, nəhayət, yetişər vədə,
Edərəm dünyaya mən də əlvida.
Dəyməz bu barədə heç qəm etməyə,
Məgər bir kəs varmı gələ, getməyə?!
Necə bel bağlayım mən axı ömrə,
Olarmı nəsibim bir də həcc, ümrə?
Bir də mən sizləri görəcəyəmmi,
Sizə öz töhfəmi verəcəyəmmi?
Kəskin bir ehtiyac sözə duyuram,

Hökm Allah hökmüdür, gərək buyuram, -
Deyə durub süzdü o, izdihamı,
Lal sükut çökmüşdü, dinməzdi hamı.
Qəlblər bu səs üçün necə təşnəydi,
Onu dinləməkdən gözəl iş nəydi!
“Buyur” söyləyirdi ona nəzərlər,
Dönmürdü bir an da yana nəzərlər.
Başladı Peyğəmbər sözə təzədən,
Üfüqdə qızarır, - dedi – təzə dan.
Doğur ordan yeni Günəşi Ərzin,
Silir şəfəqləri cəhalət mərzin.
İslamın nuruna aləm boyanır,
Ovub gözlərini, bəşər oyanır.
Oldunuz bu yolda siz birincilər,
Yaranmışlar içrə ləlü – incilər.
İslam çiçəklənib verəndə pöhrə
Əvvəl siz dərdiniz o bağdan bəhrə.
Gəlir həyatımın axır anları,
Olun bu bağçanın siz bağbanları.
Allah dərgahından verilib əmrim,
Yaxın zamanlarda bitəcək ömrüm.
Şahid çağıraraq Yeri, Göyü mən,
Əmanət qoyuram iki şeyi mən.
Birisi Qurandır – müqəddəs ehkam,
Olsun rabitəniz onunla möhkəm.

O, Haqq kəlamıdır, Haqqın səsidir,
Allahın bəşərə moizəsidir.
Həyat qanunudur insanın Quran,
Aralı düşməyin Qurandan bir an.
Ikinci əmanət –mənim itrətim,
Qanından qanımdır, ətindən ətim!
Durur itrətimin başında Əli,
Ləldir üzüyümün qaşında Əli.
Olsun haqq adından o sizə vəsi,
Olsun nə qədər ki, gəlir nəfəsi.
Ondan məsləhəti alın hər işdə,
Onda həm bilik var, həm də səriştə, -
Deyə o, Əlinin qaldırdı qolun.
Buyurdu təzədən: - Siz şahid olun.
Bu an həm şərəfli, həm məsul andır,
Bu, Haqq qarşısında bir imtahandır.
Kim məni özünə mövla bilərsə,
Qail olsun qoyub getdiyim irsə, -
Deyə durub üstdə o, rəhillərin,
Ərz etdi Rəbbinə, açıb əllərin:
-İlahi, Əlinin sən ol həyanı,
Düşmən bil Sən onu düşmən sayanı.
Əlini dost bilib onu sevəni,
Özünə dost eylə, Sən də sev onu.
Qurtardı sözünü, verməmiş ara,

Edib müraciət o, hacılara
Dedi:-Təbliğ etdim? Dedilər: - Şəksiz!
Dedi:-Deyilsiniz şahidim tək siz.
Haqqı şahid tutdum başımın üstdə,-
Qorxun, daş qoymayın daşımın üstə,-
Söyləyib, Peyğəmbər aşağı düşdü,
Gəlib Əli ilə Ömər görüşdü.
Dedi:-Oldun bizə, ya Əli, ağa,
Döndü ürəyimiz fərəhdən dağa.

## HÜSEYN KƏRİMİ
## *İMANI TAPŞIRDIM SİZƏ*

Ey camaat, itrəti –Ta – hanı tapşırdım sizə,
Birdə bu göydən gələn Quranı tapşırdım sizə.

Bu iki ağır əmanət, ey güruhi – müslimin,
Bir – birindən ayrı düşməz ta qiyami – yövmidin,
Hövzi – kövsərdə olar bahəm səfa hasil yəqin,
Ittifaqi – hümməti təqvanı tapşırdım sizə.

Etmişəm iyirmi üç il şami – səhər xidmət sizə,
Cahiliyyətdən qurtardım, verdim əmniyyət sizə,
Bir əmanətdir bu gün Quran ilə itrət sizə,
Gülüstanımdan güli – rənanı tapşırdım sizə.

Salmayın ərkani dinə iğtişaşi inqilab,
Qoymayın aşkar ola, ribhü, qumar ilə şərab,
Çıxmayın dindən camaət, etməyin kəşfi – hicab,
Qeyrətiz var isməti – nisvanı tapşırdım sizə.

Bu Əli ibni Əbutalib əmoğlumdur mənim,
Kim bunu düşmən tuta, olmuş mənimdə düşmənim,
Canişinimdir, vəzirim, varisi – şirəfkənim,
Mürtəzatək mənbəyi – ehsanı tapşırdım sizə.

Almayın haqqın əlindən, etməyin xanənişin,
Vurmayın qollarına bəndi tənab, ey müslimin,
Qüssələnnəm mən behişt içrə, Əli olsa qəmin,
Heykəli şəxsiyyəti vicdanı tapşırdım sizə.

Ey cəmaət, ziri – bari zülmə hərkiz getməyin,
Zalıma baş əyməyin, ya bir kəsə zülm etməyin,
Acizi – məzluma püştiban olun incitməyin,
Izzətü hesiyyətü imanı tapşırdım sizə.

## SEYYİD NURƏDDİN DƏRAFƏRİN
## *"QƏDİR – XUM" GÜNÜDÜR*

Qədir – Xum bayramı əslində vilayət günüdür,
Həm vilayət gününün şanlı viladət günüdür.

Axərin həcci – vidadən qayıdan vəqti Nəbi
Gəldi səs ərşi – Xudadən dayan ayət günüdür.

Endi göydən yerə müjdə gətirə Ruhil – Əmin,
Söylədi: -Aləmi – İslamə himayət günüdür.

Əmr edib ol günü Allah özü Peyğəmbərinə,
Elə elan bu sözü xətmi – Risalət günüdür.

Ver risalət ipini ibn Əbu – Talibə sən,
Seçilib Şəmsi – Hüda, ümmətə rəhmət günüdür.

Kim ki, bilməz bu günün qədrini, həm qiymətini,
Ömrünə hər günü, Quranə xəyanət günüdür.

Olacaq cümlə şəfaətdən uzaq üqbadə,
Bu günü dərk edənə amma şəfaət günüdür.

Ey Əli aşiqi, xoş haluva olsun ki, sənin,
Aldığın hər nəfəsün misli – ibadət günüdür.

Şiələr əlbir olaq, haqqın ipindən yapışaq,
Bu gün aşiqlər üçün məktəbi – vəhdət günüdür.

Seyyida: Ali Əlidir Səqeleynin birisi,
Ol səbəbdən də bu gün hifzi – əmanət günüdür.

## *"QƏDİRİ XUM" GÜNÜ*

Yövmi – Qədiri-Xummidi ərşi – fələk Əli deyir
Yerdə tamami insu – can, göydə mələk Əli deyir.

Taqəti varsa möminin şəkk eləməz hidayəti,
Əmri – Xudanı dərk edən hər bir ürək Əli deyir.

Vardı yeri təəccübə məzhəbi qeyri – Cəfəri,
Dildə nə qədri səy ilə etsə də şəkk Əli deyir.

Gərçi dəyişsə ruzigar, yağsa yağış, tökülsə qar
Batsa günəş, doğulsa ay, əssə külək Əli deyir.

Dərdi olan mərizilər dərgahi həqqə üz tutub,
Yetmək üçün şəfaətə umsa kömək Əli deyir.

Bir balaca böcək yeyir tut ağacın rətibəsin,
Hazır olan rətibədən rəsmi ipək Əli deyir.

Sureyi – həl – əta deyil, bəs nədi bülbülün səsi
Vəcdə gəlib bu sövtidən qönçə çiçək Əli deyir.

Vardı şüarı şiənin cəm ola bir məcalisə,
Kimdi əmiriz et sual, cümləsi tək Əli deyir.

Şiə odur ki, Seyyida söz aparanda həqqidən,
Əvvəli kəlməsi Əli, axıradək Əli deyir.

## ƏLİHÜSEYİN CƏFƏRİ
## *"QƏDİR – XUM" QƏSİDƏSİ*

Edərkən Əhmədi - Rəsul cahanda son ziyarəti,
Yetişdi vəhyi – həq ona təmam edə risaləti.

Mədinəyə dönən zaman Qədir – Xum adlı çöldə o,
Cəm eylədi xudanın hökmilə bütün cəmaəti.

Əliyi Mürtəzayi – həq üçün uca məqam seçib,
Təmami – xəlqə göstərib, dideyi islam ümməti.

Əli hidayət əhlidir, Əli ədalət əhlidir,
Onun kimi çətin sevər bir ayrı kəs ədaləti.

Var onda qüdrəti – xuda dəyanəti, rəşadəti,
Döyüş zəmani hər zaman o göstərib şücaəti.

Hünər ilə cəsuri tək tutub əlində zülfüqar
Xilas edibdü rəzm ilə mənimlə siz cəmiyyəti.

Kəlamü nitqinin olub bəlağəti, fəsahəti,
Çün onda cəm olub bütün kəmalü elmin hikməti.

Fəzilətin şəhəriyəm, Əli onun qapısıdır,
Gərək bu qapıdan gələ kim istəsə fəziləti.

Ilahi nazil eyləyib bu ayəni, vəliyyi – həq
O kəsdi, sailə edir rükudə həm səxavəti.

Ilahinin şəfaətin heç əqlinə gətirməsin,
Əliyə qarşı hər kəsin ürəkdə var ədavəti.

Mən hər kəsin ağasıyam, Əli onun ağasıdır,
Əliyə biət eyləyən, mənə edibdü biəti.

Sona yetən zaman vida mərasimi, bu ad ilə
Əhali təbrik eylədi xudaya, ali həzrəti.

Cəhani tərk edib rəsul, köçərkən ali dərgəhə
Nə oldu, yadə düşmədi Muhəmmədin vəsiyyəti.

Əli xuda rəsulini turabə tapşıran zəman.
Ömər, Əbubəkir ələ keçirdilər xilafəti.

Cəlali – dəhrü mülkü mal təmahə saldı onları,
Cahanda başladı bəni – Üməyyənin siyasəti.

Nümayan etsə də Əli rəsuli – həq vəsiyyətin,
Oyanmadı əhali, çün var idi xabi – qəfləti.

Buyurdu həzrəti – imam, dübarə söylədi, gəlin
Unutmayın ey ümmətim, rəsul deyən həqiqəti.

Xəlifəlik məqaminə məni seçib rəsuli – həq,
Nə cürət ilə Əhmədə edirsiniz xəyanəti.

Vəliyyi – xaliqəm mənə əzəldə biət etdiniz,
Nə oldu bəs sizə, nə tez unutdunuz sədaqəti.

Hidayət əhlisiz əgər, müxalif əhli olmayın,
Sədaqətü vəfa ilə edin mənə itaəti.

Əhaliyə kar etmədi imami – Mürtəza sözü,
Məhəl verilmədi ona, xar etdilər imaməti.

Rəsuli – Əhmədin əziz, sevimli Fatimə qızı,
Bu halə məyus oldu çox, çəkib əzab - əziyyəti.

Mirasi – validü Fədək müsəxxər oldu zor ilə,
Pozuldu Quran ayəsi, pozuldu din şəriəti.

Əzabi – dərdə Fatimə də dözməyib, gözün yumub,
Cəhanə əlvida dedi, var idi çün xəsarəti.

Fəraqi iztirab ilə, bəlayi – möhnətə salıb,
Əlini nalan eylədi əzizinin bu rihləti.

Düşüb o hüzni – matəmə, geyindi qarə əyninə,
Ürəkdə artdı həsrəti - əzabü dərdü möhnəti.

Imami – Murtəzayi – həq dözürdü hər əziyyətə,
Vəfalı idi əhdinə, var idi səbrü taqəti.

Iyirmi beş ili yola salıb, xəlifə oldu o,
Qiyamətə qədər qalar onun böyük vilayəti.

Əliyə qarşı Aişə amansız idi, çün onun
Əzəldən olmuş idi ol imam ilə rəqabəti.

Müaviyə ilə Əli cihadü rəzmə başladı,
Yazıldı tarixə uzun sürən Cəməl qəzavəti.

Döyüş zəmani düşmən hiss edəndə məğlubiyyəti,
Böyük günahə batdılar, edib böyük cinayəti.

Cidadə Quran ayəsin görən zəman imami – həq,
Çox heyrət etdi, bildi ki, yox onların ləyaqəti.

Qoşuna əmr edib dedi: geri çəkilməyin bir an,
Siyasət işlədir olar, azıb rəhi – hidayəti.

Hüzuri – həqdə əhli – şam qazandı bu qəbahəti,
Imamət əhlinin isə çoxaldı, artdı hörməti.

Müaviyə bilirdi ki, bu Heydər ilə cəng edib,
Döyüşmək üçün üzbəüz yox heç kəsin cəsarəti.

O əmri – ibni – Əbdəvid onunla heç bacarmadı,
Bütün cəhanə bəllidir onun döyüş məharəti.

Qılınc ilə vurub iki yerə böləndə Mərhəbi,
Yıxıldı xakə, qalmadı o kafərin hərəkəti.

Təkan verəndə titrədib o xeybərin qapısını,
Çıxartdı qalmadı qala qapısının əlaməti.

Onun qabağına çətin çıxa cəsuri – pəhlivan
Cəsuri – mirdi, var onun şücayi – dinü qüdrəti.

Düşündü çox qərar verən nə cür o sui – qəsd edib,
Əlindən alsın Heydərin xilafəti – rəyasəti.

Əl atdı hiyləyə o dəm çağırdı ibni – Mülcəmi
Dedi: zəhərlə xəncərin tiyəsini müvəqqəti.

Hər hansı bir məqam ola, Əliyə batmaq olmaz heç,
Gərək onu biz öldürək edən zəman ibadəti.

Imam o sübh nəmazini qılanda, arxadan ona,
Zəhərli xəncərin ilə, yetir cəfayi – zərbəti.

Bu tədbir Əbdürrəhmani sevincək etdi, yatmadı,
Sona yetirdi sübhədək tədarüki – rəzaləti.

O kufə məscidinə həq imam qədəm qoyan zaman,
Bilirdi vəslə yetməyin, çatır sona fərağəti.

Kəmalü mehrü eşq ilə imami – sahibi zaman,
Üzün çevirdi qibləyə, edib qiyamü niyyəti.

Vəfayi – etiqad ilə sədayi – təkbir eylədi,
Dəvam edirdi həzrətin nəmazi – sübhi – taəti.

Rukiyə getdi, sonra o başın qoyanda səcdəyə,
Götürməyəydi kaş başın, qalaydı bu vəziyyəti.

Aman ilahi, Heydərin götürdü səcdədən başın,
Bu başə dəydi qatilin cəfayi – tiğü zərbəti.

Yarıldı başi, qan axıb, cəmali – hüsnü oldu qan,
Imami bihal eylədi başında ağrı şiddəti.

O nuri – xaliqə xəta çətin edərdi təsirin,
Vuruldu yarə yarəyə, çox ağrıdır cərahəti.

Gözün açıb, o gördü ki, evindədir, Həsən, Hüseyn
Yanında əyləşib, edir fəğanü ahu həsrəti.

O Zeynəb ilə Gülsümün səmavü ərşə naləsi
Bülənd olub, həm Əbbasın ürəkdə var məlaməti.

Zəif səs ilə dillənib, soruşdu, qatilim hanı,
Qaçan zaman biləndə ki, tutubalr o biqeyrəti.

Dedi: aman verin ona, ya da qisas alan zaman,
Dübarə zərbə vurmayın, siz etməyin bu cürəti.

Iki gün ötdü, həzrətin pozuldu hali – səhhəti,
Bədəndə artdı zülm ilə həm istilik hərarəti.

Görəndə Zeynəb ağlayıb, fəğan edir imam dedi;
Çox ağlama bu halıma ey ömrümün səadəti.

O ağlamalı günlərin sənin hələ qabaqdadır,
Çox üzmə gəl özünü sən, ey isməti cəlaləti.

Zəhər içən zaman Həsən, cigəri parə - parə qan
Tökəndə teştə ağladar səni onun o haləti.

Yetəndə qətlə qardaşın Hüseyn, kəsiləcək başı,
Qan ağladar səni qızım, o Kərbəla müsibəti.

O Əkbər oğlunun dəyər o qədri yarə cisminə,
Bədəndə qalmaz heç onun nişaneyi – səlaməti.

Qucaqda Əsğər oğlu qan içən zaman, dəyəndə ox,
Zəlil edər səni qızım, o körpənin məhəbbəti.

Batanda Qasimin o gün hənali əlləri qana,
Toyu dönər yasa, olar libası qanlı xələti.

Fərat içində su qalıb, içəndə qan o Əbbasım,
Qələm olar iki qolu, solar o hüsni – surəti.

Əsir gedəndə Şamə siz, Səkinə can verib, ölər,
Xərabədə qalar qızım, onun məzari – qürbəti.

Təsəlli verdi Zeynəbə, bu sözlərin edib bəyan,
Cəhanda yumdu gözlərin xudaya, din kəraməti.

Vuranda başə əllərin əyali Heydərin, o gün,
Səfayi – vəslə yetdi o, tapıb xuda şəfaəti.

Nə cür nəvayə gəlməyim, nə cür bəlayə düşməyim,
Əzabi – zülm ilə edib axı imam şəhadəti.

Nəcəfdə hifz edir xuda onun məzari – pakini,
Olaydı qismətim, gedib, edəydim o ziyarəti.

Qucağlayıb məzarini, o nuri – paki – xaliqin,
Həzin səs ilə Cəfəri deyəydi bu tilavəti.

## KAMİL SƏRBƏNDİ
## *"QƏDİR – XUM" QƏSİDƏSİ*

Vəqta ki, yetdi axirə son həcci – Mustəfa
Ayrıldı Məkkədə ümmətdən, etdi əlvida.

Duymuşdu ki, xəzanə düşüb ömür gülşəni
Qəlbi gördü sıxmadadır dəhri – bivəfa.

Təxir etməyib yola düşdü Mədinəyə,
Əshabü ənsarlərlə o Purnuru porziya.

Yetcək Qədir – Xumdə, qərar tutdu qafilə,
Endi dəvəsindən yerə Peyğəmbəri – Xuda.

Cəmlətdi cümlə ümməti dərhal bir yerə,
Ərz etdi ki, ey xilqəti – zişani – Kibriya.

"Bir söyləyin görüm mənə, Mövlanızammı mən?"
Əlbətdə, şübhəsiz dedilər cümlə basəda.

"Onda bilin ki, mən kimə Mövlayəm, ol kəsin,
Mövlasıdır Əli Şiri – Xudavənd, Murtəza."

Çün təyin etdi varisin Həzrət Xilafətə,

Əl açdı həqqə, etdi bu məzmunda bir dua:

“Ya Rəbb, Əlini kim ki, sevər Sən də sev onu,
Kim düşmən olsa, düşməni ol ta dəmi – cəza.”

Xəttabın oğlu basdı onu öz qucaqinə
Ərz etdi : “Mübarəkdi, Mübarəkdi, ya Mövla!”

Təbrik eyləyib Heydəri – Kərrarı birbəbir,
Cümlə dedi : Mövlayə ola canımız fəda.

Əfsus ki, xilaf çıxdı hamı vədə aqibət,
Dünyayə uyub, etmədilər fikri – axirət.

Ol dəm ki, rehlət etdi Rəsul bəzmi – cənnətə,
Tapdandı həqq, toxundu xələllər ədalətə.

Yaddan silindi Rəhbəri – İslam vəsiyyəti,
Gözlər yumuldu, əllər açıldı xəyanətə.

Quranla Əhli – beyti əmanət alıb və leyk,
Etdi xəyanət əhli – cəfa ol əmanətə.

Dünyadən ötrü hikməti – Quranı dandılar,
Əhkami – din qatıldı qərəzkar siyasətə.

Torpağa getməmiş hələ Peyğəmbəri – Xuda,
Əhdi unutdu, keçdi Əbubəkir xilafətə.

Oldu fəramuş Heydəri – Kərrar, Qədir – Xümm,
Tərrar əliylə təxti – Rəsul getdi qarətə.

Şiri – Xudanın haqqını qəsb etdi zaliman,
Beyt əhli sürükləndi o gündən müsibətə.

Imanı süst olanları aldatdı mali – mülk,
Sövq etdi əyri yollara min – min cinayətə.

Zərbət vuruldu cüsseyi – İslamə bihesab,
Bir din bölündü bir neçə məzhəb – təriqətə.

Təfriqə düşdü ümməti – pak  içrə aqibət,
Yüz minlər ilə yetdi müsəlman həlakətə.

Ya Rəbb sən bil, zalim ilə Əhli – Beyt bilsin,
Mənlik deyil bu məsələ, qalsın qiyamətə.

Cövrü əzabü ruzi – qiyamətdən əl - əman!
Seyli – bəlavü atəşi – Qüdrətdən ələman!

Dönməzdi, olmasaydı xəyanət, bu ruzigar,
Olmazdı Əhli – Beyti – Rəsul bunca biqərar.

Gəlməzdi zinazadeyi – Süfyan Xilafətə
Dəyməzdi Heydəri – Kərrarə zəxmi – kinədar.

Köçməzdi Fatimə bivəqt fani – aləmdən,
Qalmazdı çeşmi – tifli – yetimanı əşkbar.

Içməzdi zəhri – cəfa Həzrəti – Həsən yəqin,
Düşməzdi bağrı atəşə olmazdı dağdar.

Etməzdi zülm ilə tüğyan Yezidü – bədəf ol
Almazdı zövq tökdüyü qanlardan aşkar.

Açmazdı dəşti – Kərbübəla içrə qətligah,
Qırmazdı imam nəslin o məlun nabəkar.

Kəsməzdi Şümri – şərir arxadan Hüseyn başın,
Taxmazdı cida başinə etməzdi iftixar.

Getməzdi Şamə əsir xanədani – məzluman,
Vurmazdı qamçı onlara hər cəhli – canşikar.

Pozmazdı Kufə əhli xəyanətlə əhdini,

Qalmazdı dusitani – Hüseyn böylə dilfikar.

Yanmazdı, olmasaydı xəyanət bu kin odu,
Olmazdı İmam qanı ilə dəhr laləzar.

Keçməzdi iş başına kəçmədar bəni – Əbbas,
Çalmazdı tişə, din evin etməzdi tarü – mar.

Ey kaş bu həqiqət hamiya aşkar ola!
Islam günü – gündən ucalıb payidar ola!

## AŞIQ CƏBRAYIL GİLANÇAYLI

*SƏQƏLEYN HƏDİSİ*

İki cahan sərvəri[1]
Son xütbəsin söylədi.
Quranı, Əhli – beytin
Bir əmanət eylədi.

Müsəlmanam deyən kəs
Qorusun əmanəti.
Gözlərinin önünə
Gətirsin qiyaməti.

Salavat çevirənlər
Peyğəmbərin adına.
Etdiyi əmanəti
Salmalıdır yadına.

Möminlərin könlünə
Surələr işiq saçar.
O işiqla gedənlər
Heç zaman qalmaz naçar.

[1] "Mən sizin aranIzda iki qiymətli şey qoyub gedirəm. Biri Allahın nur və hidayət kitabI olan "Quran"dır ki, bütün işlərinizdə onu örnək qərar verin və ondan ayrilmayın. Ikincisi Əhli – beytimdir.".

Ağıllılar dərk edər
Ayələrin mənasın.
Sevib əzizləyərlər
“Kitabların anası”n.

Ayələri bir dərman
Surələri həkimdi.
Hökümləri qüsursuz
Ədalətli hakimdi.

Aşiqlərin sinəsi
Sərinlər avazıyla.
Mənasını vəsf etmək
Mümkün deyil yazıyla.

İkinci əmanəti[1]
Əhli – beytə hörmətdi.
Məhşərdə hesab günü
Möminlərə rəhmətdi.

[1] “Mən bir ağacam, Fatimə onun budaği, Əli (ə) onun mayasi, Həsən və Huseyn onun meyvəsi, mənim ümmətimdən onlara məhəbbət yetirənlər isə onun yarpaqlarıdır.”

Həzrəti Əlimizdir
Əhli – beytin binası.
Fatimeyi Zəhradır
Möminlərin anası.

Hörmət edər möminlər
Peyğəmbər övladına.
Salavat çevirərlər
Eşitdikcə adına.

De unutmaq olarmı
Sevimli nəvəsini.
Kərbəlada fəth etdi
Şəhidlik zirvəsini.

Şəhidliyin tarixin
Yazdı qızıl qanıyla.
Coşdurdu insanları
Hər il şəhid şanıyla.

Nə susuzluq, nə aclıq
Qırmadı imanını.
Dəstəmazın alarkən
Su eylədi qanını.

Namazın ləzətini
Tanıtdı möminlərə.
Ölüm ayağında da
Məlhəmdir könüllərə.

Hüseyn aşiqləri
O məktəbdə dərs alsın.
Bu şəhadət günündə
İmamı yada salsın.

Ruhuna hörmət edib
Zalıma baş əyməsin.
İbadətsiz yas tutub
Nahaq zəncir döyməsin.

Düşünsün nədən imam
Şəhid etdi özünü.
Haramdan çəkindirib
Dedi "Quran" sözünü.

Yasaq, haram olubdur
Şərab, qumar, beytül mal.
Sövq edənlər önündə
Olmayasan gərək lal.

Xalq malı yeyənlərə
Yaradan lənət edər.
Dünya malı yığanlar
Ömrünü eylər hədər.

Müsəlmanam deyəni
İbadətə səslədi.
Babasına ehtiram
Sıx məhəbbət bəslədi.

Dedi bil mənim babam
Gətirməmiş belə din.
Haram, murdar, ribaya
Hər zaman eyləmiş kin.

Sənsə eyşi – işrətə
Salıbsan öz yönünü.
Dünya matahlarıyla
Keçirirsən gününü.

Quran ayələriylə
Hökm etməyən hökümdar.
Çəkinməz günahından
Günahsıza qursa dar.

Haqqa çəkmək çətindi
Nəfsinə uyanları.
Xalqın malını yeyib
Dərisin soyanları.

Müsəlmanam deyən kəs
Çəkinsin o aləmdən.
Namazsız "Şaxsey" gedib
Yapışmasın ələmdən.

Hörmət etsin imama
Hər gün ibadətiylə.
Ruhunu eyləsin şad
Onun hər adətiylə

## QUMRİ DƏRBƏNDİ
## *CƏNAB XATƏMƏL – ƏNBİYA ƏLEYHİSSƏLAMIN VƏFATI MƏCLİSİ*
## *(ONUN RUHUNA MİNLƏRLƏ SALAM DUALAR OLSUN)*

Vəqt oldu afitabi – risalət edə zəval,
Üqbayə intiqal eləyə ləngəri – cəlal.
Məhbubilən həbib arasında vüsal ola,
Əyyami – hicri axir olub ittisal ola.
Vəqt oldu ərşdən vurula kusi – ərrəhim,
Babi – rəsuldən kəsilə payi – Cəbrəil.
Vəqt oldu mehri – ərşi – nübüvvət nihan ola,
Məh çevrəsin bulud kəsə zülmət əyan ola.
Vəqt oldu aşiqə gələ məşuqidən nida,
Meraci – qəsri – cənnət edə xətmi – ənbiya.
Vəqt oldu mətləbin ala küffari – bihəya,
Bikəs qala igirmi beş il şahi – lafəta.
Vəqt oldu kaminə yetişə qövmi – bəd siyər,
Daim binayi – zülmi qoya çərxi – kinəvər.
Vəqt oldu kamini ala üdvani – bədşüar,
Məğlubi – əhli – kinə ola şiri – kirdigar.
Vəqt oldu qəlbi – Buzəru Səlman dağlana,
Tari – cəfayə dəsti – yədullah bağlana.
Vəqt oldu Mürtəza qala biyavəri – vəhid,
Dürci – sədəfdə mühsini – məzlum ola şəhid.

Vəqt oldu cinnü – ins ola aləmdə dil məlul,
Zülmi – ğəmilə şölə çəkə dərgəhi – rəsul.
Vəqt oldu nəğməsaz ola Qumri çəkib nəva,
Gülzari – aləmi eləyə təziyətsəra.

* * *

Çün mövsimi – vidaidə şahi – fələk cənab,
Eylərdi mənbər üstə durub ümmətə xitab.
Ey qövm, mən sizə necə nasih peyəmbərəm,
Çox mehribanəm, həm iki dünyadə rəhbərəm.
Vacibdü sizlərə tutasuz ehtiramimi,
Kövnü – məkanü aləmi – imkanə sərvərəm.
Küllən yetirmişəm sizə əmri – risaləti,
İmdi yavuqdu həzrəti – canənə can verəm.
Məndən sonra təriqi – hüdanı itirməyin,
Daim  rizayi – həqqi tutub eyləyin kərəm.
Vardur əmanətim neçə şeyi – büzürgüvar,
Lazımdu onları sizə əlbəttə tapşıram.
Əvvəl budur ki, hürmət edin həqq kəlaminə,
Həm itrətimdi, həm birisi Məkkəvü hərəm,
Hürmət edün əmoğluma, incitməyin onu,
Dərgahi – kibriyadə odur miri – möhtərəm.
Göz yaşlı, sinə dağlı qalır Fatimə qızım,

Ol binəvani sizlərə təslin eylərəm.
Təhluyi – nazikini onun qılmayun şikəst,
Zəhra mükəddər olsa, bilin mən mükəddərəm.
Hərgah əzizə Fatiməyə eylə söz itab,
Eylün yəqin ki, qəbrdə sizlərdən incirəm.
Qəlbim sürudur Həsəni – Müctəba mənim,
Ol nuri – eynimi hamıdan artıq istərəm.
Dari – Fənadə can sizin, can Hüseynimin,
Allah riza degil ki, onu didətər görəm.
Göndərdi Cəbraili xudavəndi – zülcəlal,
Əmr etdi oğlumu bu Hüseynə fəda verəm.
Çün eylədi şəhənşəhi – din mətləbin təmam,
Qıldı zəif halətilən mənzilə xüram.
Gün – gündən eylədi mərəzi şiddəti – əcib,
Bəzmi – vüsalə getməyə qəst eylədi həbib.
Bəstərdə cismi – paki olub zaru biqərar,
Mahi – cəlali düşdü səfadən hilalvar.
Bir dəm ayırmaz idi yanından əyalini,
Eylərdi onlar ilə cəvabu sualini.
Gah tapşırırdı Heydərə Zəhrayi – əzhəri,
Gahi basardı bağrına ol şiri – davəri.
Gah busə eyləyib Həsənin qönçə ləblərin,
Ağlardı yadına gətirib qarə günlərin.
Gahi öpüb Hüseyin boğazindan, deyərdi can,
Ey Kərbəladə gül bədəni bikəfən qalan.

Gahi baxardı Zeynəbə bəçeşmi – əşkbar,
Yad eyləyib müsübətin ağlardı zar – zar.
Söylərdi, sizdən ayrılıram ey ğəriblər,
Məndən sonra bəlayə düşən binəsiblər.
Bihuş olurdu gah olub təşneyi – vüsal,
Tutmuşdu əhli – beyti ğəmü möhnətü məlal.
Ağlardı əşki – çeşmi töküb xeyrətün – nisa,
Nagah nə gördü kim, ucalır babdən səda.
Eylər səlam o dərgahi – valadə bir ərəb,
Güya xitab edər bu məqalati ba ədəb:
Bir qasidən risalati – canan gətirmişəm,
Məhbubdən həbibinə ünvan gətirmişəm.
Məşuqidən gərək yetirəm aşiqə səlam.
Ondan sora duayi – firavan gətirmişəm.
Min şövqi – iştiyaqilə hazir təbibdən,
Bimari – hicir dərdinə dərman gətirmişəm.
Bir nimcan firqəti – peyğami – yarilən,
Qürbi – vüsalə yetmək üçün can gətirmişəm.
Bir padşahi – möhtərəmi – zülcəlaldən,
Ehzar üçün peyəmbərə fərman gətirmişəm.
Bəzmi – bəqayə qılmağa merac axərin,
Guya büraqü Rəfrəfi rizvan gətirmişəm.
Bica əbəs gələn degiləm boş degil əlim,
Ümmətdən ötrü müəldeyi – ğüfran gətirmişəm.
Eşitcəgin bu xitabi cənabi – peyğəmbər,

Buyurdu Həzrəti Zəhrayə ey əzizi – pədər,
Mürəxxəs etgilən ey bəxti – qarə, qoy gəlsin.
Olur ənis məni – dilfikarə, qoy gəlsin.
Odur zəmanəara xanimanları dağıdan,
Həmişə həsrət edən yari – yarə, qoy gəlsin.
Həqir sanma, böyük padşah qasididir,
Məni qonaq çağırır kuyi – yarə, qoy gəlsin.
Dayanmaz heç qapıda, sahibindən izn almaz,
Onun qayıtmağına yoxdu çarə, qoy gəlsin.
Ədəb yolilə mənim ehtiramimi gözlər,
Rəva degil dayana intizar, qoy gəlsin.
Degil ərəb, odur aləmdə can xəridari,
Həbibini yetirir kirdgarə, qoy gəlsin.
Gələndə hər yerə, bir kimsə surətin görməz,
Gəlibdü hürmət üçün aşikarə, qoy gəlsin.
Bu günki gün bizə mehman gəlibdü Əzrail,
Mükəddər olma, çəkil bir kənara, qoy gəlsin.
Gərək məni apara ehtiramü izzətilən,
Hüzuri – həzrəti pərvərdigarə, qoy gəlsin.
Gəlib salam edib ol qasidi – ilahi – Səməd,
Yetirdi kim, buyurur kirdigarə ya Əhməd.
Vəsli – canan axtaran candan keçər, can istəməz,
Təşneyi – cami – məhəbbət abi – heyvan istəməz.
Aşiqi – sadiq olan məşuqdən durmaz kənar.
Taibi – bəzmi – təqərrüb künci – hicran istəməz.

Möhnəti – hicrandan bimar olan istər vüsal,
Dərdinə hərgiz dəxi bir özgə dərman istəməz.
Tutiyi – gülzari – cənnət xakidani – dəhrdə,
Olsa yüz min laləzaru şəkkəristan istəməz.
Çün azim oldu aləmi – üqbayə Mustəfa,
Qıldı xitab Heydərə, ey şahı – la fəta.
Həlal qıl məni ey yari – mehriban, gedirəm,
Cəfayi – ümmətilən bağrım oldu qan gedirəm.
Təvəqqüf etmə dəxi, gör səfər tədarükimi,
Əcəl dolub gözümə, ya Əli əman gedirəm.
Veribdülər mənə zəhri – cəfani Xeybərdə,
Bu gün onun əsərindən üzüldü can, gedirəm.
Mənə əmoğlu degildin, əziz qardaş idin,
Səni qoyub bu cahan içrə natəvan, gedirəm.
Nə qədər zülm edələr, səbr elə, qılınc çəkmə,
Tökülməsin yerə İslam içində qan gedirəm.
Şikayət etmə ədu məscidə çəkəndə səni,
Hüseyni qoymağilən eyləsin fəğan, gedirəm.
Mənim yerimdə görərsən şərir ümmətimi,
Ğəmü ələmdən olur qamətün kəman, gedirəm.
Səni ğəmilə evində edəllə xanənişin,
Edərsən illərilən göz yaşı rəvan, gedirəm.
Əmoğlu can sənin, can yetim qızım Zəhra,
Sənün yanında əmanətdü az – zaman, gedirəm.
Yetimdür, ona çox ağlasa, acıqlanma,

O binəva sənə qırx gündü mehman, gedirəm.
Gələndə yanimə əzasi olmasun məcruh.
Çəkən müsibətini bilmişəm, əyan, gedirəm.
Nə zülmlər yetəcək çox ləin cəfasindən,
Bu ğəmli sinədə bir dağidür nihan, gedirəm.
Riyazı – matəmi ali əbadə nalə konan,
Qoyub çün Qumriyi – dilxəstə növhəxan, gedirəm.

* * *

Edib vəsiyyətini Mürtəzayə ol salar,
Buyurdu Fatiməyə ey ğəribi – biqəmxar.
Vəsiyyətim budur, ey binəva, fəğan etmə,
Ikincisi, əmum oğlu Əlini incitmə.
Çox ağlama demənəm ey yetimi – dilxəstə,
Evində yalqız olan dəmdə ağla ahəstə.
Nə qədri istəyəsən eylə göz yaşın cari,
Əli gələndə evə ağlama, səni tari,
Hüseynilən Həsənə çox da dərdü ğəm vermə,
Ürəklərin bu müsibətdə qanə döndərmə,
Həmişə nalə qılıb ğüssəvü ğəmə batma.
Uşaqdu, Zeynəbi allah rizası ağlatma.
Saralmamış kəfənim ey zəifeyi – müztər,
Əli ədavətinə yandırır qapumi şərər.

Mədinə içrə qalırsan qızım ğəribü vəhid,
Sınar qabırğalarun Muhsini edəllə şəhid.
O gündə səbr elə həngameyi – əza qurma,
Cənab Heydəri – Kərrarə tənələr vurma.
Əgər cahanda əsiri – ğəmu fərağimsən,
Təmam olan sora qırx gün mənim qonaqimsən,
Səni kənarə çıxarram bu qövm arasından.
Ğəm etmə tez qurtarusan ğəmu cəfasından.
Riza qəzayə verib, səbr qıl müsibətdə,
Bu intiqami alursan qızım, qiyamətdə,
Qılıb təmam əyalin vidai – bazpəsin,
Çox intizaridi nagah yetişdi ruhul – əmin,
Edib o peyki – xudayi cəlililən söhbəti,
Eşitdi müjdeyi –ğüfran firqeyi – ümmət.
Olub məqami – təvəccöhdə gərm razu – niyaz,
Behiştə eylədi ruhi mütəhhəri – pərvaz.

## *CƏNAB XATƏMƏL – ƏNBİYANIN (S) ÖLMÜNDƏN SONRA XİLAFƏTİN QƏSB EDİLMƏSİ XÜSUSUNDA HADİSƏLƏRİN SƏBƏBİ*

Çün pərçəm açdı rəyəti – tüğyan Suqeyfədə,
Oldu sitəmlə din evi viran, Suqeyfədə.
Amadə qıldı samiri ol ümməti – rəsul,
Gəvsaləvar bərxizi – nadan Suqeyfədə.
Açmaqlığa təriqilə küfrü zəlaləti,
Əvvəl qılıb müsafihə şeytan, Suqeyfədə.
İsbati – Fəzli – Heydəri inkar qılmağa,
Gizlətdilər çox ayeyi – Quran, Suqeyfədə.
Gəldi zühurə batilü həqq oldu payimal,
Göz yaşlı qaldı Buzəru – Səlman, Suqeyfədə.
Dəfn etməmiş rəsuli – xudanun cənazəsin,
Qopdu xilafət üstə nə tufan, Suqeyfədə.
Çox sinələrdə şöləlонib nari – irtidar,
Etdi biruz kineyi – pünhan, Suqeyfədə.
Yandırmağa rəsuli – xuda bargahini,
Təyin olundu atəşi – suzan, Suqeyfədə.
Bir növilən alışdı onun pür şərarəsi,
Kərbübəladən oldu nümayan, Suqeyfədə.
Tapdı şikəst dəndeyi – pəhluyi – Fatimə,
Ol zülmdən ki, etdilə bünyan, Suqeyfədə.
Səqt oldu Mühsin ağladı qan xeyrətün – nisa,

Çıxdı  sədayi – naləvü əfğan, Suqeyfədə.
Mehrab içində tiği – cəfa ilə qıldılar,
Şiri – xudanı qaninə qəltan, Suqeyfədə.
Doğrandı Müctəba cigəri zəhri – kinilən,
Tabuti – nəşin oxladı üdvan, Suqeyfədə.
Abi – Fərati bağladılar ali – Heydərə,
Qaldı Səkinə ləbləri ətşan, Suqeyfədə.
Tiği – sitəmlə kəsdilə Əbbas qolların,
Cismin yaralı qoydular üryan, Suqeyfədə.
Xəncərlərilə doğradılar teşnə Əkbəri,
Qasim otağın etdilər viran, Suqeyfədə.
Qundaq içində eylədilər hülqi – Əsğəri,
Rəhm etməyib nişaneyi – peykan, Suqeyfədə.
Yetmiş iki cəvan bədəni xaki – xunara,
Düşdü yaralı qan ilə əlvan, Suqeyfədə.
Sultani – Kərbəla başını kəsdilər susuz.
Bu məkrilən Ömər dəxi üdvan, Suqeyfədə.
Gəzdirdilər əsir qılıb bağlı qolları,
Ali – rəsuli – zülfi – pərişan, Suqeyfədə.
Zeynül – İbadi Baqir ilən oğlu Cəfəri,
Zəhrilə qıldılar cigəri qan, Suqeyfədə.
Zəncirə bağlı həzrəti – Musayə on bir il,
Mənzil verildi guşeyi – zindan, Suqeyfədə.
Can verdi zillətilə quru yerdə sinə dağ.
Şahi – qərib xaki – Xorasan, Suqeyfədə.

Ənvari – həqq Təqiyyü Nəqiyy oldular şəhid,
Həm Əsgəri o mədini – ehsan, Suqeyfədə.
Bir vəqt olur zühur qılar sahibi – zaman,
Eylər qisas almağa divan, Suqeyfədə.
Tökdü təhiyyə vurmaq üçün od əbuşşərur,
Qumrini qıldı sinəsi suzan, Suqeyfədə.

* * *

O dəm ki, barigəhi – Mustafayə od vurdu,
Ğələt degil desəm ərşi – xudayə od vurdu.
Ucaldı şöleyi – atəş olub səmayə bülənd,
Onun şərarəsi Kərbübəlayə od vurdu.
Nə Şimr idi nə Ömər Sədidi yəqin bu şərir,
Xiyami – padşahi – Kərbəlayə od vurdu.
Görən zamanda bu əhvali həzrəti Zeynəb,
Zəbani – hali edərdi o bihəyayə nida.
Bilməm nə zülmdür ki, bu dünyanı yandırır,
Qalxar şərər zəbanə çəkər cani yandırır.
Şərm eylə, xanimanimi yandırma ey şərir,
Kim, zülmilən bu dərgəhi – ehsani yandırır.
Peyğəmbərin kəfən bədənində saralmamış.
Ümmətləri onun qızı Zəhrani yandırır.
Sizlərdə rəsmdür məgər ey qövmi – bihəya,
Din əhli din evində müsəlmani yandırır.
Bu beyt içində var neçə mömin səhabələr,
Od vurmayın ki, Buzərü – Səlmani yandırır.

Qorxutmayin  Hüseynimi ümmət fədasidir,
Od şölə çəksə, ümməti – qurbani yandırır.
Nəmrud qılmadı bu cəfanı, sən eylədün,
Vallah bu zülmün aləmi – imkani yandırır.
Hansı peyəmbər ümmətidür öz imaminə,
Eylər həvalə atəşi – suzani yandırır.
Getdi bu nar şöləsi ta Kərbəlayədək,
Şami – bəladə Zeynəbi – nalani yandırır.
Qoydu bu od qarə günə bikəs əyalimi.
Dünyadə itrəti – şəhi – mərdani yandırır.
Saldun yaralı canimə od ey əbuş –şərur,
Ta həşr olunca sineyi – suzani yandırır.
Od vurma xanimanimə, əllah kəlamı var,
Quranə hürmət eylə ki, Qurani yandırır.
Vurdun bu ğəmli sinəmə bir əkkəri – cəfa,
Dürci – sədəfdə gövhəri – yekdani  yandırır.
Sizlərdə yox həya məgər ey firqeyi – yəhud.
Hansı yəhud qövmi – Məsihani yandırır.
Qoydun cahanda bir belə zülmün binasini,
Hər bir şərari Qumriyi – nalani yandırır.

*   *   *

Görüb müşgüldə Zəhrani şəhi – müşgülgüşa gəldi,
Çıxıb zülmati – ğəmdən  tacidarı – övliya gəldi.
Qızarmış rəngi ğeyrətdən, yanıb cani müsibətdən,
Dilində zikri hərdən naleyi – “va Mustafa” gəldi.

Əlində zülfəqari pur şərər lərzan ğilafində.
Difai – kəlleyi – rubah üçün şiri – xuda gəldi.
Vilayət çərxə aşub düşdü qopdu bir vəhşət,
Ki, guya səmti – məğribdən çıxıb bərqi – bəla gəldi.
Təlatüm eyləyib dəryayi – qəhri – qüdrət əllahi,
Nahəngi – qüdrəti – yəzdan əmiri – “la – fəta” gəldi.
Öhöd həngaməsin bərhəm vuran Xeybər yıxan
Heydər,
Çəkib əllahu əkbər nərəsin kani – vəfa gəldi.
Çıxıb səhni – sərayə bir məhabətlən vəliyyi – həqq,
Edib guya təməvvüc bəhri – qəhri – kibriya gəldi.
Dəxi tab etmədi gəlsin qulağə naleyi – Zəhra,
Hijbəri – ərseyi – hica Əliyyəl – Mürtəza gəldi.
Görüb Zəhrani səhn içrə düşüb bihalu bitaqət,
Dəruni – sinəsindən naleyi – “va Mustafa” gəldi.
Dedi səndən sonra düşdüm nə halə ya rəsuləllah,
Cəlalim getdi dünyadə əcəb bəxtim qarə gəldi.
Deyib bu sözləri ol şiri – həyyi – ləm yəzəli,
Vurub özün od içindən kənarə çıxdı Əli.
Uzatdı dəsti – yədullahin ol imami – mübin,
Tutub o zadeyi – napak nakəsin kəmərin .
Çu oldu pənceyi – mərdanəsi o zalimə bənd.
Təkan verib elədi qəhrilən həvayə bülənd.
Dolandırıb başının üstə şəhi – ərşi – vüqar,
Vurub yerə necə qıldı çü sayeyi – divar.

Qoyub əyaqini sənduqi – sineyi – küfrə,
Əl atdı qəbzeyi – şəmşiri – xunçekan du sərə.
Görüb bu hali ədu iltica edib hərdəm,
Verirdi Heydəri – Kərrari – Mustəfayə qəsəm.
Baxıb o əczilə ilhahə çün imami – kübar,
Çəkib əlin dedi, ey bihəyayi – bədkirdar
Bu cürət olmazidi səndə gər açaydım əl,
Gərək vəsiyyəti – peyğəmbərə olunsun əməl.
Deyib bu sözləri ol padşahi – ərşi – vüqar,
Riza qəzayə verib zülfəqari qoydu kənar.
Çü oldu qövmi – cəfacü bu sirrdən agah,
Dəxi əl açmayacaq düşmənə vəliyullah.
Dübarə cürət edib firqeyi – zəlumu – cəhul,
Cəfa ipilə yədullahi qıldılar məğlul.
Salıbdu həbli – mətin boynuna sitəmlə rəsən,
Rəsuldan sora xar oldular Hüseyinlə  Həsən.
Çəkəndə məscidə şiri – xudanı əhli – cəfa,
Düşüb dalınca Hüseyni Həsənlə xeyri – nisa.
Gətirməyib yaralı cani ol müsibətə tab,
Edərdi Fatimə guya bu dillərilə xitab.
Ey əhli – kinə eyləməyin xar əmoğlumu.
Min zillətilə dərdə giriftar əmoğlumu.
Çoxdur könüldə dərdi siz incitməyin onu,
Dari – fənadə bikəsü biyar əmoğlumu.
Gəldi biruzə kinəvüz, ey qövmi – bütpərəst,

Qılduz ğəmu müsibətə sərdar əmoğlumu.
Bilməm nə tez ədavətivüz oldu aşikar,
Salduz bu halə didəsi xunbar  əmoğlumu.
Dünyadə sizlərə məgər ey qövmi – bihəya,
Tapşırmamışdı Əhmədi – Muxtar əmoğlumu.
Ali – rəsul hümmətini yaxşı saxladuz,
Etdüz bəlayə qafiləsalar əmoğlumu.
Heç kəs cahanda xar eləməz öz imamini,
Siz eylədüz bu Heydəri – Kərrar əmoğlumu.
Qol bağlı, sinə dağlı diləfkar aparmayın,
Məscidlərə ğəribu diləfkar əmoğlumu.
Bəsdir edən cəfalərivüz min ələmkeşə,
Əldən qoyun bu didəsi xunbar əmoğlumu.
Müşgülgüşani müşgülə salmaq rəva degil,
Etmün nişani – təneyi – əğyar əmoğlumu.
Ğəm gülşənində nalə çəkər hər sabahu şam,
Oxşar həmişə Qumriyi – gülzar əmoğlumu.

* * *

Daxil olanda məscidə o şahi – bipənah,
Zəhra apardı məcərə əl, çəkdi bircə ah.
Səsləndi sındı balu – pərim, va Mühəmmədа,
Yandı bu qüssədən cigərim, va Mühəmmədа.
Səndən sora qara günə saldı məni ğəmün,
Qan yaş tökər bu didələrim, va Mühəmmədа.
Yandı canım sitəmlə şəhid oldu Mühsinim,

Caridi əşki – çeşmi – tərim, va Mühəmmədа.
Yalqızlayıbdular qolu bağlı əmoğlumu,
Gəlməz harayə bir nəfərim, va Mühəmmədа.
Yox taqətim, qabırğalarım sındırıbdular,
Məscidlərə düşüb güzərim, va Mühəmmədа.
Əmmamə əldə, gözləri yaşlı, cigərdə ah,
Ağlar Şübeyrlən  Şəbərim, va Mühəmmədа.
Deyib bu sözləri xeyrin – nisa behali – ğəmin,
Bu fikrə düşdü ki, qılsın o qövm üçün nifrin.
Qopub qiyami – qiyamət beduni – nəfğeyi – sur,
Sütunilər dağılıb oldu məhti – rahi – übur.
Görüb bu haləti Səlman ki, binti – xeyri – bəşər,
Əgər aça başını aləmi yıxar yeksər.
Xitab qıldı ki, ey banuyi – xocəstə liqa,
Əmoğlun Heydəri – Səfdər degil bu əmrə riza.
Bəlayə səbr eləmək çünki sizdə adətdir,
Səbəb odur ki, atan aləmeynə rəhmətdir.
Bu sözləri eşidib banuyi – hərimi – əzəl,
Qəbuli – ərz qılıb çəkdi məcərindən əl.
Edəndə Fatimə tərki – fəğanu naləvü zar,
Sütuni – məscidü mənbər tutub yerində qərar.
Çəkəndə taci – səri həl – ətani qövmi – dəğa,
Rəsuli – qəbrinə yüz döndərib edərdi nida.
Nəzarə qıl məni – biyarə, ya rəsuləllaah,
Olub cahanda günüm qarə, ya rəsuləllah.

Cəfayi – ümmətə bax, möhnəti – müsibətə bax.
Qərib əmoğluva qıl çarə, ya rəsuləllah.
Salubla şalımı öz boynuma kəməndi – misal,
Çəkəllə məclisi əğyarə, ya rəsuləllah.
Əbu şəruri – ləin əl götürməyir məndən,
Nə etmişəm o sitəmkarə, ya rəsuləllah.
Mənə edəllə əbuş – şərr beyətin təklif,
Itaət etməgə əğyarə, ya rəsuləllah.
Məsihtək məni almış arayə qövmi – yəhud,
Çəkər ədavətilən darə, ya rəsuləllah.
O xeybəri götürən əllərimi bağladılar,
Vurubla qəlbimə min yarə, ya rəsuləllaah.
Əbi şərarənin oğluyla zadeyi – Süfyan,
Gətirdilər məni bizarə, ya rəsuləllaah.
Edən zaman bu xitabi vəsiyyi – peyğəmbər,
Gəlib təzəlzülə qəbri – cənabi – xeyri – bəşər.
Olub zühur təcəllayi – nur məscidara,
Çıxıb o rovzeyi – nurundan yədi – beyza.
Təmam gördü ki, salar ənbiya Əlidür,
Mühəmmədi – ərəbi, yəni Mustəfa Əlidür.
Ucaldı sövti – cənabi – rəsuli – rəbbi – cəlil,
Xitab qıldı o bişərmə, ey ləinü – bəxil.
Səbəb nədür belə tez kafir oldun, ey gümrah,
Olub xilafətə ğasib qılıbsan əzmi – günah.
Ğərəz bu ğəsbi – xilafət cəhanə saldı fəsad,

Şəriəti pozuban qıldı din evin bərbad.
Bu fitnə bais olubdur Əli şəhadətinə,
Bu fitnə bais olub Kərbəla müsibətinə.
Tökülsə həşrə kimi hər nə qədri nahəqq qan,
Təmami baisi bu fitnədür salıb üdvan .
Bəs et bu qissəni Qumri, yetir sən itmamə,
Şərari – möhnətilən yandı, od tutub xanə.

## S. M. ŞƏHRİYAR
## *“REHLƏTİ – XƏTMİ – RƏSUL”*

Yıxılıb dinin evi, rehlət edib Xətmi – Rəsul,
Çırpılıb din qapısı Həzrəti – Zəhra başına.

Siqt olub Məhsüni, Zəhra özüdə oldu şəhid,
Kül ələndi o zamandan bəri dünya başına.

Kərbəla faciəsi bəzrin əkib başlandı,
Ta qiyamət nə qopa Zeynəbi – Kübra başına.

Müddəi olmadı fərmani – Qədirə təslim,
Gör nə tufan gətirib ümməti – Taha başına.

Məşvərət əmri – ilahidə olurmu? – heyhat!
Çəkdilər cəbr ilə mövlanı da şura başına.

Həzrəti – Fatimənin qəbri də məhcur oldu,
Çadiri – ismətini saldı Sürəyya başına.

Ümmət olmazsa, imamət də olar xanənişin,
Dolanar Kəbə də getdikcə kəlisa başına.

Bu olan işdiki, axşamçağı Allah çobanı,
Çöldə Allah davarın boşlaya bica başına.

Ümmətin əksəri məsdaqi – “ləqəd – həqqəl – qövl ”.
O həvari yığışanmazdı  Məsiha başına.

Müslimin dörd nəfəri mömin olub Səlman tək,
Yusifin eşqi düşər dibdə Züleyxa başına.

Kölgəsi taci – səadət bu şəhadət şövqi,
Özü bir quş ki, qonub Sidrəvü Tuba başına.

Şəhriyar, gəldi Hüseyinin səsi, aşurasi,
Ta düşə eşqi – şəhadət dili – şeyda başına

## NİZAMİ ZÖHRABİ
## *PEYĞƏMBƏRİN (S) XƏSTƏLƏNMƏSİ VƏ HƏYATININ SON GÜNLƏRİ*

Haqdan verilmişdi onun fərmanı,
Neyləyə bilərdi bəndə dərmanı.
Əzrayıl durmuşdu lap astanada,
Boylanıb baxırdı bu bostana da.
Artıq xal salmışdı yaşıl tağına,
Onu qadamışdı öz yatağına.
Daha qalmamışdı sifətində al,
Olurdu bir gündə yüz yol halbahal.
Uzanıb qalmışdı yerində xəstə,
Ruhu bulunurdu Göylə təmasda.
Duyurdu içində ölüm qoxusun,
Gözləyirdi mələk əmri oxusun.
Azca yaxşılaşdı halı bir gecə,
Gəzdi Mədinəni o, küçə - küçə.
-Qəflətən dəyişər əhvalı şayəd,-
Deyə Əli etdi onu müşayət.
Yavəri Həzrətin girdi qoluna,
Çıxdılar, şəhərdən Bəqi yoluna.
Xislətinə hopmuş ədəb, əqidə
O gecə saxladı onu Bəqidə.
O vaxt Mədinənin qızmar yayıydı,

Ayın on doqquzu, Səfər ayıydı.
Xəfif meh əsirdi axşamçağından,
Ağ bulud qalxırdı Uhud dağından.
Peyğəmbər o gecə çalmadı kiprik,
Tuşlandı Göylərə nəzəri dim – dik.
Ehtiram olaraq əhli – Bəqiyə
Əl açdı sübhədək Ulu Baqiyə.
Həmdü – səna dedi, dua elədi,
Rəbbindən onlara rəhmət dilədi.
Keçib arasından neçə məzarın,
Tezdən o, məscidə saldı güzarın.
Qılıb namazını, çıxdı minbərə,
Buyurdu bəşərə burdan son kərə:
-Eşidin sözünü Allah qulunun,
Haqqa itaətdə daim bulunun.
Yalnız düz əməldir Haqqa vasitə,
Əməli olmayan olmaz asudə.
Allahla əməldə qurmadan təmas,
Heç etmək olarmı Ondan iltimas?!
Azacıq titrədi Həzrətin səsi,
Buyurdu:-Hər işin var bünövrəsi.
Yolu xoş əməlin namazdan keçir,
Ondan qidalanır, ondan su içir.
Başlasın gününüz dəstəmaz ilə,
Günü başa vurun siz namaz ilə.

Titrədi Həzrətin səsi yenə də,
Buyurdu təzədən əli sinədə:
-Quran haqq yolun bildim çırağı,
Əldən buraxmadım heç bu yarağı.
O, halal qılanı buyurdum halal,
Haramla qatmadım ona heç xələl.
Dini təbliğ etdim sizə bidətsiz,
Yabançı nidasız, felsiz, ədatsız.
Allah kəlamını qoruyun siz də,
Imanda, əməldə, təbliğinizdə.
Haqqa qail olun daim dünyada,
Dönməyin o mənfur əski bünyada, -
Deyə, O, əbanı çiyninə saldı,
Getdi yavaş – yavaş, camaat qaldı.
Gəldi Ayişənin otağına o,
Uzandı dərhal öz yatağına o.

Içində çəkərək əcəl yükünü,
Qoymuşdu arxada o, yeddi günü.
Rahat hiss edəndə özünü bir az,
Gedib o, məsciddə qılardı namaz.
Son vaxtlar durmurdu yataqdan xəstə,
Çölə boylanırdı otaqdan xəstə.
Günbəgün xəstəlik onu üzürdü,

Qalan günlərini sapa düzürdü.
Əvəz eyləyərək dəstə dəstəni,
Gəlib yoxluyurdu evdə xəstəni.
Gəlirdi yanına dostu, yaxını,
Tükənmək bilmirdi insan axını.
Iyirmi səkkizi çatdı Səfərin,
Əsdi həzin yeli sübhü – səhərin.
Günəş doğmamışdan o gün sübh çağı,
Gömgöy görünürdü göylərin tağı.
Sanki yumuşdular göyün üzünü,
Silib asmışdılar dan ulduzunu.
Zərrəcə əlamət yoxdu buluddan,
Günəşdən təzəcə od alırdı dan.
Xilqət günü kimi dünya gözəldi,
Gördü, Həzrətin də halı düzəldi.
Qalxıb o, yerindən çox rahat durdu,
Özünü məscidə gəlib çatdırdı.
Qurtarıb namazı keçdi xütbəyə,
Bismillahir – rəhmanir – rəhim, - deyə
Danışdi bir qədər o, vacibatdan,
Danışdı zəkatdan, həcdən, cihaddan.
Buyurdu məclisə Həzrət axırda:
Bu son görüşümdür sizinlə burda.
Kimdə haqqım varsa halalı olsun,
Məndə haqqı olan qoy gəlib alsın.

Bilin ki, yetişib sona həyatım,
Bu gün söylənəcək ağım, bayatım.
Əsla dəyişməsin bundan halınız,
Xasdır əbədilik Allaha yalnız.
Bütün yaranmışlar torpağa dönər,
Günəş də parlayar, parlayar, sönər...
Olun, ey ümmətim, bir işdən agah,
Etməyin qəbrimi mənim səcdəgah.
Bilin hər səcdəgah itər, anılmaz.
Allaha baş əyən varlıq yanılmaz!
Söyləyib bir daha etdi əlavə:
Vaxtdır, tez çatdırım özümü evə.
Qaldı axirətə sizlə görüşüm,
Indi kömək edin minbərdən düşüm.
Heç vaxt unutmayın bu son qeydimi,
Qoruyun Quranı, əhli –beytimi.
Mənim risalətim sona yetişdi,-
Deyərək Əlidən yapışıb düşdü.

Həzrət nə danışır, nə də dinirdi,
Sinəsi ahəstə qalxıb – enirdi.
Uzanıb yerindən baxırdı sakit,
Əcəl başı üstə qanad çalırdı,
Haqqa yetişməyə lap az qalırdı.

Daha tükənirdi ayrılan müddət,
Get –gedə edirdi ağrısı şiddət.
Düşdü bir üşütmə canına birdən,
Saldı əllərini yanına birdən.
Fatimə başını əyib dizinə,
Tamam qərq olmuşdu qəm dənizinə.
Indi o, hamıdan artıq qəmliydi,
Baxışı yorğundu, gözü nəmliydi.
Gözündən axırdı yaş gilə - gilə,
Şam kimi yanıb o, dönürdü külə.
Xanım bu ağrıya dözə bilmirdi,
Göz yaşı dönürdü közə, silmirdi.
Həzrətin bu halı sürmədi uzun,
Elə bil Gün düşdü üstünə buzun.
Gəldi bərk hərarət, donu əridi,
Bədəni büsbütün soyuq tər idi.
Gözləri yavaşca onun açıldı,
Qopdu dodağından həzin pıçıltı:
-Gəl mənim yanıma, ey nuri didəm,
Düşün, gör dəyərmi çəkməyə sitəm.
Niyə qərq olmusan bir belə hüznə,
Söylə, niyə dolub o qan gözünə?
Bu yolu keçəcək əyri də, düz də,
Məhkumdur sönməyə Ay da, ulduz da.
Hey dolub boşalır dünya dəmadəm,

Dünür ilk halına övladi – Adəm.
Bu yolu eyləyib Rəbbimiz təyin,
Mümkün olmaz Onun dəyişmək rəyin.
Ölüm Allah qoyan ali qanundur.
Hökm Onun hökmüdür, fərman Onundur.
Ölmün qarşısın almaz bu anda
Nəzr – niyazın da, qızım, duan da.
Əlvida söyləyib dünya qəminə,
Köç edib gedirəm ruh aləminə.
Sən əhli – beytimdən ayrılıb ilkin,
Yanıma gələrsən tezliklə bir gün.
Bu bayram günümdür, deyildir əza.
Soyuq qışdan çıxıb, gedirəm yaza.
Bilsən, ya Fatimə, necə həvəslə
Indi tələsirəm yetməyə vəslə!
Qumral gözlərini dik gözlərimə,
Diqqətlə qulaq as son sözlərimə.
Olmadım var – dövlət, şöhrət əsiri,
Xalıdan mən üstün saydım hasiri.
Bir ömür yaşadım sadədən sadə,
Uymadım şər işə, fitnə - fəsada.
Dəyər yaşadığım illər min əsrə,
Çatmaz heç bir saray tikdiyim qəsrə.
Onun təməli Haqq, tavanı Haqdır,
Bu dünya durduqca o duracaqdır.

Olma bu adıma, arxayın qızım,
Sənə əməlimdən çatmaz bir cızım.
Bil ki, cavabdehsən öz əməlinə,
İki mələk qoyur göz əməlinə.
Qazanmayan kəsə Onun rizasın
Köməklik eyləməz "Fatihə", "Yasin",-
Dedi, boğazında səs xırıldadı,
Soruşdu: - Bəs qızım Əli hardadı?
Ona deyilməmiş sözüm qalıbdır.
Mənzilim uzaqdır, səfərim ağır,
Tez ol, ya Fatimə, Əlini çağır.
Yaxına eyləyib dəvət ərini,
Durub ona verdi xanım yerini.
Bu iki munisi qoyub baş – başa,
Kənardan onlara etdi tamaşa
Söylədi Peyğəmbər: Ya Əli, gəl çıx,
Al mənim başımı öz köksünə sıx.
Bu səhər sübh çağı göylərə baxdım,
Anladım ki, artıq yetişir vaxtım.
Bu gün nuş eyləyib ölüm şərbətin,
Atıram daşını fani qürbətin.
Ayrılmaq olsa da, ya Əli, ağır,
Belə bir aqibət labüddür axır.
Səni çağırmaqda vardır məramım,
Söyləyim, qalmasın qəlbimdə kamım.

Bu bir vəsiyyətdir, yadında saxla,
Canım çıxan kimi çənəmi bağla.
Eylə öz əlinlə məni tərk – libas,
Qüsl elə, su töksün Fəzl ibni Abbas
Qəbrimi bu evin içində qazdır,
Demə məzar üçün burda yer azdır.
Cənazəm üstündə sən dur namaza,
Özün dəfn et məni, tut mənə əza.
Bir də ki, ya Əli, üzüyümü al,
Əmanətim kimi barmağına sal, -
Deyib barmağından üzüyü çəkdi,
-Al, - dedi – hifz elə, bil ki, bu təkdi.
Buyurdu: - Söz bitdi, ömür tükəndi,
Yerə çiynimdəki ağır yük endi.
Tələb eyləyirdi bunu tinətim,
Bir bax, yavaş – yavaş soyuyur ətim.
Artıq dolduruldu əcəl piyaləm,
Göndərdi əmrini Qibleyi – Aləm.
Ölüm şərbətini içməliyəm mən,
Fanidən Baqiyi köçməliyəm mən.
Ya Əli, sən bizdən bir az gen dayan,
Mələk Haqq əmrini eyləyir bəyan.
Qısqan nə torpağa, nə daşa məni,
Burax Əzrayılla baş – başa məni...

## NAZİM SALAMİ
### *PEYĞƏMBƏRİN VƏFATI*

Cahanda deyək biz yaşadıq yüz il,
Bir gün əcəl bizi susduracaq bil.
Bu fani dünyadan umursan kömək,
Bilmirsən haçansa zəhər verəcək.
Kim gəlmiş həyata söylə təzədən,
Sən vəfa gözləmə belə gözəldən.
Bar –dövlət yığmağa səy etmə çalış,
Axırın torpaqdır sonu bir qarış.
Oxu, keçmişləri yaxşı nəzər sal,
Həyatdan çalış ki, bir az ibrət al.
Çalış alnı açıq, şərəflə yaşa,
Bir gün öz ömrünü vurarsan başa.
Nə qədər dünyaya gəlmiş peyğəmbər,
Zirvəyə çatmamış Məhəmməd qədər.
Məhəmməd ən ülvi bir din yaratmış,
İlahi bu işdə köməyə çatmış.
Elə ki, işini yetirdi sona,
Kəbədə sonuncu vəhy gəldi ona.
Ağappaq ağardı rəngi bu zaman,
Soyuq tər alnından töküldü bu an.
Bir qədər sonradan özünə gəldi,
Hamıya üzünü tutaraq dedi:

Mən bu gün bu dini tamamlayıram,
Bütün vəzifəmi bitmiş sayıram.
Bugündən dinimiz islamdır, bilin,
Ürəkdən bu dinə itaət edin.
Peyğəmbər bilirdi köçür həyatdan,
Müqəddəs ruhu ayrılır candan.
Həcci başa vurdu o, döndü evə,
Qayıtdı yenidən o, Mədinəyə.
İki ay keçməmiş, bərk xəstələndi,
Qalxdı hərarəti onun yüksəldi.
Başında şiddətli ağrılar vardı,
Onun bu ağrılar yuxusun aldı.
O, hələ məscidə gedirdi belə,
Namaza rəhbərlik edirdi hələ.
Elə ki, aradan ötdü bir qədər,
Tamam gücdən düşdü peyğəmbər.
Əbu –Bəkr o günü məscidə getdi,
Dayanıb namaza rəhbərlik etdi.
Peyğəmbər həmişə bunu deyirdi,
Borc alan borcunu ödəməlidir,
Bir şəxs ki, borcunu verməkdən qaçır,
Özünə axirət qapısı açır.
Bilirdi ömrünə bir az qalıbdır,
Artıq əcəl onu yaxalayıbdır.
Son dəfə bir təhər məscidə gəldi,

Kimlərə borcum var, söylədi dedi:
Bu zaman bir qoca ayağa qalxdı,
Məscid əhli bütün qocaya baxdı.
Qoca belə dedi: unutdun məgər,
Keçən il olubdur bu, ya peyğəmbər,
Sənə odun qırıb gətirmişdim mən,
Pulunu bu gün də verməmisən sən.
Peyğəmbər diqqətlə dinlədi onu,
Nə qədər demişdi, verdi pulunu.
Elə ki, qocanı o, razı saldı,
Minib dəvəsini evə yollandı.
Altı yüz otuz ikinci ildə,
Bizim bu miladi vaxtıyla bir də.
Qızdırma o qədər onda yüksəldi,
Peyğəmbər yenidən dura bilmədi.
Yanında səssizcə ağlayırdılar,
Ümidi tanrıya bağlayırdılar.
Bu zaman küçədə qapı döyüldü,
Fatimə qapıya tərəf yüyürdü.
Gördü ki, qapıda durub bir nəfər,
Uzaqdan elə bil edibdir səfər.
Parçaya bürünüb tamam hər yeri,
Görünüb gələndir qəribin biri.
Həmin şəxs söylədi izin ver keçim,
Peyğəmbər islama gedim baş çəkim,

Fatimə buyurdu: xəstədir atam,
İncimə, istəməm onu oyadam.
Qonaq təkid etdi görməyə onu,
Allahın elçisi eşidib bunu,
Dedi: ya Cəbrayıl, keç içəri sən,
Artıq neçə gündür gözləyirəm mən.
Cəbrayıl sakitcə otağa girdi,
Əvəllcə baş əyib o, salam verdi,
Buyurdu: rəbbimiz, tapşırdı mənə,
Mən də bu sözləri çatdırım sənə.
Gəldim ki, ruhunu ora aparım,
İylə bu almanı, onu qoparım.
Peyğəmbər buyurdu: əməl et buna,
Tapşır bu gün məni hökmüdarıma.
Hamı möcüzəyə diqqət edirdi,
Qorxudan nəfəs də çəkə bilmirdi.
Peyğəmbər qəfildən taqətsiz qaldı,
Nə nəfəs bilindi, nə səs duyuldu.
Ruhu bədənini tərk etdi bir an,
Böyük də kiçik də, hamı ağlayan,
Bütün qapıları bağladı Əli,
Otaqda saxladı bir –iki nəfəri.
Yaxın qohumuydu, dostuydu bunlar,
Yuyaraq kəfənə onu tutdular.
Açdı qapıları Əli sonradan,

Dedi, vidalaşsın hamı buradan.
Böyük izdihamla verib baş –başa,
Son dəfə gəldilər ki, vidalaşa.
Onu ertəsi gün dəfn etmək üçün,
O gün şəhər əhli yığışdı bütün.
Qoydu Həzrət –Əli onu məzara,
Örtmüşdü hava da matəmdən qara.
Meh vurub, gəlirdi hardansa ətir,
Salami, vaxt keçir, söhbəti bitir.
Oxucum, demirəm məni alqışla,
Nöqsanım varsa da özün bağışla.
Nəyi bilirdimsə dedim şerlə,
Allahdan arzumdur, oxu xeyirlə.
Peyğəmbər islamı gəlin yad edək,
Birlikdə biz onun ruhun şad edək.

**HACI YUSİF QULAMMİRZƏ OĞLU**
***HƏZRƏTİ PEYĞƏMBƏRİN VƏFATI VƏ DƏFNİ***

Mədinə səması duru, tər – təmiz
Səhərin mehi də əsirdi səssiz.
Yuxudan ayılıb Rəsuli - əkrəm.
Özündə yüngüllük hiss edir bu dəm.
Sübh namazna məscidə çıxdı.
Məscid əhli görüb onu karıxdı.
Həzrətin gözləri belə gülümsər,
Heç kim görməmişdi indiyə qədər.
Üzündən, gözündən sanki nur yağır,
Həddindən də artıq cazibədardır.
Bu əlamətləri onda görənlər.
Allaha şükür edib dualar edər.
Həzrət otağına döndüyü zaman,
Yaxın adamları gedir yanından.
Aradan az keçmiş yenə ağrılar,
Onu əvvəlkindən artıq ağrıdar.
Qızdırma da həddin aşıb – daşırdı,
Son dəqiqələri yaxınlaşırdı.
Xidmətində onun dayanan qullar,
Tapşırığı ilə azad oldular.
Evdə pulu vardı düz yeddi dirhəm,
Onu fəqirlərə verdirir bu dəm.

Sonrada səmaya dikdi gözlərin,
Uca dosta tərəf deyir sözlərin:
-“Ya Rəbbim, canımı asnlıqla al”!
Dili “zikirillah” deyir dalbadal.
Dərindən çox ağır nəfəs alırdı,
Yanındakı qaba əlin salırdı.
Soyuq suda əlin o etdigcə yaş,
Mübarək üzünə çəkirdi birbaş.
Göy üzü saf, duru  sakitlik idi,
Ilk xilqət günündə olduğu kimi.
Barmağın yuxarı işarə etdi,
Rəfiqi - əlaya deyərək getdi.
Artıq nə bir səs var, nə də bir nəfəs,
Dərin bir sukuta donmuşdu hər kəs.
Gözləri səmaya dikilib qaldı,
Əbədi aləmə ruhu ucaldı.
Bu zaman Fatimə fəryad qopartdı,
Bu fəryad səsləri get – gedə artdı.
Bunu eşidənlər durxub durur,
Elə bil onları ildırım vurur.
Eşidən hıçqırıb ağlayır bu dəm,
Mədinə üstünü bürüdü matəm:
-Kim dilinə alsa, ölmüş Peyğəmbər,
Boynunu vuraram!-deyirdi Ömər:
-And olsun Allaha, o ölməyibdir!

Qırx gecəlik bizi tərk eyləyibdir.
O da Msa kimi qayıdar yəqin.
Ağlaya – ağlaya silir gözlərin.
Acı hadisədən xəbər tutanlar,
“Peyğəmbər ölərmi?” sordular onlar.
Dedilər:-Allahın elçisi ölməz.
Dedilər:-Qətiyyən bu ola bilməz.
Belə bir Peyğəmbər köçsün dünyadan.
Əbu Bəkir gəlib çıxır bu zaman:
-Kim ki, Mühəmmədə sitayiş edir,
Mühəmməd ölmüşdür! – ucadan deyir:
-Kim ki, Allahına sitayiş edir,
Allah ölən deyil! O, əbədidir!
Peyğəmbər öldüyü üçün məgər siz,
“Dininizdən geri dönəcəksiniz?”
“Peyğəmbər ölərmi” deyənlər ki, var,
Ağlaya – ağlaya inanırdılar.
Peyğəmbər  vəsiyyət etmişdir: -Əli,
Ona qüsul verib, həm dəfin etməli.
Buna əməl edib əmisi oğlu,
Qüsul verib tutdu kəfənə onu.
Yaxın qohumlardan yardımçı aldı,
Onun cənazəsin qaydaya saldı.
Dəfin olan yerə təklif edirlər.
Bəzisi Məkkə ya Qüds də deyirlər.

Əbu Bəkir dedi: -Xatırlayıram,
Buyurub Peyğəmbər əleyhissəlam.
Peyğəmbərlər üçün belə qayda var,
Keçindiyi yerdə dəfn olunarlar.
Demək, o demişdir, qüvvədə qaldı,
Otağın içində qəbir qazıldı.
Müqəddəs borcların verənə qədər,
Cənazə namazın qılır gələnlər.
Kişilər, qadınlar, sonra uşaqlar
Namaz qıldığı vaxt içində ağlar.
Qılınan namazdan görünmür İmam,
Hər kəs növbə ilə edirdi tamam.
Ondan ötrü namaz uzun sürmüşdü,
Onu dəfin etmək gecəyə düşdü.
Mübarək cəsədin qəbrə qoydular,
Üstünü torpaqla etdilər hamar.
Peyğəmbər məzara qoyulan zaman
Həzrəti Fatimə eylədi fəğan.
Qəbirindən bir ovuc torpağı aldı,
Onu qoxlayanda səsi ucaldı:
-Başıma gör necə gəldi müsibət!
Gündüzün başına gəlsəydi fəqət,
Üzü qaralardı olardı gecə.
Belə müsibətə mən dözüm necə?
Deyərək, o ki var yazıq ağladı.

Içini çəkərək ürək dağladı.
Altımış üç yaşın bitirən anda,
Qurani – kərimi tamamlayanda,
Islamiyyət vüsət aldığı zaman
Gözlərini yumdu o, böyük insan.
Ürəkdən ağladı bütün camaat.
Həzrətin ruhuna verdi salavat.[1]

## *PEYĞƏMBƏRİN VƏFATI*
## *(Zəhranın dilindən)*

Çox fikir eylədi Zəhra atasından sonra,
Ona dar gəldi bu dünya, atasından sonra.

Sağlığında qızını gül kimi iylərdi Nəbi,
Soldu qəmdən güli – rəna, atasından sonra.

O bilirdi nə deməkdir anasızlıq dərdi,
Oldu bir dərdi də peyda, atasından sonra.

Atası qəbrinə dərdin danışar gündüzlər,
Şam olandan edir əhya, atasından sonra.

[1] "ALLAHIN ELÇİSİ"

Dərdi artdıqca, o artırdı namazın gecələr,
Haram oldu ona röya, atasından sonra.

Gördü məsciddə Həsən ilə Hüseyni qəmgin,
Oldu göz yaşları dərya, atasından sonra.

O çəkən möhnətə dağlar da dözə bilməz idi,
Dözdü tək Zəhra – Əleyha, atasından sonra.

Olmazın zülmü edildikcə Peyəmbər qızına,
Ölümün etdi təmanna, atasından sonra.

Qəsb edildi açıq – aşkar Əlinin haqqına da,
Gördü qalmış o da tənha, atasından sonra.

Tez unuduldu "Qədir – Xum"dakı beyət andı,
Baş verirdi yəni qovğa, atasından sonra.

Fədəki aldılar ondan ki, ziyan çəksin Əli,
Gülməsin Fatimə əsla, atasından sonra.

Mədinə oldu siyasətçilərin meydanı,
Soldu iman ilə təqva, atasından sonra.

Belə insanlara qarşı o mətanətli xanım,
İnqilab eylədi bərpa, atasından sonra.

Mədinə əhlinə xütbə oxudu qeyrətlə,
Onları eylədi ifşa, atasından sonra.

Bu çətin günlərə dözdükcə kədər üzdü onu,
Yatağa düşdü o, hətta atasından sonra.

O nübüvvət, o imamət, o həqiqət nuru,
İlk şəhid oldu bu yolda, atasından sonra.

Onu gözlərdən uzaq yerdə Əli dəfn etdi,
Qəbri də qaldı müəmma, atasından sonra.

Necə Peyğəmbərimiz ərz eyləmişdir Yusif !
Çatdı tez kamına Zəhra, atasından sonra.

## MİNAYƏ ƏLİYEVA
## *PEYĞƏMBƏRİN VƏFATI*

Neçə gün idi ki, bir qara bulud
Yığışıb durmuşdu bir evin üstə.
Mədinə əhlinin üzündə təlaş,
Gəlirdilər bura dəstəbədəstə.

Müqəddəs insanın eviydi bu ev,
Allahın rəsulu xəstə yatırdı.
Zəifdi, üzgündü, taqətsiz idi,
Ancaq ki, yenədə ışıq saçırdı.

Aman!
Qara bulud necə çoxalır!
Nəsə böyük kədər baş verəcəkdir,
Elə tutulub ki, səmanın üzü,
Sanki bu dəqiqə hönkürəcəkdir.

Nəsə his eyləyib deyən sular da,
Çayların sinəsi şişib, qabarıb.
Hara baxırsansa təlaş, həyacan...
Hər yeri, hər yanı bir kədər sarıb.

Peyğəmbər nə qədər xəstə yatıbdır.
Ancaq bu bənzəmir heç birisinə.
Özünə əyandır, qurub çağıdır,
Görünür gözünə köç gəmisi də.

Fatimeyi – Zəhra dözə bilməyir
Əziz atasının belə halına.
Qoyur əllərini nəvaziş ilə
Atanın od tutub yanan alnına.

Beləcə yoxlayır hərarətini,
Görür ki, istilik sönmək bilməyir.
Bu nə qızdırmadır tutubdur onu.
Nə məlhəm edirsə enmək bilməyir.

Odur ki, Fatimə təlaş içində
Gözünün yaşını sel kimi tökür.
Həzrəti Əlisə dolub bulud tək,
Ancaq ki, ağlamır ürəkdə çəkir.

Həsənlə Hüseyn büküb boynunu,
Baxırlar babaya məlul, pərişan,
Cəmi müsəlmanlar kədər içində.
Əhli – beyitlərinsə ürəyi şan – şan.

Birdən külək əsdi, qapı açıldı,
Hamını çaşdırdı bu qəfil külək,
Demə ki, cənabi Cəbrail gəlib,
Yalnız Peyğəmbərə göründü mələk.

Mələk söylədi ki, böyük yaradan
Ruhunun dalınca göndərib məni.
Peyğəmbərsə dedi: Əmri icra et,
Götür, nə üçün göndərib səni.

Elə bu andaca ruhu bədəndən
Ayrıldı, ürəyi dayandı onun.
Söndü istiliyi oldu buz kimi.
Sifəti ağ nura boyandı onun.

Ruh tərk eləsə də o müqəddəsi.
Nur tərk eləmədi indidə qalır.
Keçib əsrlərin kəşməkeşindən
Nəinki sönməyir, artır, çoxalır.

Fatimeyi – Zəhra bir nalə çəkdi.
Bu səsə hay verdi göydə ildırım,
Əvvəlcə gurultu qopdu səmada
Sonrada göründü qırmızı şırım.

Yerdəki itkinin ağırlığına
Dözməyib üzünü cirmışdı göylər.
Yerin kədərinə şərik çıxaraq
Matəm mərasimi qurmuşdu göylər.

Sonrada göz yaşı axdı səmanın,
Qarışdı yerdəki göz yaşlarına.
Cəmi müsəlmanlar qara geyindi,
Nə müsibət gəldi gör başlarına?

Rəsulun sözünü xatırlayanda
Bir qədər təskinlik tapırdı onlar.
“Sizin aranızda iki qiymətli
Əmanət qoyuram, ey müsəlmanlar!

Birisi o böyük Ulu tanrının
Yerə göndərdiyi Qurani – Kərim,
Digəri, Allahın bu kitabından
Hec vaxt ayrılmayan əhli – beyitlərim”.

Ancaq kədərləri keçmədi yenə.
Hamsının əynində, başında qara,
Bir azdan səmanın rəngi duruldu,
Peyğəmbərin ruhu çatmışdı ora.

Torpaq məhəbbətlə açıb qolunu,
Rəsulun nəşini basdı bağrına.
Fatimeyi –Zəhra dözə bilmədi
Ata itkisinə, ata dağına.

## HACI RZA SƏRRAF
## *HƏZRƏTİ PEYĞƏMBƏRİN(S) VƏFATI MÜNASİƏTİ İLƏ*

Ağlaram səndən sora, qardaş Əli, zar ağlaram,
Ağlaram ta hər qədər canimdə can var, ağlaram.

Sən gedən gündən vətən sənsiz mənə zindan olub,
Sərbəsər məmureyi – eyşim, Əli, viran olub,
Damənim tər, ruzugarim tirə, əşkim qan olub,
Olmuşam sər ta bepa bir əbiri – xunbar, ağlaram.

Ağlaram, çün ağlamaq razü niyazimdir mənim,
Yalqız evdə guşeyi – qəm bəzmi – razimdir mənim,
Tari – zülfün hasili – ömri – dirazimdir mənim,
Neyləyim, çəngimdə ondan yoxdu bir tar ağlaram.

Sən həmişə balişi – naz üstə qoy başun, Əli,
Şəm tək dövrəndə yansın qövmi – qardaşun, Əli,
Olmuşam bu künci – qədəm mən də nəqqaşün, Əli,
Çəkərəm divarə nəqşun rudədivar, ağlaram.

Nə təbibim var ola qəm bəstərində dadrəs,
Nə ənisim var ola axır nəfəsdə həmnəfəs,
Ağlamum, neylim olub dünya mənə künci – qəfəs,
Getdi gül, xar oldu bülbül, soldu gülzar, ağlaram.

Zahiri – surətdə gərci şur sudur göz yaşı,
Aşiqi – birəngi – buyə rəngi – budur göz yaşı,
Bilmişəm çün əhli – eşqə qurudur göz yaşı,
Olmuşam dərdi – qəmi – eşqə giriftar, ağlaram.

Mən mərizi – dərdi – eşqəm, yoxdur dərmanım mənim,
Çox xoşam budərd ilən, rahətdi çün canım mənim,
Qorxaram tutsun əcəl axır giribanim mənim,
Düşməsin bir də əlimə daməni yar, ağlaram.

Xəstəvü rəncurü təbdarəm, əliləm, naxoşam,
Mən sənin bimarüvəm, dünyadə bir dünya xoşam,
Atəşi – eşq ilə çün yanmaqda sər ta pa xoşam,
Bilirəm su töksən artar şöleyi – nar, ağlaram.

Rişteyi – səbrim çıxıb çün ixtiyarimdən mənim,
Əhli – Yəsrib zarə gəlmiş ahi – zarimdən mənim,
Qovmi – qardaşim kənar olmuş kənarimdən mənim,
Yox kənarimdə beğeyrəz əşki – gülnar, ağlaram.

Olmuşam qəmlər əsiri bir degül axir qəmim,
Dərdi – hicrün munisim olmuş, xəyalun həmdəmim,
Bir nəfər badi – səbadən özgə yoxdur məhrəmim,
Şərhi – halimdən səni etsün xəbərdar ağlaram.

Şivədür çün dərdməndi – biqərarə ağlamaq,
Ağlaram, eylər genə hər dərdə çarə ağlamaq,
Yetirir, qardaş Əli, çün yari yarə ağlamaq,
Qismətim bəlkə ola didari – dildar, ağlaram.

Gözdə bu göz yaşı, ey Sərraf, əgərçi xardur,
Abi – şuri – kəmbahadur, cinsi –bimiqdardur,
Batinən hər qətrəsi bir lölöi – şəhvardur,
Bu mətaə çün Peyəmbərdür xəridar, ağlaram.

## *NÖVHƏ*

Ağlayın, ey ümmətani – xasi – xətmül – mürsəlin,
Eyləyib rehlət bu gündə rəhmətən – lil – aləmin.

Istədi təşrif aparsın Həzrəti xətmi – məab,
Yüz tutub əshabinə qıldı bu novilən xitab.
Sizlərə məndən sora höccətdür, ey əhli – kitab,
Bir mənim öz əhli – beytim, bir bu Qurani – mubin.

Bunların həqqiyyətin xəlq içrə isbat eyləyün,
Ehtiramin saxlayın, həqqin müraat eyləyün,
Sayiri – ümmətlərə munlan mübahat, eyləyün,
Getməmiş öz mislimi qoydum yerimdə canişin.

Əvvala hörmət bu oldu ümmətani – bihəya,
Etdilər ali – əba haqqında min cövri – cəfa,
Şiələr Peyğəmbərin üç gün vəfatından sora,
Od tutub yandırdı dərgahin güruhi – müşrikin.

Səd Vəqqas oğlu od burdan götürdü, neylədi,
Nöqtəsin ərz eylərəm hərgəh soruşsan neylədi,
Saxlayıb Kərbübəla dəştində məsrəf eylədi,
Yandırıb bir od buxarindən sönüb misbahi – din.

Ruzi – aşura yetib itmamə çün əmri – imam,
Ibn Sədi – bihəya fərman verib ki, əhli – Şam,
Od vurun bu xeyməgahə od tutub yansın tamam,
Paymal olsun od içrə bəlkə ətfali – Hüseyn.

Gördü bu əhvali binti – Həzrəti Xeyrünnisa,
Seyyidi – səccadə ərz etdi sənə əmmən fəda,
Imdi təklifim nədür fərmayiş etdi söylə ta
Əmməcan, səhrayə qaçsın əhli – beyti – dilğəmin.

Rəm yeyib çün bu xəbərdən ahuvani – dəşti – ğəm,
Yüz qoyub səhrayə başsız banovani – möhtərəm,
Aşiyan yandı dağıldı çöllərə əhli – hərəm,
Qorxudan Leyla olub Məcnun kimi səhranişin.

Bilmirəm, yarəb, nədən bu kövn viran olmadı,
Haləti – Zeynəb kimi aləm pərişan olmadı,
Kərbəla dəştində şiə bir müsəlman olmadı,
Əhli – beyti – bikəsə olsun o saətdə müin.

Məhfili – matəmdə, ey Sərraf, gövhərnaşünas,
Padşahi – Kərbəlayə saxla bu cəmilə yas,
Sal nəzərdən tifli – əşki – çeşmi leyk ağuşə bas,
Çün olur hər qətrəsi məhşərdə bir dürri – səmin.

## MİRZƏ NƏSİB QÜDSİ
### *BU GÜN*

Öldü şiələr Mustəfa bu gün,
Va müsibəta Müctəba bu gün.

Aləmi tutub bangi şuri – şeyin,
Getdi heyf ola mehri – aləmeyn,
Baş açıb Həsən, ağlayır Hüseyn,
Düşdü möhnətə Murtəza bu gün.

Fatimə açıb başın ağlayır,
Lalə tək bu gün sinə dağlayır,
Matəmində bəs qarə bağlayır,
Aləmi edib qəm – fəza bu gün.

Matəmi – Hüseyn vardı sinə – suz,
Çıxmamışdı bəs qarəsi hənuz,
Matəmi – Rəsul eylədi biruz,
Rehlət eylədi müqtəda bu gün.

Qaldı binəva zari Fatimə,
Oldu gül kimi xari Fatimə,
Rüzgarıdır tari Fatimə,
Günləri olub çün səbu bu gün.

Tökdü sünbülü gül – üzarinə,
Ağladı solan lalə – zarinə,
Tab etmədi ahi – zarinə,
Əhli – yəsribi bivəfa bu gün.

Fatimə bu dəm gəl əzaya bax,
Dur Bəqidən bir nəvayə bax,
Şiələrdə bu şuri – vayə bax,
Ərzidən yetib ta səma bu gün.

Çıxmayıb hələ şiə yasidən,
Matəmi – Hüseyn fəxri nasidən,
Möhnəti və ğəm həm hərasidən,
Geydilər hamı bəs qarə bu gün.

Çərx sinədən ahi vurdu bərq,
Etdi aləmi seyri – eşqə qərq,
Tutdu təziyə əhli qərbi – şərq,
Eyləyib şaha can fəda bu gün.

Va Muhəmmədа sovti – aləmi,
Tutdu ərzilən ərşi – aləmi,
Saxlayıb sənə xəlqi matəmi,
Padişah ilən həm gəda bu gün.

Afitab – can – ərşi – üstüfa,
Novbəhari – din gülşəni – səfa,

Rahi – dini də çəkmisən cəfa,
Eylədin bizə çox əta bu gün.

Oldu dərgahın aləmi şünas,
Üz tutub gəlir fovci ami – xas,
Küfrüdən bizi eylədin xilas,
Həqq verə sənə bəs cəza bu gün.

Çərx eylədi xar "Qüdsini",
Əbr tək edib zar "Qüdsini",
Qoysa şəmsi – din tar "Qüdsini",
Başlayıb sənə çün əza bu gün.

**KƏRİMİ**

***HƏZRƏTİ MUHƏMMƏD SƏL – LƏLLAHU ƏLEYHİ VƏSƏLLƏMİN VƏFATINDA HƏZRƏT FATİMƏ ƏLEYHİS – SƏLAMİN ZƏBANİ HALİ.***

***(sinəzən və növhə)***

Ürəyim olur parə – baba ya rəsuləllah
Mənə eylə bir çarə – baba ya rəsuləllah

Baba can nə tez doydun – bu səfali gülşəndən
Məniylə danuşmursan – niyə küsmüsən məndən
Öpüb eylərəm nəşün – baba doymaram səndən
Məni qoyma avarə – baba ya rəsuləllah

Gözün aç mənə bir bax – gözüvə olum qurban
Necə gör axır əşgim – baba eyluram əfğan
Məni qoyma dünyada – belə xaru sərgərdan
Nəzər et bu biyarə – baba ya rəsuləllah

Alar eşqiya məndən – bu məqamu təcili
Nə inadiylə sani – vuracaq mənə sili
Əlinün cəfasından – olacaq üzüm neyli
Salaram başa qarə – baba ya rəsuləllah

Baba səbr edəm müşgül – dayanam fəraqundə
Məni apar qəbrə – baba can qucağunda
İkimiz yataq bahəm – dodağım dodağında
Məni salma odlara – baba ya rəsuləllah

Edəcağ məni sani – baba qanimə qəltan
Sixacağ dərdu var – edəcağ məni nalan
Bu sən öpduğun sinə – noli ey şahi dövran
Hədəf olsa mismarə – baba ya rəsuləllah

Dəxi birdən dünyadə – bulərəm üzümə gülməz
Biri halıma yanmaz – biri əşkimi silməz
Biri yadına salmaz – biri halımı bilməz
Nəzər et mənə – zarə – baba ya rəsuləllah

Babacan fəraqundə – solaram sarallam mən
Toya getmərəm birdə – başa qarə sallam mən
Ağarub başım qəddim – bükülər qocallam mən
Cigərim olar parə – baba ya rəsuləllah

Nə qədər sağam daim – baba vay deyu yannam
Yerivi görüb xali – dəxi deldən odlannam
Adivi azanlarda – eşidub əlovlannam
Axar eşq rüxsarə – baba ya rəsuləllah

Bu Kərimiyə şaha – kərəm et kəramətdən
Oni eyləmə məhrum – sən özün şəfaətdən
Üzi qarə nökərdi – nə olar səxavətdən
Sile versən əşarə – baba ya rəsuləllah

## DAHİ ALMASLI
### *PEYĞƏMBƏRİN VƏFATI*

Susdu , ya Rəbb, bülbülü-şeyda, gülüstan ağlasın,
Söndü nuri-kainat, xurşidi rəxşan ağlasın.

Soldu xilqət bağçasında ənbiyanın son gülü,
Solmayan güllər solub, gülzarı-rizvan ağlasın.

Aləmi tərk eylədi pərgari-vəhdət nöqtəsi,
Kafəru gəbru yəhud, tərsa, müsəlman ağlasın.

Mərifət dəryasının dürri-yətimin aldı çərx,
Dalğalar gəlsin qiyamə, əbri-nisan, ağlasın.

Zülməti-dünya tükəndirdi hidayət nəşini,
Kurə fərq etməz fəqət, qoy gözlülər qan ağlasın.

Eşq getdi,elm getdi, getdi Quran məktəbi,
Hicri – Yasin də «Qələm» Taha da «Fürqan» ağlasın.

Yox fələklərdə, mələklərdə o şahın bənzəri,
Xaku-əflaki dolandırsın, ha dövran ağlasın.

Dahinin fəryadına aləm qoşulsun şur ilə,
Nəğmeyi-Davud ilə mülki-Süleyman, ağlasın.

## NİZAMİ GƏNCƏVİ
## *"SİRLƏR XƏZİNƏSİ"*
## *PEYĞƏMBƏRLƏRİN SONUNCUSU HƏZRƏT MƏHƏMMƏDƏ GÖZƏLLƏMƏ*

Birinci nəqş edilmiş "Əlif" oxu lövhədə,
Ağ pərdəli qapıda qismət oldu Əhmədə.

Qüdrət, səltənət verdi "Əlif" "Hey" həlqəsinə.
"Dal" – dan gərdənlik aldı, "Mim" – dən kəmər özünə.

"Əlif", "dal" ilə "mim" tapdı həyat qüvvəsi,
Bir dövlət dairəsi, bir kamal xəzinəsi.

Firuzədən tapılmış bu əngin mavilikdə
Cənnət qəsrindən gələn turuncdu tazəlikdə.

Turuncunda dünyada öz adəti, dəbi var:
Öncə mevə gətirər, sonra çiçək, gülbahar.

Onun oldu birinci peyğəmbərlik bayrağı,
Son peyğəmbər olmağın şərafəti, növrağı.

Möhür kimi verildi Məhəmmədə yeni Ay,
Hansı zəbərcəd qaşlı üzük olar ona tay?

Cahanın qulağında onun "mim" həlqəsi var,
Ona təslim həlqəsi iki dünyadır aşkar.

O – sahə ölçən ağa, Məsih – ona qulluqçu,
O Tanrının elçisi. Bu – yalnız muştuluqçu.

Təhsili olmasada o, çox yüksəkdir, inan.
"Əlif" ilə Adəmdə, "mim" ilə Məsihadan.

Sədaqətdə, vəfada "əlif" gördülər onu,
Peyğəmbərliyin başı, peyğəmbərliyin sonu!

Məhəmməddir aləmin ən işıqlı nöqtəsi,
Bütün deyilmişlərə nöqtə qoyub nüqtəsi.

Cahana baş əyməyən kamil kişi olsa da,
Öyünməkdən, kibrdən uzaq gəzdi dünyada.

Şan – şöhrət tapdı "ədəb", gələndə onun səsi,
Fələklər, kəhkəşanlər – kəmərinin düyməsi.

Onun hərəm evində pərdəçidir hurilər,
Ürəyindən su içir ismət, ləyaqət, hünər.

Silir günahı gözdən türbəsini ziyarət,
Xərac aldı Məkkədən onun düşdüyü qürbət,

Susması könüllərə işıq salan zəriflik,
Qüsurlara od vurar ondakı eşq, ariflik.

Fitnə yaratmağıyla könüldə eşq oyadar,
Ona heyran olmayan məgər bir insanmı var?

Insanlığın ən böyük başçısı, xeyirxahı,
Ağır başlı, vüqarlı, çevik yürüşlü dahi!

Odur əzəl dərsini əbədəcən oxuyan,
Canını çıraq edib, tanrı nurunu yayan.

Feyzindən yardım dilər Günəşin nur qaynağı,
Ayı merac gecəsi şaqqaladı barmağı.

Darısqal kökslərə o asiman doldurub,
Karvanqıran ulduzun Qıratına nal vurub.

Eşidəndə ki, gəlir, dönür meracdan geri.
Yedəklədi boz atı sənət süvailəri.

Atının yəhərindən yapışmaq səadəti,
Nizaminin qisməti. Gec yetişdi növbəti.

## *PEYĞƏMBƏRMİZİ ÖYƏN İKİNCİ GÖZƏLLƏMƏ*

Yeddi ulduzun nuru, doqquz fələyə gültac,
Tanrı elçilərinin ən ucası, son yalvac.

Əhmədin ayağında əql özünü toz sanıb,
Yəhərinin tərkinə iki cahan bağlanıb.

Odur naz səhrasının yeni açmış sünbülü,
Gizlinlər dənizində ən saf gövhərdi könlü.

Saçları gündüz belə şölə verər sünbülə,
Dişləri qərq eləyər Günəşi dürrə, lələ.

Şəkər dodaqlarını daim açsaydı əgər,
Ondan utanmazdımı sədəf bağrında gövhər?

Bir daşın da könlünü qırmayan həssas kişi!
Daşlar necə qıydı bəs, sındırdı inci dişi?

Əlindən hər şey gələr, kim olarsa bağrı daş,
Qara – qura sövdaya meydan açar o kütbaş.

Məhəmmədin dürrünü sındırmasaydı əgər,
Öyünə bilərdimi o daş məgər bu qədər?!

Dar ağız qutusuna daş dəydi, düşdü gövhər,
Gövhər daşdan doğulur, əbəsmi söyləyiblər?

Qan bahası verməyə məgər daşın pulu var?
Peyğəmbərin ağzını neçin yaralıdılar?

Daşın ağzından çıxan min – min işıqlı inci
Məgər ola bilərmi bircə dişin ödənci?

Zəfər onun dişinin qan bahasıydı yəqin,
Bütün can – cövhəri zəfərindi, zəfərin.

Ağzını qanla yudu, qoroyub muradını,
Başı üstə ucaltdı mərhəmətin adını.

Sınıq dişi kökündən yerli – dibli çıxartdı,
Böyük zəfər naminə şükr edib, onu atdı.

Vaz keçdi könlündəki bütün arzularından,
Bir arpa dəyərində gözündə iki cahan.

Onun döyüş ordusu döyüş meydanında ər,
Əli bayraq əvəzi, dili sıyrılmış xəncər.

Haqq xəncəri dilinin nə ehtiyacı dişə?
Məgər dişli xəncərlə gedərlərmi döyüşə?

Qoy ondan zövq alanlar diş bəhsini unutsun,
Hamı atsın tikanı, gülündən dəstə tutsun.

Bağlar güllə doluykən kim tikandan bəhs açar?
Sapa inci düzərkən ilana lüzummu var?!

Onun gülü üstündə bülbülləşib Nizami,
Feyzindən açılıbdır təbi qızılgül kimi.

## *SON PEYĞƏMBƏR HƏZRƏT MƏHƏMMƏDƏ ÜÇÜNCÜ GÖZƏLLƏMƏ*

Ey varlığın ən təmiz ruhlardan daha təmiz!
Ruhuna canım fəda! Ulu peyğəmbərimiz!

Sənsən rəhmət yurdunun tən ortası, mərkəzi,
Qələminlə silindi hər zəhmətin nöqtəsi.

Sən Əcəm şahlarının həmişəlik şahısan,
Ərəb yolçularının Ayısan, pənahısan.

Yolu göstərməsən də, yol tapırlar sayəndə,
Baş kəntxuda özünsən, kəndə heç dönməsən də.

El baxır, heyran qalır kərəminin sirrinə,
Təkcə tamaşa etmək olmaz təklik pirinə.

Şirin xurma yediyin qonaqlıq süfrəsindən
Xırda – xuruş hansı pay gətirmisən, söylə sən?

Dil aç ki, insanlığa bal kimi sözlər gərək,
Ağız suyunla bitən həqq xurmasından dərək.

Ey gecə saçlarıyla gündüzlərə səpən nur.
Sənə eşq atəşimiz dirilik suyumuzdur!

Ağıl sənin üzünün məftunudur, ey qoca!
Məftunların nə qədər? Saçlarının sanıyca.

Çərx – sənin kəmərinin ilgəyinədə bir kölə,
Səhər – gülər üzünün günəşindən bir şölə.

Bu günahkar aləmi günahdan qurtardın sən,
Ətirləndi müşkünlə yerin göbəyi, əhsən.

Türbənin təsirindən Ərəbistan – gülüstan,
Ölkənin hüdudları müşk ətirli bağ – bostan.

Bağ demirəm, torpağın cənnətdən də yaxşıdır,
Süleymanın mehindən, o təxtdən də yaxşıdır.

Sənə ibadət qılan Kəbəni od qarsımış,
Mübarək dodağının gül suyuna susamış.

Sənin təxtü tacını daşıyır cahan, bəşər,
Təxtin – bu Yer kürrəsi, tacın – səma könüllər.

Kölgən yoxdur, çünki sən böyük əql işığısan,
Yaxud tanrı nurunun sayəsindən bir nişan.

Dörd bayrağın – təkbirin müsəlmanlıq mehvəri,
Beş duan – beş namazın sultanlıq növbətləri.

Düşgünlərin torpağı bağa döndü feyzindən.
Qüdrət sahiblərinin gözü nur aldı səndən.

Merac gecəsindən sən – aləmə dost, aşina,
Ayaqların toxundu fələklərin başına.

Sən gəldin, göy ətəyi doldu daş – qaşla, zərlə,
Göy çevrəsi süsləndi altunla, al rənglərlə.

Sübhün sədəfindəki, ah, bu hansı ətirdi?
Səba müşk ətri verən nəfəsini gətirdi.

Nəfəsinin saçdığı o ətri, ənbəri sən
İki dünyaya  versən, necə ucuz verərsən!

Qocaman Sidr ağacı – təxtinin bir ayağı,
Ərş sənin qəsrindəki kürsüdən də aşağı.

Ruhun pəncərəsi – açıq, aydın bir səhər,
O günəşin yanında ərş zərrəyə bənzər.

Əzəl sübhü hüsnünü əks eləyən bir ayna...
Onsuz yayılardımı sənin nurun dünyaya?

İki cahan başçısı, neçin yer altındasan?
Məgər xəzinəmisən, gözdən, könüldən nihan?!

Ey müqəddəs xəzinə, sən ki, yerdəsən artıq,
Bütün xəzinələri yerə tapşırmalıyıq.

Yoxsulluğun – viranə, vücudun xəzinədir,
Hamıya yetən kölgən şamına pərvanədir.

Fələyin əyri çərxi – ahının hədəf yeri.
Dolçasının çənbəri – quyunun yaş kəndiri.

Bu ağ, qara dünyanın soltanları – Ayla Gün
Peykin olub yolunda, xəbərçidir səninçün.

Ağıl şəfa arayır – onun loğmanı sənsən,
Ay yol tədarükündə - canı, cananı sənsən.

Qalx, vüsal umanların gecəsini gündüz et,
Nizaminin təbini işıqlandır, ulduz et.

## *PEYĞƏMBƏRİN ÜSTÜNƏ DÖRDÜNCÜ GÖZƏLLƏMƏ*

Ey Mədinə köynəkli, Məkkə pərdəli gözəl!
Günəş nə vaxta kimi kölgədə qalacaq, gəl!

Aysan əgər, nurundan bir şölə göndər bizə,
Gülsən əgər, bağından ətrin gəlsin tərtəzə,

Canlarını dişinə tutub yol gözləyənlər
İmdad istər,ey dada yetişən sevgili ər!

Durma Ərəb çölündə, Əcəm yurduna atlan,
Gecə Qıratla, gündüz ağ köhlənlə qanadlan!

Elə tazələndir ki, sən bu köhnə dünyanı
Tutsun səsin, nəfəsin qoy hər iki cahanı.

Sultanlıq et, əmirlər səni sultan biliblər,
Özün oxu xütbəni, sükut etsin xətiblər.

Torpağın xilafətə bir gül çələngi atdı,
Heyhat,fitnə küləyi gül ətrini dağıtdı.

Çək ipini, təxtindən endir asudələri,
Bulaşıq abidlərdən təmizlə bu minbəri.

Gəlib evə soxulan bu cinləri qovla, qır!
At ölüm quyusuna alçaqları, amandır!

Qoyma basıb yesinlər, onlar qarınquludur.
Ləğv et iqtalarını, qudurmasın hər quldur

Cansız cisimlərik biz, sən buyur can ol bizə,
Hamımız qarşqayıq, gəl, Süleyman ol bizə.

Başçı sənsən, bəs neçin başsız qalıbdı karvan?
Mərkəz sənsən, bəs neçin bayraq qalxır kənardan?

Bir yanda rəxnə salır, bir yanda tor qururlar,
Dinimizi gözündən, ürəyindən vururlar.

Sən şeytanın üstünə Öməri göndər, ya da
Əmr et, Əli vuruşsun bu vuruş meydanında.

Saçını ay üzünə Yəmən tülü kimi sər,
At bu Yəmən cübbəni, ay camalını göstər!

Kəməri bərk çəkib, vur qapı bağlayanları,
Bu bir neçə alçağı bir az da alçat barı.

Beş yüz əlli doqquz il uyudun, yatdın yetər!
Oyanıb məclisə gəl yaxındır ulu günlər.

Qalx ayağa, əmr elə, oyat sən İsrafili,
Qoy üfürüb keçirsin bu bir neçə qəndili.

Gizlən sirr pərdəsində, xəlvət yaşa, sayıq ol!
Biz hamımız uyğuda, barı bir sən ayıq ol!

Dünya – ölüm, qan yurdu. Son qoy bu afətə sən,
Mərd əlini uzat, tut hamımızın əlindən.
Könlündə haqdan savay məgər bir dilək varmı?
Sənə qovuşan kəslər başqa bir şey umarmı?

Qayğı gözüylə bir yol qoca dünyaya bqxsan,
Hər müşkülü açacaq, zülmü yandıracaqsan.

Barmağının ucuyla işarə qıl fələyə,
Bütün varlıq verilər sənə sovqat, hədiyyə.

Əfv eləsən bir ovuc toza, külə dönəni,
Qiyamətdə, məhşərdə axı kim qınar səni!

Aç pərdəni, aşiqlər görsün hüsnünü bir dəm,
Sevincdən xirqəsini atsın qoy iki aləm.

Nizami ruhu səndən xoş xəbər gözləməkdə,
Sənin baharın onun könlünü süsləməkdə.

Vəfa qoxusu göndər mənə gül nəfəsindən,
Bəxş et bir dilənçiyə Süleyman mülkünü sən.

## *PEYĞƏMBƏRMİZƏ BEŞİNCİ GÖZƏLLƏMƏ*

Ey yalvaclar tacının ən qiymətli gövhəri,
Sultanlara tac verən ağ günlər peyğəmbəri!

Yad da sənə möhtacdır, ümmətindən olan da,
Çörəyini yeyənlər nə qədərdir cahanda.

Adın ilə başlanır beytimin başlancığı
O həm də qafiyətək söz sonunda baş tacı!

Bizim bu viran kəndə gəlincə bir işarət,
Sənin ruhun, Adəmin cismi qurdu imarət.

Əllərinlə bəzənmiş bu tazə mülkə əhsən,
Ilk kərpici Adəmdir, son kərpici özünsən.

Həm Adəmsən, həm də Nuh, yox onlardan ucasan,
Onların vurduqları düyünləri açansan.

Adəm bir buğda daddı, ağır günaha batdı,
Tövbəsi – bir gülşəkər, tövbə dadına çatdı.

Sənin ətrin Adəmə tövbə yolu göstərdi,
Kandarının torpağı onunçun gülşəkərdi.

Sözünü şəkər bilib, tövbə edərkən Adəm,
Gülşəkər də əl çəkdi, inan, şəkərliyindən.

Tanrı qəbul topunu yaratmışdı əzəldən,
Könüllər meydanına atdı onu qəfildən.

Adəm öz çovkanıyla topun önündə durdu,
Hamıdan tez, birinci zərbəni özü vurdu.

Ancaq, atı şığıdı saman dalınca sağa,
Yazıq top aciz qalıb, qısıldı bir bucağa.

Nuh təşnəydi, bu dünya süfrəsinə yanaşdı,
Çeşmə çıxdı yadından, tufan başından aşdı.

Növbə çatdı, İbrahim köhlən səyirtdi...heyhat,
Çatdırmadı mənzilə, üç dəfə büdrədi at.

Könlü darıxan Davud zilə qaldırdı bəmi,
Amma, səsi çatmadı, dağılmadı dərd – qəmi.

Ədəb, ərkan gözlədi, alqışlar Süleymana!
Peyğəmbərlik tacını umub, axtarmayana.

Atıldığı quyuda Yusif nə tapdı? Dolça.
Bir də dolçaya bağlı uzun ip gördü ancaq.

Bezdi quru aləmin yolçuluğundan Xızr,
Bir də gördü ətəyi çeşmədə islanıbdır.

Musa çatdımı kama, camdakı şadlığına?
Əlindəki şüşəni çırpdı Ərni dağına.

Məsiha bu qidaya tamah salmadı...Bəli.!
Çünki xalqın önündə ləkəliydi, ləkəli!

Təkcə özün bacardın bu işi, bu hünəri,
Heyran qoydu qeyrətin, iradən fələkləri.

Möhürləndi bu namə sənin öz ünvanınla,
Tamamlandı bu xütbə dövrünlə, dövranınla.

Qalx! Bu fələkdən qat – qat gözəl bir dairə qur,
Fələk bunu bacarmaz, Sən bəşərə arxa dur.

Xütbənin meydanıdır fələyin səhifəsi.
Çövkanın ucunda bir topdur Yer kürrəsi.

O yoxluq aləmindən bir toz da ucalmayıb,
At çap, meydan sənindir, heç bir kimsə qalmayıb.

Fanilik nəçidir ki, dağıtsın piyaləni?
Alçaq yoxluq kimdir ki, silsin dünyadan səni?

Yoxluğun ayağını yoxluq içində bağla!
Faniliyin əlini faniliklə ayaqla!

Nəfəsi dilsizlərə dil verən ey hünərvər!
Yaralı ciyərlərə məlhəm qoyan peyğəmbər!

Sənin yolunu tutan ağıl qan dəryasından
Dartıb can gəmisini, sahilə çıxmış müdam.

Yurdunun qapıları – doqquz çərxin qibləsi,
Altı günə yaranmış ərz – saçının həlqəsi.

Bircə tük əskik olsa sənin məğrur başından,
Mübarək saçlarıntək pərişan olar cahan.

İdrakınla oxudun hətta yazılmayanı,
Əqlinlə işıqlatdın beyin adlı cahanı.

Hər sözə, hər cümləyə həssas yanaşdın daim,
Ta ki, sənin sözünə barmaq qoymasın heç kim.

Özgələrin sözünə barmaq qoyuruq bir az,
Ancaq, sənin sözünə heç kəs irad tutamaz.

Sənin qapının tozu – qovut, şəkər əvəzi,
Cövhərini yoğurmuş püstə, xurma çərəzi.

Bir ovuc qovudunla qırx gün dolanmaq mümkün,
Məhəbbət səhrasını gəzib seyr etmək üçün.

Nicat sübhü ver mənə, ey dağım, ey dayağım!
Sən dirilik suyusan, mən də sənin torpağın.

Canımın behiştidir daşın, torpağın sənin,
Cahanımdır, canımdır türbən, gül bağın sənin.

Rüzgar olum, dolanım o türbənin başına,
Toza dönüm, qarışım torpağına, daşına.

Torpağından gözünə sürmə çəkər Nizami,
Yəhərini daşıyar sənin qulamın kimi,

Torpağını isladıb təbərrik bilir bəşər,
Mənim də torpağımı saçlarına çəksinlər.

## *PEYĞƏMBƏRİN TƏRİFİ (“XOSROV VƏ ŞİRİN” POEMASINDAN)*

Böyük Məhəmmədə yüz min afərin!
Xilqət torpağıdır, buna ol əmin.
Həqiqət görənlər gözünə çıraq,
Varlığa bir zinət özüdür ancaq.
Vəfa meydanının qabaqcılıdır,
Nəbilərə rəhbər, başcıl sayılır.
Günahkar ümməti qoymaz xəcalət,
Eyləyər onlara daim şəfaət.
Sübhün baxçasına ətirlər saçar,
Odur hər ilahi xəznəyə açar.
Nə qədər yetimi sevdi, saxladı,
“Dürri – yetim” qaldı odur ki, adı.
Mənada Adəmin can kimiyası,
Surətdə aləmin göz tutiyası.
Şəriət evinə qoymuşdu dörd hədd,
Qurmuş dörd divarla bir əbədiyyət.
Nübbüvvətə dini verdi yenilik,
Köməkçisi oldu ağıl və bilik.
Dini dünyada son din olduğundan,
Başqa dinlər batil edildi haman.
Rəhimli kişidir, qəzəbli bir şir,
Dili gah açardır, gah da bir şəmşir.

O bütün xaslardan xas bir Ayazdır,
Məsuddan Mahmuda çatmış bir xasdır.
Bir nüsrət qılıncı Haqq vermiş ona,
Dəmirlə iz salır daşın bağrına.
Möcüzlə xar etdi bədgümanları,
Sıxdı daş qəlbilə yaşayanları.
Dostunu qarşılar gültək gülərək,
Hər qeyddən azaddır dünya sərvitək.
Yaşıllıq almışdır sərvindən göylər,
Əmmaməsi saçmış küləyə ənbər.
Sultan ordusunda tutaraq qərar,
Beş növbəyə durmuş dörd yoldaşı var.
Göy taxtının tacı başmaqlarıdır,
Vəhy ilə meracın sirri ondadır.
Mehdini quyudan aparmış göyə,
Divləri döndərmiş: -İnsan ol, -deyə.
Xəlil – qoşununun bir əsgəridir,
Məsih – karvanının bir rəhbəridir.
Dağda, mağarada yaşayan zaman
Məhrəmləri oldu əqrəb və ilan.
Gah hədəf etmişdir dişini daşa,
Gah dodağın etmiş daşla baş – başa.
“ Daşlardan çıxar ləl və gövhər” deyə,
Dişi – dodağı dözdü daşa, zərbəyə.
Dişini tökəni zəlil edərək,

Onun qapısına gətirdi fələk.
Gözləri yuxuda, qəlbi sakitkən
“Ümmətin!...” kəlməsi düşməz dilindən.
Mən bir təşnə insan, o bir sərin su,
O, mənim suyumdur, mən onun tozu.
Xidmətdə çox qüsür üz vermiş mənə,
Ey Tanrı elçisi, çarə nədir, nə?
O pak məzarından bir diləyim var:
Haqdan mən yazığa ol duakar.
Bilirəm xahişim qəbula keçər,
Mənimçün əl qaldır, lütf et bir qədər.
De ki, Nizaminin, sən karını aç,
Kafərin nəfsindən zünnarını aç!
Rahatlıq evində qəlbini sazla,
Bəxşişə layiqdir, onu bağışla!
Ağır dağlar qədər varsa günahı,
Rəhmət dənizin var, böyük İlahi!
Ruhunu bağışla, sən bəxş edənsən,
Günahı əfv edən bir Tanrısan sən![1]

---

[1] N.Gəncəvinin “Xosrov və Şirin” poeması

## *SONUNCU PEYĞƏMBƏRİN TƏRİFİ („LEYLİ VƏ MƏCNUN" POEMASINDAN)*

Ey varlıq mülkünə böyük şahsüvar,
Əqlin sultanısan, zəkavətin var.
Sonusan o mürsəl Peyğəmbərlərin,
Sonun halvasısan, duzu əvvəlin.
Varlıq bağçasının ilk gülü sənsən,
Zamanın sonuncu sərkərdəsisən.
Kifayət mülkünə sənsən hökmüdar,
Vilayət hökmüdür verdiyin qərar.
Hər kəs lovğalıqla çıxsa qarşına,
Bir ədəb qılıncı enər başına.
Gözlər işıq alır ayaq tozundan,
Aləm işıqlanır daima ondan.
Səndən işığını almayan bir şam
Sönər öz yeliylə, qaralar müdam.
Ey qəbilələrlə aydın dil tapan,
Vazeh dəlillərlə zərbə vurursan.
Allahın höccəti bütün səndədir.
Səhərin sirri də o sinəndədir.
Ey iki dünyanın saray ağası,
O qabü qövseynin mahir ustası,
Ey sonsuz göyləri gəzib bac alan,
Yetmiş min pərdənin üstə ucalan,

Ey əqlin və canın fövqündə duran,
Sənə səcdə qılır yerlə asiman.
Yer göyə dönmüşdür dininlə, gerçək,
Yox, yox, düşməndir bu sonsuz fələk.
Ey altı cəhəti heyrətləndirən,
Atını çapırsan yeddi göyə sən.
Altı – yeddi min il geçir o andan
Ki, bu dəbdəbəni eşitmiş cahan.
Hər əqlə süfrəndə bir nemətin var,
Qapında qul kimi dayanır ruhlar.
Ağıl sənsiz olsa, nə çıxar ondan?
Sənsiz yaşayarsa ölüdür hər can.
Öz adın oğlunun adıyla birdir,
Aləm "Əbülqasim Muhəmməd" deyir.
Ağıl ki, görünməz bir xəlifədir,
Qüvvəti, qüdrəti sözlərindədir.
Muhəmməd eşqiylə yanmasa ürək,
Eşqin çəmənində açılmaz çiçək.
Tanrı dostlarına sənsən şahsüvar,
Yeddi göy üstündə bir məclisin var.
Səxavət mülkünün sənsən ağası,
Dünya məqsədisən, məqsəd dünyası.
Mənalar mülkünün ilk qaynağısan,
Dirlik suyunun baş bulağısan.
Sənin torpağınla bəzəndi Adəm,

Nurunla parladı hər iki aləm.
Sən ki öz “atını”sürdün dövrana,
O, yeddi atıyla çatmadı sana.
Günəş can atırdı səcdənə, gerçək,
Ona bəhaneydi məğribə getmək.
Ulduzlar başına dolanır dəm – dəm,
Yalnız bu arzuyla fırlanır aləm.
Varlıq büsatında varmı bir insan,
Qarşında olmasın yer ilə yeksan?
Sənin iksirinlə rəgləndi torpaq,
Bu dünya sənün çün yaranmış ancaq.
Böyüksən qarşında kiçikdir hamı,
Bütün möhtacların sənsən ilhamı.
Kainat taxtının padişahısan,
Həyat ölkəsinin şahlar şahısan.
Mavi göy səninçin bir ordugahdır,
Qəmzən bir fərmandır, hörüyün saçdır.
Bu beş vaxt  namazdır əsli tövbənin,
Beş növbə təblidir qapında sənin.
Quruldu dininin beş bünövrəsi,
Yüz min zülm evinin kəsildi səsi.
Bu evi yeddi səqf yaratdın yenə,
Tapşırdın onu da dörd xəlifənə.
Siddiq sədaqətə olmuşdur rəhbər,
Faruqi fərqdən uzaq bildilər.

O, Allahdan qorxan həyali qoca,
Tanrının şiriylə həmdərs olunca
Dördü də bir yolun sarbanı oldu,
Dördüdə bir ləkin reyhanı oldu.
Bu dörd xəlifəylə güldü məmləkət,
Hər ev dörd divarla qurular, əlbət.
Bu dördlük birləşdi qoca dünyada,
Bu dördbucaq evi gətirdi dada.
Sən dinin evinə dörd dirək vurdun,
Ona bu qaydayla dörd çatma qurdun.
Sənin qaşın kimi haman dörd nəfər
Gah ayrı düşdülər, gah birləşdilər.
Yerin əl bağlayan bu halqasında
Bircə sıçrayışla ərşə qalxırsan.[1]

## *PEYĞƏMBƏRİN MƏDHİ (“YEDDİ GÖZƏL” POEMASINDAN)*

Ilk pərgar xəttinin mərkəz nöqtəsi,
Varlığın axırrı, ən son töhfəsi,
Yeddi çarx bağının gözəl nobarı,
Ağıl tacında dürr, sözdə mirvari.
Əhmədi – Mürsəldən başqası məgər

[1] N.Gəncəvi “Leyli və Məcnun” poeması.

Varmıdır, Tanrıya ola peyğəmbər.
Nəbilərdən üstün qılıncı, tacı,
Şəriət qılıncı, tac da meracı.
Varlıq bu ümmidən mayə almışdır,
Yerə nur, göylərə kölgə salmışdır,
Şərin beş təbilin hər an vurandır,
Bütün Yer üzündə şahlıq qurandır.
O məqsəd, biz ondan umarıq dilək,
Onun nəbiliyi sevilmiş demək,
Adəm palçığının gövhəri odur,
Başqalar xıltıdır, cövhəri odur.
Vurarkən sonuncu dövrünü fələk,
Onun son peyğəmbər elan edəcək,
Əmri də, nəhyi də düzgündür, inan,
Əmri bəyənilmiş, nəhyi qadağan.
Zəhməti əziyyət saymayan adam,
Yoxsul olmasıyla fəxr etsin müdam,
Belə bir xəznəylə, yaxşı düşün, bil,
Yoxsul adlanarsa, əfsanə deyil,
Kölgənin üzünü ağardan insan
Günəşdir, kölgədən nə bəhs açırsan?
Onu vəkil etdi göylər Allahı,
Şahmatda mat qoydu hər bir padşahı,
Baş qaldıranlara verməzdi aman,
Düşgünlərə kömək edərdi haman.

Yaxşı insanlara rəğbəti vardı.
Yaman adamlara nifrət saçardı.
Qılıncı axıdar qəhr ilə al qan,
Bir yandan da qoyar yaraya dərman.
Xəstə könüllərə o məlhəm yaxar,
Daşürəkliləri zəncirə taxar.
Ona qarşı çıxıb at yəhərləyən,
Beldə kin kəməri, hazıram deyən,
Keçər bir neçə il, ona baş əyər,
Şanlı qüdrətinə afərin deyər.
Adına yaradıb bir böyük cahan,
Seçilmiş etdisə onu Yaradan,
Gözlərini tutan "möhrü – mazağ"dır,
Bağlanıb duruduğu sanma bu bağdır.
Yeddi min il sonra gəldi cahana,
Dünya tabe olar sonadək ona.
Tünd – abı geyinmiş uca asiman,
Onun xidmətində durmuş hər zaman.
Şərin əsli ilə fəri ki vardır,
Dörd xəlifə ona möhkəm divardır.
Odur işıq verən bu təbiətə,
Afərin, afərin belə xilqətə.
Yerlərdə, göylərdə hər nə cisim var,
Ondan hər nəfəsdə bir kömək alar.
Hər şeyin həyatı təkcə ondandır,

Biz təxtik hamımız, o Süleymandır.
Nəfəsi havaya saçdıqca ənbər,
Qurumuş ağaclar oldu tazə - tər,
Həmən qaldıraraq baş, xurma verdi,
Tikan ağac oldu, yaş xurma verdi.
Xurma yetirsə də quru tikandan,
Bu xurma düşmənə tikandır, inan!
Ayın almasını iki parçaya
Bölüb, yetirsə o, xətər aya.
Nurla doldu gözü sitarələrin,
Tanrı bu hünərə dedi: - Afərin!
O ki hər işi ölçüb biçəndir,
Muhəmməd seçilən, Allah seçəndir.
Yerdən göyə qədər duam var olsun,
Seçilib – seçilənə salamlar olsun.[1]

## *SONUNCU PEYĞƏMBƏRİN TƏRİFİ*
### *“İskəndərnamə” poemasından*

1.

Nə bir taxt istədi Məhəmməd, nə tac,
Qılıncla çox aldı şahlardan xərac.
Yox, yox, səhv elədim, o böyük nəbi

[1] N.Gəncəvi“Yeddi gözəl poemasından”

Həm taxt sahibiydi, həm tac sahibi.
Onun taxtı idi bütün bu əflak,
Başının müqəddəs tacıydı "lövlak".
Mələk simalıydı, allahtanıyan,
Bizə də allahı o verdi nişan.
Bizləri cənnətə odur aparan,
Cəhənnəm odundan odur qurtaran.
Parlayıb nur saçdı bu kainatda,
Bənzərdi Zülmatda abi – həyata.
Uca qalxmasaydı ərşin tağından,
Kimdi kainatın sirrini açan?
Mənəvi bir töhfə o verib bizə,
Ərşin sovqatını göndərib bizə.
Yolunun torpağı olan başımız
Dəyməz başındakı bir tükə yalnız.
Bizim halımıza qəlbdən yanaraq
Gündüz günəş oldu, gecələr çıraq.
Hər sınıq ürəyin odur pənahı,
Odur bağışladan hər bir günahı.
Dahidir, böyükdür o dahilərdən,
Üstündür, yüksəkdir hər peyğəmbərdən.
Cənnətdən torpağa gəldisə Adəm,
O qoydu torpaqdan cənnətə qədəm.
Aytək çıxdı Yusif quyudan əgər,
Nur saçdı quyudan o, aya qədər.

Xızra abi – həyat oldusa qismət,
Həyat çeşməsindən keçdi Məhəmməd.
Yunisi uddusa balıq bir zaman,
Ona səcdə etdi balıqla ilan.
Davuddan yadigar tək bir zirəh var,
Məhəmməd yüz zireh qoyub yadigar.
Süleymanın taxtı getdisə bada,
Məhəmməd əbədi qaldı dünyada.
Isanın beşiyi göyə qovuşdu,
Məhəmmədsə özü göylərə uçdu.
Tur dağı Musaya oldusa eyvan,
Məhəmmədin qəsri yarandı nurdan.
Şəminin önündə durub çıraqlar,
Səndən işıq istər, səndən pay umar.
Şəffaf bir çeşməsən, təmiz bir bulaq
Üzünü suyunla yuyub bu torpaq.
Bu quru torpağın səfası sənsən,
Bu xəstə dünyanın şəfası sənsən.
Həkimsən, aydındır düşüncən, zəkan,
Əlində allahın hökmü bir dərman.
Məxluqun gözünə sən işıq verdin,
Göydə mələklərə yaraşıq verdin.
Adın möhür kimi sözə zinətdir,
Camından hər qətrə əbədiyyətdir.
Ondan bircə udum içərsə hər kəs,

Dünyada dərd bilməz, əziyyət bilməz.
Elə et ki, olsun o dadlı şərbət
Bu yazıq bəndənə – mənə də qismət.[1]

## *SONUNCU PEYĞƏMBƏRİN TƏRİFİ*
### *"İsgəndərnamə" poeması̇ndan*
### 2.

Seçilmiş elçidir ulu tanrıdan,
Möhkəm hökmləri xalqa çatdıran,
Qiymətli tacıdır azadələrin,
Ən dəyərlisidir bütün bəşərin.
Əzəldən əbədə bütün yaranmış,
Məhəmməd adından almışdır naxış.
Əqlin qanadına tək odur çıraq,
Varlığa işığı o verir ancaq.
Zamindir qaraya, ağa bu rəhbər,
Şəhavət edəndir qopunca məhşər.
Kölgəli ağaclar din saçan bağda
Budağı göydədir, kökü torpaqda.
Ziyarətgahıdır peyğəmbərlərin,
Nemət verənidir bütün bəşərin.
Bu yanar çırağa vermədən işıq
Dünyada bir işıq yox idi artıq.

[1] N.Gəncəvi "Şərəfnamə"

Xalını qaraldır Əbbasilərin,
Gözünə nur saçır şəmmasilərin,
Dodağı İsadan daha möcüzkar,
Zülmətin suyutək geyinmiş paltar.
Göy – ona dünyada dörd tağı quran,
Yer – ona fələkdə beş növbət vuran.
Odur öz ağlına eləyən təkyə,
Ayı barmağıyla bölən ikiyə.
Ona bac verəndir bütün Rum və Rey,
Xərac göndərəndir Kəsra ilə Key.
Yağdıran buluddur o səmapeykər,
Bir əlində qılınc, birində gövhər.
Gövhərlə dünyaya vurmuşdur bəzək,
Qılıncı din üçün çıxırmış kömək.
Padşahlar qılıncı çəkdiyi zaman
Baş bədəndən düşər, tac isə başdan.
Bu isə əzməyə verərsə qərar,
Qılıncı çəkmədən tökülər başlar.
Hər iki dünyadan bir don tikərək,
Onlardan düzəltmiş yeganə bəzək.
O donu geyərkən pak vücuduna,
Bir qarış az gəldi uca boyuna.
Tanrı xəlq etdiyi qamətə gərək
Vurulsun tanrının qurduğu bəzək.
Bağlı qapıların odur açarı,

Onun adı aşmış hər bir hasarı.
Dəvətə genişlik o vermiş yenə,
Daşlar da şahiddir möcüzəsinə.
Əli boş, bu dərviş geyimli soltan
Qulamlıq alandır, şahlığı satan.
O gecə meraca at siyirdərək
Fələyin donuna vurdu min bəzək.
Gecə - meracının çətrindən sayə,
Göy – o nərdivandan kiçik bir payə.[1]

**MƏHƏMMƏD FÜZULİ**
***"LEYLİ – MƏCNUN "POEMASINDAN***
***BU, SƏRDƏFTƏRİ – ƏNBİYANIN***
***KİTABİ – ÖVSAFINDAN***
***BİR VƏRƏQDİR***
***VƏ***
***SƏRVƏRİ – ƏSFİYANIN***
***GÜLZARİ – LƏTAFƏTİNDƏN***
***BİR TƏBƏQDİR***

1.Ey padşəhi – səriri – lövlak,
Məqsədü – vücudi – xakü əflak!
Olmuş əflak xaki – rahin,
Çəkmiş əflakə xak cahin.

[1] N.Gəncəvi "İqbalnamə"

**2**.Ey raqimi – nüsxeyi – məani,
Məmureyi – elmi – dinə bani!
Şahənşəhi – məsnədi – risalət,
Rəssami – qəvaidi – ədalət!
3.Ey ərşnəvazü fərşpərvər,
Dəftərdari – hesabi – məhşər!
Sərdəftəri – ənbiyayi – mürsəl,
Onlara həm axirü həm əvvəl!
4.Ey vazei – istilahi – iyman,
Həqdən səbəbi – nüzuli – fürqan!
Sənsən sultanü qeyr xeylin,
Səndən özgə sənin tüfeylin.
5.Ey xəlvəti – qürbə şəmi – məhfil,
Cibril tərəddüdünə mənzil!
Həqq əmri səninlə xəlqə cari,
Qövlünlə ol əmrin etibari.
6.Ey qiblənümayi – əhli – taət,
Gəncineyi – gövhəri – şəfaət;
Taci – səri – ərş xaki – payin,
Şəmi – şəbi – qədr nuri – rəyin.
7.Ey vasiteyi – nizami – aləm,
Əyani – vücudə sədri – əzəm.
İrfani – sifatü zatə arif,
Keyfiyyəti – kainatə vaqif!
8.Ey zatın üçün bəşər vücudi

Adəmdə sənə mələk sücudi!
“Yasin” sədəfi – düri – sifatın,
“Taha” güli – bustani – zatın.
9.Ey məktəbi – danişə müəllim,
Məhruseyi – hökmi – şərə hakim!
Dərgahinə ənbiya rücui,
Təziminə asiman rükui.
10.Təhsin sənə, ey xücəstə fərcam
Kim, vəz qılıb təriqi – islam,
Keyfiyyəti – halı rövşən etdin.
Xeyrü şər işin müəyyən etdin.
Əhvali – əvamirü nəvahi,
Məlum elədin bizə gəmahi.
11.Sən bilirdin ki,kimdir Allah,
Sənsiz kim olurdu ondan agah?
Gümrahları təriqə saldın,
Üftadələrin əlini aldın.
12.Faş oldu nəsihətin cəhanə,
Sən qoymadın ortada bəhanə.
Əmma bizə yoxdur ol səadət
Kim, hifzi – təriqin ola adət.
13.Ehmal edəriz itaətindən,
Təqsir ədayi – xidmətində.
Hər necə ki xud şərmsarız,
Bu cürm ilə həm ümidvarız

Kim, feyzi – əvatili – əmimin,
Şad eyləyə könlün əhli – bimin.
14.Asilərin olasan pənahi,
Nomidlərin ümidgahı.
Sənsən çü şəfii – hər məasi,
Nə qəm əgər olsa kimsə asi.
15.Gər məndə ola təmam taət,
İzhar nədən bular şəfaət?
Sənsən bu sərir padşahi,
Bu mülkdə olanın pənahi.
16.Hər əsrdə bir nəbi zühuri,
Hər dövrdə bir rəsul nuri,
Fitrət yolunu müzəyyən etdi,
Üzün şəmi ilə rövşən etdi.
Ta gəlməyə rövşən ola rahin,
Budur rəhü rəsmi padşahin.
17.Xabi – ədəm içrə şəxsi – aləm
Görmüşdü vücuddən müqəddəm
Kim, ləmeyi – nurdən bir əfsər
Geymiş, vermiş özünə ziyvər.
18.Bidar olanda ol yuxudan
Getmişdi qərari arizudan.
Çün istədi ol mənamə təbir,
Səndən ona müjdə verdi təqdir.
Dünyayə pəyami – feyzi – nurin,

Tənbihi – səadəti – zühurin.
19.Xəlqə verib intizari – məqdəm,
Ol dəm gəldi ki, gəldi Adəm.
Dünya tələbində oldu qaim,
Dövr ilə səni dilərdi daim.
Bir – bir yetib özgə ənbiyayə,
Meracə çıxardı payə – payə.
20.Gəzməzdi səninlə sayə həmrah,
Guya ki, nihali – qəddin, ey mah,
Bu aləmə vermiş idi vayə,
Ol aləmə salmış idi sayə.

## *BU, PEYĞƏMBƏRLƏR SƏRDƏFTƏRİNİN VƏSFİ KİTABINDAN BİR VARAQDIR VƏ MÜQƏDDƏSLƏRİN SƏRVƏTİNİN LƏTAFƏT GÜLZARINDAN BİR TABAQDIR*

**1.**Ey levlak* taxtının padşahı, yerlərin və göylərin yaradılış məqsədi! Göylər yolunun tozu olmuş uca məqamın göylərə yüksəlmiş.
**2.**Ey məna səhifəsini yazan və din elminin Binasını quran! Sən peyğəmbərlik taxtının

şahənşahı və ədalət qaydalarının qurucususan.
**3.**Ey göyü oxşayan, yeri bəsləyən və məhşər ayağının hesabdarı. Peyğəmbərlər siyahısında birinci, sən onların həm əvvəli, həm də sonusan!
**4.**Ey inam yolunun çağırışçısı və həqdən quran göndərilməsinin səbəbkarı, sən sultansan, başqaları sənin qəbiləndəndir!
**5.**Ey müqəddəs xəlvət otağının çırağı və Cəbrailin çaşıb qaldığı yeri bilən, Allah əmri sənlə və sənin sözünlə xalqa çatdırıldı, hörmətin və sevginin dəyəri oldu!
**6.**Ey Allaha tapınanlara yol gösərən, şəfa cövhərinin xənizəsi, yerlərin və göylərin başının tacı, qədr gecəsinin şamı və düşüncənin işığı!
**7.**Ey aləmin nizamının vasitəsi və əzəmətlilərin böyük sədri, sifətlərin və zatın bilicisi, kainatın halını bilən!
**8.**Ey var olduğun üçün bəşər yaranmış, Adəm və mələklərin səcdəgahı. "Yasin" sənin sifətlərinin incisinin sədəfidir. "Taha" zatının bağçasının gülüdür!
**9.**Ey bilgi məktəbinin müəllimi, şəriət hökmü məmləkətinin hakimi! Dərgahına peyğəmbərlər qayıdır, təzimində göylər baş əyir.
**10.**Əhsənlər sənə, ey sonu uğurlu olan islamın yolunu

göstərib halımızı bizə anlatdın, xeyir və şər işini aydınlatdın.
Halal və haramın mahiyyətini bizə öyrətdin!
**11.**Allahın kim olduğunu bizə sən öyrətdin , sən olmasaydın,
hardan biləcəkdik? Azanlara düzgün yol göstərdin, zəiflərin əlindən tutdun.
**12.**Nəsihətin aləmə çatdı, heç bir başqa şeyə bəhanə qalmadı.Amma ki, sənin yolunu qorumaq xoşbəxtliyi bizə nəsib olmadı.
**13.**Sənə ibadətdələngik, qulluqunda təqsirkarıq.
Bu xəcalət və günahımızla da ümüd edirik ki, hamıya çatacaq mərhəmətiniz biz qorxanları da sevindirəcəkdir.
**14.**Sənə ağ olanların da pənahı və umudsuzların da umudgahı olasan! Sənə ağ olanların da arxası olduğun üçün onların da qorxusu yoxdur!
**15.**Mən sənə tam tabe olsam onda sənin bizi qorumaq qabiliyyətin necə üzə çıxardı? Sənsən bu taxtın padşahı,
bu mülkdə yaşayanların sığınacağı.
**16.**Hər əsrdə bir peyğəmbər, hər dövürdə bir allah elçisi
xalqın yolunu işıqlandırıb, üzünün nuru ilə bəzəyib ki,

sənin gələn yolların işıqlansın, padşahın yolu belə olmalıdır!

**17.**Yoxluq yuxusu içində aləmin şəxsi öncədən sənin varlığını, işıqdan bir tac geyib sənin özünü bəzədiyini görmüşdü.

**18.**Aləm yuxusundan ayılıb səni görmək Arzusu ilə yanmışdır. Bu yuxunun yozulmasını istəyəndə allah ona səndən müjdə vermiş, dünyaya sənin nurunu, bərəkətinin xəbərini vermiş, üzə çıxmanın yolunu göstərmiş.

**19.**Xalq sənin bu dünyaya gəlməyinin intizarında ikən Adəm bu dünyaya gəldi. Adəm dünyaya gələndən də sonra dünya səni diləyirdi.Başqa peğəmbərləri keçərək addım – addım səni Meraca çıxardır.

**20.**Kölgən də səninlə yanaşı gedə bilmirdi, sanki ey ay üzlü,
qəddi – qamətin bu aləmə nəsib olub kölgəsini o biri aləmə – qaranlıq dünyaya salmışdı.

## *BU QƏSİDƏ HƏZRƏTİ – MƏHƏMMƏD ƏLEYHİSSƏLAMIN ŞƏNİNƏDİR*

1. Ya mənbəül – məkarimi və ya mədən ül – vəfa,
   Ya məcməül – məhasini və ya mənbəül – əta.

2. Əntəl – ləzi büistə ileyna mübəşşirən,
   Vəxtarəkəl – ilahə ənil xəlqi vəstəfa.

3. İtəl – ləzi təfəzzələhül qürbə vəl qəbul,
   Vəntəl – ləzi təfərrədəhül izzü vəl – üla.

4. Mənirtica bilütfikə maxabə vəntəfi,
   Məniqtəda bişərikə mazaə vəhtəda.

5. Ya övnə mən təfəqqədəhu ində şiddətin,
   Ya kəhfə mən təhəssənə fizzəri vənnəca.

6. İsa nə mirəsəd bə to dər qədrü mənzilət,
   Bər çərx əgər nəhəd zisəri iqtidar pa.

7. Merac yafti to vü bər Tur şod Kəlim,
   Fərq əz to ta Kəlim ziərşəstü ta səma.

8. Abi to bud katəşi Nəmrudra nişand,
   Ruzi ki, kərdə bud dər atəş Xəlil ca.

9. İqrari kafərist zişəri to inhiraf,
   Bürhani gümrəhist bə ğeyri to iqtida.

10. Ta münqətə nə gərdəd əz asibi ixtilaf
    Şod bəste bər to silsileyi – silki – ənbiya.

11.Baənbiyast nesbət zati – to çün əlif,*
Həm ibtida toi bəhəqiqət, həm intina.

12.Təqdir cüz rizayi – to kari və mikonəd,
Peyvəste taəti – to əda mikonəd qəza.

13.Ey afitabi – zatinə hər zərrə bir nəbi,
Min şərdin diyarinə hər zərrədən ziya.

14.Sən ğayəti – vücudisənü özgələr tüfeyl,
Sən padişahi – mülksənü özgələr gəda.

15.Carubi – girdi – rəhgüzərin bali – Cəbrəil,
Taqi – rəvaqü dərgəhin eyvani – kibriya.

16.Darüşşəfayi – həşrdə bimari – məsiyət,
Şəhdi – şəfaətindən umar şərbəti – şəfa.

17.Ey çaryari – kamilin əyani – mülki – din,
Ərbabi – sidqü mədələtü rifətü həya.

18.Dövrün bu dörd fəslilə bir mötədil zaman,
Şərin bu dörd rüknilə bir mötəbər bina.

19. Ya Mustəfa, Füzuliyi – möhtacə rəhm edüb,
İzhari – iltifat ilə qil hacətin rəva.

## *BU QƏSİDƏ HƏZRƏTİ – MƏHƏMMƏD ƏLEYHİSSƏLAMIN ŞƏNİNƏDİR*

1. Ey yaxşılıqların mənbəyi və vəfa mədəni,
Ey gözəlliklər məskəni, ehsan qaynağı!

2. Sən bizə müjdəçi göndərilənsən.
Xalqın içindən allah səni seçib ayırdı.

3. Sən allaha yaxınlaşmaq və qəbul olunmaqla şərəfləndin!
Sən əzizlik və ucalığın "tək" seçdiyisən!

4. Sənin lütfinə sığınan umudsuzluğa düşmədi, faydalandı.
Sənin şəriətini seçən itmədi, doğru yol tapdı!

5. Ey dar anda səni itirən insanın yardımçısı.
Ey düşünərəkdən sənə sığınanın sirdaşı və yuvası!

6. İsa fələyə ayaq bassa da qədr və qiymətində sənə
çatmadı.

7. Sən də merac etdin, Kəlim də Tura getdi, ancaq aranızdakı fərq yerlə göy qədərdir.

8. Xəlil atəşə atılarkən sənin suyun Nəmrudun odunu söndürdü.

9. Sənin şəriətindən dönmək kafirlikdir, səndən başqasına inanmaq satqınlıqdır.

10. İxtilaf üzündən pozulmasın deyə peyğəmbərlər zənciri sənə bağlandı.

11. Peyğəmbərlərlə sənin nisbətin əlif kimidir.
Doğrudan da əvvəl də sənsən, axır da.

12. Sənin təqdirinin allahın razılığıdır. Qəza sənin itaətindədir.

13. Ey zatının günəşinin hər zərrəsi bir peyğəmbər olan, hər zərrəsindən min şəriət və din diyarına işıq saçan.

14. Varlığın qayəsi sənsən, qalanlar xirdalıqlardır, sən mülkün padişahısan, qalanlarsa dilənçi.

15. Yolunun tozunun süpürgəsi Cəbrayılın qanadıdır. Dərgahının kəmərinin tacı allahın eyvanıdır.

16. Yamanlıqlara düşən, məhşərin şəfa evində sənin şəfahətinin şəkərindən şəfa şərbəti umar.
17. Ey dörd əsil dostun sahibi, onlar din mülkünün qoruyucusudurlar, doğruluq, ədalət, mərhəmət və həya sahibidirlər.
18. Sənin dövrün bu dörd müvsümə görə çox yumşaqdır, şəriətin bu dörd dirəklə mötəbər bir binadır.
19. Ey seçilmiş peyğəmbər, Füzuli möhtaca rəhm elə, iltifat göstər və ehtiyacını ödə!

## *YA NƏBİ!*

Səndən özgə bizlərin yoxdu pənahı, ya nəbi!
Dərgahindir bizlərin ümmidgahı, ya nəbi!

Ol zamandan kim, yolunda rahi – həqqi tapmışıq,
Azmarıq heç bir zaman bu doğru rahı, ya nəbi!

Cümlə məxluqatə lütfün şamil olmaqçün sənə,
Vasitə qıldıq fəğanü suzi – ahi, ya nəbi!

Istər olsun ruzi – məhşərdə şəfaətçi bizə,
Bak qalmaz ümmətin olsa günahı, ya nəbi!

Lütfünə ümmidvarıq, nə o naqis taətə,
Qılmayıb, ya qılmışıq biz gah – gahi, ya nəbi!

Feyzi – ədlinlə tapıbdır nəzm cümlə kainat,
Aləmin yox səndən özgə padşahı, ya nəbi!

Bəs ki, çoxdur cürmü, susmuş Füzuli, neyləsin?
Səndən özgə yox onun bir üzürxahı, ya nəbi!

## *QƏZƏL*

Qurandı vəsfi – cahu cəlali Məhəmmədin,
Əhkami şər şərh – kəmali Məhəmmədin.

Hər bir xəbər ki, cümlə nəbilərdən almışıq
Olmuşuq bəyani – hüsnü xisali Məhəmmədin.

Ol “kafu nun” ki, xilqətin əsli olub, odur
“Kaf” i kəmali, “nun”i nəvali Məhəmmədin.

Adəm başından məddi – əlif tacdır, olub
Məzmuni – mimü məniyi – dali Məhəmmədin.

Zinət olur əzəllə əbəd lövhinə təmam
Nəqşi – xəyali – nöqteyi – xali Məhəmmədin.

Əqlin qanadları uça bilməz o yerdə kim,
Olmuş o cilvəgəhi – xəyali Məhəmmədin.

Dövran Füzuli işlərinə verməyib nizam,
Vermiş onu Məhəmmədü ali – Məhəmmədin.

## *QƏZƏL*

Bir ulduza oxşar ki, onun şəninə layiq,
Göydən yerə nazil edilib ayeyi – Quran.

Hüsnün nəyi vardırsa, hamı toplanıb onda,
Bir böylə gözəl görməmiş aləm yaranandan.

Kim salsa nəzər ay üzünə, hetrət üzündən,
Təkbir ilə təsbihi bilər ol bütə şayan.

Vacibdir ona baş əyə ruhlar, edə təzim,
Yüksəkdir onun şəni deyil sadə bir insan.

Dünyanı onun eşqinin avazəsi tutmuş,
Eşq aləminə təkcə odur bir ulu Sultan.

Bir qul kimi qarşında durub xar Füzuli,
Acizdir, ona rəhm elə, qıl dərdinə dərman.

### *NƏT*

Ey dili sərgəştəvi şikəsteyi – valeh,
Səlli və səllim ələn – nəbiyyi və aleh!
*(Ey vurğun, incik və çaşqın könül, peyğəmbərə və onun nəslinə salam və salavat söylə.)*

Nəti – Nəbidir kəmali – əql nişanı,
Fəti bima şaə min sifati – kəmaleh!
*((İdrakca yetkinliyin göstəricisi peyğəmbəri nət etməkdir, onun(aləmə) yayılmış (bütün dünyada) məşhur olan kamal sifətlərini an))*

Daği – fiqarinə ehtimal nə mümkün,
Əhrəqəni naru iştiyaqi – visaleh!
*(Onun ayrılıq dağı dözülməzdir, onu görmək istəyənin odu məni yandırdı.)*

Zikri ilə xoş keçir həmişə zəmanın,
Müftəkirsən fi cəmalihi və cəlaleh!

*(Öz vaxtını hər an onu anmaqla xoş keçir, onun böyüklüyünü və gözəlliyini düşün)*

Eylə xəyali – rüxün nəzərdə təsəvvür,
Vəqtəbisin – nurə min şüai – cəmaleh!
*(Onun üzünün xəyalını gözlərin önündə canlandır və işığı onun üzünün parlaqlığından al.)*

Mərziyu məşgurdur cəmii – fiali,
Əhsənü min xassətin cəmiu xisaleh!
*((Onun işlərinin hamısı razılıq edilməli və şükür olunmalıdır (yəni bunlara görə Allaha həmd edilməli və Rəsulullaha təşəkkür bildirilməlidir) onun xasiyyəti xasiyyətlərin ən yaxşısıdır.))*

Tabeyi olmaqdadır nəcat, Füzuli,
Yəssərəkəllahu tabiən li fialeh![1]
*(Füzuli, qurtuluş ona tabe olmaqdadır, Allah sənə Onun əməllərinə tabe olmağı qismət etsin.)*

## *NƏT*

Vəslin mənə həyat verir, firqətin məmat,
Sübhanə xaliqən xələqəl – mövtə vəl – həyat.

[1] M.Füzuli – Əsərləri 1 – ci cild, səh – 290

*(Görüşün mənə həyat verir, ayrılığın ölüm, məni yaradan pak və müqəddəsdir, ölümü və həyatı yaratmışdır.)*

Hicranına təhəmmül edən vəslini bulur,
Tuba limən yusaidihus – səbrü vəs – səbat.
*(Ayrılığına dözən görüşünü əldə edər. O adam xoşbəxtdir ki, möhkəmlik və səbr ona kömək edir.)*

Mehrindir iqtinai – məqasid vəsiləsi
Maşaə mən əradə bihil – faizə vən – nəcat.
*(İstəyə çatma yolu sənə bəslənilən sevgidir, kim istəsə onunla uğur və qurtuluş əldə edər.)*

Tökmüş riyazi – təbimə barani – şövqini,
Mən ənzələl – miyahə və əhya bihən – nəbat.
*((Yağış yağdırıb, bitkiləri dirildən (yəni Allah) ilhamımın bağçalarına sənin sevgi yağışını tökmüşdür.))*

Həqq afərinişə səbəb etdi vücudini,
Əvsəbtə biz zühuri zühurəl – mükəvvənat.
*(Tanrı sənin varlığını yaranışa səbəb etdi, yaranmağınla varlığın ortaya çıxmasına yol açdın.)*

Iyzəd səriri – hüsnə səni qıldı padişah,
Əla kəmalə zatikə fi əhsənis – sifat.
*(Allah gözəllik taxtına səni çıxartdı.Zatının kamalını gözəl sifətlərlə yüksəldi.)*

Qıldın ədayi – nət, Füzuli, təmam qıl,
Kəmmilhü bis – səlami və təmmimhü bis – səl.[1]
*(Füzuli, nəti yazdın, sona çatdır, onu salamla, bitkinləşdir, dua ilə qurtar.)*

## *SU QƏSİDƏSİ*

Saçma, ey göz, əşkdən könlümdəki odlarə su
Kim,bu dəklü tutuşan odlara qılmaz çarə su.

Abigundur günbədi – dəvvar rəngi, bilməzəm,
Ya mühit olmuş gözümdən günbədi – dəvvarə su.

Zövqi – tiğindən əcəb yox olsa könlüm çak – çak
Kim, mürur ilə buraxır rəxnələr divarə su.

Vəhmdən söylər dili – məcruh peykanın sözün,
Ehtiyat ilə içər hər kimdə olsa yarə, su.

[1] M.Füzuli – Əsərləri 1 – ci cild, səh – 87

Suya versin bağiban gülzarı, zəhmət çəkməsin,
Bir gül açılmaz üzün tək versə min gülzarə su.

Oxşada bilməz ğübarini mühərrir xəttinə,
Xamə tək baxmaqdan sisə gözlərinə qarə su.

Arizin yadilə nəmnak olsa müjkanım, nola,
Zaye olmaz gül təmənnasilə vermək xarə su.

Ğəm günü etmə dili – bimardən tiğin diriq,
Xeyirdir vermək qaranqu gecədə bimarə su.

Mən ləbin müştaqiyəm, zühhad Kövsər talibi,
Netəkim məstə mey içmək xoş gələr, hüşyarə su.

İstə peykanın, könül, hicrində şövqüm sakin et,
Susuzam bir gəz bu səhradə mənimçün arə su.

Rövzeyi – kuyinə hərdəm durmayıb eylər güzar,
Aşiq olmuş, qaliba, ol sərvi – xoşrəftarə su.

Su yolun ol kuyidən topraq olub tutsam gərək,
Çün rəqibimdir, dəxi ol kuyə qoyman varə su.

Dəstbusi arizusundan ölərsəm, dustlar,
Kuzə eylin toprağım, sunun onunla yarə su.

Sərv sərkəşlik qılır qümri niyazından, məgər
Damənin tuta, əyağinə düşə, yalvarə su.

İçmək istər bülbülün qanın, məgər bir rəng ilə,
Gül butağının mizacına girə, qurtarə su.

Tinəti – pakini rövşən qılmış əhli – aləmə,
İqtida qılmış təriqi – Əhmədi – Muxtarə su.

Seyyidi – növi – bəşər, dəryayi – dürri – istifa
Kim, səpibdir möcüzatı atəşi – əşrarə su.

Qılmaq üçün tazə gülzari – nübüvvət rövnəqin,
Möcüzündən eyləmiş izhar səngi – xarə su.

Möcüzü bir bəhri – bipayan imiş aləmdə kim,
Yetmiş ondan min – min atəş xaneyi – küffarə su.

Heyrət ilən barmağın dişlər, kim etsə istima,
Barmağından verdiyin şiddət günü ənsarə su.

Dusti gər zəhri – mar içə olar abi həyat,
Xəsmi su içə dönər, əlbəttə, zəhri – marə su.

Eyləmiş hər qətrədən min bəhri – rəhmət mövcxiz,
Əl sunub vurğac vüzu üçün güli – rüxsarə su.

Xaki – payinə yetəm der, ömrlərdir müttəsil,
Başını  daşdan – daşa vurub gəzər avarə su.

Zərrə - zərrə xaki – dərgahinə istər sana nur,
Dönməz ol dərgahdən, gər olsa parə – parə su.

Zikri – nətin virdini dərman bilir əhli – xəta,
Eylə kim, dəfi – xumar üçün içər meyxarə su.

Ya Həbibullah! Ya  xeyrül – bəşər! Müştaqinəm,
Eylə kim ləbtəşnələr yanıb dilər həmvarə su.

Sənsən ol bəhri – kəramət kim, şəbi – meracdə,
Şəbnəmi – feyzin yetirmiş sabitü səyyarə su.

Çeşmeyi – xurşiddən hər dəm zülali – feyz enər,
Hacət olsa mərqədin təcdid edən memarə su.

Bimi – duzəx, nari – qəm salmış dili – suzanimə,
Var ümidim  əbri – ehsanım səpə ol narə su.

Yümni – nətindən gühər olmuş  Füzuli sözləri,
Əbri – nisandan dönən tək lölöi – şəhvarə su .

Xabi – qəflətdə  olan, bidar olanda rüzi – həşr
Əşki – həsrətdən dolanda dideyi – bidarə su ,

Umduğum odur ki, ruzi – həşr məhrum olmayam,
Çeşmeyi – vəslin verə, mən təşneyi – didarə su.

## Ş. İ. XƏTAİ
### *DƏR NƏTİ - RƏSUL*

Ol şəm ki, nuri – ənbiyadır,
Ol nur ki, mahi övliyadır.
Dedi ana heyyi – sanei – pak:
Lövlak lima xilqətül – əflak.
Müştaqi anın qamu peyəmbər,
Məmuri anın mülukü səncər.
Ol izi türabi – qürrətül – eyn,
Ol mayə məqami – qabi – qövseyn.
Ol qıldı münəvvər afitabi,
Şəqq etdi əlilə mahtabi.

Kafir ilədi dəlili tövzih,
Rik etdi anın əlində təsbih.
Çün badi – səhər pəyamə gəldi,
Ahu yügürüb səlamə gəldi.
Qəsd etdi ana cü xəsmi – bədxu,
Şəhd oldu anın önündə ağu.
Gül verdi anın düri – sifatın,
Qumrular oxudu möcüzatın.
Daş möcüzü birlə dilə gəldi,
Həm sayəsi nuri bilə gəldi.
Ayağı basan yer oldu sər tac,

Cövlani – Burağı suyi – merac.
Tən etdi fələkdə mehru ayə,
Salmadı vücudi yerə sayə.
Din ləşkərinə himayət etdi,
Həq yolu bizə hidayət etdi.
Öz ümmətini qilib güzidə,
Oldu dü cəhanda nuri – didə.
Həm şəninə münzəl oldu Quran,
Qərq eylədi küfrü, oldu furqan.
Çün xətmi – dəlili rövşən oldu,
Əşcar əgildi səcdə qıldı.
Nur etdi yeri yüzi çırağı,
Pür etdi saçı qamu dimağı.
Ol şəb ki, yeridi suyi – cəbbar,
Cəbril önüncə ğaşiyədar.
Həq həzrəti saru yol varanla,
Rəfrəflə töküldü səndəs anda.
Xətm oldu cəmii – ənbiyadə,
Oldu mələkut ana piyadə.
Ruhül – qüdüs oldu ğaşiyədar,
Keçdi yedi gögləri səbəbkar.
Nəlini – xücəstə basdı ərşə,
Nuri – rüxi doldu ərşü fərşə.
Gər cümlə peyəmbər etdi möciz,
Möcüzdə qamuni qıldı aciz.

## *MÜRƏBBE*

Şah iki cəhanın əfzəlidir,
Allahın əli anın əlidir,
Ol söz ki, zəmanə heykəlidir,
Allahü Mühəmmədü Əlidir.

Olmağ diləsin işin mülayim,
Olgil əlinin işinə qayim,
Kim, əhli - həqin dilində dayim
Allahü Mühəmmədü Əlidir.

Ol sirri – vilayətü kəramət,
Sahibhünərü düri – vilayət,
Həqqi sevənə qılan himayət
Allahü Mühəmmədü Əlidir.

Gər dilər isən olasan adəm,
Xəlq içrə sözün ola mükərrəm,
Yad et ki, duayi – ismi – əzəm:
Allahü Mühəmmədü Əlidir.

Övqati – cəmadü virdi – heyvan,
Bər ruyi – zəminü çərxi – eyvan,
Təsbihi – mələk, duayi – insan
Allahü Mühəmmədü Əlidir.

Səhradə zəbani – hər giyahi,
Dəryadə həmişə zikri – mahi,
Hacət diləyəndə, ya ilahi,
Allahü Mühəmmədü Əlidir.

Murü, məgəsü, tüyurü zənbur,
Hüşyarü divanə, məstü məxmur,
Hər şamü səhər dilində məzkur
Allahü Mühəmmədü Əlidir.

Əsrari – məqami – qabi – qovseyin,
Gözlərdə rəvaqi – qürrətül – eyn,
Dillər diləgi, muradi – kövneyn
Allahü Mühəmmədü Əlidir.

Hər şey ki, yaratdı dər du aləm,
Adəm dəmidin be dövri – xatəm
Zikrində həmin səbahü axşəm
Allahü Mühəmmədü Əlidir.

Iqbali – üməm, kamali – taət,
Ənvari – hüda, çirağı – dövlət,
Miftahi – kəlid, babi – cənnət
Allahü Mühəmmədü Əlidir.

Yazıldı vəlilər adı üstə,
Həm zülfüqarın poladı üstə,
Cəbrili – əmin qanadı üstə
Allahü Mühəmmədü Əlidir.

Mömində nihadi – əsli – iman,
Həm dəfi – bəlayi – şərri – şeytan,
Həqdən səbəbi – nüzuli – fürqan
Allahü Mühəmmədü Əlidir.

Qalxani – qəza – zəmani – möhlət,
Tiği – kərəmü kəmani – nüsrət,
Ümmidi – cəhan, şəfii – ümmət
Allahü Mühəmmədü Əlidir.

Həm mötəkifin könüldə fikri,
Həm sufilərin dilində şükri,
Həm qazilərin qəzadə zikri
Allahü Mühəmmədü Əlidir.

Möminlərə yarü ğəm güsari,
Üsyan qışının gözəl bəhari,
Ərşin dirəgi, yerin qərari,
Allahü Mühəmmədü Əlidir.

Başlarda hümayi – taci – dövlət,
Mərvanə bəla, Yəzidə lənət,
Həm qazilərin qolunda qüvvət
Allahü Mühəmmədü Əlidir.

Fəxrü şərəfü nüfusi – əyyam,
Zikrü həvəsi – xəvasü əvam,
Nəqşi – ələmi – dəvazdəh imam
Allahü Mühəmmədü Əlidir.

Mətlubi – ibadətü şəriət,
Məzmuni – iradətü təriqət,
Məqsudi – həqaiqü həqiqət
Allahü Mühəmmədü Əlidir.

Musayə mədəd qılan əsanı,
Həm Xızra həyati – cavidanı,
Isa dəmi, Nuh kəştibanı
Allahü Mühəmmədü Əlidir.

Yəqubi ğəm ilən ağladan zar,
Yusifə verən cəmali – rüxsar,
Həm odu qılan Xəlilə gülzar
Allahü Mühəmmədü Əlidir.

Qəmxari – əmanü hövli – məhşər,
Əllər dutuban siratə rəhbər,
Mizanda ağır, behiştə yavər
Allahü Mühəmmədü Əlidir.

Şəh qullarının ümidgahı,
Dünya bilə üqba padşahı
Biçarə Xətayinin pənahı
Allahü Mühəmmədü Əlidir.

## *QƏZƏL*

Dəmbədəm yüz min səlam olsun sənə ya Mustəfa!
Cümlə dillərdə səfa səndən durur ya Mustəfa!

Cümlə aləm fəxrisən, kafir – münafiq qəhrisən,
Ənbiyalər içidə sənsən gözü ya Mustəfa!

Gər mənim yetməz əlim sürtəm üzüm toprağına,
Mərhəba badi-səba versin səlam, ya Mustəfa!

Yer üzü səndən münəvvər, qibleyi – pur – nur ona,
Şol mübarək mərqədə, məndən səlam, ya Mustəfa!

Ey “Xətai”nin ümüdi, ey cəhanın sərvəri,
Cümlə peyğəmbərlərə sultan durur ya Mustəfa!

## *YA NƏBİ*

Şol mübarək zatınna işim sənadır, ya Nəbi!
Asilik bimarına adın şəfadır, ya Nəbi!

Ayağının torpağının qədrin nə bilsin hər kişi,
"Kün – fəkun ol torpağa kəmtər bahadır, ya Nəbi!

Ol məqamın kim, mələk yetməz süqufi – nəlinə,
Ayaqın altında ol bir xaki – padır, ya Nəbi!

Qaldı Sidrül – müntəha, keçdin fələkdən ta zəmin,
Kim yetər bu qədri – həqqə müntəhadır, ya Nəbi!

Ey günəş üzlü, səni hər kimsə ki, həq bilmədi,
Danla məhşərdə anın, yüzü qaradır, ya Nəbi.

Çün sənin xoşluğuna yaratdı sane aləmi,
Ayağın torpağına canım fədadır, ya Nəbi!

Hər münafiq kim, sana könlündə inkar eylədi,
Ta əbəd yanmaq cəhənnəmdə rəvadır, ya Nəbi.

Həm sənin tərifin etdi, həm Əlinin  ol ilah,
Nişə kim, sən Mustəfa, ol Murtəzadır ya Nəbi.

Möcüzatın qəddinə Musa misali-Murçə
Gərçi Firovna əsası əjdahadır, ya Nəbi!

Bu Xətayi xəstəyə qılgil şəfaət ruzi – həşr,
Çünki əslində səninlən aşinadır ya Nəbi.

## *YA MUHƏMMƏD, YA ƏLİ!*

Daima fikrimdə zikrim, ya Muhəmməd, ya Əli!
Könlümün evində şükrüm ya Muhəmməd, ya Əli!

Kəndi özün tanıyanmaz səni yəqin bilməyən,
Aləmin ayinəsisən, ya Muhəmməd, ya Əli!

Qalmışam zülmət içində sən inayət qıl mənə,
Mən günahkarəm, günahkar, ya Muhəmməd, ya Əli!

Seyyidü Bəttahi Qazı Hacı Bəktaşi vəli,
Cümləsinin səri sənsən, ya Muhammәd, ya Əli!

Baş açıq, yalın-ayaq, yoğruşur əbdallar,
Kərbəladə çağruşurlar: ya Muhəmməd, ya Əli!

Bu «Xətai», vasil olmuş sidq ilə şahə müdam,
Bu cahanda mətləbim bu: ya Muhəmməd, ya Əli!

## *YA RƏSUL(S)*

Görglü yüzün aşiqi həzrət xudadır, ya Rəsul,
Şol mübarək xulquna canlar fədadır, ya Rəsul!

Gəldi Cəbrail sənə hər dəm gətirdi,Haq sözün,
Bəzi peyğəmbərlərə gələn nidadır, ya Rəsul!

İsmini zikr eyləyən məhşər günündə, qəm yeməz,
Vay qiyamət ona kim, səndən cüdadır, ya Rəsul!

Hər qövm adını eşidib səlavət vermədi,
Onların yeri həmişə damudadır, ya Rəsul!

Ey «Xətai» qulların ümidvardır rəhmətə,
Sirri-səttarın nəzəri qamudadır, ya Rəsul!

## XAQANİ ŞİRVANİ
## *PEYĞƏMBƏRİN NƏTİ*
## *(TƏRKİBBƏND)*

Könül, “can, can” dedin, bəsdir, daha müştaqi – canan ol!
Odur can mülkünə sultan, sən o sultana dərban ol!
Həvəs layiq deyil mərdə, onu hümmətlə başdan at,
Çalış, aldanma, ağlın qarşısında bəndəfərman ol!
Sənə küfr ilə iman örtü olmuş, varsa dərrakən,
Qabaqca küfrdən əl çək, çalış sən, əhli – iman ol!
Əgər arzun igidlərlə at oynatmaqdır aləmdə,
Bu divlərdən uzaqlaş sən, otur təxtə, Süleyman ol!
Onun qəsri qabağında at oynatmaq dilərsənsə
Uşaqlıq nənnisindən dur, çalış, sən mərdi – meydan ol!
Qara at çapmış olsa o, sən o meydanda ol torpaq,
Ələ çovqan alarsa, top kimi meydanda qəltan ol!
Onun bir ox yarasıyla səni, bil, tərk edər qəflət,
Oxun pişvazına get, sinəni aç, kamil insan ol!
Onuntək olmağa səy et, onunla bir olan yerdə,
Bu yerdən köç edib getsə, nə yaxşı görsən, ondan ol!
Qulaq vermə ki, bayquşlar fəqət viranə istərlər.
Könül mülkün abaddırsa, xaraba içrə pünhan ol!
Sənə bənd oldu Xaqani, hərəmdən xaricə düşdün,
Unut Xaqanini sən də, nədimi – xasi – xaqan ol!
Aman axtarsan aləmdə o dünyanın əzabından,

Ümidin xaliqə bağla, əgər şairsən, Həssan ol!
Odur xalqa şəfaətçi, odur dünyaya peyğəmbər,
Bəni – Haşim elindəndir, olub insanlığa məzhər.

* * *

Diyari – eşqə əql ilə deyil əsla rəva getmək,
Gəlirsə eşq dərdi, şərtdir pişvazına getmək.
Diyari – eşqdə eşqi fəqət rəhbər bilər aşiq,
Şahın əmrilə lazımdır şahın dərbarına getmək.
Həvayə yol da versən, vermə qəlbindən keçən yoldan
Ki, aşiqlər sanarlar küfr, qəlbində həva getmək.
Əsil Türkistana get, orda mənalı adam axtar,
Kimə lazım Çinə adəmgiyah axtarmağa getmək?
Ürək can qeydinə qalsa, yarın vəsli deyil mümkün,
Ətək altında büt, olmaz xuda dərgahına getmək!
Birinci şərtidir aşiqliyin nəfsindən əl çəkmək,
Fəna ardınca yoxluq tərginə bağlı, fəda getmək.
Ya dilbər məclisində od tutub, qəlbən alışmaqdır,
O ərbabi – səfalarla ya çəkməkçin səfa getmək.
Ürəkdən dərdlisən, zəngtək nədəndir nalə etməzsən?
Yükün ağirsa kərvanda, çəkib neyçin cəfa getmək.
Hələ səhradasan, canın xətərdə, bir yolun vardır,
Fəna Kərxin tərk etmək, bəqa Bağdadına getmək.
Çalış, öz arzuna çat sən, ya bir gün, ya yüz il olsun,

Yarı olmuşsa yol artıq, dayanmaq yox, daha getmək.
Deyilsən canına düşmən, nə lazımdır sənə onda,
Içində can çəkişmək, zahirən əyri yola getmək?
Bu mənzildə pənah axtar, başından keçmə Xaqani,
Tutubdur yolları cadu, gərək əldə əsa getmək!
Könül eşqə veribsən, nəfsini öldür, taraşmaz ki,
Təriqi Müstəfanı Buləhblə qol – qola getmək.
Bu dünya mülkünə məhvər, bəşər övladına rəhbər,
Cahana nur saçan məşəl, Məhəmməddir o peyğəmbər.

* * *

Həqiqi yol ararsansa, buyur bu yol həqiqətdir,
Burax ulduzları, yol göstərən tək Ay kifayətdir.
Itir öz varlığın eşqin yolunda əvvəl – əvvəl, get,
Gələr bir səs ki: - Ey azmış, bu yol rahi – məhəbbətdir.
Başından kim keçə bilsə, görər ancaq o dərgahı,
Əgər varsa belə arzun, bu yolla get, səadətdir.
Nədir bir baş? Onun vəslinə çatmaqçın, başından keç,
Onun vəslinə yüz baş, hər başa yüz tac qiymətdar.
Vüsali – eşqə çün çatdın, iki aləm tələb eylər,
Nə arzun var, olar hasil, vüsalı xoş əlamətdir.
Onun eşqiylə bağlandın, çəkinmə əsla zəhmətdən,
Məhəbbət meydanı çünki ya qovğadır, ya zəhmətdir.
Qalıb heyrət quyusunda – xilaskar axtarırsan sən,
Əlində ip, durubdur o, yada salsan, kifayətdir.

Çapıb hümmət atın, artıq bu dünyadan uzaqlaş sən,
Görərsən bir axur onda, içində bollu nemətdir.
Bir ah çək odlu qəlbindən, dodağında alışsın ah,
Desinlər halədir göydə, ya ulduzdur, ya tələtdir.
Atıb sən ayrılıq daşın, gəlib birlik səfində dur,
Önündə bir qoşun var ki, sayı yox, binəhayətdir.
Xəta etmişsə Xaqani, onu əfv eyləsinlər qoy,
Xətaya əfv kim istərsə bu insandan cəsarətdir.
Yerə sahib, göyə məhrəm, o peyğəmbər Məhəmməddir.
Iki dünyada xaqanlar ona quldur, rəiyyətdir.

## QUMRİ DƏRBƏNDİ
## *PEYĞƏMBƏRİN (S) TƏRİFİ HAQQINDA BİRİNCİ QƏSİDƏ*

Ey xatəmi – nübüvvətə mehri – nigin olan,
Gəncineyi – risalətə dürri – səmim olan.
Nuri – cəmii ma xələqəallahdən əzəl,
Dəryayi – rəhmət içrə şərafət güzin olan.
Zahirdə xətmi batini – mənadə ma səbəq,
Əsli vücudi – əvvəlu həm axərin olan.
Rəfrəf səvar ərseyi – merac ittihad,
Xaki – qudumi – zinəti – ərşi – bərin olan.
Dini – mubini nasixi – ədyani – masələf,
Əhkami – şəri – ənvəri – həblul – mətin olan.
Ləb təşnəgan abi – zülali – hidayətə,
Əngüşti – paki – çeşmeyi – mai – məin olan.
Darüləman cinnü bəşər asitanəsi,
Xuddami – xaki – dərgəhi – ruhil – əmin olan.
Şəqqül – qəmər cəlalun üçün bir nümunədir,
Bürhani – aşikaru dəlili – yəqin olan.
Kimdür ki, ənbiya arasında sənün kimi,
Ismi – şərifi rəhmətən – lilaləmin olan.
Kimdür yetüb dəna fətədəlla məqaminə,
Xəlvətsərayi – qürbdə məsnənişin olan.
Kimdür ona xitab ləəmrək edib allah,

Qurani – həqq içində adı ya vu sin olan.
Səndən siva bü rütbələrün kimdü sahibi,
Ey ləngəri – səmavü zəmanu zəmin olan.
Sən xələti – nübüvvətilən sərfəraz idün,
Ünsir içində adəm idi mau tin olan.
Sən seyr edəndə aləmi ənvari – bülbəşər,
Bir ma idi məşimeyi – xaki – ğəmin olan.
Məqsudi sənsən əslən, güllən tufeyldur,
Aləmdə ta qiyamət olunca məkin olan.
Xətmi – nübüvvət olmağa bais budur bəli,
Keçməz qabaqca qafiləsalari – din olan.
Ənsafi – ənbiyavu sufufi – müqərrəbin,
Cahu cəlal xərmənüvə xuşəçin olan.
Eylər təmam aləmi – imkanə iftixar.
Səlmanilən Əbazərüvə müstəin olan.
Hər məclisi – cəlalidə ismi – mübarəkün,
Bir nurdur ürəklərə behcət  qərin olan.
Olmaz sənün şərafətüvün kimsə münkiri,
Illa sirişti – zati – xəbisü ləin olan.
Salmış özin kəməndüvə bir əbdiqru siyah,
Qəm gülşənində Qumriyi – zaru həzin olan.

## *PEYĞƏMBƏRİN (S) HAQQINDA İKİNCİ QƏSİDƏ*

Ey vücudi aləmi – imkanə nuri – kainat,
Nuri – paki – illəti – ğaiyyi – külli – mümkünat.
Illətül məlum məlulul – iləl eynəlvücud,

Minşiul inşa qivamurruh nəfsi – natiqat.
Mubdiul ibdai qütbul – kibriya rüknul – cəlal,
Cümleyi – əşya əvariz sənsən əşya içrə zat.
Səfheyi – rüxsari – mirati – cəmali – layəzal,
Zati – paki zülcəlalə məzhəri – eyni sifat.
Nurukə nurun əla nurin huvənnurulləzi.
Kanə filkövneyni – minhaculhüda vəlmürsəlat.
Kunutu kənzən kənzinün məxfi olan dürdanəsi,
Kəlmeyi – əhbəbtuən urəfdə əslul – bəyyinat.
Zati vahid, nuri vahid, ğeyri – zati zülcəlal,
Dari – kövni – kon fəkanda cümlə əksündür zəvat.
Fitrəti – nur sirişdi nuru əsli zatı nur,
Ismi nurul,cismi nuru, nəyyiri nurul hüdat.
Kani–rəhmət şəmsi–millət bəhri – şövkət rükni – din,
Eyni iman baniyi – bünyan ərkani – səlat.
Ya rəsuləl əbtəhiyyəl haşimiyy sənsən yəqin,
Məqsədi inna ərəzna məxzənül – müstəvdəat.
Zahirən xatəm vəli batində əvvəl ma xələq,
Mənbəi – ənvari – qüdrət çeşmeyi – eynül həyat.
Pərtövi – nurin kəması vərd fil vərd aşikar,
Xilqəti – aləmdən əqdəm fil – hicabil ğayibat.
Aləmi – ibdaidə yox sibqəti ənvarüvə,
Cinnu insu ərşu fərş sabiquni – sabiqat.
Sibqətündə şahidim məzmuni lövlakə ləma,
Xilqətündə acizəm var çox rümuzi – aliyat.

Hiyteyi – hökmündədir ya Mustafa ruhi – fədak,
Sakinani – bəzmi – qudsi naziatu naşitat.
Gər deyəm memari – səfhi kon fəkan sultani – ərş,
Gəh maəzəllah deyər, gahi deyər heyhat hat.
Əql naqis, fikir qasir, zehn kutahu qəsir,
Insü can mahiyyətündə valehu heyran mat.
Cövhəridən cismivün mahiyyətindən zativün,
Bixəbər abai – ülvi pur təhəyyur ümməhat.
Gər sənə sane desəm əlbəttə məhzi – küfrdür,
Özgə vəsf etsəm təmam etməkdə yox müstəlzəmat.
Saneyi – aləm degilsən leyk süni saniə,
Olmusan bais tüfeylündür ümumus – sadirat.
Haşalillah kim deyər səndən əgər izin olmasa,
Səvheyi – ğəbrayə hir bir qətrə salsun musirat.
Nuri – mehrün olmasa, olmazdı mövcud bulbəşər,
Tini – ladən olmaz ilən cazibi – mai – Fürət.
Qalibi – Adəmdə hərgiz ruh dutmazdı qərar,
Olmaseydi zərreyi – nurundan hərgiz iltifat.
Mərəzi – tufanda gər sən yetməsəydün dadinə,
Nuhə vallahi olunmazdı o tufandan nicat.
Ey Xəlilə nari – Nəmrudi gülüstan eyləyən,
Aləmi ərvah içində nuri – kənzül – möcüzat.
Çünki İsmailə qıldı nuri – pakün intiqal,
Ali İshaq oldular məyus min kullil – cəhat.
Firqətündən kulbeyi – əhzanda oldu əşkbar,

Həzrəti Yəqub qırx il biluyunil – bakiyat .
Yusifi – misrini qıldun rənci – zindandan xilas,
Tinətün oldu sənün həllali – külli – müşkilat.
Turdə Musəbnu – İmran gördü zövi – nuruvi,
Yeddi gün yox bəlkə bihuş oldu ta yəvmul – məmat.
Ya nəbiyyəl – mutəmən aləm sənünlə bərqərar,
Ruhsən İsayə sən İsadu cismi bi sübat.
Sən o peğənbərsən etdün mövsimi – miladidə,
Taqı – Kəsrani şikəstu qəli latisu mənat.
Sən o peyğənbərsən etdün çərxdə şəqqül – qəmər,
Beş bənanun oldu eyni mucizatul – bahirat.
Sən o sərvərsən sənünlə nitqə gəldi susmar,
Tapdı nurundan hidayət möminul – möminat.
Gəh Əbazər zibdən övsafivü aldı sorağ,
Möcizün göstərdi səlmanə nəxili – basiqat.
Sən o şahənşahsən merac qıldun göglərə,
Zinəti ərş oldu nəleynün künuzil – basirat.
Yox nə nəleynün Əlinün nəli səmmi Düldüli,
Külli aləmdəndü əşrəf şahidim vəl – adiyat.
Hansı peyğəmbərdə var bu rütbə ya xeyrəl – bəşər,
Leylətül – merac ola xeyli cəlali – asifat.
Hansı peyğəmbər rikabində Büraqu Rəfrəfi,
Eyləyüb xəllaqi – davər çun ciyayi – safinat.
Hansı peyğəmbər səyahətgahi sidrül – müntəha,
Oldu səntək məclisarayi – məqamur – rafiat.

Mizban Allah bəzmi xas mənzil fövqi – ərş,
Qurbi əv ədna məqamul – eşq eynul məsəlat.
Hansı aşiqdür liomrik səs gələ məşuqdən,
Sən kimi əsrarə məhrəm bilə – şiyyi vəl – ğədat.
Hiç kəs olmaz mövqifi – ruzi – cəzadə rastkar,
Gər əlində olmasa ya Mustafa səndən bərat.
Qumriyi – bixaniman vəsfün deyər sübhü məsa,
Ömri fanidür kəlami baqiyatus – salihat.

## *PEYĞƏMBƏRİN(S) TƏRİFİ HAQQINDA ÜÇÜNCÜ QƏSİDƏ*

Şahibazi – şahi – ğərra dövrü bala axtarır,
Irtifai – tarimi – əflaki – mina axtarır.
Dövrə gəlməz eyləməz pərvaz fi cəvvis – səma,
Aləmi lahut seyrində təmaşa axtarır .
Nitq şahinim hazizi – çərxə qılmaz iltifat,
Bəndi minqar etməgə ərşi – müəlla axtarır.
Pəstdür əşcari dünya mürğü xoş ləhni – məqal,
Cənnətül – məvadə şafi – nəxli – tuba axtarır.
Bəlkə fövqi – çərxi ətləs laxəlavu la məla,
Kəmmu keyfin bilməgə əsmai – hüsna axtarır.
Əhsənəllah tutiyi – nitqi – kəlami – canfəza,
Nəğməsaz olmaqlığa nitqi – Məsiha axtarır.
Rəyəti – nəzmi – fəzayi – aləmi nasutidən,

Pərçəm açmış əzminə övci – sürəyya axtarır.
Həbbəza zəvvası – fikri nüktədani – pürhünər,
Bəhri – bipayan içində dürri – beyza axtarır.
Maşaallah fülki – fikrim çox keçib dəryaçələr,
İmdi bir dəryayi bipayani – məcra axtarır.
Pərdeyi – göftaridən nuri – təcəllayi – məqal,
Turi – sinayi – fəsahət üzrə Musa axtarır.
Məxzəni – sinəmdə malamal udur dürri – yetim,
Mərifət bəzimindən bir sərrafi – dana axtarır.
Kənzi – təbin dürrüni istər nisal etsin könül,
Qiymətu qədrin bilən bazari – yəğma axtarır.
Rayizi – fikrim cilovriz olmağa amadədür,
Səthi – meydani – fəsahət üzrə əla axtarır.
Rəxşi – təbim gərdinə çatmaz qəza farisləri,
Tayiri tizi – səbuk pərvazi – rəna axtarır.
Keşvəri şirazi bağlar şerimün Şirazəsi,
Şairin əşari nəzmimdən təbərra axtarır.
Olsa gər səhban bəlağət məclisində canişin,
Müttəsil inşayi – əlfazimdə imla axtarır.
Sərfi – nəqdi nəzmü nəsrim göstərib tərhi – bədi,
Batini əsrari – hikmətdə müəmma axtarır.
Beytimün olsa şüquqati məanindən bəyan,
Hər bəyanun dürrini min fərdi – isna axtarır.
Şövqi – istidlali – mənzumatimiz bir nəhvdür,
Mübtədadə mahiru məstərdə inşa axtarır.

Məntiqi – fəhmim nətayic şəkli əvvəldən olub,
Şərhi – suğradan keçibdür, şərhi – kübra axtarır.
Çünki ustadın ricalul – ğəybə var təyididə,
Əhli – ürfan bəzminə irşadi – fəhva axtarır.
Rəmli – tərhilən nizami – nəzmimün əndazəsi,
Hər görən ədadinə min həddi – ehsa axtarır.
Kəsrü zəmmü nəsbü rəf i – beytimün tərhin əgər,
Görsə hər zifənnilər hər fənnə  ima axtarır.
Kəlməmün elali – tərkibində acizdür füxul,
Bətnidən qətin – nəzər mətnində imza axtarır.
Zahir olsa nöqteyi – əlfazi – nəzmim kən – nücum,
Əhli – heyət heyətində fənni – əla axtarır.
Şöhrəti – şerim basıb afaqi kəş – şəmsiz – züha,
İqtibasində qəmərtək aləmara axtarır.
Girsə bəhri – nəzmə nəzmim qan tökən Mərrixtək,
Müştəri durmaz müqabil künci – ixfa axtarır.
Kilki – müşginim Ütariddən alır bacu – xərac,
Zöhrə manəndi Zühəl təsiri – şera axtarır.
Əndəlibi – zehnim açdı tazədən dürci – dəhan,
Yazmağa növki – qələm bir mədhi – vala axtarır.
Qisseyi – meraci – subhanəl – ləzi əsra ilən,
Kənci cudu feyzidən bir feyzi – üzma axtarır.
Haşalillah, qəlbim heç meraca etməz etina,
Aləmi – şövkətdə fərqi fərqidən sa axtarır.
İstərəm bir zi həşəm peyğənbərün meracini,

Bəzmi – vəhdətdə onu xəllaqi – yekta axtarır.
Hansı peyğəmbər məlaik pasiban ərş asitan,
Tutiyayi – məqdəmin Musavu İsa axtarır.
Hansı peyğəmbər onun nəleyni – ərşin zinəti,
Qadiri – sübhan qurub bəzmi – tədəlla axtarır.
Hansı peyğəmbər olubdur qabi – qövseyn məhrəmi,
Aləmi – əflakidə əlavu ədna axtarır.
Hansı peyğəmbər qivami – kürsiyu – lövhi – qələm,
İsmi – pakin yümi üçün nöh taqi – xəzra axtarır.
Növi – əsfəl küllənu türrən ümumi fəslilən,
Dərgəhində tərbiyətçün cinsi – əla axtarır.
Bir nə tənha mən təmamən ənbiyavu övliya,
Asitani – ərşi – bünyanində məva axtarır.
Nə təmamən ənbiya quddusiyan lahutiyan,
Mənzəri – feyzində iksiri – təvəlla axtarır.
Eyliyüb meraci – cismanilə xərqi – iltiyam,
Münkiri – əmri – həqiqət küfri – qətən axtarır.
İsmu felu sərfi bil – külliyə müştəq nuridən,
Əhli – zahir zahirən bu hökmə fətva axtarır.
Olsa hər kimsə fəna fillahi mütləq eşqidə,
Olmuyub əslən müqəyyəd nitqi – quya axtarır.
Mərifət bəzmində əl – insani kamildir rəsul,
Ol risalət qübbəsi ali – təmənna axtarır.
Ünsüriyyət aləmindən eyni nəfsi natiqə,
Məhbiti – meraci ruhanidə sevda axtarır.

Cəzbeyi – eşqim Büraqu Rəfrəfim şövqi – liqa,
Meyli – qəlbim Cəbrili – leyli – əsra axtarır.
Lövhəşəllah qabi – qövseynim fəna fillahdür,
Nili – məqsudim fəna fillahidə la axtarır.
Övci sidrul – müntəhadəndür təcərrüd aləmim,
Qəlbi – mövla eşq həvasində mövla axtarır.
Ruh olub müstəğrəqi dəryayi – lövlakə ləma,
Həzfi – nəqşi la edib, mahiyyəti – ma axtarır.
Ümməhati – süfləvidən əl çəkib nəfsi – nəfis,
Qərqi – təcrid olmağa bir anqi – dərya axtarır.
Gəzmənəm nasuti – dəryasin sərayi – pəstidə,
Seyr üçün könlüm riyazi – cənnət asa axtarır.
Yoxdur istibadi çün meraci – mömindir səlat,
Fil – həqiqə əhli – ürfan vəhyi – ilqa axtarır.
Feyzidari – feyz ümumi həzrəti – fəyyazidən,
Qumriyi – bixaniman eyni təvəlla axtarır.

## *PEYĞƏMBƏRİN (S) TƏRİFİ HAQQINDA DÖRDÜNCÜ QƏSİDƏ.*

Tayiri – təbim fərazi – ərşə şəhpər axtarır,
Zövrəqi – fikrim nicati – rahə ləngər axtarır.
Vəhm cəlladi sərapa ğərqi – fulad olmağa,
Əldə xəncər, təndə cövşən, sərdə məğfər axtarır.
Tutiyi – nitqim gühərbarin nisar etməkligə,

Misir mülkündə mükərrər şəhdü şəkkər axtarır.
Qumriyi – bəzmi – fəsahət məhfili – Firdovs ara,
Hurivəş, qilman sifət, bir zülfi – ənbər axtarır.
Inikası – nuridə nuri – şüayi – şəmstək,
Nöh fələk, ərzü səma, həm həfti – keşvər axtarır.
Yəni merac etməgə bu nəşeyi – nasutidən,
Təbi – aşqim Rəfrəfi şövqilə rəhbər axtarır.
Ismi naqis, rəsmi naqis, cismi naqis münkəsir,
Həm xəbər yox mübtədadan nuri – məsdər axtarır.
Çünki tənha övc əv ədna mənim seyrim degil,
Sirri var seyr etməgə molayi – qənbər axtarır.
Mülhəmi – ğeybi – sirudi yetdi hatifdən mənə,
Hərəti yəzdan ürucə bir peyəmbər axtarır.
Hansı peyğəmbər onun bir zərrə nurindən əgər,
Turə düşsə nur olub min mehri – əxtər axtarır.
Hansı peyğəmbər sifati – zati bəhri – mərifət,
Ma ərəfna sirri var ol bəhrə gövhər axtarır.
Hansı peyğəmbər vücudi – eyni cudu bul – kərəm,
Yox ona həmta olan, həmtayi – Heydər axtarır.
Hansı peyğəmbər səluni – minbərin bərpa edib,
Rövnəqi – islamiçün nəfsi – mükərrər axtarır.
Hansı peyğəmbər vücudi – şəms misdaqi – qəmər,
Həm təbarək təxtinə bir taci – əfzər axtarır.
Hansı peyğəmbər vücudi – illəti – icad xəlq,
Izni – minni – sirrinə bir sirri – müzmər axtarır.

Çün sifati kuntu kəzzən iştihari hubbu xəlq,
Yox xəfayi – mərifət məqsudə məzhər axtarır.
Hansı peyğəmər dəna kəmtər məqami – qurbdur,
Həm tədəlla mudğəmi – zatində məxsər axtarır.
Hansı peyğəmbər Muhəmməd, ismi – paki Mustəfa,
Əlləməl əsma sifati – zatə zivər axtarır.
Ismu felu məsdəru kim mübtədadəndür xəbər,
Masiva kullən ərəzdür, cümlə cövhər axtarır.
Hansı peyğəmbər dəri – gəncineyi – əsrari – həqq,
Ma siva sirrində valeh, matu şeştər axtarır.
Əlğərəz, şövqi – liqayi nəfsü vəhdət kənzinin,
Tərk edib nuri – təcərrüdlən münəvvər axtarır.
Ey olan tərhi – kəlami – əhli – mənidən bəri,
Olma qail ruhi – meracın müsəvvər axtarır.
Bəlkə eyni cismilə məhzi – fənayi – eşqdə,
Fərşi – ğəbra ərşdür, əllahu əkbər axtarır.
Qabu – qövseynu dəna, həm izni minni – sirrinə,
Seyri qıl kəmtər məqami – seyri – bərtər axtarır.
Li məəllah nüktəsi burhani – möhkəmdir sənə,
Nəhnu – nəhnu vəhvə nəhnu qütbə məhvər axtarır.
Ey qüdumi – cənnətu firdovsə behcət artıran,
Xeyri məqdəm eyni həqq seyrində mənzər axtarır.
Xaki – payi məqdəmün kuhlul – üyuni ənbiya,
Cuyibari rəhmətün min hövzeyi – kövsər axtarır.
Feyziyi – nalan liqayi – mürtəza müştaqdür,

Vəsli – peyğəmbər  şəfii – yovmi – məhşər axtarır.
Həm  Hüseyni – xuncigər ya leytə ruhi – dunəhu,
Qasimu Əbbasu Əkbər Övnu Cəfər axtarır

## SEYYİD NİGARİ
## *SİNƏMDƏDİR OL DAQİ – TƏMƏNNAYİ – MƏHƏMMƏD(S)*

Sinəmdədir ol daqi – təmənnayi – Məhəmməd,
Könlmdədir ol nari – təvallayi – Məhəmməd.

Əğyar ələmi qalmadı əsla ki, dilimdə,
Hər ləhzə gəzər fikri – dilarayi – Məhəmməd.

Hər ləzə qılır könlümü rəşkvari – ənbər,
Əfkari – du keysuyi – səmənsayi – Məhəmməd.

Əltafi – xudadır verir imani – həqiqi,
Dildadələrə zülfi – cəlilayi – Məhəmməd.

Əsradə salıb vəlvələ mülki – məlakutə,
Rəftari – şirin qaməti – balayi – Məhəmməd.

Əyyami – ləyali həmə sərkəştəvü heyran,
Rəşk – zədeyi – leyliyi – əsrayi – Məhəmməd.

Ta ruzi – əzəl könlümü şeydalığa salmış,
Güldəsteyi – rüxsarə həmrayi – Məhəmməd .

Birdir gecə – gündüz bəna, zira ki sərimdə,
Oynar həmədəm bərqi – bəxtsəlayi Məhəmməd.

Əlminnəti – lillahi mənəm ruzi – əzəldən,
Pərvaneyi – Əsmayi – müsəmmayi – Məhəmməd.

Sərhəlqeyi – rüsvayi sər xeyli cünunəm,
Ta kim olubam aşiqi – şeydayi – Məhəmməd.

Ey Miri – Nigari, bəna məxsusi – müsəlləm,
Sər xidməti – meyxaneyi – sövdayi – Məhəmməd.

Açmış ki, şirin təbimi tuti kimi söylər,
Ovsafi – ləbi – ləlü şəkər xayi Muhəmməd.

### *MƏRDANƏDİR OL Kİ, ÇƏKƏ PEYMANEYİ – ƏHMƏD (S)*

Mərdanədir ol ki, çəkə  peymaneyi – Əhməd,
Fərzanədir ol ki, ola məstaneyi – Əhməd.

Fərhadu Məcnun, həmə ərbabi – cününə
Sultanlıq edər aşiqi – divaneyi – Əhməd.

Tavusi bəhşətdiru yeridir xüldi – Muhəmməd,
Hər kim ola pərvaneyi – suznayi – Əhməd.

Iqbali yekidir kim, ola kaneyi – mehrəş,
Iqbali bəd oldur, ola biganeyi – Əhməd.

Nəxs oldu qəmu nəql hekayəti – ləzizə
Pozdu rəvişin ləzzəti – əfsaneyi – Əhməd.

Bən bilməzəm ovsafini, mövla bilur əmma,
Xurşid verər şəşəə gülxaneyi – Əhməd.

Fərda ərəsat içrə Nigari nə qəm eylər,
Kim olsa bu gün suzilə pərvaneyi – Əhməd.

## *SANA EY TACİ – SƏRİM, ŞAH – ŞƏRİƏTMİ DEYİM*

Sana ey taci –sərim, şah – şəriətmi deyim,
Əfsər – dinmi, ya ciqqeyi – millətmi deyim.
Qəməri – Leyliyi – əsrarmi, hidayətmi deyim,
Sairi – ərşi bərin tairi – qüdrətmi deyim.
Güli – gülzari səfa, bülbüli – iffətmi deyim,
Düri – dəryayə vəfa, kani səxavətmi deyim.
Qülzimi – lütfimi, ya kuhi – kəramətmi deyim,
Neməti – Məhzimi, ya aləmə rəhmətmi deyim.
Bilməzəm eynina, afət, sana surətmi deyim,
Şaşmişəm vəsfində aya, buna heyrətmi deyim.

Sana Əhmədmi, Məhəmmədmi, məhəbbətmi deyim,
Yoxsa məhbubi – xuda şahi – məlahətmi deyim.

* * *

Qərqi –dəryayi – günahəm, əgər ey təkyəgəhim,
Qəm dəgil – lütfünlə ki, mənə neylər günəhim.
Bulmuşam çareyi – mehrinlə ki, ey ruyi – məhim,
Feyzi çeşmindən alır dari – dəruni təbəhim.
Qaşların şami – ruxin, vəqti – səhər səcdəgəhim,
Şami – naləmlə yanar vahimlə sübhkəhim.
Payimal eylə bu sərkəştəni ki, xaki rəhim,
Dolanım başinə, göstər yüzün, ey sərv səhim.
Olmasın dideyi – tər qeyrə olursa nəgəhim
Qalmışam məhz tərədüddə ki, ey padşəhim.
Sana Əhmədmi, Muhəmmədmi, məhəbbətmi deyim,
Yoxsa məhbubi – xuda şahi – məlahətmi deyim.

* * *

Iştiyaqin gecələr aşiqi bidar eylər,
Məsti – çeşmin həvəsi maili – didar eylər.
Kakilin talibi – sövdanı havadar eylər,
Dili – şəhtasi – ləbin zövqi – şəkərxar eylər.
Iltifatın nəzər əhlini xəbərdar eylər,
Meyi – sərməsti – gözün qafili huşyar eylər.
Qəmzən ərbabi – deli sahibi – əsrar eylər,

Tutiyi – təbi – ləbin şövqi şəkərxar eylər.
Edməməm vəsf səni eşqi – şirinkar eylər,
Təbi tər, ey güli – tər, şövqilə təkrar eylər.
Sana Əhmədmi, Muhəmmədmi, məhəbbətmi deyim,
Yoxsa məhbubi – xuda şahi – məlahətmi deyim.

* * *

Təbi Həssanimə hər şairi yeksan deməzəm,
Sifətin söylərəm gər qorqaram, asan deməzəm.
Sana Quran deməsə, mən sana insan deməzəm,
Arizin mushəfi mövla, necə Quran deməzəm.
Sana can verməyənə sahibi – iman deməzəm,
Can nədir, kim onu ey büt sənə qurban deməzəm.
Can fəda olmasa, qurbanin olum, can deməzəm,
Qeyri – peykani – qəmin dərdimə dərman deməzəm.
Seyfi – mövla qaşına payi – nəriman deməzəm,
Aşikara deyirəm bu sözü, pünhan deməzəm.
Sana Əhmədmi, Muhəmmədmi, məhəbbətmi deyim,
Yoxsa məhbubi – xuda şahi – məlahətmi deyim.

* * *

Nə qəmim Əhmədi – muxtar ki, qəm xarimdir,
Rəhi – sövdadə Məhəmməd ki, mədədkarimdir.
Dəmbədəm şiri – məhəbbətin həvadarimdir,
Eşqi – məhbubi xuda kim həmədəm yarimdir.

Xidməti – şahi – məlahət ki, gözəl karimdir,
Mədhin, ey – dilbəri, ziba şirin əzkarimdir.
Dəhənindən nə deyim, can kimi əsrarimdir,
Vəsfi – şəhtabi – ləbin baisi – əşarimdir.
Ləlinə verməyə can şövqilə əfkarimdir,
Şəşdir heyrəti sövdadə bu gövtarimdir.
Sana Əhmədmi, Muhəmmədmi, məhəbbətmi deyim,
Yoxsa məhbubi – xuda şahi – məlahətmi deyim.

* * *

Arizin Miri Nigarin ki, tamaşa eylər,
Iltifat eyləməz, əğyarə ta haşa eylər.
Güli – gülzarə nəzər eyləməz haşa eylər,
Gülşəni – eşqini ey qönçi ki, məva eylər.
Məsti layəqəl özün bülbüli – şeyda eylər,
Meyli sərv eyləməz ol, qaməti – bala eylər.
Rəhgüzarində özün bir səri – bipa eylər,
Xaki – rahi qədəmin ol ki müsəlla eylər.
Şəşeyi – çeşmini ol kəhli – təcəlla eylər,
Səndən, ey mah səhər, şami – təmənna eylər.
Sana Əhmədmi, Muhəmmədmi, məhəbbətmi deyim,
Yoxsa məhbubi – xuda şahi – məlahətmi deyim.

## *EY HƏBİBİ – KİBRİYA, EY ŞAHİ CÜMLƏ ƏNBİYA*

Ey həbibi – kibriya, ey şahi cümlə ənbiya,
Kimdü səndən özgə bir sərdar, bir sahibliva.

Ey hidayət şəmsi, ey nuranilər sərhəlqəsi,
Kimdü səndən özgə xurşid, kimdü mahi – rəhnüma.

Kimdü səndən özgə şəhbazəm deyən aləmdə, kim
Səndən özgə bir təzərvü – nazənin, ey dilrüba.

Kimdü səndən qeyri kamil, kimdü bir sahib cəmal,
Kimdü səndən özgə fateh, kimdü bir müşgülgüşa.

Səndən, ey məh, maəda xubəm deyib laf etməsin,
Səndə xətm olmuş gözəllik, səndə xətm olmuş bəha.

Ey şəfi ül müznibin, ey rəhmətən lil aləmin,
Şəvqətin sübhü məsa istər "Nigari" binəva.

## NÖVRƏS İMAN "DİVANİ"
### *DANIŞAQ*

Sidq – dildən sığınmışam,
Kirdigardan danışaq;
Möminlərin dadrəsi
Şahsuvardan danışaq;
Ənbiyalar sərvəridi
Ol Məhəmməd Mustafa,
Nitqə gəlib onun kimi
Tacdardan danışaq.

Xəlq eləyib məxluqatı,
Qərar qoydu bir xudam;
İnsü cinni, külli – aləm
Tapdılar ondan nizam.
Məhəmmədin ümmətinə
Göydən endi xoş kalam;
Eynimizdə gizli deyil,
Aşikardan danışaq.

Yalan deyən hesab günü
Olacaqdı lal kimi;
Dili tutmaz, başı çəkər
Ondan qilü – qal kimi;

Ölən vaxtı qarşımızda
Bizə var sual kimi;
Bağıl dildən, odlu gürzdən,
Dar məzardan danışaq.

Bir gün olar, əcəl gələr
Ağrı yetişər sərə;
Hər əməlin öz nəfinə
Yazılacaq dəftərə.
Vay halına bu dünyada
Qarışan böhtan – şərə;
İman deyər, doğru yoldan,
Düz ilqardan danışaq.

## ƏNVƏR NƏZƏRLİ
## *PEYĞƏMBƏR HƏZRƏTLƏRİMİZ MƏHƏMMƏDƏL MUSTƏFA (S) HAQQINDA NƏT*

Sən ey qadir Allah, ey Pərvərdigar,
Sənə Sənin qədər məhəbbətim var.
Həyysən, əbədi – əzəlisən sən,
Nurlu könüllərin məşəlisən sən.
Alimsən, Müdriksən iradəlisən,
Çıxmaz məhəbbətin bir an könlümdən.
Sadiqlər sadiqi, haqdır hər sözün,
Sirli aləmlərin, gecə – gündüzün
Bütün varlıqların yaradanısan,
Sənin iradənlə yaranmış insan.
Cəmi məxluqata nemət verənsən,
Düz yol yaradansan, yol göstərənsən.
Şükür, həmdi səna tək Sənə layiq,
Yolunla gedənlər tək Sənə aşiq.
Bu necə sirrdir, bu necə hikmət –
Səndəki ən böyük istək, məhəbbət
Özün xəlq etdiyin bir insanadır,
Aləm bir yanadır, O bir yanadır.
Adı Məhəmməddir, künyəsi Əmin;
Səbəb o olmuşdur kulli – aləmin

Sənin bir sözünlə yaranışına,
Onu tac etmisən bəşər başına.
Bilirəm, İlahi, yoxdur şərikin,
Ona məhəbbətdə, sevgidə, lakin
Bağışla, mən sənə şərik olmuşam,
Elə bilinməsin müşrik olmuşam.
Səni sevdiyimtək səmimi – qəlbdən,
Sənin istəklinin aşiqiyəm mən.
İlahi, nə olur, kömək ol mənə,
Təriflər söyləyim Onun şəninə.
Özün tərif etdin Onu Quranda,
Cəsarət olarmı aciz insanda,
Sənin sözün üstə bircə söz deyə?
Məni vadar edən bu cahilliyə
Sənin həbbinə məhəbbətimdir,
Sənə də, Ona da sədaqətimdir.
Ey böyük Peyğəmbər, ey həbibullah,
Dünya yaranmadan yaratdı Allah
Müqəddəs nurundan Sənin ruhunu,
Qurani – Kərim də təsdiqlər bunu.
Xilqəti xətrinçün xəlq etdi Xaliq.
O, Sənə aşiqdir, Sən Ona aşiq.
Doğuldun günəştək sübh açılanda,
Səadət günəşi doğdu cahanda.

Sən hələ dünyaya gəlməzdən öncə
Möcüzə, əlamət gəldi bir neçə.
Qədim suhuflar da vermişdi xəbər:
“Gələcək dünyaya xatəm Peyğəmbər”.
Hansı əlaməti göstərmiş onlar,
Hamısı olmuşdur Səndə aşikar.
Atasız, anasız yetim böyüdün,
Yetimə mərhəmət oldu öyüdün .
Böyüyün, kiçiyin yerini bildin,
Ümmətlə ağladın, ümmətlə güldün.
Əlini öyrətdin halal zəhmətə,
Gənc ikən Məkkədə çatdın hörmətə
Düzlükdə şöhrətin ucaldı Sənin,
Adın çağırıldı Məhəmməd – əmin.
Məhəbbət, mərhəmət şüarın oldu,
Qəlbinə Allahın sevgisi doldu.
Çevrəni sarmışdı zülmət, səfalət,
Cəhalət içində batmışdı millət.
Hərə bir taxtadan, daşdan, çamurdan
Bütlər düzəldərək edirdi inan.
Hərənin öz yapma allahı vardı
Kəbənin evində onu asardı.
Qalxdın müşriklərə öyüd verməyə,
Çağırdın pis yoldan üz döndərməyə.

O daş allahlılar, daş ürəklilər
Haqlı sözlərini sandılar hədər.
Zalımlar dünyası sıxırdı Səni,
Məzlumlar naləsi yaxırdı Səni.
Gecəli – gündüzlü etdin ibadət,
Allaha yalvardın bitsin bu bidət,
Yolunu azanlar düz yola gəlsin,
Dünyada tək Allah adı yüksəlsin.
Duanı – sənanı eşitdi Dərgah,
Həzrət Cəbraili göndərdi Allah.
O, Sənə Allahdan ənam gətirdi,
Ruhuna,qəlbimə ilham gətirdi.
Gətirdi Allahdan bəşarət Sənə,
Söylədi verilmiş nübüvvət Sənə.
Ürəyin bir anda hikmətlə doldu,
Bu da bir xariqə möcüzə oldu.
Öyrətdi Cəbrail Sənə dəstəmaz,
İkiniz birlikdə qıldınız namaz.
Dünyaya yeni bir ayin gətirdin,
Bəşərə müqəddəs bir din gətirdin.
İslama ilk beyət Xədicə etdi,
Əli, Əbu – Bəkr ardınca getdi.
Başına yağdıqca arxadaşları
Yağırdı başına kafər daşları.

Tənəyə, töhmətə, səbrlə dözdün,
Nə şikayət etdin, nə də əl üzdün.
Səndəl əvvəl gələn bütün ənbiya
Dözməyib ümmətə etmiş bəd dua.
Sən isə düşdükcə işin çətinə,
Şəfaət dilədin öz ümmətinə.
Yaydın İlahidən gələn xitabı,
Endi ayə – ayə onun Kitabı,
Sənə Quraninda Rəbb "Yasin" dedi ,
"İnnəkə ləminəl mürsəlin"dedi.
Çağırdı yanına "Meraca" uçdun,
Haqqın dərgahını ruhunla qucdun.
Durdu xidmətində bütün mələklər,
Sevinib şad oldu Sənə fələklər.
Oldu qədəmlərin göylərə zinət,
Qadir yaradanla elədin söhbət.
Ümmətə şəfaət dilədin Ondan,
Tanrın tək rəhmli oldun, ey İnsan.
Endikcə qəlbinə yeni vəhylər,
O Əbu – Ləhəblər, Əbu – Cəhllər
Küfrü artırdılar, Sənə qızdılar,
Qətlinə gizli bir hökm yazdılar.
Qəlbən etdiyiçün Allaha pənah,
Atəşi Xəlilə gül edən Allah

Səni də qurtardı ölümdən, qandan,
Kafər qılıncından, ey sadiq İnsan.
Buyurdu Məkkədən edəsən hicrət,
Gedib Mədinədə tapasan qüvvət.
Bölük İlahiyə səna, şükr ilə
Köçdün Mədinəyə Əbu – Bəkr ilə.
Mədinə göstərdi Sənə etibar,
Yığışdı başına muhacir, ənsar.
Qəflətdə yatanlar tamam ayıldı,
İslam vüsət tapdı, İslam yayıldı.
Bütün döyüşlərdə qələbə çaldın,
Qanlar axıtmadan Məkkəni aldın.
Kəbədə bütləri sındırıb – yıxdın,
Hamıya ədalət gözüylə baxdın.
Kimsədən almadın keçmiş qisası,
Ucaldı göylərə "Allah"sədası.
- Kimin ürəyində Allah eşqi var -
Söylədin – İslama etsin etibar.
Bir olan Allaha gətirsin pənah,
Allah tək Allahdır, Mən Rəsulullah.
Qəlblərdə Allaha inam çoxaldı,
Yayıldı dünyaya İslam, çoxaldı.
Bəxş edən bəşərə onu Sən oldun,
Ülül əzmlərin sonu sən oldu .

Gətirdin dünyaya ülvi bir kitab,
Bütün suallara o verir cavab.
İnsana elmtək kövsər verir O,
Yerdən də, göydən də, xəbər verir O.
O böyük möcüzə "Qurani – Kərim"
Nur saçır aləmə, ey yari – Rəhim.
"Quran"dır ədalət, fəzilət kanı,
Onun bərabəri bir kitab hanı?
Müqəddəs qanunlar Onda olub cəm,
"Quran"tək möcüzə görməyib aləm.
"Quran"dır Allahın sirri, hikməti,
Düz yola çağırır bəşəriyyəti .
"Quran"dır əsası, ürəyi dinin,
Dəstamaz, namazdır dirəyi dinin.
Odur ki, dünyadan edəndə rəhlət,
Onları əshaba etdin vəsiyyət.
Əhli – əyalını tapşırdın bir də,
Heç bir vəsiyyətin qalmadı yerdə.
Əbu – Bəkr ,Ömər, Osman və Əli
Xilafət taxtına oldular vəli.
Sevir onları da Səni sevənlər,
Sənin gətirdiyin dini sevənlər.
Əyalın Xədicə, qızın Fatimə
Anadır, bacıdır bütün müslimə.

On dörd əsr ötüb, keçib o gündən,
Yenə qəlbimizin günəşisən Sən.
İslamı dünyaya bəxş etdiyinçin,
Dini qəlbimizə nəqş etdiyinçin,
Sənin Xaliqinə şükr eləyirik,
Səni Allahla bir zikr eləyirik.
Ey xətmi – ənbiya, Sən ey Mustafa,
Sən ey könlümüzə gətirən səfa,
Ənvər rica edir Səndən, ey Sultan,
Kəsmə şəfaətin bu müsəlmandan.
Səndən əziz bir qul yoxdur Allaha,
Yalvar bizdən  ötrü o şahənşaha.
Qoymasın düz yoldan çıxmağa bizi,
Artırsın imanla iradəmizi .
Silinsin qəlblərdən cəhalət pası,
Güclənsin daima İslam dünyası.
Aləmə nur saçsın haqqın çırağı,
Ucalsın müqəddəs İslam bayrağı.
Bütün yer üzündə o dalğalansın,
İslamın günəşi yandıqca yansın.
Qiyamət qopanda hesab günündə
Şəfi ol bizlərə Allah önündə.
Çəkməyək məhşərdə Ondan xəcalət,
Ey Rəsuli – Əkrəm, sənə min rəhmət.

## *NƏT*
## *MƏHƏBBƏT ÇƏLƏNGİ*

İlahi, dərgahına əl açan aciz qulam,
Kərəminə möhtacam, qoyma köməksiz qalam.
Ürəyimə od salıb həsrətli bir məhəbbət,
Sevgilimin özü tək iffətli bir məhəbbət.
O qənirsiz gözəlin görməmişəm üzünü,
Özüm tək aşiqlərdən eşitmişəm sözünü.
Onu Sən yaratmısan ilahi qüdrətinlə,
Aləmə nur çiləyən ülvi məhəbbətinlə.
Onunçün xəlq etmisən yeri, asimanları,
Dənizləri, dağları, sonsuz kəhkəşanları.
Onun təmiz qəlbinə öz nurundan vermisən,
Onu bu yer üzünə xilaskar göndərmisən,
Göndərmisən ki, bəşər dərk eləsin özünü,
Qondarma məbudlardan Sənə tutsun üzünü.
Əziz həbibin olmuş sədaqətilə Sənə,
Məhəbbət qazanmışdır məhəbbətiylə Sənə.
Odur bizə çatdıran Sənin kəlamlarını,
Sadiq bəndələrinə qüdsi salamlarını.
Gətirdiyi hər surə iradəm, ilhamımdır,
Özü əziz nigarım, sözü şərbət camımdır.
Onu yaratmasaydın Səni necə sevərdim?
Onun məhəbbətilə könlümü Sənə verdim.

Boyanmışıq – O Sənin, mən də Onun nuruna,
Kaş onunla gələydim məşhərdə hüzuruna.
Məhəbbət göylərində qanad çalan quşam mən,
İlahi, həbibinə candan vurulmuşam mən.

Bu eşqin yollarında çox bəlalar çəkmişəm,
Zalımlar pəncəsində göz yaşları tökmüşəm.
Zülmət səltənətində göz açıb doğulmuşam.
Cəhalət girdabında illərlə boğulmuşam.
Allahsızlar aldadıb baş – beynimi yeyiblər,
“Adəm oğlu deyilsən, od oğlusan”deyiblər.
Əslimi dananlara bilmədən inanmışam,
Ömrüm qəflətdə keçib, ancaq indi qanmışam
Adəmi yaratdığın torpağın balasıyam,
Torpaqdan yaradana sadiq qul qalasıyam.
Oddan İblis yaranıb, torpaqdansa Peyğəmbər,
Oddan yaradılsaydı iblis olardı bəşər.
Atəş torpağı yaxmaz, torpaqla sönər atəş,
Sən istəsən külə də gülə də dönər atəş.
Kainatda nə varsa İradənə bağlıdır,
Mənim arzularım da yalnız sənə bağlıdır.
Qəlbimdə qoyma solsun, ya Rəbbi, arzularım,
Arzum ürəkdə qalsa xəzan olar baharım.
Bilirəm, kamil deyil hələ imanım Allah,

Kərəm göstər, dadə yet, Sənsən gümanım, Allah.
Bütün yaranmışlara mərhəmətin var Sənin,
Sonsuz kəramət Sənin, külli – ixtiyar Sənin.
Əsirgəsən lütfünü zəlalətdə qalaram,
İstəklimin yanında xəcalətdə qalaram.
Ey bütün nəbilərə göydən vəhy endirən,
İmanlı şairlərə ilham verib dindirən.
Mənə də ilham yetir, şirinlik ver dilimə,
Niskilli bir eşqdən söz açım sevgilimə.

Sevgilim bir ömürdür
Həsrətində qalmışam,
Rayihəni sevdiyin
Qızılgüldən almışam.

Xaliqdə sevir Səni,
Məxluq da sevir Səni.
Belə xoş yaratmayıb
Yaradan heç kimsəni.

Yenə aşiq olanlar
Görüşünə gəlirlər,
Torpağına baş qoyub
Eşqinlə yüksəlirlər.

Kaş qanadlı quş olub
Hüzuruna uçaydım,
Astananı öpəydim,
Kandarını qucaydım

Günəş kimi, ay kimi
Baxaydım Sənə sarı,
Irmağa çevriləydim,
Axaydım Sənə sarı.

Göz yaşımla yuyaydım
Yollarının tozunu,
Qəlbimə həkk edəydim
Ayağının izini.

Çiçək kimi  od kimi
Yolun üstə bitəydim,
Sənin nurun içində
Əriyəydim, itəydim.

Yol asan, imkan çətin,
Necə gəlim bilmədim.
Əfv et, ya Rəsulullah,
Görüşünə gəlmədim.

Bu niskilli məhəbbət
Məni üzüb – inlədir.
Bircə təsəllim bu ki ,
Ürəyim Səninlədir.

Niskilim can yandıran həsrətli bir türküdür,
Bu türüknün yazarı bir azəri türküdür.
Türkün başa yetişir, eşqimsə yetə bilməz,
Peyğəmbər məhəbbəti tükənib bitə bilməz.
Məhəbbətlə gül açır ömrüm, həyatım mənim,
Məhəbbətlə dil açır şirin bayatım mənim:

Əzizinəm, dönmərəm,
Məhəbbətsiz dinmərəm.
Yarsız cənnətə düşsəm,
Orda da sevinmərəm.

Mən aşiqəm simim var,
Mizrabım var, simim var.
İki dünya Sərvəri,
Səndən özgə kimim var?

Əzizinəm, yenə mən,
Vurulmuşam Sənə mən,

Eşqində can da versəm
Sevəcəyəm yenə mən.

Sevgilim istəmirəm sözü burda bitirim,
Izn ver qəzəlimlə Sənə salam yetirim:
O günəş timsalı yarım şövq ilə etcək zühur,
Ruh alar eşqindən aləmlər, tutar dünyanı nur.
Məqdəmiylə iftixar eylər zəminu asiman,
Kainatda hər nə var eylər o sərvərnən qürur.
Öylə kamil xəlq edib Xaliq o xublar şahını,
Hər necə cəhd etsə əğyar Onda tapmaz bir qüsur.
Varmı bir məxluq o Şahlar şahıtək gəlcək adı
Ərşdə yeksər mələklər şad ola, cənnətdə hur.
Həm həqiqət, həm sədaqət, həm səxavət kanıdır,
Elminə, idrakına yetməz ağıl, çatmaz şüur.
Dosta şəfqət, düşməni əfv eyləyən bir Zati – pak,
Ənbiya fövcinə sərvər, həm həlimdir, həm cəsur.
Sayə sal Ənvər fəqirin başına, ey Sayəsiz,
Söyləsin vəsfin Sənin, salsın sözü dünyaya şur.
Yoxdur Allahdan səva Allah, Məhəmməddir qulu,
O Qula qulluq edəydim, istəyim – arzum budur.

*** * ***

Ilahiyə min şükür, məni darda qoymadı,
Vəsfini söyləməkçin itizarda qoymadı.

Yenə kərəm göstərib ilham bəxş etdi mənə,
Ölüncə sadiq qulam həm Ona, həm də Sənə.
Ey nəbilərin sonu, ey həbibi Allahın.
Sənə daim açıqdır qapları dərgahın.
Kafirlər salıb yenə ümmətini düzlərə,
Yalvar İlahiyə ki, rəhm eləsin bizlərə.
Dar məqamda qoymasın qırılan müsəlmanı,
Müsəlman olduğuyçün vurulan müsəlmanı.
Ürəklərdə söndürsün küdurət atəşini,
Könüllərdə yandırsın məhəbbət günəşini.
Yox olsun yer üzündən şeytanın fitnə – şəri,
Ilahinin sevgisi sevindirsin bəşəri.
Əbədi qanuna dönsün bütün dünyanın
Sənə nazil olunan ayələri "Quran"ın.
Möhtacdır insan oğlu yetişməkçin kamına
Sənin şəfaətinə, Onun sərəncamına.
Mənim də məhəbbətim qoy nisgilli qalmasın,
Allah məni bircə an Səndən ayrı salmasın.
Gəlim ziyarətinə türbətini öpməyə,
Şerimi çiçək kimi ayağına səpməyə.

Mən aşiqəm, ötərəm,
Bülbüldən də betərəm,
Allah qismət eləsə
Vüsalına yetərəm.

Ey sevimli Peyğəmbər, yalvarıram bir daha,
Bu aciz bəndələrçin Sən də yalvar Allaha
Dərgahından əli boş bizi yola salmasın,
Heç kimsənin istəyi ürəyində qalmasın.

*** * ***

Sənə aşiq olub könlüm binadan, ya Rəsulallah,
Ölüncə dönmərəm sidqü vəfadan, ya Rəsulallah.
Səmimi aşiqəm, fəxrim – vüqarımdır Sənin eşqin.
Uzaqdır bu sevən könlüm riyadan, ya Rəsulallah.
Nə xoşbəxtəm ki, dünyada Sənin tək sevgilim vardır,
Neçin qorxum qiyamətdə cəzadan, ya Rəsulallah.
Dönərsəm Səndən, ey istəkli sultanım, üzüm dönsün,
Üzülsün rişteyi – canım cəfadan, ya Rəsulallah.
Ilahi bir ziya vermiş Sənə öz zati – pakından,
Cahan nura boyanmış o ziyadan, ya Rəsulallah.
Bəlakeş ümmətinçin iltimas et dərgəhi – həqdən,
Xilas olsun müsəlmanlar bəladan, ya Rəsulallah.
Bütün dünyada Islamın şüarı bərqərar olsun,
Təmənna eyləyir Ənvər Xudadan, ya Rəsulallah.

## MARAĞALI ƏVHƏDİ
### *PEYĞƏMBƏRİN NƏTİ*

Qalx, döy bu qapını aşiqsənsə sən,
Çalış peyğəmbərin tut ətəyindən.
Onun məhəbbəti hər şeydir inan,
Onun qayğısıdır hər dərdə dərman.
Özgəsi boş addır, o, məna tamam!
Ancaq o, yetkindir, başqaları xam.
Bu sonsuz göylərdə uçan mələklər
Deyillər yolunun torpağı qədər.
Hərə bir ov üçün özünü yordu,
Hədəfə oxu düz ancaq o, vurdu,
Insan qapısında yetər murada,
Bu qapı – bacanı sən  burax yada.
Odur kainatda insan da, ər də!
Həm dinə, həm dərdə sahib gövhər də!
Adəmin kitabı ilk quranıdır.
Idrisin sandığı qələmdanıdır,
Ona beyət edib, durmuş kilsələr
Naqislər sükutla ömür keçirər.
Yaxşı adlılıqdan başında var tac,
Bütün gecələri olubdu merac.
Yanında gecədən etmə hekayət,
Onun tək çıraqla nədir şikayət?!

Doqquz göy, dörd ünsür gövhəri odur,
Doqquz bürc, beş rüknün əxtəri odur.
Onun kölgəsidir göylərdəki nur,
Mələklər önündə xidmətdə durur.
Ayı barmağıyla bölübsə əgər,
Yumruğu önündə günəş neyləyər?!
Göydə ay əlində olan bir nəfər
Göylərin yolunu çox asan gedər.
Saxlayar günəşi merac gecəsi.
Göyün zirvəsində durar xeyməsi.
Ondan aşağıda qalmış Tir, Zühər,
Dünyanın sirrini eyləmişdir həll.
Ən çətin sirlərə olmuşdur agah,
Şərh etmiş onları, həm vermiş izah.
Qeyibdən doxsan min söz gəlib haman
Bir anda könlünə olmuşdur əyan.
Bir anda göylərə gedib qayıtmış,
Allahı görərək vüsala çatmış.
Qalxarsa Əhmədin mimi aradan.
Yerində bir "əhəd" qalar o zaman.
Cəbrayıl bələdçi, o yol biləndir,
Onun buyruquyla ruhu sevindir.
Fələk büsatındır ulduzlar əsgər,
Səninlə şadlıqa yetişdi bəşər.
Haşimi nəsəbli, Qureyş əsilli,

Məkkə, Mədinənin nurudu, bəlli.
Gəlir fəth bayrağı nur dünyasından,
Səba ordusuna öncüldür hər an.
Doqquz qat göyləri keçmiş məbərin,
O ərşi – əlanı seçmiş məmbəri.
Möcüzü daşlara dil bağışlayar,
Xülqündən ölülər canlanıb durar.
Hesab çəkiləndə, gələndə məhşər,
Sənə ümmət olar büsbütün bəşər.
Nuru, ziyasiylə şəriətinin
Tutmuşdur dünyanı dörd yarın sənin.
Bizdən və tanrıdan yağışlar qədər
Sənə, yarlarına olsun rəhmətlər!

## *AND VERİB YALVARIŞ*

Ey göyü eşqilə məftun eyləyən,
Məni də yada sal, and verirəm mən.
Dinin düyününü vurduğun çağa,
Içində yatdığın qoca torpağa.
O ay parçalayan bir barmağına,
O şirin dilinə, xoş baxmağına,
O ənbər qoxulu hörüklərinə,
Qara gözlərinə, kirpiklərinə,

Oturub duraraq namaz qılmağa,
Diz çöküb dualar yola salmağa,
Məscidə, mehraba, azana qəlbən,
Suya, dəstəmaza and verirəm mən,
Həm o mağarana, o hicrətinə
Hörümçək toruna, dost söhbətinə,
Yerdən fələklərə yol salmağına,
Ğöylərdən geriyə yön almağına,
Islamın qapısı şəhadətinə,
Oruca, zəkata, səlavətinə,
Az yeyib etdiyin qənaətinə,
Hünər meydanında şücaətinə,
Mindiyin Rəfrəfə, o Burağına,
Allah hüzuruna tək çıxmağına,
Səndəki vüqara mələk yanında,
Həm o əzəmətə, fələk yanında,
Həm həyat qurduğun o nigarlara,
Könül bağladığın o dildarlara,
Bir də Kərbəlanın şəhidlərinə,
Məşhəddə zülm ilə ölənlərinə,
O qırx səhabənə, o dörd yarına,
Yataq dostlarına, qonşularına,
Həmişə yaş tökən iki gözünə,
Böyük yarlarına, bir də özünə.
O əqiq dodağa, hədis, kəlama,

Şəfaət et mənə xasla əvama.
Buqəbis, həridə qalib gəl mənə,
Torpağı, səması əziz Məkkənə,
Sənin dözümünə, ac qalmağına,
Gecələr yatmayıb yalvarmağına,
Yarlarında olan hüsnə, ilqara,
Beşikdə boy atan doqquz nigara,
Kəbənin qəlbinə haqqa, hesaba,
Əmin Cəbrayıla, bir də kitaba,
Hətimə, zəmzəmə, rüknə, məqama,
Məkkə əlindıki o ehtişama,
O Mərvə, Ərafat, bir də Səfaya,
Günəşə, kürsüyə, ərş ilə aya!
Yazıq Əvhədini qovma qapından,
Ona yardım elə nur dünyasından.
Günahı olsa da gizli, aşikar,
Sən onunla olsan, nə dərdi olar!?
Bu bərk can, bir dəki, yüngül qədəmlə,
Sən onunla olsan, nə işi qəmlə!?
Taətdə təqsiri varsa, at yana,
Baxma dövlətinin az – çoxluğuna.
Işimə kərəmlə bax, ey Mustafa!
Hər iki dünyada et başı uca.

## ŞAKİ
## *HƏZRƏTİ PEYĞƏMBƏRİN MƏDHİ*

Qurani Xuda nazil edib bəndələrinə,
Təklif edib onunla hamını aləmi – dinə.
Vəhyi ki, gəlib ol müxbiri siddiqi əminə,
Atasıdır Əbdullah, anası Əminə,
Olsun salavat ruhi – Rəsuli – Səqəleynə,
Ismi ki, Məhəmməd, yox mədhinə hacət,
Qurban ola ümmət, bir sahibi – elmə,
Bir xazini – fənnə, bir baniyi – dinə,
Qurban belə elmə, belə fənnə, belə dinə,
Bəh – bəh nə deyim şükr Xudanın Kəreminə.

Peyğəmbərimiz Əhmədi Muxtari – yeganə,
Təşrifi əgər olmamış olsaydı cahanə.
Olmazdı cahandan bu cahan içrə nişanə,
Aləm yaranıb ancaq olubdur, o bəhanə.
Şənində onun hər nə desən dəxi fəsanə,
Ismi ki, Muhəmməd, yox mədhinə hacət,
Qurban ola ümmət, bir sahibi – elmə,
Bir xazini – fənnə, bir baniyi – dinə,
Qurban belə elmə, belə fənnə, belə dinə,
Bəh – bəh nə deyim şükr Xudanın Kəreminə.

Bir kəs ki, çıxa ərşə ola Xaliqə mehman,
Əfvac – mələk xidmətinə bəndeyi – fərman,
Bax gör necə əşrəfdi, nə əfzəldi bu insan,
Zati – pakində onun yox zərrəcə nöqsan,
Ismiylə mükəmməldi müsəlmandakı iman,
Ismi ki Muhəmməd, yox mədhinə hacət,
Qurban ola, bir sahibi elmə,
Bir xazini – fənnə, bir baniyi – dinə,
Qurban belə elmə, belə fənnə, belə dinə,
Bəh – bəh nə deyim şükr Xudanın Kəreminə.

Bir şəxs ki dünyada olub sadiqi – rəhbər,
Peyğami – ilahilə qılıb xəlqi münəvvər,
Məşhərdə şəfaətçidir islamə sərasər,
Xoşbəxtdir ol qovm ki, bir böylə peyğəmbər,
Qismət elıyib onlara ol xaliqi – davər,
Ismi ki, Muhəmməd, yox mədhinə hacət,
Qurban ola ümmət bir sahibi  elmə,
Bir xazini – fənnə, bir baniyi – dinə,
Qurban belə elmə, belə fənnə, belə dinə,
Bəh – bəh nə deyim şükr Xudanın Kəreminə.

Bir parça bulud çətirdi başi üzərində,
Cəbrili –  əmin xadim idi rahi – bərində,
Əshabi – kübar ali – rəsul idi dərində,

Gör hikmətini ərşə uruci səfərində,
Əfv etmək idi, ümmətinin asilərində,
Ismi ki, Muhəmməd, yox mədhinə hacət,
Qurban ola ümmət bir sahibi  elmə,
Bir xazini – fənnə, bir baniyi – dinə,
Qurban belə elmə, belə fənnə, belə dinə,
Bəh – bəh nə deyim şükr Xudanın Kəreminə.

Bir şəxsə Həbibim deyə xaliq bu şərafət,
Yox başqa nəbilərdə bu hacət, bu fəzilət,
Bir Xaliqi, bir mushəfi, bir hökmü, bir adət,
Bir dini – mubinlə eliyib aləmi dəvət.
Birlik, mutəəddit neçə mümkün  nə ədavət,
Ismi ki, Muhəmməd, yox mədhinə hacət,
Qurban ola ümmət bir sahibi  elmə,
Bir xazini – fənnə, bir baniyi – dinə,
Qurban belə elmə, belə fənnə, belə dinə,
Bəh – bəh nə deyim şükr Xudanın Kəreminə.

Bir kəski nə məktəb görə, nə məşq, nə ustad,
Bir tifli – yetim, olmaya tədrisilə mötad,
Sonra ola ol əkməli ələm belə əfrad,
Peyğəmbər o şəxsə necə söylənməyə heyhat,
Olmaz belə möcüz, dəxi olmaz belə isbat,

Ismi ki, Muhəmməd, yox mədhinə hacət,
Qurban ola ümmət bir sahibi  elmə,
Bir xazini – fənnə, bir baniyi – dinə,
Qurban belə elmə, belə fənnə, belə dinə,
Bəh – bəh nə deyim şükr Xudanın Kəreminə.

Cahil necə alımlə bərabər ola bilməm,
Adəm yaranıb məhzi ülum ilə mükərrəm,
Eynilə olub kəşf təmam mətləbi – mübhəm,
Əczai – pərişan tapıb elmilə fərahəm,
Elmilə dəxi fəxr elədi seyyidi – aləm,
Ismi ki, Muhəmməd, yox mədhinə hacət,
Qurban ola ümmət bir sahibi  elmə,
Bir xazini – fənnə, bir baniyi – dinə,
Qurban belə elmə, belə fənnə, belə dinə,
Bəh – bəh nə deyim şükr Xudanın Kərəminə.

Cahil qala bir kəs necə insafə rəvadur,
Cahil qalanın hər işi nöqsani – xətadur,
Aləmdə işıq alimin elmilə ziyadur,
Həm rahi hidayətdə qalanlar üləmadur,
Tənbih qılan bunları məhbubi – Xudadur,
Ismi ki, Muhəmməd, yox mədhinə hacət,
Qurban ola ümmət bir sahibi  elmə,
Bir xazini – fənnə, bir baniyi – dinə,

Qurban belə elmə, belə fənnə, belə dinə,
Bəh – bəh nə deyim şükr Xudanın Kərəminə.

Şənində demiş bir nəfər ümmət ki, min il mən,
Ömr eyləsəm, ağzım yusam hər dəm gülabilən,
Bu ağzıma layiq görə bilməm, genə qətən,
Zikr eyləməyə ismi – rəsuli necə bəs mən,
Cürət elədim mədhə cəsarət elədim mən,
Ismi ki, Muhəmməd, yox mədhinə hacət,
Qurban ola ümmət bir sahibi  elmə,
Bir xazini – fənnə, bir baniyi – dinə,
Qurban belə elmə, belə fənnə, belə dinə,
Bəh – bəh nə deyim şükr Xudanın Kərəminə.

Axırda gəl ey Şaki, sən eylə bu suali,
Min üç yüz il ol kim edib eylə xəyali,
Mənzur edə həm onda bu əsri belə hali,
Hər əsrə müvafiq ola, məzmuni – məlali,
Ta ruzi – cəza tapmaya ehkami  zəvali,
Ismi ki, Muhəmməd, yox mədhinə hacət,
Qurban ola ümmət bir sahibi  elmə,
Bir xazini – fənnə, bir baniyi – dinə,
Qurban belə elmə, belə fənnə, belə dinə,
Bəh – bəh nə deyim şükr Xudanın Kərəminə.

## MUSTAFA ZƏRİR
### *BİSMİLLAHİR – RƏHMANİR – RƏHİM*

Ol rəsuli – əvvəlinü axirin,
Ol Muhəmməd Mustafa, salari – din.
Həqdən ana gəldi dövlət izzü cah,
Həm yarənləridir anın pişü rah.
Oldurur ol padişahi – müttəqin,
Ol Əbu Bəkri – səfa, sultani – din.
Ol ikinci yari Ömərdir benam,
Qıldı anı ol sahibi – kiram.
Birisi Osman, səfadır bahəya,
Ol birisi Şahi – Əli Mürtəza.
Baqi övladiylə əshabi – kiram,
Anları qıldı şərəf rəbbül – ənam.
Sən dəxi dilər isən, ey səfa,
Kim, şəfaət qıla yarın Mustəfa.
Anlara sidqini qılsən bir məzid,
Xof yerindən olisərsən sən bəid.
Bilirəm şükri xudavəndə cəhan,
Söyləyəlim bir əcaib dasitan.
Ol gülilə bülbüli şad edəlim,
Qisseyi – Yusifə bünyad edəlim.
Dinləyənlər ta ki, bulsunlar murad,
Anlıyənlər cani – könli olə şad.
Söz dənizinə dalıb qəvvasvar,

Ol dənizdə gövhəristan şahvar.
Çün çəkərsin zəhmət, ey fərxəndə ray,
Olmadı mehriylə hiç kimsə bay.
Yol bulanları qolavuz eyləgil,
Ol dənizdə əşki əvəz eyləgil
Kim, bulasın gövhəri gövhər nihad,
Gövhər ilə işin olə cümlə şad.
Can qulağın aç, dinlə bir zəman,
Bir əcaib, bir qəraib dasitan.
Həq – təalə əmr qıldıvü şühud,
Həm mələklər ana qıldılar sücud.
Adəmin gəldi belindən ənbiya,
Bişümarü bihesabü biriya.
Ənbiyanin biri sultani – kərəm,
Ol Xəlilullahi – şahi – möhtərəm.
Həm Xəlilin iki oğlu var idi,
Ikisi də böylə peyğəmbər idi.
Biri İsmayıl, İshaqdır biri,
Yəqub İshaq oğludur, ey din əri.
On ikidir oğlu Yəqubun təmam,
Altı övrətdən doğubdur, ey hümam.
Hər birində iki oğlu var idi,
Ikisi bir anadan doğar idi.
Ol ikisi bir anadən doğdular,
Ata – ana bir qərindaş oldular.

Eşit imdi qalanının adını
Kim, bulamın sən bu sözün dadını.
Biri Şəmundur, Yəhudadır biri,
Biri Əliyun, biri İmran yol əri.
Biri Bəşir, biri Lavidir, bilin,
Biri Rəvil, biri Salun anlərin.
Biri Dadan, ol biri can idi,
Ol birisi Yusifi – Kənan idi.
Biri Yamin, çün Yusifdən kiçik idi,
İlla Yusif babasının içi idi.
Qamu oğlənlərini ol elmi – din,
Ögrədərdi illa Yusifdən gəzin.
Bəhsi – elm daim anınlə qılır,
Ayruğinə çün həsəd andən qılır.
Yəqubun dəvəsi, qoyunı çox idi,
Kimsəyə həm ehtiyacı yox idi.
Hər bir oğlinə verir üç bin qoyun,
Yusifə vermişdi altı bin qoyun.
Ol həsəd bünyadı həm andə bitər,
Bil, həsəddən neçə - neçə baş yetər.
Gəl həsəddən key saqın, ey bəxtli,
Olmasın, şeytan qılə sana qəlli.
Buncə peyğəmbərə nə qıldı ol,
Qatı düşməndir bizə ol şərr bol.
Eşit imdi Yusifin əhvalini,

Əvvəlində necə oldu halini.
Çünki doğdu Yusif, öldü anəsi,
Bir qəravaş aldı satın atəsi.
Yusifi ol qəravaş bəslər idi,
Bəsləyən anı xoş sevər idi.
Ol qəravaşun bir oğlu var idi
Kim, gülər üzlü gözəl dildar idi.
Ikisin əmzirməgə süd yetmədi,
Yəqub anın oğlunu həm tutmədi.
Qəravaşın satdı oğlun ol zəman,
Zari qılıb inlədi ol natəvan:
Netə kim məhrum qıldın sən bəni,
Satdirə oğlancığını ol qəni
Kim, hacət qapısı açıq idi məgər,
Hacəti oldu qəbul, ey mötəbər.
Gəl sınıq könüldən özüni saqın
Kim, sınıq könül bilir tənri haqqın.
Eylə buyurdu xudavəndi – kərəm,
Bən sınıq könüldə oluram müqim.
Rövşən oldu işbu qissə əvvəli,
Axırı həm duşdən oldi, ey vəli.
Eşit imdi qisseyi – Yusif sana,
Aydı verəm gər qulaq ursən bana.
Bəslədilər Yusifi ezaz ilə,
Ulalubən elm oxurdu naz ilə.

Tanri bana ruzi qıldı bərcəmal,
Oldu ol sultani – xubani – cəmal.
Üzi qatində olurdu Ay xəcil,
Gün üzünü görsə, olur təngdil.
Ayü gün üzi qatində bir xəyal,
Hüsni vəsfi sığməz, ey pürkəmal.
Hər kim anın üzünə qıldı nəzər,
Əqli zail oldu, düşdi bixəbər.
Daima alırdı dürri – niqab,
Eylə kim, buludə girdi afitab.
Anı babası sevərdi can kibi.
Bir dəm əgər görməsəydi üzünü,
Qəsd edərdi öldürə kəndözünü.
Qıldilər qərdəşləri bu gəz həsəd,
Ayıtdilər, Yusif bizə bağladı səd.
Imdi dinlə qissei – Yusif imam,
Qamu qissədən ol yegdir benam.
Bir rəvayət İbn Abbas eylədi,
Ol ki, təğyirdə kəlami söylədi.
Kim, nədən oldu nüzulinə səbəb,
Mustafayə verəydi ol fərdi – rəbb.
Müxtəlifdir neçə dürlü qovl ilə,
Bir – ikisini gətirəlim dilə.
Şahi təfsirdə bəyan edər məgər,
Qapı önündə oturmuşdu Ömər.

Mülzəm oldılər qəmu xurü həqir.
Arə yerdə bir yəhudi söylədi,
Nüktə qıldı, Ömərə gör nə dedi.
Ayıtdı, bizim yek kitabımız təmam,
Nə dəlilə dedin, sən, ziimam.
Ayıtdı, bizim dəftərimizdə xəbər
Qıldı Yusif qissəsin mötəbər.
Ol sizin kitabinizdə varmı, bil,
Anı sizə vermədi Rəbbül – cəlil.
Anı eşitdi Ömər könlü məlul,
Gəldi Seyyidə dedi ol pürüsul.
Mustafayə söylədi bu dasitan,
Mustafa oldu məlul, ey dusitan.
Mustafa ol dəm minacat eylədi,
Tənri dərgahinə hacət eylədi.
Gəldi Cəbrayil, gətirdi bir xəbər,
Qissei – Yusif rəsulə mötəbər.
Bir rəvayət dəxi bünyad eylədim.
Ol zəman kim, hicrətə gəldi rəsul,
Məkkədən Mədinəyə qıldı nüzul.
Məkkədən yönəldilər çünki bəri,
Evlərinin tərki urdı hər biri.
Tənri yolinə fəda qıldı bulər,
Axirət yolini möhkəm tutdilər.
Ayıtdilər kim, bizə olsa bir bəyan

Kim, anunlə əglənəydik bir zəman.
Bir əcaib qissə olsa, söyləyək,
Anunlə gönlümüzü əgləyək.
Gəldi Cəbrayıl gətirdi bir bəyan,
Həm Kəlamüllah qisəs qıldı əyan.
Biri ol aşiqlərin bir gün məgər,
Dilədilər Mustafadən bir xəbər.
Əglənəydik, der, əya fəxri – cəhan,
Anınlə könlümüzü bir zəman.
Dilədi həqdən rəsulül mürsəlin,
Verdi ol dəm surei – Yusif əmin.
Tənri Qurandən bəyan qıldı məgər
Kim, ərəb dilincə, ey şahi – bəşər.
Verəydim sana Quran, ey həbib,
Ta ki, qövmün bilə bula həm nəsib.
Tənri aydır, ey Muhəmməd Mustafa,
Yegrəgini qissənin verəm sana
Kim, eşidənlər zövqi – can bula,
Aşiqə sidqlə din iman ola.
Ibn Abbas eylədi şərhi – bəyan,
Neçələr kim, söylədi bu dasitan.
Bən fəqirü bu duaçı söylədim,
Dasitani – türki bünyad eylədim.
Gərçi kim, yox bəndə elmi – hünər,
Ey hünər əhli, kərəm qılın güzər.

## S. İ. NƏSİMİ
### *QƏZƏL*

Hər du aləm sərvərisiz, ya Muhəmmməd, ya Əli,
Cümlənin həm behtərisiz, ya Muhəmmməd, ya Əli.

Du cahanın afitabısız, yenə həm afitab,
Həm zulumat ənvərisiz, ya Muhəmmməd, ya Əli.

Şəninizə gəldi həm "Ta – havü", "Yasin", "Hələta",
Vəzzühanın dəftərisiz, ya Muhəmmməd, ya Əli.

Ayəti – "lövlak" ilə həm afitabın mənisi,
"Ləhməki ləhmi" deyilsiz, ya Muhəmmməd, ya Əli?

Mədəni – sidqü səfasız, həm yenə lütfi – kərəm,
Laməkanın gövhərisiz, ya Muhəmmməd, ya Əli.

Dürri – şəhvari – gühərbar lütfünüzdür bigüman,
Həm sədəfin cövhərisiz, ya Muhəmmməd, ya Əli.

Hadiyi – rəhbər çü sizsiz cümlə aləmdə bu gün,
Cümlə nazir mənzərisiz, ya Muhəmmməd, ya Əli.

Əmri – mərufun bəyani sizdən oldu aləmə,
Nəhy işlərdən bərisiz, ya Muhəmmməd, ya Əli.

Danla ki, gündə şəfaət sizdən umar xasu am,
Həm Rəsuli Heydərisiz, ya Muhəmmməd, ya Əli.

Fatimə Zəhra Bətulu qürrətül eyni Rəsul,
Şəhpərü həm şəhpərisiz, ya Muhəmmməd, ya Əli.

Şah Zeynülabidindir ol imami – rəhnüma,
Şah Baqir, Cəfərisiz, ya Muhəmmməd, ya Əli.

Museyi – Kazim, Rzavü həm Təqiyyü, həm Nəqi,
Həm Həsənül – Əsgərisiz, ya Muhəmmməd, ya Əli.

Mehdiyi Sahibzəmansız hadiyi – insü mələk,
Əvvəlü həm axərisiz, ya Muhəmmməd, ya Əli.

Bu fəqirü binəva hərdəm dilər sizdən dua,
Lütf ilə ehsan yerisiz, ya Muhəmmməd, ya Əli.

Çün Nəsimi mədhinizdə bir zamandır söyləmiş,
Gecə - gündüz zakirisiz, ya Muhəmmməd, ya Əli.

## *QƏZƏL*

İki aləmdə sultandır Muhəmməd
Bəyani elmi Qurandır Muhəmməd.

Risani həşri-nəşri ölən günündə
Şəfi cümlə xəlqə rəhmandır Muhəmməd.

Cahana mərifət ondan açıldı
Yəqin bil gövhəri candır Mühəmməd.

Sərasər yer-göyü gəzdi və gördü
Ki, ərşə fərşə seyrandır Muhəmməd.

«Nəsimi» daimə mədhi onu qıl,
Həmişə dini imandır Muhəmməd.

## *QƏZƏL*

Nuri-cəmali Mustafa, canə verər səadəti,
Batinə xoş cəla verər, zahirə həm səlaməti.

Möcüzə dini Əhmədi, kafirə yoxmu faidə
Gərdəni cahil əbədi, onnan edər şəqavəti.

Elm ilə çünki doğmadı, münkirə məzhəri Xuda
Teyyibü tahir olmadı, cəhlilədür təharəti

Əməyi kafiri əzəl, vechinə qılmadı sücud
Hüsnünə uymadı tamam, küfr ilədür dəlaləti.

Möcüzu aləm öldürər, səlli əla cəmalinə
Mənbəi nuri qul kəfa, xəlqə verər şəfaəti.

Məhsəvi elmi məllədən, bəlkə onun vücududur
Leysi kəmislədir onun möcüzünün fəsahəti.

Qibleyi ənbiya durur, quddəvi övliya dəxi,
Hər ki, eşitmədi sözü, nar ilədür fəlakəti.

Ey mələki zəmanə gəl dəftəri mən ərəf oxu
Rəhməti Mustafa bilən, kim bulasız şəfaəti.

Səcdeyi nuri Mustafa, çünki «Nəsimi» eylədi.
Ayəti əz cidov oxur, uştə edər tilavəti.

## *QƏZƏL*

Ya Rəsuli-fəxri-aləm, seyyidü-zati sifat!
Bəhri-zatın gövhərisən, həm sifatın eyni-zat.

Qüvvəti-zati-əzəl daim səninlə müstəqim,
Hikməti-darül-əbəd qaim səninlə mümkünat

Məzhəri-sirri-həqayiq mətləi-nuri-əzəl,
Məzhəri-kani-dəqaiq, mənbəi-hər möcüzat.

Əhmədü Mahmudu Qasim, şahü sultani-rəsul,
Küntə gənzin mədəni, həm kəşfi-həlli-müşkilat.

Vəsfini «vənnəcmü», «vəşşiəmsü» təbarək söylədi,
Şaninə «Tahavü», «Yasin» gəldi həqdən bəyyinat.

Surəti-ənvarinin hər zərrəsi şəmsü, qəmər,
Türreyi-ənbərfəşanın leylətül-qədrü bərat.

İzzü iqbalından ötrü oldu tərkibi-cahan,
Yerü-gök, insü məlaik, əsli fəri-kainat.

Gövhəri-dəryayi-eşqin qətrəsindəndir yəqin,
İsmü rəsmü fövqü təhtü dörd təbaye, şeş cəhat.

Ey müttəhər gəldigin dəm çün vücuda anadən,
Kafirin deyri yıxıldı titrədi latü, mənat

Elm ilə hilmü, həyavü, tövbəvü, zöhdü,vərə
Xəlqə fəzlindən irişdi rövzəvü həccü zəkat.

Hər ki, imanın yəqin etdi sana, ey pak din,
Layəzal oldu həmişə cavidan əndər həyat.

Mömini-sadiq, müvəhhid canfəşan oldu sana,
Gərçi müşrik şübhədən pak olmadı ol bisəbat.

Yaşəfiül-müznibin, rəhm et Nəsimiyə bu gün,
Hasilim iki cahanda sənsən, ey pakizə zat!

## *QƏSIDƏ*

Ey risalət çərxi üzrə mahi taban Mustafa,
Bu şəriət ərşi üzrə şahi sultan Mustafa.

Xələti lövlak geyibən tact nuridən yaranan
Qabi-qovseyn mənzili, mənşuri Quran Mustafa.

Çərx üzrə göylərin, seyrini çövlan edən
Həqq ilən həqqi görən, həqqə mehman Mustafa.

Dürrü dəryayi həqiqət, dürrü dərci nöh fələk
Rövzeyi-rizvani həmdəm, dəxi ürfan Mustafa.

Tutiyi şəkərristan, rəhməti fəzli ilah
Bülbülü gülzarı həqdən, həm çü ehsan Mustafa.

Tavusi baqi behişt, turacı meracı-səfa
Mürqi baqi övliya, xildi sübhan Mustafa.

Ənbiya və övliyaya sərvəri salar olan
Mominə iman olan, həm dini iman Mustafa.

Həqq təalanın həbibi, həm şəfiül münzibin
Həm dəxi xəlqi cahana, cani-canan Mustafa.

Cümlə başlar tacı, dillər zikri, canlar rəhməti
Həm könüllər fikri, zikri dildə asan Mustafa.

Bu qamü mücrimlərə, asilərə, acizlərə
Rəhməti rəhman olan, həm lütfi yəzdan Mustafa.

Yatmayıb, otrumayıb, həm qulluğunda ruzi-şəb
Ərimiyib, usanmayıb eşq ilə dövran Mustafa.

Lütfü ehsani pərəmlə qul qılan düşmənləri
Elmi, helmi xəlqi cudi mədən kan Mustafa.

Özünə yavər sananlara çox ilkilər edən
Düşmən ilən suzi tatlu nuru xəndan Mustafa.

Ata-ana tərk edib həqdən dilidən ümmətin
Ümmətin yolunda öz nəfsini qurban Mustafa.

Mustafa eşqi «Nəsimi»ni qılıbdır şöylə kim,
Həşr oluncan dü sərayə var Süleyman Mustafa.

## *QƏZƏL*

Üzündə nurun gördü əzəl gündən iləh,
Dedi ki, əşhədü ənla iləhə illəllah.

Ol kim sifət eyni, zatı bəlli eyni zat,
Dedi ki, əşhədü ənla Muhəmmədən rəsulullah.

Ya rəsuli – fəxri – aləm, seyyidi – zatü sifat!
Bəhri – zatın gövhərisən, həm sifatın eyni – zat!

Qüvvəti – zati – əzəl daim səninlə müstəqim,
Hikməti – darül – əbəd qaim səninlə mümkünat.

Məhzəri – sirri – həqayiq mətləi – nuri – əzəl,
Məhzəri – kani – dəqaiq, mənbəi – hər möcüzat.

Əhmədü Mahmudu Qasim, şahü sultani – rəsul,
Kuntə kənzin mədəni, həm kəşfi – həlli – müşkilat.

Vəsfini “Vənnəcmü” “Vəşşmsü” təbarək söylədi,
Şaninə “Tahavü” “Yasin” gəldi həqdən bəyyinat.

Surəti – ənvarinin hər zərrəsi şəmsü qəmər,
Türreyi – ənbər fəşanın leylətul – qədrü bərat.

Izzü – iqbalından ötrü oldu tərkibi – cahan,
Yerü gög, insü məlaik, əslü fəri – kainat.

Gövhəri – dəryayi – eşqin qətrəsindəndir yəqin,
Ismü rəsmü fövqü təhtü dörd təbaye, şeş cəhət.

Ey mütəhhər, gəldigin dəm çün vücudə anədən,
Kafirin deyri yıxıldı, titrədi latu – mənat.

Elm ilə helmü, həyavü, tövbəvü, zöhdü, vərə,
Xəlqə fəzlindən irişdi rövzəvü həccü zəkat.

Hər ki, imanın yəqin etdi sana, ey pak din,
Layəzal oldu həmişə cavidan əndər həyat.

Mömini – sadiq, müvəhhid canfəşan oldu sana,
Gərçi müşrik şübhədən pak olmadı ol bisəbat.

Yaşəfiul – muznibin, rəhm et, Nəsimiyə bu gün,
Hasilim iki cahanda sənsən, ey pakizə zat.

## *QƏZƏL*

Əya lətifi – zamanə, əya xülaseyi – zat!
Eşit bu pəndimi tut kim, bulasan anda nəcat.

Şəriət əmrini mürşid edən təriqətə gir,
Kim, ol təriqət ilə sən içəsən abi – həyat.

Həqiqət əhli olasan, görünə hər nə ki, var,
Dəmində mərifətindən buluna çox həsənat.

Bu gün duruş özüniçün, eyi əməl edə gör,
Yarınki mərəkələrdə behişt ola ərəsat.

Səni diri tutanı sən bilirsən əlbət əziz.
Ki, hər nəfəsdə bulasan eyicə qədrü bərat.

Bu gün bu dari – fəna bir nəfəsdürür, biliniz,
Bu bir nəfəsdə qılın səd həzar sovmü səlat.

Rəsuli – səyyidi – gövneynə mömin ayinədir,
Bu mömin ayinəsində göründü cümlə sifat.

Fəna məmat ilə nəfsin bu üçü bil gecədir,
Bəqa həyat ilə, gündüz, bu əql ilə mirat.

Bəqa elindən irişdin, fənadə elm oxudun,
Bu elm ilə özünü bildin ömrünə bərəkat.

Bu elmi oxuyuban bilmədinsə kənduzini,
Ilət şu dəftərini tez bazarda bir pula sat!

Həzər qıl, anla səni, sən özünü bilməkçin,
Saqın ki, cənnət üçün olmaya yerin dərakət.

Dilərmisən ki, yəqin əl verə təcəllilər,
Gözün ayırma üzündən, bu nəfsini oda at.

Qaçan ki, qətl edəsən, nəfsini oda atasan,
Irişə ayəti – ünzür, dönə həyatə məmat.

Dürüş bu mərifətin xirqəsinə cəm ola gör,
Dağılma dörd yana aşiq ki, qandasan heyhat?

Gətirdi zatını doğdu o yuca aləmdən,
Bəzəndi nuru – təcəlli, sürüldü çün zülmat.

Olur ki, təşnədilə sözlərimdən irdi həyat,
Bəriyyə içrə qalanlara mətə fis – sələvat.

Dilimdən irdi, qələmdən töküldü kağıza dürr,
Dirildi cümlə lətayif, cəvahir oldu səbat.

Bu mərifət, bu təriqət, həqiqət oldu tamam,
Şəriət əmri üçün ver Muhəmmədə sələvat.

Bu mərifət sözünün sirrini bəyan edəvüz,
Əya lətifi – zəmanə, əya xülaseyi – zat!

Bir qətrə bəhri – həqiqət sözünü dərc edəlim
Ki, bir təriqətə min dürlü göstərir hərəkat.

Bu gün Nəsimi sözünün həlavətinə irən,
Həzar səcdə qılır tuti birlə qəndü nəbat.

## S. Ə. ŞİRVANİ
## *QƏZƏL*

Ey gözün eyni – Xuda, "nuni – qələm" qaş sənə,
Verdi öz sürətini nəqşdə nəqqaş sənə.

Sənsən ol padşəhi – məsnədi – izzət kim, olub
Rüsüli – sabiqə yol açmağa fərraş sənə.

Səcdeyi – Adəmə zahirdə olundu təklif,
Endirib aləmi – batində mələk baş sənə.

Xilqəti – xüşkü tərə oldu vücudun bais,
Bəndə – fərmandı bu gün hər quru, hər yaş sənə.

Səngrizə dil açıb oldu güvahi – halın,
Nərm olunsa nə əcəb hər cigəri daş sənə.

Şəbi – meracdə getdin, sənama, bir yol kim,
Cəbrəil olmadı getməkliyə yoldaş sənə.

Ərzi – halımdı sənə suzi – dili – zarımdan
Gözlərimdən tökülüb qanlı axan yaş, sənə.

Seyyid ol gün ki, olub zairi – xaki – hərəmin
Canını bəzl qılaydı o gün, ey kaş, sənə.

## *QƏZƏL*

Ey tari – səri – zülfün “vəlleyli iza yəğşa”
Vəşşəms yüzün vəsfin zərratə qılıb inşa.

Ey mürşidi – nasuti, vey sayiri – lahuta!
Kim olmadı həmseyrin Cibril şəbi – əsri.

Gün olsa gecə olmaz, ey məh,nədir vəchi,
Yəldayi – səri – zülfün gün üzdə olub peyda.

Sən cövhər, ərəz, sən əsl, tüfeyl adəm,
Həm illəti – ğaisən, həm illətəsən məbda.

Hər illətə illətsən, sən baisi xilqətsən,
Sən eyni məşiyyətsən, sən aləməsən mövla.

Sən əvvəlü sən axir, sən zahirü sən batin,
Sən teyyibü sən tahir, sən surətu sən məna.

Ey çardə məsumun səyxeylü sərəfrazı,
Qurani – xudavəndə şahid bu sözə “Taha”

Xurşid cəmalindən bir zərrə əyan oldu,
Tur üzrə təcəlladən məbhut qala Musa.

Seyyid nəçidir etsin övsaf səni, ey məh,
Izhari – xülusiyyət eylər sənə ol şeyda.

## *QƏZƏL*

Kənari – ləli – ləbində siyah xali – Muhəmməd,
Kənari – çeşmeyi – zəmzəmdədir Bilali – Muhəmməd.

Çəkər bəyazinə mehri – munir mərdumi – çeşmim,
Kumeyl bəyaza çəkə surəti – misali – Muhəmməd.

Nəmeyli – baği – behişt eylərəm, nə huri, nə qılman,
Əgər müyəssər ola dövləti – visali – Muhəmməd.
Behişt vəsfini kim, bunca eyləyir bizə xaliq,
Müşəxxəs oldu ki, mənzurdur cəmali – Muhəmməd.

Haram edər bizə hicranı şürbi – badə ilə,
Olubdu qanımız aya nədən həlali – Muhəmməd.

Işimdi səcdə həmişə dü taqi – əbruyi – yarə,
Xəmidə qıldı qədim həsrəti – hilali – Muhəmməd.

Səfa isə qərəzin kəbeyi – visaldə, Seyyid,
Bəsindi eşqi – Muhəmmədlə mehri – ali – Muhəmməd.

## *QƏZƏL*

Istərəm bir gülü nə bağü nə bustan gülüdür,
Bülbüləm bir gülə kim, rövzeyi – rizvan gülüdür.

Eşqimi eyləmə nisbət özünə, ey bülbül,
O sənin istədiyin fəsli – gülüstan gülüdür.

Cümleyi – rövzeyi – rizvanda tapılmaz belə gül,
Gülü – xoşrayihədir, çünki bu qazyan gülüdür.

Bu gülü – xilqəti – xaliqdə lətafət çoxdur,
Sanma kim bu güli – xoşrayihə Səlyan gülüdür

Ey Xuda, kim çəkər axırda gülabın bu gülün,
Dərdi – sərdəfinə aləmdə bu, dərman gülüdür.

Ərəqi – ruyi – Muhəmməddən olub gül zahir,
Bu güli – tazə məgər ol şəhi – Mərdan gülüdür.

Ya Muhəmməd özüdür, gül ərəqi – paki onun;
Ruxi – həmrayi – dilarası bunun can gülüdür.

Səlavət eylə görüb surəti – pakın, Seyyid,
Ruxi - zibası bunun xaliqi – sübhan gülüdür.

## *QƏZƏL*

Ey dil açılıbdır gülü – rüxsari Muhəmməd,
Can oldu yenə bülbülü – gülzari Muhəmməd!

Bərqi gülə nisbət nə qılım ol ləbi – yarı,
Yox güldə ləbi ləli şəkərbari Muhəmməd!

Cənnətdə məgər kim açılıb sünbülü – sirab,
Düşmüş üzə ol, türreyi – tərrari Muhəmməd!

Ey kaş, olaydım qəddinə sayə o sərvərin,
Yəni ki, şəbim ruzi olan yari Muhəmməd!

Pünhan deyil əngüştü – Muhəmməd bölüb ayi,
Şəqqül – qəmərə kim olu inkari Muhəmməd!

Seyyid səlavət eylə görəndə məhi – ruyi,
Rövşən qılıb aləmləri ənvari Muhəmməd!

## *QƏZƏL*

Fəda bu asitanın xakinə can, ya Rəsulüllah!
Ki, əhli-dərdədir bu dərdə dərmam, ya Rəsulüllah!

Güruhi-ənbiyadır rizəxari-xani-ehsanın,
Qarında övliyadır cümlə dərban, ya Rasulüllah!

Səninlə yetdi, soltanım, qəbula tövbeyi-Adəm,
Səninlə oldu Nuha rəfi-tufan, ya Rəsulüllah!

Verən Davuda sənsən ahəni mum etməyə qüdrət,
Qapında murdən kəmdir Süleyman, ya Rəsulüllah!

Sən ol baği-kərəmsən ki, nəsimi hübbün etmişdir
Xalilə nari-Nəmrudu gülüstan, ya Rəsulüllah!

Əgər Zün-Nuna bətni-hutdə olmazdı ehsanın,
Olurdu həşrədək məhbusi ümman, ya Rəsulüllah!

Hənüz əngüşti-pakın həsrətindən rüzü şəb durmaz,
Dolanır dövri-xakə mahi-taban, ya Rəsulüllah!

Şəbi-Meracda yetdin maqimi-qürbi-Xəllaqə,
Sən etdin aləmi-lahutu cövlan, ya Rəsulüllah!

Uzaq oldun haçan Xəllaqdən kim, qürb ola hasil?
Varımdır bu süxəndə səhvü nisyan, ya Rəsulüllah!

Sənə hər bir nəfəs Merac idi, ey sahib-rifət,
Bu Mercın da var çox sirri-pünhan, ya Rəsulüllah...

Əliyyul-Mürtəzanı canişin etdin məqamında,
Varamdır güntəki bu əmrə bürhan, ya Rəsulüllah...

Şəbi-tərikdir aləm, tutubdur zülmət afaqı,
Qalıb əbri-xəfadə mehri-rəxşan, ya Rəsulüllah!

Zühuri-həqqə yeksər müntəzirdir dideyi-aləm,
Cəmali-həqqi qıl dəhrə nümayan, ya Rəsulüllah!

Kərəm qıl, Seyyidi qurtar bəlayi-nəfsi-şumundan,
Dəxilindir bu gün Həssani-Şirvan, ya Rəsulüllah!

## KƏRƏM KÜRQIRAXLI
### *PEYĞƏMBƏRİM*

Allah istəyindən yaratmış səni,
Çox yaxşı bilirsən bil, Peyğəmbərim.
Əhli – beytin üçün yarandı dünya,
Sevin Peyğəmbrim, gül Peyğəmbərim.

Qəlbində ömürlük gəzdirdin məlal,
Fənadan ummadın heç cahi – cəlal.
Allahdan vəhy gəldi istədiyin al,
"Məlik" yox, götürdün "Qul", Peyğəmbərim.

Məkkədə nə qədər qəmlərə batdın,
Əli qılınc aldı, murada çatdın.
Quruca həsirin üstündə yatdın,
Salmadın altına tül, Peyğəmbərim.

Eşqinlə haqq nurun islama yaydı,
Həzrətim dövrəndə ulduzdu, aydı.
Səninlə özünü arxalı saydı,
Nəki məzlum, yetim, dul, Peyğəmbərim.

Sən verdin bəşərə ali ədəblər,
Cəmdi sinən üstündə ilhamlar, təblər.
Bütün Əbu Süfyan, Əbu Ləhəblər,
Oldu ayağında kül, Peyğəmbərim.

Səbrinlə düşmənin bağrını oydun,
Cəmi pislikləri yaxşılıq duydun.
Bəşərə nə böyük xəzinə qoydun,
Yatır hər kəlmədə ləl, Peyğəmbərim.

Xəzana dönübdür gülşənim, bağım,
Sinələr üstündə çarpazdır dağım.
On ildir işğalda qalıb torpağım,
Gəl yetir bizlərə əl, Peyğəmbərim.

Kərəm, onsuz işlər düzələr çətin,
Şəfası bil odur son axirətin.
Cəhənnəm oduna yanar ümmətin,
Amandır köməyə gəl, Peyğəmbərim.

### *YA RƏSUL!*

Sənin xatirinə xəlq oldu dünya,
Kainat borcludur sənə, ya Rəsul!
Dörd əhli – beytinlə sən olmasydın,
Dünya bürünərdi çənə, ya Rəsul!

Bilsəydim bir ömrü itirməzdim mən,
Yalanı dilimə gətirməzdim mən.
Səni axtarardım götürməzdim mən,
Versələr dünyanı mənə, ya Rəsul!

Şükür ümmətinik sən Peyğəmbərin,
Səntək xəzinənin, gövhərin, zərin.
Haqdan olmasaydı möcüzələrin,
Ümmətin gəlməzdi dinə, ya Rəsul!

Neyləyər müşküldə zəlil bir bəndə,
Təntiyər yol azan dumanda, çəndə.
Axirət günündə tir – tir əsəndə,
Sənə sığınarıq yenə, ya Rəsul!

Çox sevdin Zəhra tək qönçə gülünü,
Həm Həsən, Hüseyni, həm də Əlini.
Kərəm ətəyindən üzməz Əlini.
Xızırın atına minə, ya Rəsul!

### *YA MUHƏMMƏD(S)*

Haqdan sonra ümmətin əzabın çox çəkmisən,
Sən özün öz canına cəfasan, ya Muhəmməd!

Xudam sənə elə bir təbiət bəxş eyləyib,
Niskin olan bəndənə nəvasan, ya Muhəmməd!

Min bir ali məktəbdən üstün oldu ədəbin,
Yetimə, lüt üryana əbasan, ya Muhəmməd!

Dini – islam yolunda qurban getdi əyalın,
On dörd məsüməyə sən əzasan, ya Muhəmməd!

Nəfəsində Allahın möcüzəsi var idi,
Kulli bimar olana dəvasan, ya Muhəmməd!

Kərəməm, axirətdə ümidimiz sənədir,
Əhli – beytinlə bizə şəfasan, ya Muhəmməd!

## *MUHƏMMƏD YA MUHƏMMƏD*

Kainatın sərvəri hörmət qoydu adına,
Bir and darda qalanda tez yetişdi dadına.
Ümmətlərin yanmamış cəhənnəmin oduna,
Yetiş imdadımıza Muhəmməd, ya Muhəmməd!

Bir – birinə ümmətin kim deyir qəs eyləmir,
Arxalılar zülm edir, arxasız səs eyləmir.
Milyonların qazancı birinə bəs eyləmir,
Yetiş imdadımıza Muhəmməd, ya Muhəmməd!

Zülüm ərşə dirənib sızıldayır asiman,
Hər tərəfdə vurhavur, hər tərəfdə nahaq qan.
Əl qaldır Yaradana zühur etsin Əz – zaman,
Yetiş imdadımıza Muhəmməd, ya Muhəmməd!

Üz astara çevrilib, astarsa üzdən baha,
Gözdən düşüb etibar, itibdi qeyrət səxa.
Ata ölür, yasına övladı gəlmir daha,
Yetiş imdadımıza Muhəmməd, ya Muhəmməd!

Bizlərə dərs olmadı sənin əqlin, kamalın,
Sulardan saf vücudun, günəşdən pak camalın,
Çoxu kəbinsiz qoyur övladının təməlin,
Yetiş imdadımıza Muhəmməd, ya Muhəmməd!

Məscidlər boş qalıbdır ibadətə gələn yox,
Imama ağlayanın kədərini bölən yox.
Sızlayan yetimlərin göz yaşını silən yox,
Yetiş imdadımıza Muhəmməd, ya Muhəmməd!

Süfrə üstə şərabsız çörək qoyulmur, əfsus,
Hikmətli kəlamların indi duyulmur, əfsus.
Günah bizi bürüyüb daha yuyulmur, əfsus.
Yetiş imdadımıza Muhəmməd, ya Muhəmməd!

Məni aləm tanıyır evimdə keçmir sözüm,
Adın haqqı özümə nifrət edirəm özüm.
Qalmayıb ürəyimdə nə taqət, nə də ki, dözüm,
Yetiş imdadımıza Muhəmməd, ya Muhəmməd!

Haqdan sonra dünyanın bil ki, pənahı sənsən,
Bu zülmət gecələrin nurlu sabahı sənsən.
On dörd məsum kimsənin başının tacı sənsən.
Yetiş imdadımıza Muhəmməd, ya Muhəmməd!

Sizi hər kim sevirsə bil bəxtəvər o kəsdir,
Fani dünya hamıya axırda dar qəfəsdir.
Beş əhli – beyt yolunda Kərəm təngi nəfəsdir,
Yetiş imdadımıza Muhəmməd, ya Muhəmməd!

## *MUHƏMMƏD (S)*

Quran ayələrin Allah göndərdi,
Bu yolda qeyrətlə durdu Məhəmməd.
Diliylə söylədi incilər, dürlər,
Əliylə min naxış vurdu Məhəmməd.

O, dağlar başında ləkəsiz qardı,
Abırdır, həyadı, ismətdi, ardı.
Görən bu dünyanın işi nolardı,
Deyirəm nə yaxşı vardı Məhəmməd.

Qatdı qanımıza qeyrət – arını,
Başına tac bildi düz ilqarını.
Səmada Allahın qurduqlarını
Torpaqda təzədən qurdu Məhəmməd.

Duydu yaşamağın mənasın dərin,
Binasın o qoydu xeyirnən şərin.
Allaha, İmama şəkk edənlərin
Ümidin bir yolluq qırdı Məhəmməd.

Ömründə bir kəsi qoymadı zarı,
Səvaxəti oldu ömürdən varı.
Neçə zülmətləri, qaranlıqları
Üzünün nuruyla yardı Məhəmməd.

Ay Kərəm,o haqqın düşdü izinə,
Əyri gedənləri çəkdi düzünə.
Vallah insan deyil, bu yer üzünə
Tanrının saldığı nurdu Məhəmməd.

**ZƏKİ İSLAM**
***MƏHƏMMƏD(S)***

Doqquz qat göylərdə haqq məleykələr
Heyran qaldı kamalına, Məhəmməd!
Ay xəcalət çəkdi, günəş baş əydi,
Bərəkallah camalına, Məhəmməd!

Sən nurdan yarandın, dünya gərdişi,
Düz verib qiymətin yaradan kişi,
Adəmin günahı, Nuhun səhv işi,
Bağışlandı hər halına, Məhəmməd!

Nəbilər nəbisi, Adəmin sirri,
Günü günortadan qaytardın geri,
Allahın sağ əli, meracın şiri
Cavab verdi sualına, Məhəmməd!

Özün yoxsan, sayılırsan müqəddəs,
Qurban üçün mən hazıram, apar kəs,
Can şirindi, eyləmərəm bircə səs,
Qəbul olsa amalına, Məhəmməd!

Qüdrətindən qüdrətinə yarandım,
Allahu Məhəmməd, Əlini andım,
Bəxtim dedi:-“Zəki İslam”, oyandım,
Şükür olsun cəlalına, Məhəmməd!

## HƏBİBİ

Ol mübarək zatına işim sənadır, ya Nəbi,
Asilik bimarına adın şəfadır, ya Nəbi.

Ayağın torpağının qədrin nə bilsin hər kişi,
Kun fəkan ol torpağa kəmtər vəfadır, ya Nəbi.

Ey günəş üzlü Səni, hər kimsəni həqq bilmədi,
Ruzi – məhşərdə onun üzü qəradır, ya Nəbi.

Çün sənin xoşluğuna yaratdı sane aləmi,
Ayağın torpağına aləm fədadır, ya Nəbi.

Bu “Həbibi ”xəstəyə qılgil şəfaət ruzi – həşr,
Çün ki, əslində səninlə aşinadır, ya Nəbi.

## AXUND HACI SOLTAN HÜSEYİNQULU OĞLU *HƏBİBULLAH (S)*

Səni təhqir edən kəs əqldən kəmdir, Həbibullah,
Səni həq bilməyənlər bəs nə adəmdir, Həbibullah.

Rəsuli Əkrəm adlandın ənisin aləmin rəbbi,
Sifatullahul əhsən xülqünə cəmdir, Həbibullah!

Nə bilsin cahilü nadan Mühəmməd Mustəfanı çün,
O kəslər cəhlü nadanlqla xürrəmdir, Həbibullah.

Ədalət yox, səxavət yox, sədaqət yoxdu bir zərrə,
Yəzid ilə bu qövmi – fitnə bahəmdir, Həbibullah.

Əliyyəl Mürtəza meydanıdır bu Zülfüqar istər,
Əli əhli – həqiqətçün yanan şəmdir, Həbibullah.

Sənə tohin edən kəs rast olar tiği – Yədullahə,
Nə yarə olsa İslamun o məlhəmdir, Həbibullah.

Səmayə əllərin qaldır qiyam etsin İmam Mehdi,
Bizi məzlum görüncə çəkdiyi qəmdir, Həbibullah.

Əzadarı – Hüseynik biz rəhi – Kərbübəla bağlı,
Məzarın öpmədən matəm nə matəmdir, Həbibullah.

Edibdir erməni nakəs Qarabağ torpağın işğal,
Bizə sərkərdəvü rəhbər Qəşəmşəmdir, Həbibullah.

Əsir olmuş Vətən torpağını bir eyləyək busə,
Verək canı əqidə bizdə möhkəmdir, Həbibullah.

Hacı Soltan sənə düşmüş dəxil sidqü vəfa ilə,
Vüsalın yağmurundan gözləri nəmdir, Həbibullah.

### *YA RƏSULALLAH (S)*

Səni verdi cəhanə həq əmanət, ya Rəsulallah,
Sənin nurunla aldıq biz şərafət, ya Rəsulallah.

Məkani – eyşidi dünya vəfadan bir əsər yoxdu,
Sözün öyrətdi dünyayə sədaqət, ya Rəsulallah.

Nişan verdi səni Quranda Xaliq bizlərə taki,
Xuda hökmüylə tapsın xəlq hidayət, ya Rəsulallah.

Sənin vəsfindi “Taha”da, sənin vəsfindi “Yasin”də,
Adınla eynidi çünki ədalət, ya Rəsulallah.

Peyəmbər olmağın bəsdir Qiyami eşq üçün dəhrə,
Hələ sənsən şəhən şahi – Qiyamət, ya Rəsulallah.

Səni hər kim  dana ya söyləyə haqqında bir hərzə,
Həşri də əffinə olmaz zəmanət, ya Rəsulallah.

Fəna əllərdə dərd çəkdi xətər gördü cəfalərdən,
Əliyyə verdiyin kamil vilayət, ya Rəsulallah.

Qızın qətl oldu namərdlər əlində zülmü cövr ilə,
Sənə səndən sora oldu xəyanət, ya Rəsulallah.

Hacı Soltan sənə bir aşiqi – şeydadır əfv eylə,
Əgər vəsfində vardırsa qəbahət, ya Rəsulallah.

## *SULTANDI MÜHƏMMƏD(S)*

Çox dərdə dəva ümmətə loğmandı Mühəmməd,
Biçarələrin dərdinə dərmandı Mühəmməd.

Allah onu təyin elədi bizlərə rəhbər,
Ol gündən adı dillərə dastandı Mühəmməd.

Aləmlərə rəhmət yaranıb çünki əzəldən,
Əxlaqə nümunə gözəl insandı Mühəmməd.

Quran ilə dəvət elədi düz yola xalqı,
Düz yolda olan kəslərə ünvandı Mühəmməd.

Yerdən göyə merac edib Allaha yetişdi,
İslama şərəf – şöhrət ilə şandı Mühəmməd.

Övladları can verdi onun qoyduğu yolda,
İnsanlığı dərk etməyə imkandı Mühəmməd.

Soltan, o ada bağla ümid eylə duanı,
Hər harda bəşər var ona Sultandı Mühəmməd.

### *QƏZƏL*

“Taha”də əyan, sahibi – hikmətdi Muhəmməd,
Eynilə Əlif Lamu Mimə xətdi Muhəmməd.

Dünyanı münəvvər elədi nuri – kəmali,
Qanuni nizam həqqü ədalətdi Muhəmməd.

Şamil elədi bəndələrə lütfünü Xaliq,
Ol Heydəri – Kərrarə əmanətdi Muhəmməd.

Ac qaldı, susuz qaldı, nələr çəkmədi, heyhat,
Biçarəvü bizarə şəfaətdi Muhəmməd.

Səlmanu Əbazər onun eşqində fədakar,
Xoş səsli Bilal sovtinə ziynətdi Muhəmməd.

Qoydu qədəmin çünki Əli duşi – Nəbiyyə,
Həq gəldi, əyan oldu həqiqətdi Muhəmməd.

Quranı onun daimi bir möcüzədir həm,
Həm elmi ilə xəlqə fəzilətdi Muhəmməd.

Bir şer ona ithaf eləyib sidq ilə Soltan,
Çün qəlbdə ən odlu məhəbbətdi Muhəmməd

## ELNARƏ BUZOVNALI
### *QƏZƏL*

Olubsan rahı – həqqə ənvərəfşan, ya Rəsuləllah,
Sənə layiq görülmüşdürsə Quran, ya Rəsuləllah!

Dedim kim "əşədü ən la ilahə" yekdi Allahim,
Olubsan sən ona bir bəndə fərman, ya Rəsuləllah!

Sənə xidmətdə durmuşdur Əliyyibni Əbutalib,
Sənə təatdədir əhli – müsəlman, ya Rəsuləllah!

Cahanın küfrünü səbr ilə sildin sən həqiqətdir,
Bütün insanlara bəxş etdin iman, ya Rəsuləllah!

Bütün İsavü Musa möcüzindən alisin seçdin,
Sənə Əyyub səbri verdi sübhan, ya Rəsuləllah!

Cahana göz açandan qəlb evin hər nurinə məftun,
O Rəhmandan olunmuşdur bu şayan, ya Rəsuləllah!

Əsan ilə dağıtdın bütləri Beytülhəram içrə,
Başın üstündədir xaliqi – dövran, ya Rəsuləllah!

Məqamın rövzeyi – rizvan, dilində Allahın adı,
Onun dərgahıdır təkcə şəbistan, ya Rəsuləllah!

Adın dillərdə əzbərdir, sən ey yol göstərən dahi,
Sənin simandır yalnız durəfşan, ya Rəsuləllah!

Yazir Elnarə kim, nəslindənəm eşqim həqiqətdir,
Sənə qurban ola cismimdəki can ya, Rəsuləllah!

## SOFU BILAL
## *PEYĞƏMBƏR*

Ya xaliqim, ya Allah!
La ilahə illəllah!
Mühəmməd Rəsul Allah.
Nəbilərin mürsəli,
Ona köməkdir Əli!

O, Rəsuli – Əkrəmdir,
Allahına mərhəmdir.
Allah: “Dostumdur!” – dedi.
Ona buyurdu: - Vəli!
Ona vəlidir Əli.

O, bu yolda qaldı ac,
Əyni köhnə, yalavac.
Ona məxsusdu merac.
Ələmdarı qüvvəli,
Ələmdarıydı Əli!

Nəbilik verilibdir,
Allaha əyilibdir.
“Quran” ona gəlibdir
Oxurdu təntənəli –
Əzbər bilirdi Əli!

## MƏMMƏD ASLAN
## *ALLAHIN RƏSULU*

Bu kirlənmiş dodaqlara səni öymək nə günah!
O dil – dodaq öysün səni – virdi Quran, Bismillah!
Nida gəlir göylərdən: La ilahə illəllah!
Ey kəlami Kəlamullah! Müşk qoxuyan vücudu!
Sən öyrətdin ümmətinə haqq önündə sücudi.

Çəmən – çiçək pıçıldasın o mübarək ismini!
Bağ – bağçada qızıl güllər xətm eləyib rəsmini.
Həsrətindən coşan sular dil – dil ötür vəsfini.
Ilahidən sevilən sən, öyülən sən, ancaq sən!
Amalına, kamalına, camalına min əhsən!

Sübhə işıq, gözə nursan! Işıq ölməz, nur ölməz!
Təcəllinlə ölməyənlər qiyamətdə dirilməz!
Şəfqətinlə hörülməyən sınıq könül hörülməz!
Sən könüllər memarısan: şəfa səndə, ruh səndə!
Ömrümüzə bahar əsər: sən qəlblərə əsəndə!

Dəva səndən, şəfa səndən, kani – irfan, ya Rəsul!
Sübhi – məsa, nuri – əhəd, mülkə sultan, ya Rəsul!
Övliyalar mürşidisən, fəxri – cahan, ya Rəsul!
Gözəlliyin səbəbkarı göydə Allah, yerdə sən!
Sən baqisən, sən dirisən, bir ilahi sirdəsən!

Sevildikcə çevrə – çevrə yaxınlaşan üfüqsən!
Bizə bizdən daha yaxın, könlümüzə rəfiqsən!
Pənahsızlar pənahısan, imdadsıza tövfiqsən!
Aç qolunu, bas bağrına nə qədr ki, miskin var!
Əlacsız var, nəsibsəz var, taleyindən küskün var!

Sıyrıl mahi – taban kimi bu zülmətin içindən!
Xilas elə hümmətini müsibətin içindən!
Qurtar bəşər övladını kəsafətin içindən!
Nizam səndə, düzən səndə: sən dirilik qaynağı!
Başımızın tacı olsun ayağının torpağı!

Möcüzətək endirildi Quran sənin adına!
Könül istər fəda olsun hər an sənin adına!
Ismi gözəl, cismi gözəl! Qurban sənin adına!
Əllərinin təravəti hopub gülə, gülzara!
Qiyas edib vəsf etməyə ətrin hara, söz hara?!

Hər buyruğun – din çırağı, hər kəlamın – vəcizə!
Qədr – qiymət ayarında hər vəcizən – möcüzə!
Bir ilahi nur çilənib hər nəfəsə, hər cüzə!
Həyatın başdan – başa sirrullahdır, ya Rəsul!
Gələn sənsən! Qalan sənsən! Qeyri lafdır, ya Rəsul!

Elə böyük Sultansan ki, düşmənin var hələ də.
Xof etməzsən – sənə qarşı min – min yağı gələdə!
Igid başı qovğadadır, iman əhli bəlada,
Şərlə xeyir əlbəyaxa: gecə – gündüz didişər,
Nə dünyamız bir usandı bu qovğadan, nə bəşər...

Ya Peyğəmbər! Bizi səndən qoparmağa qalxdılar.
Sənin uca bayrağını yandırdılar, yaxdılar.
Haqqın ulu kitabını süngülərə taxdılar.
O dəhşət də, o vəhşət də, dizə çıxan o qan da
Bacarmadı unutdursun səni bir can cahanda.

Dağıdıldı Allah evi xaçlıların xaçıyla,
Qucaqladıq Quranın udduğumuz acıyla.
Dağlar boyda müsibətlə, vulkan qədər sancıyla...
Yenə sənə arxalandıq, kəráminə sığındıq,
Işığınla, ümidinlə, təsəllinlə ovunduq.

Duzax üstdən duzax gəldi, sovuşduqca duzaxdan.
Qadağalar sərtləşdikcə sevgi doğdu yasaqdan!
Yapışaraq ətəyindən, əl üzmədik biz haqdan!
Nə dərinmiş mehrin sənin, ya Peyğəmbər, nə dərin!
Səni tutduq, səni andıq caynağında kədərin.

Sənə olan sevgimizdən əzab çəkdik bir belə!
Qarşımızda min – min “yezid”, hər yan dəhşəti Kərbala.
Bəla ki, var:udmaq olar, bəla olsa bir bəla;
Salxım – salxım müsibətə bizi düçar etdilər,
Harda iman gördülərsə, çeynədilər, diddilər...

Göyərməyə suya həsrət, Günə həsrət bir dəndik,
Ya Peyğəmbər, açılmağa sənə möhtac mədəndik.
Bilirik ki: hansı dindən, hansı ruhdan, nədəndik:
Yetmiş ildə o səbəbdən qurmadıq, doğrusu,
Uca ruhum bəxş elədi bizə həyat, bizə su!

Sənə sevgi izharıdır verdiyimiz şəhidlər!
Bayrağını uca tutdu alp - ərənlər, igidlər!
Şəhid qanı – könüllərdə möhürlənmiş tövhidlər!
Hümmətinə örnək olsun şəhid qanım, ya Rəsul!
Haqqa elçim haqq divanım, haqq Sultanım, ya Rəsul!

Arsız dünya düzən tapar: əxlaqından barınsa!
Sərçeşmələr bərraq olar – nəfəsinlə arınsa!
Nəsihətin gözlənilsə, yol - ərkanın qorunsa,
Sənin Quran əxlaqınla, ya Həzrəti – Məhəmməd,
Qalib gələr ağıl zəka, qalib gələr həqiqət!

Bu cəhanda tapdığımız xeyir səndən, şər bizdən.
Təmizlərsən buludları kirləndikcə hər bizdən!
Bir dünya nur göndərirsən – çəkildikcə nur bizdən!
Sənin üzün hörmətinə o Günəş ki, göydə var!
Avazının timsalıdır o nəva ki, neydər var!

Sən ki, səndən əzəl vardın, yenə varsan, ya Rəsul!
Qurtar üzün hörmətinə, bizə yarsan, ya Rəsul!
Biz günahkar fanilərə havadarsan,ya Rəsul!
Sən əbədi köməkdarsan!Həqiqət bu söz budur!
Kərəm eylə, bu təklənmiş hümmətinə arxa dur!

Bu kainat kitabın da bir ayəti – kübra sən!
Tələtümkən sığınmısan təhəmmülə, səbrəsən!
Ölümünlə şərəf verdin ölümə sən, qəbrə sən!
Ölmək sənə qovuşmaqdır;bu vüslətdə müjdə var!
Bu vəhdətdə şükran borcu milyon – milyon səcdə var!

Ta həşrəcən sürüb gedər, sənin dinin zirvədə!
Möminlərin ürəyində saf duyğusan hər vədə!
Biz səninlə üz tutarıq barışa da, hərbə də!
Nə qədər ki, kainat var gülzarına yox zaval!
Ya Məhəmməd! Şəmsül – Xuda!ya Həbibi – Zülcəlal!

**İSMAYIL ZƏNGİLANLI**
***ALLAHIN ELÇİSİ OLAN MƏHƏMMƏD (S)***

Mənim peyğəmbərim olan Məhəmməd.
Qarşında mübarək Quran dayandı,
Bəşər cana gəldi Sizə inandı,
Xar olub kafərlər qəmə boyandı,
Allahın elçisi olan Məhəmməd.
Mənim peyğəmbərim olan Məhəmməd.

Göstərdin möcüzə aciz qaldılar,
Buludlar üstünə gölgə saldılar,
Düşmən köks  ötürüb məyus oldular,
Allahın elçisi olan Məhəmməd.
Mənim peyğəmbərim olan Məhəmməd.

Müqəddəs sənaya Siz ucaldınız,
Haqqın dərgahında Siz ad aldınız,
Məhəmmədli Mustafayı oldunuz,
Allahın elçisi olan Məhəmməd.
Mənim peyğəmbərim olan Məhəmməd.

Islama həm mayaq, həm dayaq oldun,
Dönmədin bu yoldan mübariz oldun,
Gözəl əməlinlə çox parlaq oldun,

Allahın elçisi olan Məhəmməd.
Mənim peyğəmbərim olan Məhəmməd.

Allahın nəzəri üstündə oldu,
Əli vuran qolun qılıncın oldu,
Beş sözün islama əmanət oldu,
Allahın elçisi olan Məhəmməd.
Mənim peyğəmbərim olan Məhəmməd.

Danışdın Allahla Hərra dağında,
Çox idi hörmətin Allah yanında,
Allah məhəbbət vardı qanında,
Allahın elçisi olan Məhəmməd.
Mənim peyğəmbərim olan Məhəmməd.

Kərbəla torpağın məskənən seçdiniz,
Dəvən yatan yeri niyyət etdiniz,
Haqqın dərgahında nura döndünüz,
Allahın elçisi olan Məhəmməd.
Mənim peyğəmbərim olan Məhəmməd.

## MİRBƏDƏL SADİQ
### *QƏZƏL*

Az da olsa kimdəki vardır vəfa, ya Mustafa!
Eyləyər uğrunda öz canın fəda, ya Mustafa!

Olmasaydın indi nə dünya var idi, nə bəşər,
Səndən ötrü dəhri xəlq etmiş Xuda, ya Mustafa!

Xətmi – peyğəmbər seçib Xaliq səni, bu rütbəyə
Hiç kim layiq deyil səndən səva, ya Mustafa!

Ruzi məhşər sən himayət eyləyərsən bizləri,
Dərdə düşmüşlər dilər səndən şəfa, ya Mustafa!

Şübhəsiz ki, Xaliqi – yektaya olmaz aşina
Olmasa kim ki, səninlə aşina, ya Mustafa!

Hüsnünü seyr eyləməkdən heyf məhrum olmuşam,
Ol səbəbdən eylərəm ahu nəva, ya Mustafa!

Sadiqin könlü dilə gəlmiş düşəndən eşqinə,
Söyləyir biixtiyar ya Mustafa, ya Mustafa!

## KƏRBƏLAYİ TACƏDDİN GÜNƏŞ
### *PEYĞƏMBƏRİN(S)-MƏDHİ*

Hər səhər cilvə saçıb qırmızı xələtdə Günəş
Zənn edər yoxdu onun tək daha xilqətdə Günəş.
Bu səbəbdən öyünər hüsnü vəcahətdə Günəş
Bir qürur ilə yanar atəşi – qəflətdə Günəş
Keçirər ömrünü heyhat bu halətdə Günəş

Sübhdən şamə kimi nur saçar dünyaya
Gecədən sübhə kimi növbəti vermiş ayə
Leyk yox qüdrəti vaqif ola bu mənaya,
Ki, işıq saçmağı mümkün olamaz əlayə,
Bağlanıb çünki bu dünya ilə fitrətdə Günəş.

Bir Günəş var dəxi, insandı əgər surətdə
Min Günəş yetməz ona nuru ilə tələtdə
Əzəl hökmüylə misilsiz doğülüb fitrətdə
Onun eşqiylə yaranmış nə ki var xilqətdə
Hər iki aləm üçün xeyirdə, rəhmətdə Günəş.

Onun eşqiylə gəlib ərsəyə lövh ilə qələm,
Ki, yaza xilqətin əmrin, ola icad aləm,
Nurunun zərrəsinə oldu müşərrəf Adəm,

Qoya ta sidqi ilə meydani – bəşarətdə qədəm,
Saça öz nurunu hər ləhzə hidayətdə Günəş.

Ərşə tac oldu Onun məqdəminin torpağı,
Saçdı əflakə ətir gül üzünün yarpağı,
Qəməri şəqqələdi yerdən onun barmağı,
Qurdu əzm ilə bəşərçün yeni bir növrağı,
Bir nicat eşqi ilə doğdu nübuvvətdə Günəş.

Varmı bir kəs ki, yetə mislinə ol insanın,
Hanı bir əqli ki, elmin bilə ol loğmanın,
Nə qələmdir ki, çəkə rəsmini ol cananın,
Hansı təbdir ki, edə vəsfini ol sultanın,
Vəsf edibdirsə özü həqqi həqiqətdə Günəş.

Demə Tacəddinə dünyada cəfa görmüşdür,
Uyub öz nəfsinə dəhr içrə səfa görmüşdür.
Gər xəta etməyi hərdən ki, rəva görmüşdür,
O Günəşlər Günəşin əhdə vəfa görmüşdür.
Arxayındır yetəcək dadə şəfaətdə Günəş.

## ŞƏLALƏ ANA
## *UCA PEYĞƏMBƏRMİZƏ NƏT*

Ey ulu Məhəmməd! – Adı mübarək!
Səni salamlayır sinəmdə ürək!
Səni salamlayır əlimdə qələm –
Səndən yazan qələm bilməz dərd, ələm.
Fəqət söz varmı ki, hüsnünə çatsın?
Könlümdən ruhuna körpü yaratsın?!
Ey uca Tanrımın gözəl elçisi!
Yox sənə sevgimin həddi, ölçüsü...
Elə bir zamanda gəldin cahana,
Cahan boyanmışdı çox nahaq qana...
Sanki insanlığın gözü tutulmuş,
Bütü Allah sanıb səcdəyə durmuş...
Taxtadan, palçıqdan olarmı tanrı?
Heç günəş palçığa dolarmı, Tanrım?!
Şeytan azdırmışdı bəndəni haqqdan.
Bəndə də uymuşdu ona nahaqdan...
Cəhənnəm yolçusu olmuşdu bəşər,
Tanrım acıyırdı, sevinirdi Şər...
Nəhayət rəhm etdi böyük Yaradan –
Göndərdi elçisin, əlində "Quran"!
Sən oldun Tanrıya elçi, Məhəmməd!
Sən bizə peyğəmbər, biz sənə ümmət!

Tanrım kamanınıdan atdı ilk oxu –
Verdi ilk əmrini, söylədi: - “Oxu!”
Hər ayə – bir inci, sən – inci düzən –
Beləcə yarandı “Quran” möcüzən!
“Zaval yox elçiyə!” – bunu bilirsən –
Döydün könüllərin qapısını sən.
Ən paslı qıfıla açardı “Quran”,
Ərp bağlı könülü açardı “Quran”!
Açdın gözümüzü – bizə göz oldun,
Sönmüş ocaq idik – yanar köz oldun.
Bir olan Allaha gətirib iman,
Tapındıq İslama, olduq müsəlman!
Cənnətin yolunu tanıtdın bizə,
Yüz sual önündə verdin bir cəvab:
Cənnət qapısına açardı savab!
Savabdan yük tutsa ömür karvanı,
Bildik, cənnət olar axır ünvanı!
Cənnət – anaların ayağı altda,
Cənnət – peyğəmbərin bayrağı altda
Zəfər çalanların ölkəsindədir!
Söylədin: “Beşikdən qəbrəcən oxu!”
Hikmət libasını bilikdən toxu!..
Elmlə yüksəlir Adəm övladı.
Hamıdan ucadır alimin adı!
Düşsən də həyatda çox bərkə - boşa,

Söylədin: Möminsən, ümüdlə yaşa!
Ümidlə səhrada gülüstan bitir,
O, haqqın bəndəyə mərhəmətidir!
Ümid olmasaydı ürəkdə əgər,
Nə bir kəs torpağa bir ağac əkər,
Nə də ki, bir ana öz körpəsinə
Süd verib gərərdi hər dərdə sinə...
Hədisi – şərifin, Əhmədi – Mürsəl,
Gəzir ağız – ağız, dolaşır əl - əl...
Başında,İslamın o parlaq tacı,
Bir gün də göylərə etdin meracı!
Sonrasa yenidən qayıdıb geri,
Ayələr gətirdin, dürdü hər biri!
Sən zülmət gecədə doğan Ay kimi,
Söylə, tutmaq olar sənə tay, kimi?!
Sənə də şükr olsun, ey uca Xaliq!
Peyğəmbər göndərdin adına layiq!
Oldun ən vəfalı könül sirdaşım,
Tək sənin vəsfin sözümdə qüdrət...
Mən sənin elçin söyləyirən nət.
Ey uca Məhəmməd, ey sən peyğəmbər!
Sözü gül qoxuyan, hədisi ənbər!
Könlümdən sözləri çiçək tək dərdim,
Mövlud günün üçün sənə göndərdim.
Qalıb atalardan bir məsəl miras;

Deyərlər: - "Varını verən utanmaz!"
Adım Şəlalədir, özüm su tək saf,
Tanrım rəhmlidir, sən də et insaf...
Bəlkə də solğundur sözümün rəngi,
Lütf eylə, qəbul et, sən bu çələngi.[1]

[1] "Şəhriyar" qəzeti

## HÜSEYİN KÜRDOĞLU
## *MƏHƏMMƏDƏ SƏS VERİR*

Allahu əkbər deyir şərq ilə qərb arası,
Gör neçə milyon insan Məhəmmədə səs verir.
Günəş ondan qığılcım, torpaq da bir zərrədir,
Əsən yel, coşan ümman Məhəmmədə səs verir.

Çıxmaz Tanrı yolundan imanlılar, əsillər,
Çıxsa da qənşərinə bəd zamanlar, nəhs illər.
Zamanın məcrasında gəlib – gedir nəsillər,
Köksündə şanlı Quran, Məhəmmədə səs verir.

Müsəlman oğlu deyil döyüşdə qorxub əsən,
Şahimərdanımıztək çarpışana min əhsən!
Öz ana torpağından kafir ayağı kəsən,
Şəhid olan qəhrəman Məhəmmədə səs verir.

Onun əliylə yandı ədalətin çırağı,
Fəzilətin çırağı, ülviyyətin çırağı.
Şöləlлəndi şövq ilə məhəbbətin çırağı,
Hər könüldə bir cahan Məhəmmədə səs verir.

Doqquz fələyin səsi – la ilahə illəllah,
Doqquz taxtın üstündə Məhəmməddir şahənşah.

Açılar işığıyla bizə də bir xoş sabah,
Zaman, məkan, asiman Məhəmmədə səs verir.

Nə qədər ki, sinəmdə bu yanar nəfəsim var,
Tanrının dərgahına ucalmaq həvəsim var.
Etiqad qurbanıyam, ulu müqəddəsim var,
Çapır ürəyimdə qan, Məhəmmədə səs verir.

## HACI MAİL

### *QƏZƏL*

Ya Mühəmməd! Ya Nəbi! Ey bir adı Xeyrülbəşər,
Olmasydın, dərk qılınmazdı şərü xeyrin bəşər.

Ey salan heyrətlərə elmi, cəhan alimlərin,
Baxma ki, elimindən onlar agah olmuş müxtəsər.

Ol ki arifdir, bilir yetməz sənə kim bir nəbi,
Ol ki cahildir, səni dərk eyləməz, cəhl eyləyər.

Ol ki fazildir, bilər mümkün deyil fəzlinlə bəhs,
Ol ki qafildir, həsudindən sənə qılmaz nəzər.

Ol ki dostundur, nəbilikdən sənə iradı yox,
Ol ki düşməndir, sənin haqqında söylər küfrlər.

Ol ki qabildir, sənin ecazına inkarı yox,
Ol ki naqisdir, ona yəqin deyil "Şəqqül – qəmər".

Ol ki alimdir, sənin meracını eylər qəbul,
Ol ki nadandır, ona "ruhani meracdır", - deyər.

Ol ki müslümdür, qəbul eylər "Furuiddin" ivi,
Ol ki kafərdir, ona "Quran" sözü etməz əsər.

Ol ki salimdir , tutar düz yol – “Siratəlmüstəqim”,
Ol ki şeytandır, salar dəhr içrə yüz min şürü şər.

Ol ki insadır, cəhan əhliylə eylər ünslər,
Ol ki heyvandır, verər əhli – cəhanə qəm – kədər.

Ol ki xalisdir sənə, eylər o, dünyanı xilas,
Ol ki iblisdir, edər viran cəhani sərbəsər.

Ol ki, hafizdir, səni, “Quran”ivi hifz eyləyər,
Ol ki batildir, ona təsir qılmaz hiç şər.

Ol ki sərrafdır, səni yəqin bilər “Dürri – yetim”,
Ol ki qanmazdır, nə qansın, versələr min bir gühər.

Ol ki məhrəmdir sənə, bulmuş hərimi – qürbi – həqq,
Ol ki naməhrəm ola, olmuş Xudadən bixəbər.

Ol ki şakirdir sənə, şakirdir öz Allahına,
Ol ki münkirdir, səni, Allahını inkar edər.

Ol ki zakirdir sənə, zikir eyləyər hər gün səni,
Ol ki müşrikdir, onun qövlində olmaz bir kəsər.

Ol ki vəssafin ola, vəsf eyləyər öz Rəbbini,
Ol ki qəsdində durar, keçməz həyatı bixətər.

Ol ki maildir sənə, bir özgəyə meyil eyləməz,
Ol ki salidir sənə, bilməz nədir bir özgə dər.

Ya Nəbi! Rəhm et bu Mail əbdüvə məhşər günü,
Olmasın üqbadə əhvalı bu dünyadən betər.

## *QƏZƏL*

Hər kimsəyə olmuşsa əgər yar Muhəmməd,(s)
Qoymaz onu ta olmaga bimar, Muhəmməd.(s)

Qəflət yuxusu tutsa o şəxsi bu cəhanda,
Yəqin edəcəkdir onu bidar Muhəmməd.(s)

Sən etmə güman tərk eyləyib mülki – cəhani,
Cismi əgər ölmüşsə, özü var Muhəmməd.(s)

Hər kəs onu, övladını bilmiş ulu daim,
Qoymaz onu məhşərdə çəkə ar, Muhəmməd.(s)

Hər sirrə çalışsan, bəli, vaqif olacaqsan,
Ancaq ki, bilinməz hələ əsrari – Muhəmməd.(s)

Düşmən səni dörd yandan əgər etsə əhatə,
Bilki edəcəkdir onları xar, Muhəmməd.(s)

Ol gün ki, qədəm qoydu cəhan mülkünə, ey dil,
Onda var idi Məkkədə küffar, Muhəmməd.(s)

Dəvət elədi onları islama küfürdən,
Bir – bir elədi bütləri inkar Muhəmməd.(s)

Kuffar onu istədilər qətl etsinlər,
Hicrət elədi onda da naçar Muhəmməd.(s)

Ol gündən odur tarixi – islam qoyuldi,
Oradan neçə şəxs eylədi iqrar, Muhəmməd.(s)

Ondan sonra ol şahə Mədinə vətən oldi,
Faş oldu bütün aləmə sərdar, Muhəmməd.(s)

Ol gün ki, Nəbi adına məbus olub ol şəh,
Xətim oldu nübüvvətdən o miqdar, Muhəmməd.(s)

Əşrəf sayılır cümlə Peyğəmbərlərə, məqsəd,
Olmaz bu cəhanda dəxi təkrar, Muhəmməd.(s)

Nur aldı üzündən günəş ol mahi iqanın,
Etdi bu cəhan mülkini ənvar Muhəmməd.(s)

Müjdə yetişib xəlqə Xudadən, dəxi qorxmun,
Məhşərdə olar hamıya qəmxar Muhəmməd.(s)

Ol gün ki, vida eylədi bu mülkü – cəhanə,
Söndi çırağı – günbədi – dəvvar Muhəmməd.(s)

Tapşırdı Əli ibni – Əbu Talibi xəlqə,
Xəlq eylə bilə, ta yenədə var Muhəmməd.(s)

## *QƏZƏL*

Xəmrələnib nur ilə, mayəsi Peyğəmbərin,(s)
Olmuş hüda məqsədi, qayəsi Peyğəmbərin.(s)

Ondan alır afitab nurunu ta sübhü şam,
Düşməz idi ol səbəb sayəsi Peyğəmbərin.(s)

Qardaşı Cəbril olub vasteyi - əmir üçün,
Körpəliydən olub dayəsi Peyğəmbərin.(s)

Ayeyi "Quran" ona nazil olub vəhy ilə,
Küfürdü, kim var, desə ayəsi Peyğəmbərin.(s)

Xətmi – rəsul olduğu bəllidi aləmlərə.
Tək bu idi rütbəsi, payəsi Peyğəmbərin.(s)

Həşr günü Mailin başinə, yarəb, düşə,
Zahirə o olmayan sayəsi Peyğəmbərin.(s)

## *QİTƏLƏR*

Səmadən beş kitab nazil olub dəhrə hidayətçün,
“Sühüf” İbrahimə bir vaxt, “Zəbur” Davudi  - xoşxanə.

Gəlib Musayə “Tövrat”, “İncil” İsayə olub nazil,
Görülmüş Müstəfa layiq fəqət dünyadə “Quran”ə.

Səmadən üç “Əmin” ismi verilmiş üç kəsə, bəli,
Biri  şəhrə, biri cinnə, biri bir ali insanə.

Deyərlər Məkkəyə şəhrül – Əmin, məhşur olan sözdür,
Əman var Məkkədə insanə, həm qaçmış bir heyvanə.

Mələklərdən “Əmin” adı olub Cəbrailə məxsus,
Bəşərdənsə Mühəmmədir olan layiq bu ünvanə.

“Əminin” çünki mənası bizim dildə əmanətdar,
Əmanət etibar etməz  xəlayiq hər müsəlmanə.

O ki, Xaliq ola, “Quran” kimi hökmi – İlahini
Ki, söz – söz , hərfbəhərf oni yetirsin xəlqi – nadanə.

Odur, Cəbrəili əvvəl əmin bilmiş mələkiərdən,
Əmanətdar edibdir izzilə ayati – fürqanə.

Ki, şəhri – Məkkədə öz beyti var şəhri – müqəddəsdir,
Nüzuli – ayəni layiq bilib orada müsəlmanə.

Bu şəhrin ali insani Mühəmməddi, Əmin oldu,
Ki, ondan ayələr bir – bir yetişdi əhli – imanə.

Bu gün bir ayəsi təğyir olunmub, bu səbəbddəndir,
Yenə “Quran” salır bir gün pərişan xəlqi səhmanə!

## QƏNDALI ƏLİYEV ATAÇAYLI
## *SƏNSƏN*

Haqqın sırasında sonuncu olmaq,
Min illər ötdükcə sonuncu qalmaq,
Axır olmaq deyil, son olmaq deyil.
Ömrü bu nisbətdə sanılmaq deyil.
Var olmaq, əbədi olmaq deməkdir.
Idrakın övladı olmaq deməkdir.
Bu ali idrakın yeganəsi sən.
Ən nurlu danəsi, dürdanəsi sən.
Elə bir zirvədə tutdun ki, qərar,
Sonraya dünyanın yolu qurtarar.
Haqdan zəka sənin, səxavət sənin.
Iki dünya, iki məmləkət sənin.
Əvvəli səninlə başlar hər əsrin.
Sonu sən o mürsəl peyğəmbərlərin.
Nurun şəfa saçırənginliklərə.
Zülmət ayaq açmaz sən ola yerə.
Fövqündə durarsan ağlın, kamalın.
Yerdən asimana qalxar cəlalın.
Sənsən yer üzünün adil hakimi.
Mənalar mülkünün şah müəllimi.
Sən bütün bəşərə nemət kanısan.
Əzəmət kanısan, qüdrət kamısan.

Axirət paklığı yaşar ruzunda.
Tutiya gücü var ayaq tozunda.
Sən vahid kanısan min gözəlliyin.
Gözəllik sənindir, sən gözəlliyin.
Allahın hüccəti, sübutu səndə.
Heybəti, qəzəbi, sükutu səndə.
Ən uca bir dinin ustadı sənsən.
Ustadı, həm də ilk övladı sənsən.
Səndən sonra bu yol, bu hikmət ağır.
Təzə bir peyğəmbər idraka sığmır.
Bu yollun səyyahı, sultanı sənsən.
Sözü sən, şeri sən, dastanı sənsən.
Səndən danışmırsa dil, ya Muhəmməd,
O dilə çəkilsin mil, ya Muhəmməd!

## YUSİF BALASAQUNLU
## *PEYĞƏMBƏR(S) FƏZİLƏTLƏRİ*

Tanrı elçisiydi həzrət peyğəmbər,
Xəlq içrə mötəbər, kişilikdə ər.

Məşələ çevirdi zülmət gecəni,
Hüsnünün nuruna qərq etdi səni.

O xəbər gətirdi pərvərdigardan,
Doğru yola çıxdın, sən ey qəhrəman.

Ata – anasını fəda qıldı o,
Yalnız ümmət üçün açdı doğru yol.

Nə gündüzlər yetdi, nə gecə yatdı.
Tək səni tanrıdan sordu, ucaltdı.

O sənin uğrunda çox çəkdi nalə,
Sən ona həmd qıl, səadət dilə.

Bütün qayğıları ümmət üçündü,
Ümmətin uğrunda, məşələ döndü.

Atadan, anadan yaxın, mehriban,
Ümməti sorardı yalnız Tanrıdan.

O el səadəti, allah zəhməti,
Tanrı vergisiydi xülqü, xilqəti.

Ipək təbiətli, əliaçıq, mərd,
Qılıqlı, mehriban həzrət Muhəmməd!

Hanı yerdə, göydə o qədər əziz?
Tanrı qarşısında hörməti hədsiz.

Bütün başçılara bir göz işığı,
Bütün peyğəmbərlər ondan aşağı.

Mən onun yoluna könül bağladım,
Qövmünü, hökmünü bərk qucaqladım.

Özün ehtiyat tut mənim könlümü,
Onunla oyanım qiyamət günü,

Ilahi, əlimdən özün yapış gəl,
Bədrlənmiş Ay tək gördüm üzünü.

## QÖVSİ TƏBRİZİ
### *QƏZƏL*

Ey olub Qurani – ecaz afərin bürhan sana,
Məddi – bismillah mizani – ülüvvişan sana.

Zatına ol qürblə hacət degil merac kim,
Ömrlər möhtac idi pabus üçün keyvan sana.

Bəs degil ol şövkətü şan ilə cövlan etməgə,
Tövsəni – gərdun səməndü laməkan meydan sana.

Zati – bişübhəmisalın bəs ki, aliqədridir,
Gündə min yol tazələr ərşü bərin iman sana.

Bəs ki, ehsan etməgə möhtacdır lütfün sənin,
Dəmbədəm ehsan uman səndən qılır ehsan sana.

Müxtəsər kaşanədir firdovs, nisbət cuduna,
Bir mühəqqər sərzəmindir rozeyi – Rizvan sana.

Kəsmə məndən guşeyi – çeşmim tərəhhüm, ya Nəbi,
Ey mənü yüz min mənü Qövsi kimi qurban sana.

## NACİ
### *QƏZƏL*

Qıl məni, ya rəbb, bəlavü dərdü möhnətdən xilas,
Nə bəlavü dərdü möhnət, bəlkə firqətdən xilas!

Ol ki, hicran atəşindən yetsə əmniyyət ona,
Eylə bilsin boldu duzəxdə üqubətdən xilas!

Nəfsi – zalım eyləmişdir əmrinə tabe məni
Ey xoş ol gün kim, olam bu bimürrüvətdən xilas

Fikri – dünya eyləməkdən canə yetdim, saqiya,
Bir qədəh sun, qıl məni məst, eylə fitrətdən xilas

Əksi – ruyi – şahidi – məqsəd olurmu çilvəgər,
Olmasa mirati – dil zəngi – məniyyədən xilas!

Bəh nə taledir bu kim, kuyində bir dəm olmazam
Xəncəri – bidaddən, səngi – məlamətdən xilas.

Mərifət nurilə qəlbi – Nacini purnur qıl,
Şəmi – şəri – Əhməd ilə eylə zülmətdən xilas.

## *QƏZƏL*

Həkimi – sün əzzəldən mizacım müstəqim etmiş,
Mizaci – müstəqimim çeşmi – bimarın səqim etmiş.

Sənə bənzər büti – zibanə mümkün madəri – giyti,
Gətirsin ruzigarə, dəhr onu çoxdan əqim etmiş.

Deyirlər Yusifi əhsən, nədir həddi sənə yetsin,
Onun hüsni – rüxi göydə haçan mahi dünim etmiş.

Sənin şənində lövlakə buyurmuş bariyi – mütləq
Əgər İsanı ruhullahu, Musanı kəlim etmiş.

Zəhi – ərbabi – dövlət rövzeyi – kuyində sakindir,
Məni kaşaneyi – hicrində bəd bəxtim müqim etmiş.

Verən tövfiqi – taət firqeyi – zöhhadə, ey Naci,
Bizimçün eşq camın dafei – ümmidi – din etmiş.

## *QƏZƏL*

Xak üzdə ki, qoydun qədəmin oldu müşərrəf,
Etdi fələki-əzəmi bü mərtəbeyi xak.

Aləm hami meydani-risalətdə əsirin,
Olmuş sənə şahani-cahan bəsteyi fitrak

Yox zərrəcə bir eybi vicudində sərasər
Xəllaqi-cahan cövhərini öylə qılıb pak.

Gülzari-məlahətdə qədin sərv, rüxün gül,
Yanında gülü sərv misali xəsü-xaşak.

Gər ruzi-əcəl yetsə mənə müjdeyi-vəslin,
Ol müjdəyə yüz can verərəm şadü fərəhnak.

Qıl əfvdərində nə ki tərgi ədəb etmiş,
«Nacı» kimi yox dəhri də divaneyi bibak.

## AŞIQ ƏLƏSGƏR
### *"MƏRD"*

Altı gündə xəlq eylədi, aləmi sübhani mərd,
Aya, günə qərar qoyub, dolanır dünyanı mərd.
Muhəmməd şəninə endi, doxsan min kəlmə təmam,
Osman yazdı, cəm eylədi otuz cüzv Quranı mərd.

Ibrahimi – Xəlilullah əhd – peyman eylədi,
Çıxartdı Mina dağına, oğlun qurban eylədi,
Hacər yandı, nalə çəkdi, ahu fəğan eylədi,
Barilahim kərəm qıldı, göndərdi qurbanı mərd.

Ələsgər adın qurbanı, Ya Muhəmməd Mustəfa!
Şəninə ayə xətm oldu, həl – ətasan, qul – kəfa.
Dinini aşkar eylədi, munkirə verdi cəfa,
Qılıncı mərd, qüvvəti mərd, atı mərd, meydanı mərd.

## AŞIQ ŞƏMŞİR
### *BİR ƏLİMDƏ VAR*

Yey ya rəbbi aləmləri yaradan,
Əhmədi Muxtarım bir əlimdə var.
Min bir ismi gecə - gündüz çağıran
Bu adı yazmağa bir ələm də var.

Üç yüz on üç gülü yaxşı bilən dər,
Ağ bağlı xanəmi yaxşı bilən dər.
Batinləri görən yaxşı biləndər-
Alimlər alimi bir alim də var!

Şəmşirəm, sözümün budur bir ağı,
Düşmənlərə içirdəydim bir ağı.
Merac səfərində minmiş Birağı,
Xatəmil ənbiyə bir əlimdə var.

## ZEYNƏB SOLTAN QIZI
## *QƏZƏL*

Daim sizsiz pənahım, ya Muhəmməd, ya Əli,
Dünən, bu gün, səbahım, ya Muhəmməd, ya Əli.

Aciz dayanmaram mən nadanlar qabağında,
Sözünüzdür silahım, ya Muhəmməd, ya Əli.

Nədir səbəb aləmə, nədir xilqətə bais,
Adınızdır izahım, ya Muhəmməd, ya Əli.

Qoy tökülsün üstümə kafirlərin ləşkəri,
Qorxu bilməz silahım, ya Muhəmməd, ya Əli.

Qiyamətin günündə edin şəfaət mənə,
Əfv eyləyin günahım, ya Muhəmməd, ya Əli.

Siz ədalət, sədaqət, səxavət, mənbəyisiz,
Ey neməti – ilahim, ya Muhəmməd, ya Əli.

Vəfapərəst Zeynəbəm dilimin virdi olub,
Ağam, sultanım, şahım, ya Muhəmməd, ya Əli.

## ƏBDÜRRZA ƏHMƏDOV
## *YA MUHƏMMƏD MUSTƏFA(S)*

Ey rəsuli – rəbb – sübhan, ya Muhəmməd Mustəfa
Ənbiyayi – insü həm can, ya Muhəmməd Mustəfa.

Ey Həbibullahi – hadi, kainatın əşrəfi,
Ey mələk xislətli insan, ya Muhəmməd Mustəfa.

Rəhbərisən dini islamın, çəhardəh məsumun,
Həmdə dünyaya çıraqban, ya Muhəmməd Mustəfa.

Göstəribsən getməyə doğru təriqət, doğru yol,
Çatdırıbsan xalqa Quran, ya Muhəmməd Mustəfa.

Çoxlu cahil, çoxlu nadan, çoxlu yoldan azmışı,
Eylədin mömin, müsəlman, ya Muhəmməd Mustəfa.

Hökmünü rəhbər tutanlar, ey Həbibi ləmyəzəl,
Oldular dininə heyran, ya Muhəmməd Mustəfa.

Saf, təmiz niyyətlə Əbdülrza ümmətdir sənə,
Bağlayıb islama iman, ya Muhəmməd Mustəfa.

## ƏLİHÜSEYİN CƏFƏRİ
### *QƏZƏL*

Alıb vəhyi – xudadən hikməti – qurani peyğəmbər,
Bu hikmətlə tanıtdırdı bizə sübhani peyğəmbər.

Həyati – cümlə aləmdən xəbərdar etsə də xəlqi,
Əzizi - əşrəfi – aləm sanıb insani peyğəmbər.

Yaradıb dini – islami müsəlman bayrağı ilə,
Dəyişdirdi mühiti – tarixi – dövrani peyğəmbər.

Cəhalət əhlinə rahi – hidayət səmti göstərdi,
Fəzilətlə bəşərdə artırıb imanı peyğəmbər.

Kəmalü vəhdətü elmü fəzilət xanədanında,
Bu dünyanın olubdur fatehü sultani peyğəmbər.

Oyadıb xabi – qəflətdən məni, əhli – nəmaz etdi,
Yetirdi aşiqinə səcdeyi – fərmani peyğəmbər.

Ilahi eşqim artdıqca bu qəlbimdə mənim ya rəb,
Edərkən cani qurban, qoy olum qurbani – peyğəmbər.

Səlami – ehtiramın Cəfərinin sən ona çatdır,
Salıbdır qəlbimə hər gün qəmi – hicrani peyğəmbər.

* * *

Sübhan Rəsuli – Əkrəmi xəlq etdi quran eşqinə.
Xəlq oldu peyğəmbər, yazıb qurani sübhan eşqinə.

Ey mömin insan, cəhd elə, quran əlündən düşməsin,
Allahın hikmət elmidir, vəhy oldu insan eşqinə.

Dünyaya aşıq olma kim, onsuz da dünya fanidir,
Sün aqibət istər əməl, gəl düşmə dövran eşqinə.

Ta qurban istər həqqü din, Allah yolunda et cihad,
Qürdətlənibdir dinimiz çün canü qurban eşqinə,

Şahi – Hüseyni – Kərbəla Allahu Əkbər söyləyib,
Can qurban etdi qüdrəti – ali müsəlman eşqinə.

Ta Həzrəti – Əbbas təki cəng eyləyən şir olmayıb,
Çün cəngü rəzmi aləmi etmişdi heyran eşqinə.

Yetmiş iki məzlum şəhid sadiq qalıb öz eşqinə,
Sübhanə qurban oldular ol feyzi – ürfan eşqinə.

Ey Cəfəri aləmdə sən oldun həqiqət aşiqi,
Can qurban etmək istəsən ver cani iman eşqinə.

## MİRZƏ DAHİ ALMASLI
### *PEYĞƏMBƏR-İN (S) NƏTİ*

Hər kim dilərsə gövhəri – kani – Muhəmmədi,
Tutsun həmişə rahi – rəvani – Muhəmmədi.

Yazmış cahan səhifəsinə katibi – əzəl
Qüdrət əliylə namü – nişani – Muhəmmədi.

Hər kəs könül bulağını pak etdi nəfsdən,
Gözsüz də gördü sirri – nihani – Muhəmmədi.

Səhrada zərrə qum ola, dəryada qətrə su,
Söylər öz aləmində bəyani – Muhəmmədi.

Ey alimi – zəmanə, sən ey əhli – mərifət,
Vermə fənaya dürri – yegani – Muhəmmədi.

Haqqın sədası gəldi onunla bu aləmə,
Qəlbinlə söylə virdi – zəbani – Muhəmmədi.

Ya Rəbb, inayət eylə bu həsrətdə Dahiyə,
Qoyma gözündə vəsli – məkani – Muhəmmədi.

## *NÖVHƏ*

Olub o nuri-xudavənddən nişanə Məhəmməd,
Nişanə verdi həqiqət yolun cahanə Məhəmməd

Hira dağında ona bir salam yetişdi xudadan,
Dəyişdi halı cahanın o pak, ülvi nidadan.
Nicatə yetdi bəşər nəsli möcüzüylə bəladan,
Sığarmı ərzə,bəyanə, dilə, dəhanə Məhəmməd?

Kənarda qalmadı bir dəm vücudu dəhr qəmindən,
Nə gəldi başına naəhl kəslərin sitəmindən!
Alanda tövheyi-pərvərdigarı ruhi əlindən,
Yetişdi bir təzə gəncineye-nihanə Məhəmməd.

Büraqi əyləşərək fəth qıldı ərzü səmanı,
Səyahət eylədi bir ləhzə içrə ərşi-xudanı.
Nəbilər içrə görən varmı böylə zövqi-səfanı,
Vücudi-pak ilə can verdi asimanə Məhəmməd.

Tutanda Məkkəni başdan-başa səmümi-ədavət,
Mədinə şəhrinə din nuri ilə verdi şərafət.
Kitabi-tarixə zərxətt ilə yazıldı bu hicrət,
Gətirdi gərdişi çərxi-zəmanı cana Məhəmməd.

Əliyü Fatimə vəsliydi əmr bağına zinyət,
Xuda ol bağə behişt gülləriylə verdi təravət.
Ölüb Həsənlə Hüseyni bilərdi, baisi-nemət,
Fəda deyərdi özün hər iki cavanə Məhəmməd.

Keçirdi ləşkəri-islamı Bədrdən o dilavər,
Ühüd sualını xəndək cavabı etdi münəvər.
Alındı qəleyi-Xeybər, qayıtdı Məkkəyə sərvər,
Zəfər libası geyindirdi konfəkanə Məhəmməd.

Ədayi-həcc qılıb, oldu qərq-nuri bəqayə,
Vida xitabı ilə çəkdi xətt ruhi-fənaya.
Qəfəsdə dözmədi vəhdət quşu, ucaldı səmaya,
Gətirdi kövnü-məkan əhlini fəğanə Məhəmməd.

Bu şer atəşi-eşqin şirin əzabıdır ey dil,
Əzaba təşnə olan, Dahinin xitabıdır, ey dil
İnan ki, nameyi-əmalıvın səvabıdır, ey dil,
Çəkən zaman səni məhşərdə imtahanə Məhəmməd.

## CƏFƏR RƏMZİ

### *YA MUHƏMMƏD (S)*

Ucaldı sənlə dövran, ya Muhəmməd!
Sən oldun dövrə şayan, ya Muhəmməd!
Çiçəkləndi, boy atdı hər tərəfdə,
Səadət ilə tufan, ya Muhəmməd!
Çəkildi ölkədən zülmət cəfası,
Göründü xəlqə mizan, ya Muhəmməd!
Həqiqət aləmin xətm eyləmişsən,
Buna şahiddi Quran, ya Muhəmməd!
Səni dərk eyləyən insafın əhli,
Nicata tapdı imkan, ya Muhəmməd!
Kim olmuş sinəsi, fikri, xəyalı
Sənin tək bitməz ünvan, ya Muhəmməd!
Gələ bilib, gələ bilməz sənin tək
Kəramət əhli ehsan. ya Muhəmməd!
Səmalar aləmi meracın ilə
Qazandı şöhrət, ad – san, ya Muhəmməd!
Xudavəndə gögün üst qatlarında
Sən oldun şanlı mehman, ya Muhəmməd!
Fəzilət mülkünün dəryasısan sən,
Məhəbbət mülkünə kan, ya Muhəmməd!
Nəcabət yolların saçdığı ilham,
Büründü nura hər yan, ya Muhəmməd!

Ana zəhmətlərin, həqqin sənin tək
Ola bilmib ucaldan, ya Muhəmməd!
Şəfaət bəzminə rövnəq yazıldın,
Iki dövrə Süleyman, ya Muhəmməd!
Səni təqdirə yoxdur məndə qüdrət,
Ürək heyrandı, heyran, ya Muhəmməd!
Kamalın vəsfinə aciz qələmlər,
Kəlamın minlə dəstan, ya Muhəmməd!
Yəqinimdir ki, İslam bayraqilə
Olar hər yan gülüstan, ya Muhəmməd!
Bəşər ovladını yoldan çıxarmaz,
Inan, bir yol da Şeytan, ya Muhəmməd!
Bəlakeş Rəmzi vəslin həsrətində
Sənə qurbandı – qurban, ya Muhəmməd!

## KAMİL SƏRBƏNDİ
### *PEYĞƏMBƏRİN TƏRİFİ*

Ya Muhəmməd, tək yaratmışdır səni Pərvərdigar,
Ziynəti – ərşü zəminsən ta əzəldən aşikar,
Insü cinn qarşında baş əymiş biixtiyar,
Xidmətində padişahlar müti qul, sən tacidar.

Cümlə xilqətdən seçib fərqləndirib Xaliq səni,
Ta əbəd, dünyayə son hakim görüb layiq səni,
Acizəm vəsf eyləyim, ey aşiqi – sadiq, səni
Kim, sənin tək olmamışdır bir Həbibi – Kirdigar.

Xilqətin sənsən birinci, həm sonuncu rəhbəri,
Ey kəramət mənbəyi, ey ənbiya sərdəftəri,
Şəfqətindir eyləyən asan əzabi – məşhəri,
Cümlə ümmət dar günündə lütfüvə ümmidvar.

Gərçi Məryəm oğlu İsa göylərə basmış qədəm,
Qədrdə lakin sənin tək olmamışdır möhtərəm,
Gərçi Musa göstəribdir möcüzatın müntəzəm,
Etməyib əmma cahanda haqqı sən tək bərqərar.

Tutmamışdır ərşdə bir kəs məqamın tək məqam,
Heç kimə göstərməmişdir Tanrı sincə ehtiram,

Müntəzir durmuş mələklər taətində sübhü şam,
Başların əymiş önündə cümlə əhli – ruzigar.

Əmri – Yəzdan ilə sən ta əzmi – merac eylədin,
Nuri – paki – hüsnünə əflakı möhtac eylədin,
Başına qoydun qədəm çərxin, qızıl tac eylədin,
Çilçıraq oldu səninlə bəzmi – çərxi – üstuvar.

Əmrini  Pərvərdigarın sən yetirdin xilqətə,
Insanı sən dəvət etdin düz yola, qüdsiyyətə,
Ey şəfaət göstərən sidq ilə əhli – taətə,
Hardadır sən tək cahanda bir vəfalı şəhriyar?

Hökmi – Rəhmanir – Rəhimi sən tanıtdırdın bizə,
Rəsmi – Qurani – Kərimi sən tanıtdırdın bizə,
Həm "Sirat-əl müstəqim"i sən tanıtdırdın bizə,
Sən bizi etdin ləin şeytan fəsadından kənar.

Dini – İslam ilə zülmət dəhri rövşən eylədin,
Ümmətin səhrayi – ömrün bağü gülşən eylədin,
Xeyrü şər məfhumunu açdın, müəyyən eylədin,
Bəndeyi – fərmanına çəkdin səlamətdən hasar.

Haq yolu azmışları saldın təriqi – əqdəsə,
Məzluma etdin himayət, əl uzatdın bikəsə,

Verdi xalq “Allahu Əkbər” sovti ilə səs – səsə,
Qüssədən azad olub etdi ürəklər iftixar.

Ey şəfaət məxzəni, sənsən pənahı ümmətin,
Ey fəzilət mədəni, sənsən sabahı zülmətin,
Ey kəramət məskəni, sənsən riafhı xilqətin,
Bu cahan mülkündə sənsiz kimsə olmaz bəxtiyar.

Hüsni – ziban ilə sən zibalərin zibasısan,
Qəddi – tuban ilə sən tubaların tubasısan,
Ətri – rənan ilə sən rənalərin rənasısan,
Hər iki aləmdə bir gül yox sənin tək müşgbar.

Şərmsar etmiş camalın göydə mahi – ənvəri,
Nuruna həsrət çəkir hər ləhzə Mehrü Müştəri,
Çərxi – dövran bir üzükdür gərçi, sənsən gövhəri,
Öylə gövhər kim, Xudayi – Ləmyəzəl vurmuş əyar.

Ləfzini gülşəndə bülbüllər eşitsə, lal olur,
Gül cəmalın görsə güllər xiclətindən al olur,
Nitqinə natiq olanlar qılsa guş, bədhal olur,
Hikmətindən, ya Rəsulullah, bu aləm huşuyar!

Bənzərin yoxdur vəfada, sən sədaqət rəmzisən.
Mənbəi – nursan, ziyasan, elmü hikmət rəmzisən,

Ülvilik, paklıq, təmizlik, haqq – ədalət rəmzisən,
Insana səndən qalıbdır hər fəzilət yadigar.

Dostusan dostun həmişə, düşmənin də düşməni,
Haqqı hifz etməkdən ötrü kim əvəz eylər səni?
Sən dağıtdın yer üzündən zülməti – Əhriməni,
Neyləyər qarşında yüz min Rüstəmi İsfəndiyar?!

Mübtəlayi – dərd olan səslər səni imdaına,
Məzlumun dar gündə sənsən səs verən fəryadına,
Mumiyadır şəfqətin xalqın dili – naşadına,
Şad səndəndir cahanda hər mərizü dilfikar.

Qoyduğun yolla gedənlər heç zaman görməz zərər,
Dinivə qail olanlar düşməz eldən dərbədər,
Ismi – pakindən alar ilham tamam cinsi – bəşər,
Cümlə xalq möhtaci – mehrin, xalqa sənsən qəmküsar.

Gülşəni – İslamına çatmaz behiştin gülşəni,
Ayeyi - Quranına dəyməz cahanın məxzəni,
Bir əvəzsiz nur bəxş etmiş bizə Xaliq səni,
Sənsən hər ömrün bağında xoş nəsimi – növbahar.

Olmasaydın, cəhldən kim qurtarardı xilqəti?
Kim xilas eylərdi məhşər atəşindən ümməti?

Şəmi – ruyindir edən yox yer üzündən zülməti,
Kimdə var Xaliqdən özgə səndəki bu iqtidar?!

Ibtidadən ta əbəd məsud səninlədir cahan,
Şad səninlədir həmişə bu zəminu asiman,
Dərgəhində qul olanlar heç zaman görməz yaman,
Müşgülati – qəmlər içrə çeşmi olmaz əşgibar.

Çox təəssüflər ki, bəzən asiyik fərmanına,
Bivəfalıq göstərib baş əymirik Quranına,
Lənət olsun bu cahanın xaneyi viranına!
Kim, onun malü mənalında bulunmaz etibar.

Gərçi çoxdur cürmümüz, yox əfv üçün ümmidimiz,
Gərçi çox müşgüldü bar versin dirəxti – bidimiz,
Leyk sən əhli kərəmsən, tabeyində bəndə biz,
Qul xəta işlətsə, şah etməz qulamın şərmsar.

Ya Rəsuli – Rəbbi – aləm, sən pənahımsan mənim,
Ya nəbilər mürsəli, sən qibləgahımsan mənim,
Ya zaman Peyğəmbəri, sən padışahımsan mənim,
Canımı hər dəm yolunda eylərəm gül tək nisar.

Xilqətin hər müşkülati – dərdinə sənsən təbib,
Məzluma, biçarəyə sənsən mədətkar, həm həbib,

Kamili lütfündən etmə, ya pənahım, binəsib,
Ağlayıb ta ruzi – məhşər yoxsa eylər ahu – zar.

Qoyma həsrət könlümü ol şəfqəti – ehsanına,
Gər günahkarəm, bağışla cürmümü Quranına,
Getməyim şərməndə dünyadən fələk divanına,
Olmasın nari – cəhənnəmdən vücudum taru – mar.

## *YA PEYĞƏMBƏRİM*

Ya Muhəmməd, hər iki aləmdə ya Peyğəmbərim!
Əvvəl Allah, sonra sənsən bu cahanda sərvərim.

Rişeyi – ömrüm sənin dinindən hər dəm su içər,
Bir qulami – kəmtər olmaqdır bu dində zivərim.

Sən günəşsən, aləmi – imkan qaranlıq bir mühit,
Yox bu müdhiş zülmət içrə səndən özgə rəhbərim.

Sən nişan verdin mənim tək qafilə haqqın yolun,
Bu müqəddəs yolda sənsən uçmağa balü – pərim.

Aləmi dərk etməyə qabil deyilkən mən səfil,
Zehnimə nur saçdı Quranın, açıldı gözlərim.

Mən sənin sayəndə  tapdım hər məqami – izzəti,
Bir gəda ikən, başımda indi vardır əfsərim.

Ta nəfəs vardır bu cismimdə, unutmam xatirin,
Hər zaman, hər yanda olsan pak adındır əzbərim.

Kamila, mən dadxahi – dərgəhi – Peyğəmbərəm,
Var ümidim olmasın əfzun əzabi – məhşərim.

## ƏLİAĞA BAKİR
## *QƏZƏL*

Bərqərar etdi cahanı öylə ki, ol gün Xuda,
Aləmin cahi – cəlalın qoymadı getsin bada.

Hər cürə nemətlərindən lütf ilə bəxş eylədi,
Canlılar xəlq eyləyib, həm onlara verdi qida.

Hər şeyi səhman üçün göndərdi peyğəmbərləri,
Rəhbəri kamil olanlar dəhrdə düşməz oda.

Göstərib haqqın yolun daim bəşər övladına,
Böylə minval ilə onlar aləmə salmış səda.

Öyrədir ali – əbalar borcudur ümmətlərin,
Neməti – sahib – cəmalı hər zaman salsın yada.

Üz tutub şükr eyləsinlər xaliqin dərgahına,
Doğru yoldan azmayıb, göstərməsinlər bir xəta.

Bakira, yad elə sən ali – əba peyğəmbəri,
Borcudur hər ümmətin canın ona etsin fəda.

## HƏKİM QƏNİ
### *HƏZRƏTİ MUHƏMMƏDİN-(S) MƏDHİ*

Ey qüruru fəxri – ümmət fəxr şayandır sənə,
Əqli – külli zatsan ki, əql heyrandır sənə.

Rütbeyi – əqlin kəmalın fövqü əflakındadır,
Həqqə girmək hikməti mizanü idrakındadır,
Pakdamən fərdsən, dərya, gözü pakındadır,
Zati – pakında sifati – mənii – Furqan olan,
Ey səmavi nemәti Xəllaqidən Quran olan!

Ey müəzzəm, ey ulu Allah – Təala elçisi,
Baisi – xilqət, İlahi, həqqü Mövla elçisi.
Ey olan peyvəstə qaim, hər iki dünya elçisi,
Elmi – küllü, iftixari – ümmətü ədyan olan,
Ey səmavi nemәti Xəllaqidən Quran olan!

Olmadı qeyri nəbi, ehkami – Qurandan bəri,
Sən təki bir alişan, Firdovsi – tabandan bəri,
Sidqdə bir sən kimi məddahi Furqandan bəri,
Qibleyi – imanü şəhri – hikmətü ürfan olan,
Ey səmavi nemәti Xəllaqidən Quran olan!

Təbinə tab etməyənlərdir Sənin əhli – cünun,
Alişanlar təbini anlarmı heç əxlaqi dun?
Dininə asi olanlardır bütün zirü – zəbun,
Ey əyan elmi bütün aləmlərə darülfünun,
Asitanında Xuda şiri Əli dərban olan,

Aqil, arifdir tutanlar Xaliqin dərgahini,
Dinü dinsiz kəslərə düz göstərən həq rahini,
Ey mərizi – cəhlə cümlə dəhrdə Loğman olan,
Ey səmavi neməti Xəllaqdan Quran olan!

Ey Nəbi! Quran nüzul oldu təmami şəninə,
Binizam dünyadə qoymaqçün nizami şəninə,
Həqq özü layiq görübdür bu mərami şəninə,
Övci – hatifdən gəlir haqqın kəlami şəninə,
Xaki – payi ey fələklər başına şükran olan,
Ey səmavi neməti Xallaqidən Quran olan!

Ey Nəbi! Aləmdə sən tək sözləri zər varmıdır?
Pürbəha, məna dolu gövtarı zivər varmıdır?
Gövhərin tək bəhrlər qoynunda gövhər varmıdır?
Dində manəndi misalın bir Peyğəmbər varmıdır?
Ənbiyə xətmində Sənsən bibədəl insan olan,
Ey səmavi neməti Xəllaqidən Quran olan!

Aləmi – mənidə Sənsən möminan üçün pənah,
Yoxdu bir digər belə, mizanü əcrü ya günah,
Aqilü dana ararmı başqa bir din içrə rah?
Ey çıxan meracda pişvazına xürşidü mah,
Gündən – aydan, fəzlə, ey fürqanı nurəfşan olan,
Ey səmavi neməti Xəllaqidən Quran olan!

Min – min axdı, gəldi zəvvar Kəbəyə şahü gəda,
Qıldılar əmali – həcc, təzim ilə orda əda,
Aldı mətləb xaki – payindən bütün əhli – nida,
Min Qəni qurbanın olsa, azdı, ey yarü – Xuda!
Min – min əhli – qədr ümmətdir sənə qurban olan!
Gündən – aydan, fəzlə ey Fürqanı nür əfşan olan!
Ey səmavi neməti Xəllaqidən Quran olan![1]

[1] ***“Məqam” qəzeti 23-30 iyun 1999 cu il***

## ƏHMƏD HƏRAMİ
### *QƏSİDƏ*

Nə dilim var anı şərh eyləyəm bən
Nə bilim var ki, şərhin söyləyəm bən.
Anın dil zikrini etmək gərəkdir,
Anın doğru yolun getmək gərəkdir.
Yüzüm qara, sözüm qısa, suçum bol,
Belim əgri, yolum doğru, boyum sol.
Şaşi baxdım, cüda düşdüm bən andan
Bənim halım necə olusər andan.
Qova – qova könül dünyaya irdi,
Ömür keçdi saqalı, saçı ağardı.
Əbəs yerlərdə xərc etdim yaşım bən,
Yeridir daşlara dögsəm başım bən.
Həmin vardı ümidimiz səfadan,
Məgər mədəd irişə Mustafadan.
Ümidimiz iki aləmdə oldur,
Anın şəfqətləri qullara boldur.
Dökəli ənbiya "Nəfsi" deyisər,
O ümmətlərinin qeydin yeyisər.
Salam olsun anun yaranlarına,
Müdam rəhmət irişsin canlarına.
Əbubəkr, Ömər, Osman, Əlidir.
Eyi dirliklidir bunlar, vəlidir.
Bunlar tutmadılar kibrü, kinayət
Bular bildi nədir dinü dinayət,

Səfa xətirlər içində kin olmaz,
Kin olduğu könüllərdə din olmaz.
Sürəlim könlümüzdən kibrü, kini,
Yıxarlar kibr edənlər mülki – dini.
Gəl şimdi Müstəfaya ver səlavət,
Deyəlim necədir anla hekayət.
Eşit gəl bir Həraminin sözünü,
Əgər görür isən məni yüzünü,
Olursa həqq – təaladan inayət,
Qılam bu qissəyə bir – bir hekayət.[1]

[1] "Dastani – Əhməd Hərami"

## HƏQİRİ
### *QƏZƏL*

Dilrüba, sən eylə gəl əhdə vəfa,
Yazuğam çox canıma qılma cəfa.

Ey saçın şəhri "ələm nəşrəh" sənin
Məh yüzün vəsfi dəhanın "qul kəfa".

Firqətindən olmuşam zarü həzin,
Vüslətinlə dərdimə qılgil şəfa.

Acıdır, cana, sənin hicrin günü,
Həm misalındır mənə sidqü səfa.

Səndən özgə kimseyi yar istəməm,
(Bil) behəqqi – nuri – paki – Müstəfa.

### *QƏZƏL*

Səndən ayru zar qaldım, ey həbib!
Dərd ilən bimar qaldım, ey həbib!

Həsrətindən gecələr kövkəb kibi
Ta səba bidar qaldım, ey həbib.

Vüslətinlən nola gər qılsan dəva,
Fikr ilən əfkar qaldım, ey həbib.

Şimdi ol gülgün cəmalından cüda,
Bənddanü zar qaldım, ey həbib.

Eşq ilə aləmlərə pünhan ikən
Sənsizin izhar qaldım, ey həbib.

Eyləməzsən dərdimin dərmanını
Acizü biçar qaldım, ey həbib.

Firqəti – hicran(ın) ilən şimdi mən.
Məhrumü bazar qıldım, ey həbib.

## AĞA
## *PEYĞƏMBƏRİN TƏRİFİ*

Quranda buyurub Xaliqi – xilqət;
“Biz səni göndərdik aləmə rəhmət”.
Hüdudsuz elmindən pay verib ki, sən,
Bəşəri İslama dəvət edəsən.
Yaradıb hər nə var çün, sənə xatir,
Quran göndəribdir bir adı “Fatir”.
Müqəddəs İncildə İsa peyğəmbər,
Sənin gəlişini veribdir xəbər.
Allahın izniylə sən doğulan gün,
Bir çox möcüzələr olubdur mümkün.
O, gecə aləmlər nura büründü,
Farsın min il yanan atəşi söndü,
Kəsra sarayından bir neçə sütun,
Yerindən laxlayıb uçuldu bütün.
Savə adlı dərya qurudu tamam,
Kəbədəki bütlər yıxıldı haman.
“Elmi – ilahi”dən tapdın mərifət,
Allah sənə verib “izni – şəfaət”,
Bəyənib çağırıb, adını sənin,
“O”, böyük Yaradan, “Muhəmməd – Əmin”.
Adınla hər zaman fəxr edirik biz,
“Xatəmül – Əmbiya” sənsən şübhəsiz.

Hər kəs ki, sözünə edir itaət,
Qəlbində qalmayır özgə bir hacət.
Xar olsun o, kəs ki, haqqını danıb,
Cəhənnəm odunu sözsüz qazanıb.
Ey, ulu peyğəmbər, ey ulu insan,
Şəninə təriflər deyib Yaradan.
Sənsən “Qiyamət”də, “Sahibi – Kövsər”,
Səni vəsf eyləyib cümlə - peyğəmbər.
Adınla fəxr edir bütün kainat,
Sevinir mələklər, qurulur “büsat”.
Bu fani dünyadan edəndə rehlət,
Bizlərə tapşırdın iki əmanət.
Bəs bu əmanətin biri, Qurandır,
Ona əməl edən, “əhli – cinan”dır.
Sonra tapşırmısan “Əhli – Beyt”ini,
Vacibdir saxlayaq biz hörmətini.
Bacarıb onları qorusaq hərgah,
Bizi cəhənnəmdən qoruyar Allah.[1]

[1] May – oktyabr 1999 – cu il

## FƏXRİ KÜRGANİ
## *MƏHƏMMƏD (S) PEYĞƏMBƏRİN TƏRİFİ*

Sinəm peyğəmbərə söz ilə dolmuş,
Tanrı hüzuruna elçimiz olmuş.
Azğınlıq, yolsuzluq tutdu dünyanı,
Avamlıq zülməti basdı hər yanı.
Qurdu kafirliyin damını iblis,
Saldı bu məhbəsə hamını iblis.
Öküzdü, ulaqdı avam insanlar,
Gözləri qarovdu, qulaqları kar.
Kimi avestalı, atəşpərəstdi,
Kimi cansız bütü allahı saydı
Kiminin tanrısı Günəşdi, Aydı.
Hamı varlığından bezib – doymuşdu,
Cəhənnəm yoluna qədəm qoymuşdu.
Tanrının yazığı gəldi insana,
Mərhəmət nurunu səpdi cahana.
Günəşin eşqiylə xilqət göz açdı,
Yolsuzlar yoluna nurunu saçdı.
Muhəmməd dininin çırağı yandı,
Sonuncu peyğəmbər adı qazandı.
Adəm övladına müqəddəs ağa,
Başladı haqq yola işıq saçmağa.
Xilqətdən yaratdı onu ilahi,

Əməldə müqəddəs, zəkada dahi.
Peyğəmbərlik verdi bir ona görə, -
Odlu qılıncına, Qurana görə.
Şair də, ədib də hüsnünə heyran,
Cəsurlar, igidlər yolunda qurban.
Əsrində adamlar dönməz ərdilər,
Şücaət, natiqlik göstərərdilər.
Həmin hikmətləri şerdə ara,
Hünər  gərəksə də, bax kitablara.
Hər sözdə fəsahət, incə mənalar,
Saysız hünərlərə ağıl mat qalar.
Dilləri dür saçan, qan tökən qəmə,
Işləri bəllidir bütün aləmə.
Əldən – ələ gəzdi Quran hər yanda,
Bədrdə, Xeybərdə zəfər çalanda.
Haqqın qüdrətinə inam yarandı,
Ümid çıraqları ürəkdə yandı.
Itaət eylədi ona hər biri,
Qırılıb atıldı hiylə zənciri.
Iblisdən qurtarıb azad gəzdilər,
Məkkə bütlərini qırıb əzdilər.
Din nuru zülməti sildi aradan,
Mərhəmət yağışı tökdü yaradan.
Bütləri toz kimi süpürdü yellər,
Iman qılıncına baş əydi ellər.

Alqış da, şükür də azdır Allaha,
Qurbandır yolunda canımız daha.
Gör necə müqəddəs din verdi bizə,
Gör necə mərd rəhbər göndərdi bizə.
Ondan peyğəmbərlik gördü bu cahan,
Tanrı qəzəbindən qorundu cahan.
Xeyirxah əməlli, şəfqətli haqdır,
Necə mərhəmətli, qəlbi yumşaqdır.
Yaman ağır gəldi bəşərin dərdi,
Doğru yol naminə elçi göndərdi.
Haqqın qüdrətinə qəlbən inandıq,
Tanrı elçisini bir başçı sandıq.
Kimsəni özünə tay tutmadıq biz,
Sözünü, hökmünü unutmadıq biz.
Hər iki dünyada bir qibləgahdır,
Pənah aparana dostdur, pənahdır.
Yağsa başımıza odlu qılınclar,
Ar olsun dinindən dönənlərə, ar!
Dini müqəddəsdir neçə ki, sağıq,
Ölsək də məzara aparacağıq.
Ilahi, qoyduğun yolla getmişik,
Bu yolda canı da fəda etmişik.
Dinini peyğəmbər yaydı cahana,
Şükürlər, alqışlar yağdırdıq sana.
Vermisən həyatı, bu günü özün,

Yazmısan taleyin hökmünü özün.
Bəndənin təqsiri, xatası olsa,
Səhv edib günaha batası olsa,
Qaxma əməlini başına onun,
Qatma zəhərini aşına onun.
Yazığıq, bir sənə ümid bəslərik,
Muhəmməd dininə mənsub kəslərik.
Saysızdır yanında günahımız da.
Sənsən axirətdə pənahımız da.
Şahidsən fəryada, insan ahına,
Bizi qəbul eylə öz dərgahına.
Comərdlər salarlar acizi yada,
Biganə qalmazlar aha – fəryada.
Comərdsən, dərgahı aç üzümüzə,
Qalmışıq naləndən can üzə – üzə.
Zəlilik, qəbul et, can veririk, can,
Günahkar olsaq da qovma qapıdan.
Sənin mərhəmətin, dözümün bəlli,
Biz isə günahkar, çirkin əməlli.
Özün səxavətli, comərdsən hər an,
Elçimiz şəfqətli, həm də mehriban.
Nə zaman Muhəmməd üz tutsa sənə,
Lütf eylə, rəhm eylə yazıq bəndənə.[1]

[1] F.Gürgani "Vis və Ramin"

## ƏTTAR TƏBRİZİ
## *MUHƏMMƏD PEYĞƏMBƏRİN TƏRİFİ*

O bir olan yaradanın sevimlisi, Rəsulu,
Allah ilə xəlvətgahda söhbət edən o ulu.

Sitayişin qibləgahı Əbulqasim Muhəmməd,
Eşqin feyzi yaradılmış nurundan aldı qüvvət.

Gözəlliyin mahiyyəti oldu aytək siması,
Camalından nəşət etdi hüsnün ülvi mənası.

Açıq gözlü adamlara ziya vermişdir gözü,
Kainata bəzək verdi onun nurani üzü.

Hüsnü ilə bədrləndi ayın üzü gülərkən,
Qədr gecəsi ətir aldı onun qara zülfündən.

Dodaqları lətif, duzlu sözlər yaydı cahana,
Onun dili fəsihətlə şəkər səpdi hər yana.

Nərgizləri sürmələnmiş qar rəngli bəzəklə,
Qönçəsi də açılmışdır can bəxş edən küləklə.

Çin – çin olan zülflərinin saçdığı xoş ətirlər,
Bu dünyanın göbəyindən yayılmış Çinə qədər.

Camalına cilvə verib göstərərsə üzünü,
Nazəninlər xəcalətdən itirərlər özünü.

Əla ənbər dəryasının atı duysa ətrini
Heyrət edib, dona qalıb itirər öz əqlini.

Gözəlliyi Üzranın da hüsnün salar hörmətdən,
Qaşlarıyla Taqi – Kəsra düşər qədrü qiymətdən.

Qamətindən kölgə düşsə yerin hər bir daşına,
Bir tac olub qoyular bil fələklərin başına.

Hilal kimi barmağını ay səmtinə tutanda,
Bədrlənmiş ayın hüsnü parçalandı bir anda.

Adi insan kimi sadə paltar geyib görünər,
Gah sevilən, gah da sevən olar daim o rəhbər.

O rəsalət göylərinin günəşidir paydar,
O cəlalət eyvanının Cəmşididir, hökmdar.

Aşiqlərin ürəyinə səfa verər hər zaman,
Böyük – kiçik razı qalar onun davranışından,

Onun kimi bir oğulu doğmamışdır bir ana,
Ilahiyyət kitabını sirri əyandır ona.[1]

[1]Ə.Təbrizi "Mehr və Müşbəri"

## SƏMƏD BEYLƏQANİ
## *PEYĞƏMBƏRLƏRƏ SALAM OLSUN*

Peyğəmbər – Allahın əziz rəsulu,
Göydə mələklərin can sirdaşıdır.
Insanın qəlbini duyan bir ulu,
Müqəddəs qanunun məhəng daşıdır.

Peyğəmbər – dünyanın bilicisidir,
Hər yetən bilici peyğəmbər olmaz.
Haqqın, Mərhəmətin birincisidir,
Ona inanmayan hünərvər olmaz.

Adəm də, Əyyub da, Yəhya da, Nuh da,
Yaqub da, Yusif də əzizimizdir.
Bəndələr qalanda amanda, ahda,
Onları yadına gətirir bir – bir...

Əzəldən yazılıb Zəbur Davuda,
O, Yövrat Musaya, İncil İsaya.
Quran Muhəmmədə gəlib dünyada,
Yüz iyirmi dörd min gəlməzmi saya?

Onlar dönmədilər əqidəsindən,
Insanı yaşadır bir saf iradə,

Ruhları önündə əyilirəm mən,
Mən dinsiz olmadım olmaram nə də...

Cərcis tək soyulsam Allah yolunda,
Şad ollam, bircə an of! Demərəm mən
Yaşadım mən onun saf amalında,
Dərs aldım Cərcisin haqq məktəbindən.

Allahın yolunu saxlamaq gərək,
Əl verib, dil verib, can verib bizə.
Hər namaz üstündə salam göndərək,
Qəlbimiz ruhumuz qoy olsun təzə.

Peyğəmbər yolunu saxlamaq gərək,
Başqa yol varmıdır o yoldan gözəl?
Haqqın dərgahına bağlanmaq gərək,
Ey Adəm övladı haqq yola düzəl!

## ƏMANİ

Əhmədi – mürsəli qıldın Xatəm,
Əhli – küfr içinə saldun matəm.

Ənbiya rütbəsi din meracın
Oturub, geydi "liəmrük" tacın.

Görməmiş insü mələk bu əltaf
Eylədin şamili – övladi Mənaf.

Əliyi – alini bivasitəsiz
Hərəmi – möhtərəmin içrə təmiz.

Fatimə bətnidin etdin zahir,
Ey ülüləmri – rəhimi – qahir.

Övsiya bədi – nəbiyyi – ali
Eylədin xəlqə Əliyyü ali.

Bivəlayi – Əlivü ali – nəfəs
Çəkmər üz, çün bu səadət bizə bəs.

Ey Əmani, eləgil xətmi – kəlam,
Hər nə həqq rəyidür olsun sana kam.[1]

[1] Əmani "əsərləri"

## MƏSİHİ
## *BU, NƏTİ – RƏSULİ – MÜCTƏBADUR*

Ey şahi – bəlavü izzü təkrim,
Vey xosrovi – mülki – xəlqi – təzim.
Sərlövhi – kitabi – afəriniş,
Tüğrayi – xitabi – hökmi – biniş.
Ey məhrəmi – razi – sirri – mübhəm,
Vey bəzm tərazü vəhy mülhəm.
Şərin durub etdi nəsxi – ədyan,
Göstərdi təriqi – kuyi – irfan.
Ey cameyi – məniyi – həqiqət,
Qanunnəhi – kişvəri – təriqət.
Cün şəmi – vücudin oldu rövşən,
Qıldı bu cəhani tazə gülşən.
Ey şafeyi – mücrimani – asi,
Səndin qəmuyə rəhi – xilasi.
Zərrati – cəhan tənbəli – rahın,
Ərş oldu kəminə təkyəgahın.
Ey Kəbeyi – çar rükni – aləm,
Nuri – əzəlivü möhri – xatəm.
Çərxi fələk etdilər ərusi,
Verdün olarə çü paybusi,
Ey zinəti – məhfili – nübuvvət,
Arayişi – bəzmi – ünsü vəhdət.

Sən ləcceyi – kövnə löleyi – nab,
Sən zülməti – bəhrə nuri – məhtab.
Ey baisi – nəzmi – xakü əflak,
Şahid bu sözə kəlami – lövlak.
Vicdanınədür təriqi – adət,
Binayi – quyub vəşşəhadət.
Ey kaşifi – rəmzhayi – müşkil,
Təbliğ sərayü vəhyü münzil.
Irdi qəmu xəlqə feyzi – cudin,
Ta yetdi şəhadəti – şuhudin.
Ey çeşmi – cəhanə nuri – didə,
Xurşid qulami – zərxəridə.
Tənqihi – dəfatiri – qiyamət,
Mövquf açasan ləbi – şəfaət.
Ol fatehi – həştbabi – gülşən,
Zatilə sifatə elmi rövşən.
Çün görmədi bizdə nuri – idrak,
Yazdı o misali – maərəfnak.
Ol kim bula qürbi – qabi – qövsin,
Ol pərdədə ola surəti – zin.
Di anda neçün qalur cəhalət,
Kim ola ona rəva bu halət.
Ey valiyi – çar həddi – təmkin,
Təhsi – nişanə, həzar təhsin!
Güftarın açub dəri – hidayət,

Rəf eylədi zülməti – zəlalət.
Saldı araya kitabü əlam,
Göstərdi təriqi – küfri – islam.
Sabit sən edüb vücudi – qayib,
Səndin əgər olmasaydı təlim,
Keyfiyyəti – din, ədayi – təzim.

Kim anlar idi ziyanu sudi,
Kim eylər idi xuda sücudi?
Dövranə əcəb mədar qoydun,
Şərin bizə yadigar qoydun,
Hər müşkil əgər olunsa izhar,
Sən həll edüb eylədün xəbərdar.
Nə faidə bu tərəfdən iqbal,
Yoxdur sənə qeyri – ruyi – ehmal.
Səndin bizə lütfü mehribani,
Bizdən sənə qəhrü sərgirani.
Səndən bizədür yetən şəfaət,
Bizdən sənə nəqsi – əhdü adət.
Üsyan səni bizdən etdi tirə,
Qəmdür bizdən sənə zəxirə
Sındurduq əgərçi zərifi – irfan,
Cəhlilə dutub təriqi – üsyan.
Haşa kəsəlüm ümid səndin,

Ya görmüyəlüm nəvid səndin.
Aləm qəmudur sənin əsirin,
Adəm qəmudur sənin fəqirin.
Yox qeyrə sənin çü ehtiyacın,
Ta inciyə olmasa mazacın.
Olmadı səninlə sayə həmseyr,
Yəni ki, sənə ədil yox qeyr,
Zatın qəmu nuri – pakdur pak,
Çün bulmaz ani həvasü idrak.
Pəs düzdü həkimi – ləyəzali,
Ol nurə bu surəti – xəyali.
Ta aləmi – cismə ola şahid,
Xəlqə ola mənşəi – fəvaid.
Yox sayəsi surəti – xəyalın,
Bir şəkl misaldür cəmalın.
Gər cism duranda intisabə,
Möhtac ola badü xakü abə.
Ol necə çıxar dutub kəranə,
Bu şuğlilə qürbi – laməkanə.
Pəs zahir olundu ol mükərrəm,
Bu növidə nurdur mücəssəm.[1]

[1] "Məsihi "Vərağa və Gülşən" əsərindən"

## *OL DÜRİ – DÜRCİ – NÜBÜVVƏT NƏTİDÜR*

Ey nuri – çeşmi – binişü vey qibleyi – dua,
Xurşidi – afərinişo şəmi – şəbi – hoda.
Dər mətbəxnəvali – to in nöh rəvaqi – çərx,
Bəhri – dəqiq qürseyi – nanəst asiya.
Pişi – ədibi – qədri to tifli – fələk müdam,
Rəhli – hilal dər bəru xəm kərde poşt ra.
Budiyi – to əsli – illəti – qayio vücud ra.
Xaki – rəhi – to çeşmi – cəhanəst tutiya,
Əncom be pasibaniyi – hərəmət ta tülui – mehr,
Məşəl bekəf gereftevo istade cabeca.
Hərku xilafi – rayi – to rayi – degər zənəd,
An bixirəd ze cəhl gereftəş rəhi – xəta,
Dər bəzmi – bargahi – to in gərdxani – xur,
Şud xani – ma həzərkeş piş avər gəda,
Nuri – to dər bidayət fitrət nəmud rox,
Vəz tost moqtəbes, həme ənvari – ənbiya,
Dər bəzmi – eyş çəngi – moradəş şəkəste did,
Hərku bəzili – qeyri – to zəd çenin eqtida.
Fülki – məasiyə kənəfin sahili – nəcat,
Dərdi – günahə mərhəmətin nüsxeyi – dəva,
Əzmin rayətində qılar bəndegi qədər,
Meylin iradətində qılar çakəri qəza.
Görməz əsir üsr ta qılsan əgər nəzər,

Qalmaz fəqir füqridə açsan kəfi – əta,
Səndin yetişdi aləmə feyzi – vücudi – cud,
Səndin bu tirə guşeyi – dünya bulub ziya.
Həqqa ki, cuyi – şir ona şürbilhəmim olur,
Cənnatə gər girərsə sənə döndərən qəfa.
Dünya çü cismidir qəmu tənlərdə ruhsən,
Sən aftab qədrsənü özgələr səha.
Hər cürmə kim şəfaətin eylər səfinəliq,
Haşa ki, qərq edə ani ol ləcceyi – bəla.
Yüz döndərən sənə ola üsyanə gər qərib,
Olur fəzayi – düzəx ona rövzətül – səfa.
Zahir sənə təmam müradi Məsihinin,
Nə ehtiyac elminə izhari – müddəa?
Yığmə bu zürriyyədin götürüb zeyli – mərhəmət,
Həqqi – Şəbirü Şübeyrü Zəhravü Mürtəza.

**ŞAHİN FAZİL**

Ya Nəbi, ya Ülvi İnsan, ya Muhəmməd Mustafa,
Ya Rəsul, ya İlk Müsəlman, ya Muhəmməd Mustafa.

İthaf etdim bir qəsidə mən Sənə, əfv et məni,
Şəninə layiqdi dastan, ya Muhəmməd Mustafa.

Ey Qureyşilər soyundan fəxr olan çox soylara,
Bəxş edən çox xəlqə iman, ya Muhəmməd Mustafa.

Gəlməmişkən aləmə Sən, getdi Abdullah atan,
Mövludundan öncə hicran...., ya Muhəmməd Mustafa.

Sən cocuqkən, Aminə həm köçdü, ey Dürri – yetim,
Gözlərindən axdıümman, ya Muhəmməd Mustafa.

Körpəlikdən görmüsən Əbdülmütəllib qayğısı,
Dərdinə eylərdi dərman, ya Muhəmməd Mustafa.

Olmusan müdrik çağında son Rəsuli aləmin,
Əqlinə xəlq oldu heyran, ya Muhəmməd Mustafa.

Möcüz oldun, Musa – İsa həm ediblər möcüzə,
Möcüzən Qurandı, Quran, ya Muhəmməd Mustafa.

İlk zamanlar, Tanrını təbliğ edən tovhidinə
Bütpərəstlər etdi üsyan, ya Muhəmməd Mustafa.

Bütpərəstlik ayinində vəhdətin ziddin görüb
Oldu əhvalın pərişan, ya Muhəmməd Mustafa.

Fitrətinlə bir çıraq tək parladın zülmətdə Sən,
Kəbəni etdin çıraqban, ya Muhəmməd Mustafa.

Cahiliyyət vaxtı qüdrət bəxş edib çox müslimə
Kafəri qıldın peşiman, ya Muhəmməd Mustafa.

Hikkəvü təqib üzündən Məkkəni tərk eylədin,
Hicrət etdin ol məkandan, ya Muhəmməd Mustafa.

Bir bəşərkən, Allahın lütvüylə ey merac edən,
Ya Nəbi, ya Ülvi İnsan, ya Muhəmməd Mustafa.

Səndə Peyğəmbər dühası, Səndə məntiq, Səndə fiqh,
Səndə hikmət, Səndə irfan, ya Muhəmməd Mustafa.

Yetmiş il bizlər Səni mədh etmədik, əfsus ola,
Yetmiş il fövt oldu imkan, ya Muhəmməd Mustafa.

Biz hər il nətinlə, Allah qoysa, sözlər söylərik,
Ortadan yan oldu şeytan, ya Muhəmməd Mustafa.

Çox  şükürlər, bizdə dövranın dəyişmiş gərdişi,
Dövr edir rəyincə dövran, ya Muhəmməd Mustafa.

Biz də vəsfin eylərik, bizlər də "Nət"in söylərik,
Biz bu halə şadü xəndan, ya Muhəmməd Mustafa.

Şahidim var, Samitim var, Mahirim var, həm də var
Hacı Mail tək qəzəlxan, ya Muhəmməd Mustafa.

Mən də yazdım şerimi, layiq olarsa et qəbul,
Tutiyə ver şəkkəristan, ya Muhəmməd Mustafa.

Bülbüləm mən, saf qəzəl şövqüylə pərvaz eylərəm,
Bülbülə bəxş et gülüstan, ya Muhəmməd Mustafa.

Türk Dəyanət vəqfinə bir "Nət" göndərdim bu il,
Çox nəzərdən qaldı pünhan, ya Muhəmməd Mustafa.

İndi ümmidim qalıb münsiflərin insafına,
Qıl kömək, lütf eylə ehsan, ya Muhəmməd Mustafa.

Mən bu gün nahəqq yerdə, Sən bu gün həqq yerdəsən,
Şahin olsun həqqə qurban, ya Muhəmməd Mustafa!

## İSMAYIL AMİL SƏMƏDZADƏ
## *YA MUHƏMMƏD, YA ƏLİ*

Vermisiz dünyayə rövnəq, ya Muhəmməd, ya Əli,
Olmusuz siz ən yaxın həqq, ya Muhəmməd, ya Əli.

Gəldi "Yasin" vəsfinə, ey xatəmi mürsəl nəbi,
Göydə ay çün oldu münşəq, ya Muhəmməd, ya Əli.

Həl əta şənində gəldi, Mürtəzanın adına,
Bu səxavət oldu bərhəq, ya Muhəmməd, ya Əli.

Necə qardaş olmusuz Musa ilə Harun kimi,
Bu şərikli etdi mülhəq, ya Muhəmməd, ya Əli.

Qövlünüzlə feliniz birdir, nübuvvət bişərik,
Birdir itrət sizdə mütləq, ya Muhəmməd, ya Əli.

Əbdüvəd davasına çıxdı Əliyyəlmürtəza,
Kəsdi başın ruzi – xəndək, ya Muhəmməd, ya Əli.

Bir bəla dəryası olsa, bizlərə sözsüz nicat,
Nuh tufanında zövrəq, ya Muhəmməd, ya Əli.

Çox əziyyətlər çəkib küfrə nəhayət vermisiz,
Dinimiz oldu mühəqqəq, ya Muhəmməd, ya Əli.

Görmədiz siz Kərbəlada zülm olundu itrətə,
Etdilər qurbani – nahəqq, ya Muhəmməd, ya Əli.

Amilin ümmididir, başına düşmüş kölgəniz
Sizdəki zinətli beyrəq, ya Muhəmməd, ya Əli.

## ƏLİBALA SƏYYAH
### *QƏZƏL*

Hansı peyğəmbər de, rahi – həqqdə çəkmiş cəfa,
Müstəfadır, Müstəfadır, Müstəfadır, Müstəfa.

Hansı peyğəmbər de, bulmuş həqqi bulmazdan səfa,
Müstəfadır, Müstəfadır, Müstəfadır, Müstəfa.

Hansı peyğəmbər de, etmiş həqqdən həqq iktifa,
Müstəfadır, Müstəfadır, Müstəfadır, Müstəfa.

Hansı peyğəmbər de, istər aləm əhlin bavəfa,
Müstəfadır, Müstəfadır, Müstəfadır, Müstəfa.

Hansı peyğəmbər de, vermiş cismi – bimarə şəfa,
Müstəfadır, Müstəfadır, Müstəfadır, Müstəfa.

Hansı peyğəmbər de, qurban rahinə tən, can, qəfa,
Müstəfadır, Müstəfadır, Müstəfadır, Müstəfa.

Hansı peyğəmbər de, zati ali, ismi Müstəfa,
Müstəfadır, Müstəfadır, Müstəfadır, Müstəfa.

## *QƏZƏL*

Gördü dərd əhli məni eşqdə məğmun – məğmun,
Oldu öz dərdi – cigərsuzinə məmnun – məmnun.

Gəldi mövludi – Rəsul, endi səmadan yerə nur,
Gör məlaikləri kim, qaməti mövzun – mövzun.

Mövti – cismanimə verdi, bu nuru şər hərəkət,
Tapdı təb, qafil ikən şerdə məzmun – məzmun.

Ol Rəsulüllaha oldu bəli, nazil, Quran,
Etdi Bismillahı ol Müstəfi qanun – qanun.

Bir Muhəmməd yol açıb ərşə, on ikiymiş imam,
On biri bəllidi xalqa, yeri hamun – hamun.

Min Yezid etsə qiyam, ali – əbayə neylər,
Fironu Şəddad adın el çəkə məlun – məlun.

Bir müsəlman ki, edər həqqi – müsəlmani tələb,
Gözü bəhreyni – Fərat, kim axa Ceyhun – Ceyhun.

Bir səlavat eləyək zikir peyəmbər adına,
Gül cəmalının olaq nurinə məftun – məftun.

## VÜQAR NAKAM
### *FÜZULİYƏ TƏXMİS*

Dust olub şeytan ilə hər kim tutub nöqsan sana,
Zahir həm batin gözəllik bəxş edib Sübhan sana,
Göydən enmiş Cəbrail olmaq üçün mehman sana,
“Ey olub merac bürhani – ülüvvi – şan sana,
Yerə enmiş göydən istiqbal edib fürqan sana”.

Şairü sahirü kahin söyləyərkən naminə,
Səngü xardən həm vurarkən yarələr əndaminə,
Qorxmadan təbliği – iman eylədin sən haminə,
“Hini – dəvayi – məhəbbət müddəi ilzaminə,
Cahil ikən el, kəmali – elm bəs ürfan sana”.

Həm bələdsən zahir elmə, həm bələdsən batinə,
Öylə paksan kim, sənin nöqsan yetişmib zatinə,
Ayə var Quran ara ünvan olub ayatinə,
“Baqiyi – möcüz nə hacət əmri – həq isbatinə,
Aləm içrə möcüzü – baqi yetər Quran sana”.

Gördü imanundakı möhkəmliyi hər məmləkət,
Gəldi həm dərgahuva təzim qılıb çox səltənət,
Qövmi – cahil sənlə kəsb etdi ədəb, həm mərifət,
“Kilki – hökmün çəkdi hərfi – sairi – ədyanə xətt,
Hökm isbat etdi nəfyi – sairi – ədyan sana”.

Zülməti aydınladan bir nurə bənzər besətin,
Şərqdən ta qərbəcən tutmuş cahanı şöhrətin,
Səndən əvvəl hər nəbi sənlə tanıtmış ümmətin,
“Vəsf Cibrili – əmin  etmiş qəbuli – xidmətin,
Sirri – həq kəşfinə  ayətlə yetib fərman sana”.

Ədl mizanında bir tutdun qulami, hakimi,
Həqq sana çün bəxş qılmışdı məqami – hakimi,
Sənsən həm peyğəmbəri dövrün, imami, hakimi,
“Sənsən ol xatəm ki, dəf etmiş tamam hakimi,
Xatəmi – hökmi – risalət tapşırıb dövran sana”.

Çoxdur hərçənd günahım, ey kəramətli nigar,
Ol şəfi ruzi qiyamət, etmə üz məndən kənar,
Çün, verib tanrım səni aləmlərə rəhmət qərar,
“Ol qədər zövqi – şəfaət cövhəri – zatında var,
Kim, gəlir ərzi – xəta mənidə bir ehsan sana”.

Çün, süvar oldun Büraqə, ey vəliyyül – insü – can,
Ərzdən merac edib ta ərşə qalxdın bir zaman,
Qabü – qövseyndə sana cananun eşq etdi bəyan,
“Mahi – növdür, yoxsa sən etdikdə seyri – asiman,
Qaldırıb barmaq, gətirmiş asiman iman sana”.

Nəfs əlindən Nakam eylər ahü – fəryad, əlaman,
Qıl şəfaət tanrıdan, sənsən bu yolda tək güman,
Kim sana etmiş itaət, axirət görməz ziyan,
“Ya nəbi! Lütfün Füzulidən kəm etmə ol zaman,
Kim, olur təslimi – miftahi – dəri – ğüfran sana”.

## *NÖVHƏ*

Əhli-həq tutduğu yol Ali-Peyğəmbər yoludur,
Zülfüqar sahibi ol Şirü dilavər yoludur.

Şəbi-meracidə hüsnüylə saçan göylərə nur,
Kəbədən bütləri pamal edən şahi qəyur,
Dini İslama verən rövnəq edən şeytani-kur,
Səlavət isminə, ol Məhmudu-sərvər yoludur.

And ola Fatimeyi-Binti Rəsul iffətinə,
Zövceyi Heydəri-Kəffarı Əli izzətinə,
And ola ol xanımın məsum olan qeyrətinə,
Əhli-cənnət yolu pak çeşmeyi kövsər yoludu

Vermiş ismin rəmz ilə Quran 114 surədə,
«Ba» ilə «Sin» arəsi ünvan 114 surədə,
Bibəsirətdən olub pünhan 114 surədə,
Qəflət əhli bilməz əlbətdə bu Heydər yoludu.

Ol Həsəndi, ol Hüsendir bağı cənnət laləsi,
Qəlbi dağlı, sinə alqan, abi-çeşmi jaləsi,
Şəhrdə məhbusu sər, çöldə bədən pərkaləsi
Zibhi-İbrahimdi bu zənn etmə Azər yoludur.

Zeynülabidini salıb məhbəsdə dustaq etdilər,
Həm Məhəmməd Baqir haqqın sonra tapdaq etdilər.
Zəhr içirdib ol əzizə, hökmü alçaq etdilər,
Düz gedib haqqa çatan yoldur bu Cəfər yoludur.

Kazim üçün zaliman hey durmadan qıldı cəfa,
Eyni yolla cövr çəkdi, həm şəhid oldu Rza,
Həm Təqiyə, həm Nəqiyə qılmadı dəhr vəfa,
O yolu sən də tutub get ki, o yol ər yoludur.

Həsən Əsgər yolun istəsən hərgah gedəsən,
Sən gərək əhli-cahan ilə təbərra edəsən,
Nəfsini saleh olan işlərə həm öyrədəsən,
O zaman aşgar olar getdiyin Əsgər yoludur.

Gəl, Ağa eylə zühur, məhv ola küffari-ləin,
Payidar eylə ki, tutsun yerin İslami-Mubin,
Gözlərik həsrətilən rahini ey sərvəri-din,
Çün bizə örnək olan zati namivər yoludur.

Bu yolun eyşi, ğəmi yol gedənindir, Nakam,
Bu yolda izni qoyub, can verənindir Nakam,
Biz yolun yolçusu, yol göstərənindir Nakam
Bu Kumeyl, Hürr yoludur, Səlman, Əbazər yoludur.

## ƏLİ NASİR
### *MUHƏMMƏD(S) ƏL MUSTƏFA*

Rəhbəri – əhli – vəfa,
Muhəmməd əl Mustəfa.
Dəhridə nəqdül nəva,
Sahibi – beytüs – səfa.
Muhəmməd əl Mustəfa.

Var buna hədsiz dəlil,
Düzlərə Oldur vəkil.
Sidq ilə düşsən dəxil,
Dərdinə eylər dəva,
Muhəmməd əl Mustəfa.

Müsəlmanın qayəsi,
Hər sözü Haqq ayəsi.
Həqiqətin mayəsi,
Yox Əmin ondan səva,
Muhəmməd əl Mustəfa.

Fatehi – Merac Odur,
Eşqidə sərtac Odur.
Müşkülə əlac Odur
Ruze – cəzadə şəfa,
Muhəmməd əl Mustəfa.

Verdi xəbər Xatəmi,
Cümlə Nəbinin cəmi.
Gördü Nuhu, Adəmi,
Kim görüb ondan səva?
Muhəmməd əl Mustəfa.

Verdi nişan sünnəti,
Şərh elədi ayəti.
Ruh evinə cənnəti,
Bildi bizimçün rəva,
Muhəmməd əl Mustəfa.

İblisi məğmun edən,
Kövni ona bun edən.
Xaliqi məmnun edən,
Muhəmməd əl Bavəfa,
Muhəmməd əl Mustəfa.

## HACI YUSİF QULAMMİRZƏ OĞLU
## *QƏSİDƏ*

Şiə, fəxr eylə, əzəldən binası var Əlinin!
Bütpərəstlikdən uzaq, ibtidası var əlinin!

Göz açıb Kəbə evində, o Günəş saldı işıq,
Nur saçır aləmə parlaq, Şuası var Əlinin!

Neçə yüzillər onun eşqi ürəklərdə yanır,
Sevən aşiqləri çox, mübtəlası var Əlinin!

Onun eşqindəki bu cazibənin sirri nədir?...
Ona can verməyə saysız fədası var Əlinin!

“Əlini sevmək imandandı!”-Peyğəmbər buyurub,
Hər vilayətdə yaxın aşinası var Əlinin!

Əliyə beyət edən axirətin həll eləyir,
Mətləbin varsa dilə, hər davası var Əlinin!

Onun əxlaqi, həyat tərzi böyük məktəbdir,
Nur çilər qəlbinə, vallah, ziyası var Əlinin!

O qiyamətdə sipərdir “Əli aşiqlərinə”,
Yalvar, ondan səfa istə, səfası var Əlinin!

Ona “Elmin qapısın” tapşırıb “Elmin şəhəri”,
Çünki, Qurani – kərimdən qidası var Əlinin!

“Mən Əlidən, Əli məndəndi!” – deyib Peyğəmbər,
Şəninə nazil olan “Həl – Əta” sı var Əlinin!

“Həm əmioğlu, həm qardaş, həm damaddı mənə”
Bəşəriyyət nə qədər var, sədası var Əlinin!

O sədaqət, o məhəbbət, o səxavət rəmzi,
Rüku halında üzükdən ətası var Əlinin!

Ruzigarın anası bir daha doğmaz ondan,
Hatəmi – Tay nəçidir ki, səxası var Əlinin!

Məzluma hörmət edərdi, ödüyərdi haqqın,
Amma, zalimlər ilə çox davası var Əlinin!

Dini – İslami sevəndən sinəsin etdi sipər,
Ağla gəlməz, saya gəlməz şücası var Əlinin!

Dininin xeyrinə vurmuş o bütün zərbələri,
“La fəta” “Şiri Xuda” dır, nidası var Əlinin!

Xətmi – Peyğəmbər İmam təyin edib Xumda onu,
Çün nübüvvətdən alınmış qidası var Əlinin!

O adamlar ki, Qədir – Xumda onun sıxdı əlin,
Dedilər sonra: “Əbəs iddiası var Əlinin!”

İki dost qaçdı xilafətliyi alsınlar ələ,
Nəzərə almadı onlar, dühası var Əlinin!

Hələ bu azmış, Əli beyətə məcbur edilir,
Dedilər : - Gəlməsə, hərgah cəzası var Əlinin!

Fatimə dözmədi haqqsızlığa, erkən getdi,
Sevinənlər də tapıldı: “Əzası var Əlinin!”

Ruzigarın üzü döndükcə ona zülm elədi,
Gör başında nə qədər macərası var Əlinin!

İbn – Müləcəm də namaz üstə qılınc çəkdi ona,
Gördülər qanlı başında yarası var Əlinin!

Bu fəna mülkünü tez tərk eləyib getdisə də,
Bitmədi dərdi, fəqət çox bəlası var Əlinin!

Öz evində Həsənin ömrünə son qoydu zəhər,
Ciyəri parçalanan Müctəbası var, Əlinin!

Zülm ilə Şimr – ləin kəsdi Hüseynin başın,
Bağrı qan ilə dolu Kərbəlası var, Əlinin!

Kimi xəncərlə, kimi oxla girib meydanə
Şəhid oldu, nə qədər əqrabası var, Əlinin!

Sən də ey şiə, bu gün səs ver Əlinin səsinə,
Yerdə qoymaz bu qanı, iddiası var Əlinin!

Bəşər övladı onun dərkini bilməz əsla,
Tarixə qanlı yazılmış qisası var, Əlinin!

O hidayət çırağın söndürə bilməz heç kim,
Çün iman üstə qurulmuş qalası var, Əlinin!

Paklığın aynasıdır hər iki dünyamız üçün,
Əl açıb istə şəfaət, şəfası var Əlinin!

Tanrının nurudur o, nuri vilatəyətdə bizə,
Nə qədər Hüccəti sağdır, şüası var Əlinin!

Gün gələr bayrağı İslamımızın üstün olar,
Yusifa, hər şeyə qadir Xudası var Əlinin!

Əhli – beyt aşiqisən, üzmə Əlidən əlini,
Bir münacatına min bir duası var, Əlinin!

## PƏNAH GÖYCƏLİ
### *NƏT*

Yenə düşünürəm əlimdə qələm,
Varlığıma yaddı kədər, qüssə, qəm.
Qəlbimə hakimdi ali bir varlıq,
Onu düşünmək də bir bəxtiyarlıq;
Adəmdən bəriyə ən kamil insan,
Mübarək bir vücud, saf ürək, saf qan.
Sevimli bəndəsi ulu Tanrının,
Həm də ki, birinci qulu Tanrının...

Söhbət kimdən gedir, aşkardır, aşkar,
Bu qədər şöhrətli özgə kimsə var?
Odur, o, Tanrıya ən yaxın bəndə,
Hər gün buna şahid dururam mən də .

**La ilahə illəllah**
**Məhəmməd Rəsul Allah!**

Anamın öz dilində
Daha gözəl səslənir.
O da haqq vergisidir,
Gəzmə burda özgə sirr:
**Allahdan özgə Allah**
**Yoxdu əzəldən bəri,**

**Məhəmməddir bəşərə**
**Verdiyi peyğəmbəri.**

Ya Məhəmməd, adını
Hər dəfə söyləyəndə,
Bir sevinc, bir rahatlıq
Sanki, cəmlənir məndə;
Gözlərimdə kainat
Tamam özgə don geyir,
Hər yaranmış adına,
Sanıram ki, baş əyir.
Sərin-sərin əsir meh,
Ətirlənir gül, çiçək,
Ay elə bil yuyunub
Şəfəqlənir Günəş tək.
Daha bir parlaq olur
Kəhkəşanda hər ulduz,
Səhər banında sanki,
Bülbülə dönür xoruz.
Ağaclarda hər yarpaq
Sanki, sənə əl edir,
Hər tərəfə yayılır
Özgə əfsun, özgə sirr.
Günəş qalxıb ucalır,
O da qoşulur bizə,
Aləmə yaydığı nur

Daha gur gəlir gözə,
Uçur xallı kəpənək,
Heyran edir bizləri,
Şübhəsiz öz dilində
**Söyləyir bu sözləri:**
**Allahdan özgə Allah**
**Yoxdu əzəldən bəri,**
**Məhəmmədir bəşərə**
**Verdiyi peyğəmbəri.**
Torağay nəğməsini
Başlayır adın ilə.
Bülbül öz şərqisini
Adınla çəkir zilə.
Yer üzündə hər varlıq
Səni salama gəlir.
Sanıram, cansızlar da,
Düz qibləyə yönəlir.
Hər tərəfi çulğayır
Ən mənalı bir nida,
Yayılır dalğa-dalğa
Yerdə, havada, suda:
**Allahdan özgə Allah**
**Yoxdu əzəldən bəri,**
**Məhəmmədir bəşərə**
**Verdiyi peyğəmbəri.**

## ŞÖVKƏT HICRAN
### *PEYĞƏMBƏRƏ(S) NƏT*

Əhsən ol aşiqə eşq içrə yazılmış adı,
Ömrü sevdadə keçib, sevgi olub bünyadı.

Ya Rəsul, eşqin əgər olmasa qəlb viran olar,
Sənin eşqindi abad eyləyən hər bərbadı.

Kimsədən görmədim imdad bu fəna dünyadə,
Təkcə lütfündən umur xəstə könül imdadı.

Nurun ilə dağıdıb küff qaranlıqlarını,
Çəkdin İmana, dinə doğma sanıb hər yadı.

Nə qədər dərdü-bəla çəksədə biçarə könül,
Həqq yolun tərk eləməz, sən kimi var ustadı.

Sən çağırdın bütün insanları haqqın yoluna,
Sənə möhtacdı həbibim, bu bəşər övladı.

Şövkət hicran ilə keçdi bütün ömrün, nə olar,
Kəm deyil aşiqin hicranı ilə fəryadı.

## BƏBİR FƏQİR (TURKAN)
### *TƏSDİS*

Dünyada edib nurini izhar Muhəmməd!
Dinilə açıb gülləri gülzar Muhəmməd!
Kim aşiq olub çəhrəvi rüxsar Muhəmməd!
Bu şəkk olacaq dərdinə dərgar Muhəmməd!
Əhsən bu cəmalə, bu kəmalə, bu cəlalə,
Səlavət ola nurani o xurşidi cəmalə.

Quranilə islamə verib şənü şərafət,
Gülzarə, cəmənzarə verib tabü təravət
Hər bülbüli-şeydayə xoş avazi məlahət
Bəxş eylədi ol Əhmədi Muxtar Muhəmməd!
Əhsən bu cəmalə, bu kəmalə, bu cəlalə,
Səlavət ola nurani o xurşidi cəmalə.

Afiqi edib dəhridə nurilə münəvvər
Hər mərhələdə fikri olub safi müzəffər
Cənnətdə onun nuri ilə oldu müyyəttər
Dünya nə qədər var, olar asar Muhəmməd!
Əhsən bu cəmalə, bu kəmalə, bu cəlalə,
Səlavət ola nurani o xurşidi cəmalə.

Bu cahi-cəlalə çox əqillər qalıb heyran
Şahlar da, nəbilər də onun hüsnünə qurban
Meracagedib xaliqi-sübhaninə mehman
Xaliq elədi dəgəhi əhcar Muhəmməd
Əhsən bu cəmalə, bu kəmalə, bu cəlalə,
Səlavət ola nurani o xurşidi cəmalə.

Həmd eyləyərik xaliqi-sübhanə dəmadəm,
Lütf etdi bizə fəhmü zəka xaliqi-aləm,
Aləmdə «Fəqir»əm demə mən aşiqi həqqəm,
Sidqilə könül oldu xiridar Muhəmməd!
Əhsən bu cəmalə kəmal, bu cəlalə
Səlavət ola nurani o xurşidi cəmalə.

## ƏLİ SƏFƏROĞLU
## *YA MƏHƏMMƏD, MƏHHƏMMƏD!*

Peyğəmbəri vəsf etməyə aciz qalıbdır qələm,
Ürəyimdə intizar var, gözlərimdə bir ələm.
Dizim yerdə, əlim göydə, gecə gündüz deyərəm:
Ey Allahım, sən özün ver ürəyimə cəsarət,
Ey dünyanın xilaskarı, ya Məhəmməd, Məhəmməd!

Ya Məhəmməd, insanların ən təmizi sən oldun,
Peyğəmbərlər səcdə edən nur dənizi sən oldun,
İlahinin ən yaxını, ən əzizi sən oldun.
Vücudunda vəhdət tapıb camal, kamal, səxavət,
Ey dünyanın xilaskarı, ya Məhəmməd, Məhəmməd!

Kürəyində bəyan oldu peyğəmbərlik nişanı,
Qırx yaşında haqq tərəfdən eşitdin sən nidanı,
Yoxdur sənin bərabərin axtarsalar cahanı.
Allah özü bəxş elədi sənə savad, mərifət,
Ey dünyanın xilaskarı, ya Məhəmməd, Məhəmməd!

La İlahə İlləllahı yer üzünə sən yaydın,
Bu dünyanın gecəsinə, gündüzünə sən yaydın,
Kainatın uzaq-uzaq ulduzuna sən yaydın.
Bəşər nədir dərk eləsin, necə oldu bu hikmət?
Ey dünyanın xilaskarı ya Məhəmməd, Məhəmməd!

Ya peyğəmbər cəfa çəkdin ümmətinin yolunda ,
Düşmənlərin baş qaldırdı sağında və solunda,
Daş atdılar, dişin sındı, yaralandı qolun da,
Hətta sənə qəsd etməyə eylədilər cəsarət,
Ey dünyanın xilaskarı, ya Məhəmməd, Məhəmməd!

Sənə iman gətirənlər, sənə kömək durdular,
Sözlərini yaymaq üçün özlərini yordular,
Ən ümidsiz anlarında dada çatdı Zülfüqar.
Kimdə vardı Əlidəki elm, hünər, ədalət?
Ey dünyanın xilaskarı, ya Məhəmməd, Məhəmməd!

Mədinəyə Hicrət etdin sən o gecə Məkkədən,
Min-min idi o zamanlar tək Allaha şəkk edən,
Çox axtarıb tapmadılar, çatladılar hikkədən.
Gizləndiyin mağaraya tor çəkdi sahib-qüdrət,
Ey dünyanın xilaskarı, ya Məhəmməd, Məhəmməd!

Aylar, illər ötüşdükcə artdı tərəfdarların,
Kimi canın fəda etdi, kimi verdi varların,
Əqidəsin dəyişdirdin sən cahil insanların.
Vəhşiliyi məhv eyləyib, qurdun yeni cəmiyyət,
Ey dünyanın xilaskarı, ya Məhəmməd, Məhəmməd!

Bütün dünya heyran qalıb indiyədək bir şeyə,
Çox vədələr versələr də sən uymadın heç nəyə,
Bir gün də «vaxtdır», - deyib, üz çevirdin Kəbəyə.
İlahinin xanəsini eyləməkçün ziyarət,
Ey dünyanın xilaskarı, ya Məhəmməd, Məhəmməd!

«Allahın şiri» ilə sındırdınız bütləri,
Çətin oldu qandırmaq cahilləri, kütləri.
Qırdınız neçə-neçə quduzlaşmış itləri.
Əridi zülmət kimi yavaş-yavaş cəhalət,
Ey dünyanın xilaskarı, ya Məhəmməd, Məhəmməd!

Həmişə kömək etdin sənköməyə möhtaca,
Yetimlərə, dullara, zəlillərlə, həm aca,
Əfsanəvi buraqla uçub getdin meraca.
Yer üzündə kimdə vardır belə hünər kəramət,
Ey dünyanın xilaskarı, ya Məhəmməd, Məhəmməd!

Ya peyğəmbər, özün qoru Azərbaycan elini,
Qılıncdan kəsərli et müsəlmanın dilini,
Dərgahından ayırma Səfəroğlu Əlini.
Mənə də havadar ol, qopan zaman qiyamət,
Ey dünyanın xilaskarı, ya Məhəmməd, Məhəmməd!
Hamımızın havadarı, ya Məhəmməd, Məhəmməd!

**MƏMMƏD ASLAN**

## *ETİRAZ*

Bir dağsan ki başından
Gündə min tufan keçər!
Cəhalət cəhli doğar, -
Məhşəri dövran keçər

Düşmənlərin amansız:
Nə yırtıcı, nə qansız!
Kəsər haqsız divansız
Vermədən aman keçər.

Bir rəngdə qalmaz bəşər,
Bəzən gerçək, bəzən şər;
Gah belə müşrikləşər -
Bir idbar zaman keçər.

Əbu Cəhl nə rəzil!
Rəzillikdən nə hasil?!
Qəm eləmə ya Rəsul,
İt hürər karvan keçər!

## MÜCRİM
### *TİLAVƏT*

Ya Rəbbi, bizi Əhmədi-Muxtarə bağışla,
Meraca gedən sahibi-sərdara bağışla.

Damadi-Nəbi, fatehi-Xeybər, şahi-Qənbər,
Hikmət qapısı, Heydəri-Kərrarə bağışla,

Mahmudə ciyər parə olan ol gözü yaşlı,
Zəhradə olan pakizə rəftarə bağışla.

Məsum sitəmə, əhli-cəfayə olan amad,
Qasim atası, dideyi-xunbarə bağışla.

Ləbtəşnə Hüseyn, şahi-şahidani-zəmanə,
Biqüslü kəfən, peykəri-sədparə bağışla.

Səqqayi-Bəla təşdi-ələmdari Əbəlfəzl,
Ayrı bədənindən iki qollarə bağışla.

Sərvi-çəməni-baği-Hüseyn, qaməti rəna,
Nakam Əli Əkbəri – Muxtarə bağışla!

Qundaqı batan qanə, dəyən hulquna peykan,
Ləbtəşnə Əli Əsğəri-qəmxarə bağışla.

Ol kamili dil, suzi ciyərguşeyi Zəhra,
Sirri-üsəra-Zeynəbi bimarə bağışla.

Çün tapdı Hüseyn qardaşın ol qətligah içrə,
Öpdü yarasın, ağladı biyarə bağışla.

Ərz etdi Hüseyn, dur yola sal əhli-əyalun;
Şama qolu bağlı gedən Azarə bağışla.

Yüz möhnət ilə şami-səhər Şam yolunda,
Zəncirə bağlı Abidi-bimarə bağışla.

Dünyada olan möhnəti azara giriftar,
Ol baqiri məzlumi vəfadara bağışla.

Hökmü-İlahini gecə-gündüz eləyən car,
Ol Sadiqi-Həqq, ol Şahi-Biyarə bağışla.

On bir ilədək məhbus olan zülfü pərişan,
Məzlumi-zaman, Museyi-dindarə bağışla.

Qürbətdə gözü yaşlı qalan, hücrəsi bağlı,
Musəbni Rza, şahi-diləfkarə bağışla.

Dəryayi vəfa ki, var onun incisi dürrü
Xilqətdə Təqi bikəsi-biyarə bağışla.

Sərvi-çəməni-bağı-behişt, sahibi dövran
Zatında Nəqi Seyyidi-Əbarə bağışla.

Tavusi-cinan, ruhi-rəvan, natiqi-Quran,
Məsum Həsən-Əsgəri-Məhparə bağışla

Allahın olan höccəti aləmlərə rəhbər
Soltani-zaman, qayibi-sərdarə bağışla.

Layiq deyiləm çün mənə də rəhmət oxunsun
Mücrümə yetir əcrini, bir parə bağışla.

## İSTİFADƏ OLUNMUŞ ƏDƏBİYYAT


1. Ş. İ. Xətai «Keçmə namərd körpüsündən» Bakı Yazıçı 1988
2. M. İ Rəsulzadə "Ş. İ Xətai külliyatı" – Bakı 2004
3. Q. Dərbəndi. " Kənzül-məsaib" – "Boz oğuz nəşr. 1999
4. M. Füzuli "Leyli və Məcnun" – Azərnəşr nəş. 1999
5. Ə. Mərağali "Cami-cəm" Azərb. Dövlət Nəşr.
6. N. Gəncəvi « Sirlər xəzinəsi» Bakı. «Yazıçı» nəşr. 1988.
7. N. Gəncəvi «Xosrov və Şirin» - Lider nəşr. 2004
8. N. Gəncəvi «Leyl və Məcnun» Lider nəşriyaatı. 2004
9. N. Gəncəvi «Yeddi gözəl» Lider nəşriyyatı. 2004
10. N.Gəncəvi « İskəndərnamə» - Bakı. «Yazıçı» nəşr. 1982
11. H. Şıxəli Tuti «Qəsidələr» Bakı, Minarə nəşr. 2001
12. Növrəs iman «Seçilmiş əsərləri» «Səda» nəşr. – 2004
13. Ənvər Nəzərli «Məhəbbət günəşi, həsrət çələngi» «Səda» nəşr. 1998
14. Ələmdar Mahir «Səadət intizarında» Bakı «Ağırdağ» nəşr. 1998.
15. H. Soltan «Azərbaycan dərvişləri və rövzəxanları» «Boz oğuz» - 1995
16. H. Soltan «Allah eşqi, insan eşqi, söz eşqi» «Ozan» nəşr. – 2003
17. H. Soltan «Qarabağ azad olan gün» Bakı – Azərbaycan nəşr. 1996

**18.** M. Aslan «Allahın Rəsulu» «Qismət» nəşr.-2001.
**19.** S. Nigari «Xaki-payin, taci-sərim» Azərbaycan nəşr. 2004
**20.** X. Şirvani «Seçilmiş əsərləri» Bakı, «Yazıçı» nəşr. 1987
**21.** K.Kürnıraxlı « Sayası haqdan, mayası eldən» Azərnəşr 1994
**22.** K. Kürqıraxlı «Ümidim peyğəmbər şəfaətində, əlim Allahımın ətəyindədir» Bakı 2006. Azərnəşr.
**23.** Hüseyn Kürdoğlu «İmana dinə gəldim» «Elm» nəşr. 1999
**24.** İsmayıl Zəngilanlı «Ədalət zəfər çalsın» «Günəş» nəş. 2006
**25.** Hacı Mail «Divan» Bakı – 2006
**26.** Nizami Zöhrabi «Məkkədən doğan günəş» Bakı- «Adiloğlu» nəşr. 2006
**27.** M. Füzuli «Divan» - Tehran 1996
**28.** H. Yusif Qulammirzə oğlu «Allahın elçisi» Bakı -2000
**29.** N. Xəzri «Saflıq Hekayəti» 1992 – Bakı
**30.** Əlihüseyn Cəfəri «Həqiqət aşiqləri» Bakı – Təhsil-elm nəşriyatı 2004
**31.** S.İ.Nəsimi « Seçilmiş əsərləri» Azərnəşr 1973
**32.** K. Sərbəndi «Dərə xəlvət, tülkü bəy» Bakı 1995. Yazıçı nəşr. 1983
**33.** Simuzər Baxışlı «Dəniz anamdır mənim» Bakı, Yurd nəşriyatı. 1998

**34.** Şahin Fazil «Allah eşqi, peyğəmbər məhəbbəti, iman sevgisi» Bakı 2001

**35.** F. Gürgani «Vis və Ramin» Azərbaycan Dövlət nəşriyyatı Bakı 1974

**36.** Ə. Təbrizi «Mehr və Müştəri» Bakı – «Yazıçı» 1988

**37.** S. Beyləqanlı «Həzrət Cərcis Peyğəmbər» - Bakı – Gənclik 1999

**38.** Arif Buzovnalı «Mərifətdən-həqiqətə» - Bakı «Qanun» 2005

**39.** Aşıq Cəbrayıl Gilançaylı «Müsəlmanın həyatı» Sumqayıt 2000

**40.** Zeynəb Soltanqızı «Azərbaycan müsəlmanları və idman» Ozan nəşriyatı. 2005

**41.** İsmayıl Amil Səmədzadə «Sözum qaldı» Bakı, Ozan, 2006

**42.** Əlibala Səyyah «Şəhid qardaş» - Bakı 2001

**43.** Vərağa Almasov «Peyğəmbər şairi Füzuli (4c.1.c) Bakı 2007

**44.** Hüseyn Cavid «Əsərləri» 3 cild Bakı Yazıçı 1984

**45.** Əli Nasir «Ümmana dönən eşq» Bakı 2005

**46.** Həbibi «Şerlər» Bakı Şərq-Qərb 2006

**47.** Qövsi Təbrizi «Seçilmiş əsərləri» - Bakı Lider nəşriyyatı 2005

**48.** Yusif Balasaqunlu «Qutadqu bilik» Bakı Gənclik 1998

**49.** Azərbaycan klassik ədəbiyyatından seçmələr 3-cild. Bakı Şərq-qərb nəşr. 2005.
**50.** Dastani Əhməd Hərami – Bakı Gənclik 1978
**51.** Ə. Raci «Seçilmiş əsərləri» Bakı Sabah nəşr. 1992.
**52.** Əli Səfəroğlu «Niyə belə gəlmisən» Bakı Şuşa nəşr. 2000